*Bu kitab “**Mir Cəlal.** Seçilmiş əsərləri. İki cilddə. I və II cildlər”*
(*Bakı, Azərnəşr, 1986, 1987*) *nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni və
ön sözün müəllifi: **Yaqub İsmayılov**

**894.3613 - dc 21**
**AZE**
**Mir Cəlal. Seçilmiş əsərləri.** Bakı, “Şərq-Qərb”, 2005, 384 səh.

XX əsr Azərbaycan ədəbiyyatında fəxri yerlərdən birini tutan Mir Cəlal qiymətli hekayə və romanlar müəllifi kimi tanınmışdır. Ədibin güldürə-güldürə düşündürən, bir-birindən gözəl və mənalı onlarca əsəri ədəbiyyatımızın qızıl fonduna daxil olmuşdur.

Təqdim olunan kitabda görkəmli yazıçının seçmə hekayələri və “Açıq kitab” romanı toplanmışdır. İdeya-bədii məqsədi, fikir qayəsi həmişə aydın və işıqlı olan müəllifin bu hekayələrində həyatın dərin qatlarına enilir, köhnəliklə yeniliyin mübarizəsi, inkişafa mane olanların tənqidi önə çəkilir.

Kəskin tənqidi-satirik ruhu ilə seçilən və sənətkarlıq baxımından qüvvətli “Açıq kitab” romanında isə dövrün əsas qüsuru kimi “gəldiyevçilik” əsl bədii-fəlsəfi ümumiləşmə səviyyəsində ifşa olunur.

**ISBN 9952-418-91-1**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## ÖN SÖZ

Mir Cəlal XX əsr Azərbaycan ədəbiyyatı, mədəniyyəti və elmi tarixində şöhrət tapmış parlaq şəxsiyyətlərdən biridir. O, yetmiş illik ömrünün tam yarım əsrini çətin, lakin mənalı və şərəfli bədii, elmi və pedaqoji yaradıcılıq işinə həsr etmişdir. Böyük uğurlarla nəticələnən bu çoxşaxəli sahələrin hər üçü yanaşı inkişafda bir-birini tamamlayıb zənginləşdirmiş və dolğunlaşdırmışdır. Mir Cəlalın elmi məntiqi bədii ilhamına, həyata sənətkar baxışına, estetik duyğu-düşüncələr sisteminə uyğun gəlirdi, bilik potensialı, zəka və təfəkkür işığı sənətini də təbii məcraya yönəltməyə kömək edirdi. Alim-müəllim Mir Cəlalı düşündürən bir çox mətləblər, müəyyən elmi-pedaqoji fikirlər bədii yaradıcılığında da qoyulub, əsasən həyati surətlər və obrazlı vasitələrlə həll olunurdu.

O, milli şifahi ədəbiyyatın, klassik və müasir bədii nəsrin ən yaxşı ənənələri əsasında yetişib, mahir hekayə ustası və romançı kimi yüksəlmişdir.

Müəllifin adamlarımızı mərhələ-mərhələ inkişafda əks etdirən, güldürə-güldürə düşündürüb fəaliyyətə çəkən onlarca hekayə və novellası, ədəbiyyatımızın qızıl fonduna düşmüş bir çox romanı, ciddi monoqrafik tədqiqatları, dərin elmi-nəzəri mülahizələri, gərəkli dərs vəsaitləri, aktual problemlərə dair maraqlı məqalə, çıxış, oçerk və publisist yazıları geniş istifadə olunan faydalı və etibarlı mənbələrdir.

Mir Cəlal (Cəlal Əli oğlu Paşayev) 1908-ci il aprelin 26-da Cənubi Azərbaycanın Əndəbil kəndində anadan olmuşdur. Lakin sonralar Gəncə şəhərinə gəlmiş, ibtidai təhsilini burada almış, uşaqlıq və ilk gənclik illərini burada keçirmişdir. 1924-1928-ci illərdə Gəncə Darülmüəllimində oxumuş, qurtaranda Gədəbəy yeddiillik məktəbinə müəllim göndərilmişdir. 1929-1930-cu illərdə 1saylı Gəncə şəhər məktəbində direktor vəzifəsində çalışmışdır. 1930-1931-ci illərdə Kazan Pedaqoji İnstitutunun dil-ədəbiyyat fakültəsində oxumuş, 1932-ci ildə Bakıya qayıdaraq Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutunun aspiranturasında təhsilini davam etdirmiş, “Kommunist” və “Gənc işçi” qəzetlərində işləmişdir. 1933-cü ildə SSRİ EA Zaqafqaziya filialı Azərbaycan şöbəsinin ictimai elmlər bölməsinə elmi işçi götürülmüş, 1936-1941-ci illərdə Pedaqoji İnstitutda və Dövlət Universitetində müəllimlik etmişdir. 1940-cı ildə “Füzulinin poetik xüsusiyyətləri” tədqiqatına görə filologiya elmləri namizədi, 1947-ci ildə isə “Azərbaycanda ədəbi məktəblər (1905-1917)” əsərinə görə filologiya elmləri doktoru adına layiq görülmüşdür. Yazıçılıq,

alimlik, müəllimlik sənətini yanaşı – əlaqəli davam etdirərək uzun müddət respublika Elmlər Akademiyası Nizami adına Ədəbiyyat və Dil İnstitutunda şöbə müdiri, 1961-cı ildən ömrünün sonuna kimi Azərbaycan Dövlət Universitetində kafedra müdiri və müəllim işləmişdir. O, Füzuli irsinin sovet dövründə ilk gözəl tədqiqatçılarından biri, XX əsr Azərbaycan ədəbiyyatının görkəmli mütəxəssisi, müasir ədəbi proseslə ciddi maraqlanan nüfuzlu alim, respublikanın əməkdar elm xadimi, milli kadrların hazırlanması, gənc nəslin yetişməsi və təlim-tərbiyəsi sahəsində böyük əməyi olan istedadlı pedaqoq idi. Xalqına qeyrət və vicdanla xidmətlər göstərmiş Mir Cəlal 1978-ci il sentyabrın 28-də vəfat etmişdir.

Ədəbiyyata 20-ci illərin axırlarında şeirlə gələn Mir Cəlalın bədii istedadı nəsr növündə parlamışdır. İlk hekayə və oçerkləri 1930-cu ildə çap olunmuşdur. Dövrün ruhuna uyğun olaraq “Sağlam yollarda” (1932) adlandırdığı ilk oçerklər kitabında o, müasir həyat və insanlarla bağlı müşahidələrini canlı dillə qələmə alırdı. Lakin Mir Cəlalın ədəbi fəaliyyəti üçün hekayə və roman janrları əsas olmuşdur. O, hər şeydən əvvəl, mahir hekayə ustasıdır. Sovet dövrü Azərbaycan ədəbiyyatında hekayə janrının inkişafında böyük xidmətlər göstərmişdir. İnsanda sağlam duyğular, xoş arzu-ümidlər oyadan, gerçəkliyə baxışa həqiqət işığı, tənqidi ruh və ayıqlıq hissi gətirən, haqsızlığa, nöqsan, eybəcərlik və mənfiliyə qarşı mübarizə keyfiyyəti aşılayan bədii gülüş ədibin yaradıcılığında mühüm tərkib hissə, əsas estetik əlamət və məziyyətlərdəndir. 30-cu illərdə ədəbiyyata “Mirzə”, “Həkim Cinayətov”, “Mərkəz adamı”, “Kağızlar aləmi”, “Təzə toyun nəzakət qaydaları”, “Bostan oğrusu”, “Kələntərovlar ailəsi”, “Anket Anketov” tipli dəyərli hekayələr gətirmiş Mir Cəlal tənqid oxunu hədəfə qarşı cəsarətlə yönəldə bilirdi. Özünəməxsus realist qələmlə savadsız mirzələri, başgirləyən müəllimləri, cinayətkar həkimləri, “mərkəz adamı” Əntərzadələri, arvad alıb boşamaqla varlanan Balaxanları, mənəviyyatca pozulub “murdar cənazə“yə çevrilən Səadət xanımları, “nəzakət” pərdəsi altında çirkin simalarını gizlədənləri, bürokrat Anket Anketovları vəziyyət və şərait konkretliyində rüsvay edib, oxucuya tanıdırdı.

Mənfi ehtirasların təsiri ilə biri digərindən qisas almağa can atan qardaşlar da, “dəm-dəsgah hərisi” və əsiri ər-arvadlar da müəllifin diqqətindən yayınmırdı. Onun gülüşə böyük əhəmiyyət verdiyi, komik duyğu və incə idrak qabiliyyəti ilk hekayəsindən (“Müəllim”, “Qızıl Gəncə”, 1930, №3) başlayaraq getdikcə güclənmişdir. “Kağızlar aləmi” və “Anket Anketov”da bürokratik iş üsulu və düşüncə tərzi tənqid-ifşa obyekti seçilmişdi. Rəisi olduğu trestdə adamları şəxsi ləyaqətinə, bacarığına, xarakterinə

görə yox, "liçni delo"suna görə növlərə ayıran, canlı insanlara "iş qovluqlarının səyyar kölgələri" kimi baxan, hər kəsin tərcümeyi-halında "əmma" tapıb onu özündən asılı etmək istəyən Anket Anketov bürokrat tipi kimi ümumiləşdirilmişdir.

Diqqəti zahiri effektə yox, daxili mənaya, səciyyəvi əlamətə yönəltmək, obrazı konkret əməlləri, duyğu-düşüncələri, fərdi və ümumi cizgiləri ilə canlandırmaq Mir Cəlal sənətini dəyərləndirən keyfiyyətlərdəndir.

Müəllifin əlvan mövzulu hekayələrində həyat birrəngli deyil, müxtəlif sahələri, əxlaqi-tərbiyəvi motivləri, ailə-məişət məsələləri, adi əhvalatları, dərin mətləbləri, aktual və gərəkli hadisələri ilə tədqiq olunurdu.

Yumoristik və satirik əsərlərində lirika olduğu kimi, lirik əsərlərində də çox vaxt mənalı gülüş, tənqidi ruh vardı. "Qonaqpərəst", "Dost görüşü", "Vicdan əzabı" və "Müalicə"dən ibarət "Həkim hekayələri" (1938-1939) silsiləsində yazıçı yalnız mənəviyyatca yox, fiziki cəhətdən də sağlam adamlar yetişdirməyi vacib sayır, bədii əyaniliklə zərərli vərdiş, yanlış etiqad və əxlaqi naqislik hallarına qarşı çıxırdı. O, bəzən sərt, kəskin, bəzən mülayim-yumşaq, ayıldıcı-saflaşdırıcı gülüşə arxalanırdısa, bəzən də lirik-psixoloji motiv və məqamlara üstünlük verirdi.

Mir Cəlal ədəbiyyata "yenişələn insan" surətləri də gətirdi. Əməkçi insanın, xüsusən Azərbaycan qadınının taleyi, fikri-mənəvi təkamülü ədibi ciddi düşündürən problem idi. Bu baxımdan "Dəzgah qızı", "Gözün aydın", "Badamın ləzzəti", "Nanənin hünəri" forma və məzmun xüsusiyyətləri, bədii detalları, müqayisə və təsvirləri ilə cazibəli hekayələrdi. Amma onlar əsasən sovet ideologiyası, sosialist varlığının tələb və vəzifələri mövqeyindən qələmə alınmışdı. Qadının yenilik axtarışları, hüququ uğrunda mübarizə cəhdləri, şəxsi-ictimai təşəbbüskarlığı sosial mühit və amillərin təsiri, yeni əlaqə və münasibətlərin nəticəsi kimi ümumiləşdirilmişdi.

1941-1945-ci illər müharibəsi dövründə Mir Cəlal daha da fəallaşdı, "Yollar", "Anaların üsyanı", "Vətən yaraları", "Şərbət", "Mərcan nənə", "Havalı adam", "Silah qardaşları" kimi çoxlu hekayələr yazdı. Bunların bəzisində səfərbərlik ruhu və cəbhəyə yollanmaq əzmi əks etdirilirdisə, digər qismində faşizmə qarşı mübarizəyə qalxan döyüşçü surəti yaratmaq niyyəti əsasdı. Söz yox ki, Mir Cəlal da bütün ölkəni Vətən kimi qəbul edir, onun müxtəlif milli tərkibli ordusuna ümidlər bəsləyirdi. Ona görə əsgərin həm fiziki, həm də mənəvi qüdrəti, onu mübarizəyə çəkən amillər araşdırılırdı. "Vətən yaraları" o zaman böyük rəğbətlə qarşılandı, döyüşçülərin, "oxucuların əlindən düşməyən bir əsər" oldu.

Mir Cəlal hərbi-vətənpərvərlik mövzusunda yazdığı kimi, arxa cəbhə adamlarından, onların iş, arzu və qayğılarından, sevinc və kədərindən də həssaslıqla danışırdı. Ədəbi-estetik qayəsinə uyğun olaraq o, hekayələrində konkret lövhə də çəkir, ümumi təsvirə də keçir, odlu publisistikaya, həzin lirikaya, bədii gülüşə də müraciət edirdi. Həyatla ölümün təzadından təsirli səhnələr də yaradırdı. "Anaların üsyanı"nda coşqun publisistika ilə təsirli lirika uyuşub birləşirsə, "Xəbər-ətərsiz"də həm konkret hissi, həm də ümumi publisist təqdim əsasdırsa, "Odlu mahnılar" lirik-romantik süjeti, həzin ahəngi, incə ruhu ilə səciyyəvidirsə, "Çəkmə", "Ər və arvad" mənalı yumor və satira xüsusiyyətləri ilə seçilirdi...

Müharibədən sonrakı illərdə Mir Cəlal həyatın müxtəlif sahələrinə müraciət edir, seçdiyi mövzu-mətləbi aydın estetik baxışla işləyib bədii şəklə salmağa can atırdı. "Od içindən çıxanlar" (1945) silsilə hekayələrində gözləri ilə dəhşətlər görmüş insanlar haqqında söhbət açır, onların fədakarlığını, arzu və məqsədlərini işıqlandırırdı. Digər bir sıra hekayələrində isə müharibə siyasətini pisləmək, xalqları zülmə, əsarətə, haqsızlığa qarşı, sülh və azadlıq uğrunda mübarizəyə çağırış ideyası əsasdır. Bu əsərlər içərisində "Badam ağacları" xüsusi seçilir və nəsrimizin qiymətli nümunəsi kimi diqqəti cəlb edir. Real fakt, mənalı təfərrüat və canlı xarakter vasitəsilə, möhkəm süjetdə təbii əks olunmuş hadisə və vəziyyət əsasında müstəmləkə siyasətinin mahiyyəti açılırdı. Ədibin realist üslubunu, təsvir-təcəssüm üsulunu əlvanlaşdıran bir keyfiyyət burada da gözlənilirdi. Həyat faktının, ictimai hadisənin, mənəvi-psixoloji ovqatın inikası, ideya-bədii məzmunun tələbi ilə əlaqədar hekayədə incə lirika da, kəskin satira da var; bəzən ayrılıqda, bəzən də qovuşuq halında.

Tərbiyə problemi, müəllim-şagird-tələbə münasibətləri Mir Cəlalın yaradıcılığında xüsusi yer tutur. Ağıllı, namuslu, mərd övlad, həqiqi vətəndaş böyütmək haqqında düşünən, zəhmət çəkən, yollar axtaran ata-anaları, baba-nənələri, müəllim-tərbiyəçiləri sənətkar məharətlə təsvir edir, çox vaxt onların yaddaqalan maraqlı surətlərini yaradırdı. Tərbiyə məsələlərində çalışırdı ki, quru nəsihətçiliyə uymasın, həyati müşahidələrə, həssas müəllim-yazıçı duyğu və düşüncələrinə əsaslansın. Diqqətəlayiq uğuru da o zaman qazanırdı ki, qabaqcıl mövqedən qələmə aldığı əsərində fikirlə hissin, əqllə emosiyanın, bədii təfəkkürlə elmi mülahizənin, yazıçılıqla müəllimlik məharətinin vəhdətinə nail olurdu. Ümumiyyətlə, tərbiyə-əxlaq probleminə dair elə mövzular seçib, elə hadisə və surətlər qələmə alırdı ki, onlar oxucunu düşündürüb, mənəviyyatca saflaşdırır, düzgün istiqamətləndirir, məhəbbət və nifrət duyğuları ilə zənginləşdirirdi. "Əsgər oğlu",

“Ulduz”, “Plovdan sonra”, “Elçilər qayıtdı”, “Nazik mətləb”, “Naxış”, “Vicdan mühakiməsi”, “Müdafiə vəkili” və s. belə hekayələr idi.

İnsan həyatı və təbiətini gözəl görmək Mir Cəlalın ictimai-estetik ideallarının özəyini təşkil edir, mənfiliyə qarşı mübarizə zərurətini də şərtləndirirdi. “Səyyah xanım”, “Xarici naxoşluq”, “Dil və əməl”, “Heykəl uçulanda”, “Rola girib”, “O yana baxan”, “Məhəbbət, yaxud qəlp pul”, “Hesab dostları”, “Neçə cür salam var”, “Möhür və məhəbbət” hekayələrində, adlarından da göründüyü kimi, müəllifi daha çox həyatın neqativ halları, mənfilik və eybəcərliyin müxtəlif təzahürləri narahat edir. Müsbət ideal belə məqamlarda əsasən tənqidi münasibət vasitəsilə verilirdi. Yazıçının məsələyə konkret baxışı, satira və yumora müraciəti obyektin dərki, məzmun və mahiyyəti ilə üzvi şəkildə bağlanırdı. Bir çox hallarda qarşılaşdırma üsulundan, bədii təzad və ziddiyyətlərdən məharətlə istifadə edilirdi.

Mir Cəlalın müxtəlif səciyyəli çoxlu hekayələri içərisində realizmi səthi olanları da var. Amma ədib çox zaman çalışırdı ki, dərinə nüfuz etsin, ziddiyyətləri araşdıranda dolaşıq və dumanlı təsvirlərə uymasın, təmiz, sadə və aydın dildə yazsın. Sənətin, yeri gələndə işarə və simvollarla danışmaq səlahiyyətini də unutmurdu.

Mir Cəlal uzunçuluğu, sözçülüyü xoşlamır, yığcam, konkret və təbii yazırdı. Bu, onun üslub xüsusiyyəti idi. Bütün bunları başqalarına da tövsiyə edir, imkan düşdükcə öyrədir, müzakirə və redaktə zamanı köməyini əsirgəmirdi. Təsadüfi deyil ki, akademik Məmməd Arif Mir Cəlalın əsərlərindən aldığı xoş, güclü, unudulmaz təəssüratın başlıca səbəbini, hər şeydən əvvəl, onun üslubundakı səmimiyyət, sadəlik və təbiiliklə bağlayır, bu cəhəti ən yaxşı yazıçılara xas keyfiyyət kimi yüksək qiymətləndirirdi.

Bu da təsadüfi deyil ki, Mir Cəlal hekayələrindən birində kiçik məclis üzvləri arasında mühüm həyat probleminə dair başlanmış mübahisə və müzakirələri qocaman müəllimin dili ilə yekunlaşdırır, ürəkdə olanları cəsarətlə, açıq-aydın deyə bilməyi dünyada ən böyük xoşbəxtlik sayır, son dərəcə aktual səslənən düşündürücü, geniş mənalı nəticəyə gəlirdi: “Məncə bütün ölkələr, xalqlar, dövlətlər, başçılar öz vətəndaşlarına bu böyük və çox nadir neməti bəxş etsələr, dünyada zülm, kədər yox olar, ədalət bərpa olar, yer üzü işıqlanar, cənnətə dönər, insanlar “yüngülləşər”, gözəlləşər, mələyə dönər!

Yoxsa bu olmayınca əsl tərəqqi, kamil mədəniyyət, həqiqi sərbəstlik boş söhbətdir. Bu olmayınca beyinlərdən şiş, ürəklərdən yara, ciyərlərdən vərəm, zehinlərdən tüstü-duman, qəlblərdən kin-küdurət tamam kəsilməyəcək!” (“Xoşbəxtlik barəsində”, 1964).

Qocaman müəllim əslində Mir Cəlalın özü idi. O, həmişə xalqını azad, xoşbəxt, mədəni, savadlı, intellektual səviyyəli və xoş güzəranlı görmək istəmiş, bu nəcib, ali arzu-ümidlə də fəaliyyət göstərmiş, yazıb yaratmış, əlindən gələni əsirgəməmişdir. Təbii ki, ömrünün axırınadək ardıcıl məşğul olub, bir sıra klassik nümunələrini yaratdığı hekayələri zəngin irsində mühüm yer tutur, dəyərini, aktuallığını və müasirliyini qoruyub saxlayır.

Mir Cəlal həm də istedadlı romançı idi; qələmindən "Dirilən adam" (1934-1935), "Bir gəncin manifesti" (1939), "Açıq kitab" (1941), "Yaşıdlarım" (1946-1952), "Təzə şəhər" (1948-1950), "Yolumuz hayanadır" (1952-1957) kimi romanlar çıxmışdır.

Azərbaycan romanının inkişafında, məzmun və formaca zənginləşməsində onun da xidmətləri az olmamışdır. Romanlarından üçünün mövzusu keçmiş, üçününkü isə müasir həyatdan alınmışdır. Maraqlı süjet qurmaq, hadisələri və obrazları təbii məcrada qələmə almaq, mətləbi yığcam, konkret və lakonik formada ifadə etmək bacarığı bu əsərlərin hər birində özünü göstərir. Müşahidə dəqiqliyi və dərinliyi, həyat hadisələrinə yaxından bələdliyi, insan psixologiyasını yaxşı duyması və bilməsi ədibin sənətini səciyyələndirən xüsusiyyətlərdəndi.

1941-ci ildə tamamlanan, lakin müharibə başlandığı üçün 1944-cü ildə ("Vətən uğrunda", №2, 3, 4-5) çap olunan "Açıq kitab" müəllifin nisbətən az öyrənilmiş, müasir mövzulu ilk romanıdır. Əsərin süjeti bilavasitə ziyalı mühiti, məktəb həyatı ilə bağlansa da, o sahə ilə məhdudlaşmır, 30-cu illərin mürəkkəb hadisələrindən də bəhs olunur. Dövrün bir sıra nöqsan və mənfilikləri cəsarətlə açıqlanır, "gəldiyevçiliyin" ictimai xarakteri dürüst müəyyənləşdirilirdi.

O zaman haqqında müxtəlif mülahizələr söylənən roman həm yüksək qiymətləndirildi, həm də kəskin tənqid olundu. Bəziləri onu "həqiqətin üzünə dik baxan əsər", Mir Cəlalı "ədəbiyyata həyat gətirən yazıçı" adlandırır, bəziləri də "Açıq kitab"a başqa cür yanaşır, müəllifi həyat həqiqətini təhrif etməkdə, varlığı birtərəfli qələmə almaqda, mütərəqqi realist ənənələrdən uzaqlaşmaqda, zəif və sönük əsər yazmaqda günahlandırırdı.

İllər keçdi. "Açıq kitab" həqiqəti əsasən inandırıcı və düzgün canlandırdığı üçün yaşadı, ədəbiyyatımızın tarixinə qüvvətli realist əsər kimi daxil oldu. Çünki doğrudan da "Mir Cəlal həmin əsərində həyata və həqiqətə sadiq yazıçı, insan psixologiyasını dərindən bilən, onu təsvir və təmkinlə əks etdirən, müasir varlığı dərin məhəbbətlə sevən sənətkar kimi çıxış etmişdi" (Qulu Xəlilov). Burada həyat həqiqəti məharətlə qələmə alınmış, varlıq tam halında konkret yaradıcılıq məqsədi baxımından işıqlandırılmışdı.

“Açıq kitab” satirik roman olsa da, lirik və dramatik məqamları da az deyil. Mir Cəlal həyatı əks etdirdiyi, həyatın təzadlarını açdığı, insan münasibətlərinin konkret vəziyyət və şərait daxilindəki xarakterini, gözəllik və çirkinliyin mahiyyətini göstərdiyi üçün həmin cəhətlər çox vaxt əlaqəli şəkildə real təzahürünü və bədii təcəssümünü tapmışdır.

Bir çox mənfi xüsusiyyətlər, neqativ hallar, xoşbəxtliyi başqasının bədbəxtliyi üzərində qurmaq ehtirası Kərim Gəldiyevin simasında məharətlə tənqid və nifrət hədəfinə çevrilmişdir. Obrazın “... əzməsən əziləcəksən, ayaqlamasan ayaqlanacaqsan... Güzəran, mənsəb cəhənnəmin təkində də olsa enməyi bacar!” kimi “həyat fəlsəfəsi” var ki, onun hər şeyə – varlığa, ailəyə, qadına, dosta, yoldaşa, işə münasibəti də ordan qidalanır. Özünə rahat güzəran yaratmaq üçün heç nədən çəkinməyən tipin fəaliyyətinin əsas istiqamət və mahiyyətini yalan danışmaq, böhtan atmaq, hədə-qorxu gəlmək, tor qurmaq, satqınlıq və xəyanət etmək kimi xüsusiyyətlər təşkil edir. Romanda Gəldiyevin düşdüyü mühit də, ona havadar çıxanlar da real boyalarla verilir. Əvvəllər törətdiyi cinayətlərin üstü açılacağını görüb, “oxumaq” niyyəti ilə o, rayondan şəhərə qaçmış, instituta girmişdir. İndi əməllərini başqa şəraitdə, təzə “dostlar” və tanışlar əhatəsində davam və inkişaf etdirir. Gəldiyev “müasir” bürüncəkli rəzil, təhlükəli və zərərli varlıqdır. Şəhərdə də qala bilməyib yenidən “əkilməyə” çalışan, meşədə quru qarağac kötüyü üstündə əyləşib xəyala dalan Gəldiyev daxilində bir səs eşidir: “Bir də göyərsəydim”. Bu, mənalı işarə və ciddi xəbərdarlıqdı. Bu o deməkdir ki, gəldiyevlər hələ ölməmişlər, “münbit” zəminə düşən kimi imkan tapıb təzədən “cücərə” bilərlər. Belələrinə qarşı ayıq-sayıq olmaq lazımdır. Bu, oxucuya hazır təqdim edilmiş mülahizə deyil, hadisə və vəziyyətlərin inkişaf məntiqindən təbii yolla çıxarılan, sənətkar qələmi ilə əsaslandırılan bir həqiqətdir.

Mir Cəlalın yaradıcılığında başlıca tədqiq və inikas obyekti, hər şeydən əvvəl, insandır, onun mənəvi dünyası, fikri-hissi həyatı, mübarizə və fəaliyyətidir. İnandırıcı surətlər, xarakterlər yaratmaq tələbi sənətkar Mir Cəlalı da daim ciddi düşündürmüş və əksər hallarda o, məqsədinə nail olmuşdur. Müəllifin realist qələmlə canlandırdığı surətlər bir-birinə oxşamır, hərəsinin öz daxili aləmi, həyata öz baxışı, öz təfəkkür tərzi, orijinal xarakteri, bu xarakteri fərdiləşdirən və ümumiləşdirən keyfiyyətləri var.

İstər müsbətin təsdiqində, ona yol açılmasında, istərsə də mənfinin inkarında, onun aradan qaldırılmasında müəllif qabaqcıl mövqedən çıxış etməyə, düzgün prinsiplərə arxalanmağa çalışmışdır.

Mir Cəlal əsərlərində süjet inkişafını ləngidən təfərrüatlardan qaçmağa cəhd edir, hadisə və mətləbin məğzini təşkil edənləri ön plana

çəkir, fikri bədii məqsədəuyğun, bəzən ciddi, bəzən də yumoristik tərzdə oxucuya çatdırmağa diqqət yetirirdi. İstəyirdi ki, yaratdığı obrazların fəaliyyəti, şəxsi-ictimai taleyi, həyat yolu, daxili aləmi, fərdi psixologiyası açılsın; onlar münasib bədii cizgi və vasitələrlə səciyyələnsin. Ədibin əlvan, zəngin sənət qalereyasında yaddaqalan surətlər az deyil. Bəbir bəy, Qədir, Qumru ("Dirilən adam"), Mərdan, Bahar, Sona, Hacı İbrahim Xəlil ("Bir gəncin manifesti"), Vahid, Sadıq kişi, Kərim Gəldiyev, Rübabə ("Açıq kitab"), Kərimzadə, Səlim, Nəriman ("Yaşıdlarım"), Yunis ("Təzə şəhər"), Sabir, Əntiqə, Bəndalı ("Yolumuz hayanadır") və başqaları həmin yolla yaradılmışdır.

Mir Cəlalın əsas hekayə və romanları həyati problemlər qaldıran, mənəvi-əxlaqi və ictimai-sosial məsələlər əks etdirən oxunaqlı, məzmunlu, tərbiyəvi əsərlərdir. Xalqımızın inkişaf yolunun və mübarizə tarixinin bir çox mənalı və ibrətli səhnələri burada öz əksini tapmışdır.

Şifahi xalq ədəbiyyatı və klassik bədii irsin bir çox qabaqcıl, realist ənənələrinin Mir Cəlal yaradıcılığında yeni məzmun və formada yaşaması, inkişaf etməsi təsadüfi deyil. Çünki Mir Cəlal irsdən faydalanarkən məsələyə heç vaxt formal yanaşmamış, zahiri təsirə qapılmamış, həqiqi sənətə məxsus yol tutmuş, orijinal yazıçı kimi hərəkət etmişdir. Orijinallıq küll halında özünü həmin əsərlərin ideya-bədii keyfiyyətlərində, hadisələrə sağlam müəllif baxışında, obyektiv qiymət və təsvirlərdə göstərmişdir.

Xalq yaradıcılığı ilə canlı və qırılmaz əlaqə ədəbi əsərin yaşamaq hüququnu təmin edən mühüm şərtlərdəndir. Ona görə də hər bir dövrün söz ustaları məqsədlərinə müvafiq tərzdə, müxtəlif ölçü-şəkildə həmin zəngin xəzinədən istifadə edib gözəl əsərlər yaratmağa çalışmışlar. Folklordan istifadənin vasitə və yolları isə müxtəlifdir. Yazıçı folklordan mövzu, süjet, motiv də götürə bilər, əsərində məsəl, atalar sözü, bayatı və sair nümunələr də işlədə bilər. Lakin bu nümunələrin işlədilməsi hələ özözlüyündə hünər sayılmamalıdır. Söz sənət və sənətkar haqqında getdiyi üçün məsələ şifahi ədəbiyyatdan alınmış nümunələrin sayında, müxtəlifliyində, bolluğunda deyil, onlardan harada, necə, nə məqsədlə istifadə etməkdə, hadisənin mahiyyətini açmaq üçün onları tutarlı bədii vasitəyə çevirməkdə, mətləbin üzərinə işıq salıb ümumiləşdirici nəticə çıxarmaq və yekun vurmaqda onlara əsaslanmağı bacarmaqdadır. Əlaqə-faydalanma özünü yalnız ayrı-ayrı folklor "ünsürləri"nin, nümunələrinin, vasitələrinin işlədilməsində, onlardan bəzən olduğu kimi, bəzən də dəyişdirilmiş şəkildə istifadə edilməsində deyil, sözün geniş mənasında, yaradıcılığın ümumi ruh və mahiyyətində göstərməlidir. Əsas məsələ şifahi xalq

ədəbiyyatının, eləcə də klassik ədəbiyyatın incəliklərinə, zənginliklərinə, məna gözəlliklərinə, dərindən bələd olub, onu bədii yaradıcılığın inkişaf, öyrənmə və faydalanma mənbələrindən birinə çevirə bilməkdir. Həmin qaynaqlardan qidalanıb milli zəmin üzərində "bərəkətli" ədəbi məhsul yetirməkdir. Ədəbi mirasa yaxşı bələd olmaq və ondan yaradıcı bəhrələnmək sənətkarın mənəvi dünyasını, bədii təxəyyül və fərdi üslubunu zənginləşdirir, əsərinə milli-ictimai keyfiyyətlər gətirir, canlılıq, kolorit və xəlqilik ruhu aşılayır.

Mir Cəlal da ədəbi mirasdan həmin sağlam və düzgün yaradıcılıq prinsipi, ədəbi-estetik meyar əsasında istifadə etməyə, zəngin xəzinə ilə əlaqəsini qüvvətləndirməyə çalışmışdır. Məna zənginliyi, fikir dolğunluğu və ifadə gözəlliyi ilə seçilən atalar sözü və məsəllər yazıçıya həm də sözə qənaət etməyi, aydın, yığcam, səlis və obrazlı yazmağı öyrədir. Ümumiyyətlə, folklordan, xüsusən, onun bu "aforistik təfəkkür" növündən Mir Cəlal da çox şey öyrənib faydalanmışdır. Bir çox atalar sözü və məsəllər ədibin bəzi əsərlərinin bir növ ideya özəyini təşkil edir. Məsələn, "Oğul" hekayəsində "Kölgədə bitən ağacın kölgəsi olmaz" kəlamı epiqraf kimi götürülüb, hər kəsin öz zəhməti, qabiliyyəti sayəsində ucalması, hörmət və şöhrət qazanması, xalq və cəmiyyət üçün faydalı olması fikri əks etdirilir. "Yalan ayaq tutar, yeriməz" aforizmi "Yalan yeriməz" hekayəsinin meydana gəlməsinə səbəb olmuşdur. "İbrətli sözlər" silsiləsindən "Pul tapmışdım" hekayəsinin əsasında "Haram pul ev dağıdar", "Xatalı adam"da isə "Çağırılan yerə ar eləmə, çağrılmayan yeri dar eləmə" hikməti dayanır və s.

Qeyd edək ki, sənətkarın folklordan faydalanma imkanları, vasitə və üsulları geniş, müxtəlif olduğundan bu, xüsusi tədqiqata möhtac bir məsələdir.

Yaradıcılığının digər aparıcı qolunu elmi və tənqidi fəaliyyəti təşkil edir. O, bu sahədə də heç kəsə bənzəməyən üslubu ilə seçilmiş, özünəlayiq önəmli yer və mövqe tutmuşdur. Klassik irsin, xüsusən Füzuli sənəti və sənətkarlığının araşdırılması, habelə XX əsr Azərbaycan ədəbiyyatı və ədəbi məktəblərinin öyrənilməsi ədibi xüsusi maraqlandırırdı. "Füzulinin poetik xüsusiyyətləri" (1940) yığcam əsəri ilə o, böyük şairin sənətkarlıq hünərini təhlil etmək, dil-üslub vasitələrini aydınlaşdırmaq vəzifəsini qarşısına qoydu, Azərbaycan filologiyasında yüksək qiymətləndirilmiş "ilk mühüm addım" atdı. "Füzuli sənətkarlığı" (1958) kitabı isə alimin iyirmi illik tədqiqatının yekunu, gərgin əməyinin və səmərəli axtarışlarının nəticəsi idi.

Söz yox ki, alim zəngin ədəbiyyatımızın müxtəlif dövrləri, mühüm hadisələri, maraqlı simaları haqqında az yazmamışdır. Amma o, daha çox XX əsr Azərbaycan ədəbiyyatının görkəmli mütəxəssisi sayılırdı. Çünki həmin dövrün ədəbi-mədəni həyatını bütövlükdə tənqid etmək, ədəbi-ictimai prosesin vacib məsələlərini, ayrı-ayrı yazıçıların yaradıcılıq xüsusiyyətlərini araşdırıb öyrənmək sahəsində çox səmərəli işləmişdir. Onun bu baxımdan səciyyəvi və əhəmiyyətli olan "Azərbaycanda ədəbi məktəblər"i yeni ədəbiyyatşünaslar nəslinin yetişməsində də az rol oynamamışdır.

Mir Cəlal eyni zamanda müasir ədəbi-nəzəri, elmi-tənqidi fikrimizin inkişafına ürəkdən can yandıran güclü qələm və ağıllı təfəkkür sahibi idi. O, Azərbaycan ədəbiyyatının 70-ci illərədək keçdiyi yola, sənətkarlıq, realizm və xəlqilik axtarışlarına, ədəbi prosesin mənzərəsinə, janrların vəziyyət və imkanlarına dair məzmunlu çıxışlar edir, məqalələr yazır, tədqiqat işləri aparırdı.

Zəngin ədəbi-mədəni irsinin bir hissəsi – 1939-1970-ci illərə aid bəzi məqalələri "Klassiklər və müasirlər" (1973) kitabında toplanmışdır. Kitab müəllifin axtarış həvəsi, elmi təfəkkürü, tədqiq-təhlil qabiliyyəti haqqında aydın və canlı təsəvvür oyadır.

Mir Cəlal S.Vurğun, M.S.Ordubadi, Mirzə Cəlil, Ə.Haqverdiyev, S.Rüstəm, Ə.Məmmədxanlı, Ə.Cəmil, İ.Əfəndiyev və başqaları haqqında yazdığı məqalələrdə yeni söz demiş, sənətkarlıq sirləri kəşf etmiş, dəyərli mülahizələr söyləmişdir.

F.M.Dostoyevskinin məşhur bir kəlamı var: "Biz hamımız Qoqolun "Şinel"indən çıxmışıq". Mir Cəlal da müasir nasirlərimizi nəzərdə tutaraq, "Biz hamımız Mirzə Cəlilin "Poçt qutusu"ndan çıxmışıq" deyirdi. Bu, bir aforizm kimi səslənir və ədib onu tez-tez təkrar etməyi xoşlayırdı. O, Mirzə Cəlili özünə ustad sayır, yaradıcılığını hamıdan yaxşı duyur, sevir, tədqiq edir və yüksək qiymətləndirirdi.

Həqiqət naminə onu da qeyd edək ki, bir çox yazıçılarımız Mir Cəlalın sərrast qələmi, xeyirxah və obyektiv təhlili nəticəsində daha da populyarlaşmış, hətta bəzi başabəla tənqidçilərdən müdafiə oluna bilmişlər. Onun bəzən kiçik bir replikası, tutarlı bir müqayisəsi, obrazlı bir cümləsi tədqiq obyektinin mühüm bir cəhətini, yaradıcılıq xüsusiyyətini dürüst müəyyənləşdirməyə kömək edirdi: Filan yazıçı həyatdan, filan isə kitabdan gəlmişdir; Əhməd Cəmil az yazır, fəqət saz yazır; Ə.Məmmədxanlı özünün məharətli qələmi ilə bəzən az ağlabatan vaqiələrə belə oxucunu inandıra bilir və s. və i.a.

Mir Cəlalın mühüm bir xidməti də ədəbiyyat tarixi və dərsliklərinin yaradılması ilə bağlıdır. O, "Müxtəsər Azərbaycan ədəbiyyatı tarixi"nin (2-ci cild), "Azərbaycan ədəbiyyatı tarixi"nin (2-ci cild), "XX əsr Azərbaycan ədəbiyyatı" və "Ədəbiyyatşünaslığın əsasları" kitablarının əsas müəlliflərindən, yaradıcı və təşkilatçılarından biridir. Rus ədəbiyyatının böyük simaları haqqında da alimin dəyərli fikirləri vardır.

Təvazökarlığı gözləməyən, elmi etikadan kənara çıxaraq lovğalanan tələbələrə Mir Cəlal ibrətli və faydalı tövsiyələr də edirdi: – Bəzi cavanlar bir əsər yazmağa, bir tədqiqat aparmağa başlayan kimi sinəsini irəli verərək deyir: – Bu elm sahəsi məndən başlanır, onun ilk təməlini mən qoyuram. Bu, çox pis xasiyyətdir. Qardaş, birdəfəlik bilin ki, heç nə sizdən, nə də məndən başlanır. Ədəbiyyatşünaslığın hansı sahəsini götürsəniz, görərsiniz ki, bizdən əvvəl yaşamış kişilər hər şeyi demişlər, tədqiq etmişlər, bizimki olsa-olsa ümmana bir damla əlavədir. Məsələn, elə Aristoteli xatırlayın. Ədəbiyyat nəzəriyyəsi sahəsində onun dediklərinə bir neçə əsrlər ərzində bəşəriyyət çoxmu əlavə etmişdir? Əlbəttə, yox!

Mir Cəlal zəngin irs qoyub getdi. Elə bir irs ki, öyrənməli, nümunə götürməli, davam və inkişaf etdirməli cəhətləri çoxdur. Elə bir irs ki, onda dərin realizm gücünə malik sosial kəsərli bədii nümunələr, klassik və müasir mənəvi sərvətlərə, ədəbiyyat tarixi və nəzəriyyəsinə dair maraqlı tədqiqlər, məqalələr, fikirlər mövcuddur. Bütün bunlar təsdiq edir ki, Mir Cəlal zəngin miraslı yaradıcı şəxsiyyət kimi milli ədəbiyyatımız, elm və mədəniyyətimiz tarixində yaşamağa layiqdir. O, ad və şöhrət ardınca qaçmadı. Xalqına xidmət idealına arxalanaraq təbiətinə uyğun sadəlik və təmkinlə işlədi, yazıb yaratdı və xatirələrdə əbədiləşdi.

***Yaqub İsmayılov***

## HƏKİM CİNAYƏTOV

Gənc tələbə Ramazan Əlizadə səhiyyə şöbəsində ərizəsinə dərkənar qoydurub, tələsik müalicəxanaya yollandı, qırmızı mürəkkəblə və xırda xətlə yazılmış dərkənar bu məzmunda idi: "Təcili tibbi yardım göstərməli!".

Ramazan atasının başına gələn bədbəxt hadisədən təşvişə düşmüşdü. Atasız qalacağını təsəvvür etdikcə beyninə bir ağrı dolurdu. Özünə ümid verərək deyirdi: "Atamın yarası bir o qədər qorxulu deyil. İndiki həkimlər ölünü dirildirlər. Atam üçün niyə qorxuram? Klinikadan bu saat bir həkim alaram, təcili müalicəsinə başlaram".

Ramazan bu kimi fikirlərlə klinikanın qapısından içəri girdi. Bir tərəfdə qadınlar durmuşdu. Bunların duruş və baxışlarından xəstəlik yağırdı. Çoxunun qucağında azarlı uşağı vardı. Kiminin başı, üzü və ayağı sarıqlı idi.

Ramazan şapkasının günlüyünü qaldırdı, ətrafa baxa-baxa müdirin otağını tapdı. Onun işi rayon həkiminə aiddirsə də, səhiyyə şöbəsinin təkidini müdirə söyləməyi yersiz görmədi.

Müdir Ramazanı hörmətlə qarşıladı. Onun atasının başına gələn qəzanın nədən ibarət olduğunu dinlədi. Sonra onu bir tibb bacısına qoşub, rayon həkiminin yanına göndərdi.

Ramazanla tibb bacısı müalicəxananın çiçəkli və ağaclı həyətinə çıxdılar, bir alçaq pilləkəndən qalxdılar. Balaca otağa girdilər. İki nəfər ağ döşlüklü gənc qız nömrə üçün kağız doğrayırdı. Stolun dalında kök, ortaboylu, alnının qırışları uzaqdan görünən bir həkim oturmuşdu. Müəyyən bir işi yoxdu. Yalnız kağız doğrayan qızlarla söhbət edirdi. Hərdənbir söylədiyi məzəli sözlərdən qızlar şaqqıldayıb gülür, həkim də öz müvəffəqiyyətindən açılırdı.

Ramazan gözünü stolun üzərindəki siyahıya dikib, həkimi gözlədi, həkim Cinayətov öz işində idi. Qızlardan birisi Ramazana baxaraq, həkimə nə isə dedi. Həkim naşı bir ifadə ilə:

– Nə istəyirsən, balam? – deyə soruşdu.

Ramazan əlindəki kağızı göstərərək, izah etdi:

– “Yerevanlılar” küçəsində oluruq. Atam kankandır. Quyuda işlər-kən yuxarıdan düşən daş çiynini yaralamışdır. Bərk xəstədir. Buraya gətirmək mümkün olmadı. Təcili kömək lazımdır.

Həkim Cinayətov həvəssiz bir halda əvvəlcə Ramazanın səhiyyə şöbəsinə yazdığı ərizəni oxudu. Sonra səhiyyə şöbəsinin dərkənarını gözdən keçirtdi. Qızlardan birisi naz sata-sata həkimə bir şey anlatmağa başladı. Ramazan tələsirdi. Həkim isə hələ yerindən qımıldanmaq istəmirdi. Nəhayət, qız sözünü bitirdi. Həkim başını qaşıyaraq güldü, qızlar da gülüşdü. Ramazan həkimin diqqətini səhiyyə şöbəsinin yazdığı “təcili” kəlməsinə cəlb etmək istədi:

– Səhiyyə şöbəsində onu çox təcili yazdılar. Tələsik gəldim. Tez kömək etməsəniz, sonrası qorxulu olacaq, atamın halı ağırdır.

Həkim Cinayətov haqq-hesab dəftərçəsini istədi. Ramazan tez təqdim etdi. Həkim yenə tələsmədən, qızlar ilə mazaqlaşa-mazaqlaşa iki-üç dəfə haqq-hesab dəftərçəsini başdan-ayağa varaqladı. Sonra bir papiros yandırdı. Əlinə bir kağız aldı. Soruşmağa başladı.

– Adınız? Familiyanız? Küçəniz?

Ramazan bitmək bilməyən cansıxıcı sualların hamısına cavab verdi. Həkim bu işi bitirdikdən sonra kamali-səliqə ilə suçəkəni aldı, yazdığı sual vərəqini qurutdu, ağır bir işdən qurtarmış kimi geniş bir nəfəs aldı, stula söykəndi. Qollarını boynuna çataraq, bərk gərnəşdi. Stulun cırıltısına qadınlar da gülüşdülər. O, saxta bir ciddiyyət göstərərək, yumruğunu stola vurdu, onlara acıqlandı. Təkrar gülüşməyə başladılar.

Ramazan cəsarətlə dedi:

– Yoldaş həkim, tələsmək lazımdır.

– Siz gedin, xatircəm olun, mən adam göndərərəm. Ramazan sıxıldı. Atasına təcili yardım lazımdı. O, həkimsiz qayıda bilməyəcəkdi. Bu fikrini anlatdı, Cinayətov çəkdiyi papirosu kül qabında söndürərək soruşdu.

– Yerevanlılar küçəsi haradadır?

Ayağa qalxıb, divardan asılan planın qabağına getdi, aramağa başladı. Ramazan ona kömək edib, küçəsini ona göstərdi.

Həkim:

– Bura çox uzaqdır, – dedi, – piyada necə getmək olar?

Ramazan əsəbiləşdi:

– Həkim yoldaş, tələsmək lazımdır! Siz getməyəcəksinizsə, mən başqa bir həkim istəyim?

Cinayətov ayağa qalxdı. Təkrar oturaraq, üzünü qızlardan birisinə tutdu, onu o birisi otaqdan başqa bir həkim çağırmağa göndərdi. Bu ikinci həkimin gəlib çıxması yarım saat çəkdi. Cinayətov əvvəlcə başqa bir iş haqqında danışdı. Sonra onu Ramazanın atasına baxmağa göndərmək istədi. O isə getmək istəmirdi. Axırda Cinayətov özü getməli oldu. O otaqdan çıxınca Ramazan iki dəfə klinikanın bayır qapısından çıxıb, təkrar geri qayıtdı. Həkim çox naz ilə yeriyirdi, ağır addımları ilə Ramazanı əsəbiləşdirirdi. Ramazan nə qədər tələsirdisə Cinayətov bir o qədər ağır tərpənirdi, öz vəziyyətini dəyişmirdi, bəzən ilk dəfə görürmüş kimi mağazaların vitrinlərinə tamaşa etməyi də unutmurdu. Ehtimal həkim öz yerişində hifzi-səhhə qaydalarına riayət etmək istəyirdi.

Nəhayət, gəlib, qapıda on dəqiqədən bəri gözləməkdə olan Ramazana yetişdi. Xəstənin başı üstünə gəldi. Yorğan altından işıldayan zəif və batıq gözlərə baxdı, "Haran ağrıyır, niyə yatmısan?" – deyə bir neçə məlum sual verdi. Xəstənin istiliyini ölçmək, tənəffüsünü, ürək fəaliyyətini yoxlamaq məqsədilə termometri, trubkasını axtardı. Kostyum, şalvar ciblərini bir-bir yoxladı, tapa bilmədi.

– Vay səni... – deyə təəssüfləndi. Öz hafizəsizliyini söydü. Unutduğu şeyləri gətirmək üçün təkrar ağır addımlarla müalicəxanaya tərəf hərəkət etdi.

*1930*

## İSTİFADƏ

1

– Yolçu, oradan müəllliməni səslə, bir az söhbət eliyək...

İdris bunu deyəndə, mən həm sevindim, həm də narazı qaldım. Sevindim, ona görə ki, bilikli, məlumatlı adamlar ilə həmsöhbət olmaq adamın məlumatını artırar. Belə adamlardan çox istifadə etmək olar. Narazı qaldım ona görə ki, yazın günündə, istirahətə çıxdığımız yerdə nə istifadəbazlıqdır.

Müəllimə təbiiyyatçı idi, ali təhsili vardı. Öz-özümə dedim: "Yəqin yenə təbiiyyat elmindən danışacaq, səhər-səhər sürünənləri, fəqərəliləri, məməliləri və qəlsəməliləri yığıb üstümüzə tökəcək".

Müəllimə gəldi. Narıncı ipək paltar geyinmişdi. Qapıdan girən kimi işıqlı bir dalğa duydum. Deyəsən otağı bəzədilər, hər şey mənə zərif, gözəl və sevimli göründü. Dodaqaltı salam verib, kresloya əyləşdi.

Paxıllıqdanmı, nəzakətsizlikdənmi, nədənsə yoldaşlarım məni müəllimə ilə tanış etmədilər. Onsuz da utancaqlıq məni boğurdu. İlk dəfə idi ki, belə bir qadınla qarşılaşırdım. O danışırdı. Lakin nə danışdığını bilmirdim. Mən onun üzünə baxırdım. Zahiri təntənəsinə, əda, gülüş və nəzakətinə görə bir o qədər gözəlliyi yox idi.

Dəyirmi, mütənasib üzü vardı, ağzı balaca, boyalı dodaqları nazik, gözü yekə, qara qaşları qalın idi. Burnu aşağı getdikcə çadır kimi yayılır, sanki dodaqlarındakı boya qurumasın deyə kölgə salırdı.

Üzündən aşağı endikcə tənasüb pozulur: boynu yoxdu. Deyəsən, ağır bir qapaz vurulmuş, boynu qınına girmişdi. Ağ, açıq qolları hər iki tərəfdən mərmər sütun kimi sallanırdı. Sinəsi daş ayna kimi parlayırdı.

Səadət xanım məclisi qat-qat şənləndirdi. Hamı özünü yığışdırdı. İdris tərli, kirli corablarını gizləmək üçün çəkməsini ayağına taxdı. Yolçu yuyundu, gəldi, mən də bürküyə baxmayıb, yaxamı düymələdim.

Mən yanılmışdım. Səadət xanım təbiiyyatdan danışmadı. O mənim istəmədiyim, lakin maraqlandığım şeylərdən söhbət açdı.

– Qadın qəlbi qapalı bir bağçadır, açarı da qadının özündədir. Bu açarı qəlbdə yanan sevgi fanarı ilə arayıb, tapmalı, bağçaya isə, yaz çağı, küləksiz bir səhərdə, həm də ayaqyalın girməli, iyləməklə kifayətlənməli...

Səadət xanım utandığımı, ya qəribliyimi hiss etdi, tez-tez mənə atdığı baxışlarla kifayətlənmədi:

– İdris, heç qonağın danışmır? – dedi.

Yolçu hazırcavablıq elədi:

– Sən macal verdin ki!

Hamı güldü. Səadət xanım qollarını açaraq, tələbkar bir əda ilə:

– Pajalusta, – dedi.

Mən danışmadım, sözüm də yoxdu. “Bəli”, “xeyr” ilə, ya da heç nə demədən dişlərimi ağartmaqla başımı girləyir, məclisimizin bitməsinə tələsirdim.

Başını pəncərədən uzadan bir göy köynək kişi İdrisə bilet verdi:

– Vaxta qırx dəqiqə var, hazırlaş, – deyib, tələsik ötdü.

İdris Şamxora gedəcəkdi. Yolçu da kimi isə gözlədiyi üçün vağzala çıxmalı oldu.

Mən də qalxdım. Həyətə çıxanda İdris dedi:

– Səadət xanımı evlərinə qədər ötür.

Biz xiyaban kənarında əkilmiş cavan tut ağaclarının kölgəsi ilə gedirdik. Onun ilk sualı bu oldu:

– Yəqin siz Gəncədə çalışırsınız?

– Bəli!

– Təzə qurtarıbsınız, eləmi?

– Birinci ildir!

Səadət xanımın sualları məni cəsarətləndirdi, mən bu suallarda cavab arayan bir adamdan artıq sual arzulayan bir həsrət ruhu duyurdum.

Bir az fikirləşdim. Ürəyimdə sualı sərf-nəhv cəhətcə yoxlayıb dilləndim:

– Buraya təzəmi gəlmişsiniz?

O güldü, dodaqlarını büzüb, başı ilə "yox" işarəsi etdi, dili ilə də dedi:

– Yooox! Yooox a... a!..

Gülüşü elə qaynayırdı ki, deyəsən qarqara eləyirdi. Mən başqa bir sual hazırlamaq fikrində ikən, cavabın davam etdiyini görüb dinlədim:

– Yooox... Səhviniz var. Mən üç ildir ki, buralarda ləbbəyk deyirəm... Nə edim? Mən xanım adamın birisi idim. Başıma işlər gəldi, işləməyə məcbur oldum. Allah kəssin siz kişilərin vəfasını...

Heç mən bunu gözləmirdim. Bir tərəfdən onun "başına gələn iş", o biri tərəfdən də mən yaşda bir uşağı "kişi" adlandırması məni təəccübləndirdi, ona bir çəpinə baxdım.

– Mənim kimi kişilərdəki vəfanı haçan ölçdünüz?

– Bəli, bəli, siz kişilərin vəfasızlığı... Kimə deyəsən ki, bir arvadı, altı ayın gəlinini...

Bunlardan sonra müəllimə mənim qarşımda ucuz bir kitab kimi açıldı. Mən onu köhnə əlifba kimi ötəri oxudum. Səadət xanım Gəncə bəyzadələrindən birinin arvadı imiş.

Əri cüzi qısqanclıq üstündə onu evdən qovmuş, sonra peşman olub, nə qədər çağırmışsa, bu getməmiş, "Eşşək nə bilir zəfəran nədir?" – deyə rədd etmiş. İndi rayon uşaq bağçasında mürəbbiyədir. Neçə-neçə mötəbər yerlərdən onu istəyən var, getmir. Çünki heç birisi xasiyyətinə uymur. Vağzalda bütün mötəbər adamların yanında xüsusi hörməti var. Hətta naçalnik onun şərəfinə bir ziyafət də vermişdir. "Hansı ki" orada İdris də tost deyibmiş...

Bunları eşidəndə mən vicdanən sıxıldım. Belə bir qadına evlənmiş adamın yorulub, yarı yolda qalmağına acıdım. Bunu gizləyə bilmədim:

– Məncə, Səadət xanım, siz nahaq inad edirsiniz. Ürək verdiyiniz adam ilə başacan olmalı idiniz... Hər kiçik ixtilaf ailəni pozarsa, onda nə olar?

Bu söhbətlərlə biz vağzal yanında yeni tikilmiş evlərə çatmışdıq. Səadət xanım burada güllər, sarmaşıqlarla örtülüb, üfüqləri açıq bir həyətdə yaşayırdı. Qapıda dayandım, axşama az qalırdı. Günəş batırdı, batmasından da acıqlanmış kimi qızarmışdı. Buna baxan kim idi; dağlardan, meşələrdən uzanıb gələn böyük, qara kölgələr üst-üstə mindikcə qatılaşır, qaralır, günəşin bozarmış ətəklərini qamçılayırdı. Günəş çəkilib, yuvasına getdi.

Mən əl verib Səadət xanımla vidalaşmaq istərkən, o bir az duruxdu, əlimi buraxmadı. Pambıq kimi yumşaq, ağ əllərinin hərarəti ürəyimə qədər işlədi.

Qatar gəldi. Mən öz kupemə getdim. Səadət xanımdan ayrıldım. O, bufetin qabağında dayanıb, qırmızı haşiyəli əl yaylığını oynadırdı...

İki gün sonra Səadət xanımdan məktub aldım. Zərif kağız, göy astarlı zərf, bənövşəyi mürəkkəb. Bunların hamısı, nədənsə, nəcib, təmiz, saf bir qəlbin nişanəsi kimi mənə çox xoş gəldi. Stansiyadakı görüşü xatırladım. Məktubunda, nigaran qaldığını yazırdı "Tənəzzül buyuraramsa", ona "təskini-qəlb" üçün balaca bir cavab yazmağı xahiş edirdi.

Onun xahişinə əməl etdim. Bir açıq məktub göndərdim.

## 2

Yazın yuxusu nə qədər şirinsə, oyaqlığı da o qədər ləzzətlidir. Oyaq olasan! Səhərin açılmasına, dənizin içindən qalxan günəşə, üfüqün gül rənginə, may paltarı geymiş meyvə ağaclarının yaylıq oynatmasına, səslərində yerə gümüş pul səpən quşlara, daşları yalayaraq axan duru sulara, arılara, o şüursuz "memarlara" baxdıqca, ən tez duran adamlardan salam aldıqca ömür artmırmı?

Heyif ki, zəng tez çalınır. Dan üzü qalxıb anasına kömək etdikdən sonra çantasını qoltuğuna vuran, yuxuya qalıb, yaxmac gəvələyə-gəvələyə, yaxası açıq məktəbə tələsən uşaqlar sinfə doluşurlar, skamyaların arasına səpələnib, məsum və gülər üzlə məni gözləyirlər. Mən tez bağçadan qayıdıram, təəssüflə qayıdıram.

Bu təəssüf sinfə girənə qədər davam edir. Bura, bu sinif bağdan, bağçadan əskikmidir?

Budur, bu bağçanın baharı gəlir! Buranın kiçik günəşləri var! Bütün təbiət – günəş, hava, yerlər, sular, şəhərin bir başından o başına qədər düzülmüş idarələr, hamı, mən də onların içində bu günəşləri bəsləyir, böyüdürük. Bu bağın quşları səsləndimi, o biri quşlar nə lazım? Onların saf, bakir, həyat və gələcək dolu şən səsi dillərin ən böyük mahnısı, şeirlərin ən gözəl şeri, dünyanın ən dadlı musiqisidir. Ah, mən də uşaq olsaydım!..

Dərs başlanır.

Sabirin yaradıcılığı!

Mən bu böyük insanı uşaqlara tanıtmalıyam.

– Necə başlayım?

– Çətindir.

Mən hər birini bir Sabir, bir Puşkin, bir Axundov görmək istədiyim uşaqların qarşısında acizliyimi etirafa məcbur oluram. Əllərimi ovuşdurub, sinifdə gəzişirəm. Nə çıxır çıxsın, başlamalıyam.

– Tahirzadə Ələkbər Sabir...

Xidmətçi qadın qapını açıb, mənə baxır:

– Bağışlayın, darvazada sizi gözləyirlər.

– Deyin dərsdədir!

– Tələsirəm, deyir, bir dəqiqəliyə...

Mən kitabı yerə qoyub, çıxdım. Darvazada bir qırmızı paltar qadın dururdu. Əvvəl tanımadım. Yaxınlaşdıqca onun boyu, baxışı və duruşunda keçirdiyim günlərdən bir cizgi seçməyə çalışdım, tanıdım: Səadət xanımdı.

– Sə...

İstədim salam verib, görüşəm. O, üzümə elə tünd baxdı ki, sözüm ağzımda qaldı. Ancaq vəsfəgəlməz yaxşılıqları, ömrü uzunu dostluq və məhəbbəti yerə vurub, ən böyük cinayətə qoşulan xainə belə baxarlar. Sanki gözümə istiot tökdülər.

– Çox ayıb olsun!

O bu sözü elə bərk və etimadla dedi ki, elə bil, müqəssir bir adama xitab edirdi. Mənə bir kağız uzatdı.

– Bunu sizmi yazmışsınız?

– Kağızı çevirib baxdım, mən yazdığım açıq məktub idi.

– Bəli, mən yazmışam.

– Sən çox qələt eləmisən, başını da... Yoxsa, sənə xəyal, xalq çöldəmi qalıb?.. Xəyalın kimə gedib? Mənə Səadət xanım deyərlər! Sən nə cürətlə mənə bunu yazırsan?

Danışdıqca səsini ucaldır, sifətini turşudur, mənə yaxınlaşırdı. Qurudum qaldım. Məktubda nə yazdığımı xatırıma gətirə bilmədim.

Uşaqlar açıq pəncərələrdən əyilib baxırdılar. Xidmətçi də astanada saymazyana fikir verirdi. Müdir arvadın qırmızı paltarını görüb, pəncərəsini çoxdan açmışdı. Qarnı üstə pəncərəyə yıxılıb baxırdı.

Səadət xanım təhlil edib dururdu:

– Mən ciddi danışmaq istəyirəm. Yoxsa üzüaçıq görmüsən? And olsun vicdana, sənə bir toy tutduraram, külün göyə sovrular, buyur, düş qabağıma, gedək məhkəməyə, görək sən nə haqq ilə bunu mənə yazırsan!

Qorxudan boğazım qurudu. Məhkəmənin açıq iclası, müttəhim skamyası, camaat, yazı, müşavirə otağı, komendant, hökm... Ömrümdə təsəvvürümə gətirə bilmədiyim bir vəziyyət, bir dəhşət xəyalımda böyüdü. Mən, sabah hər biri bir günəş kimi həyatı işıqlandıracaq uşaqların hörmətinə nail olmaq istərkən, təmiz və abırlı böyümək istərkən nə iş idi başıma gəldi? Bu lənət damğasını alnıma kim basdı? Səadət xanımın qumaş libası müdirin gözünü qamaşdırdı, enib gəldi. Həyətdə baxınır, sağa-sola keçib mənə eşitdirirdi:

– Zəng çalınıb ha, sonra...

Özümü itirmişdim. Nə edəcəyimi bilmirdim. Müdirin sözünü bəhanə etdim:

– Bağışlayın, xanım, dərsimi qurtarım, sonra danışaq.

Səadət xanım darvazanın səkisində çömbəlib gözləyirdi. Sinfə qayıtdım. Dərsimi dedim, oyunmu çıxardım, yoxsa hönkür-hönkür ağladım? Bəlli deyil! Onu bilirəm ki, bütün bədənim əsirdi. Ancaq bəbəklərim oğurluq üstündə döyülmüş pişik gözü kimi işıldayırdı.

Mənə elə gəldi ki, zəng bir ildən sonra çalındı. Uşaqlar qımıldanmadan üzümə baxırdılar. Mən çıxdım.

Səadət xanım yola düzəldi.

– Siz ilə seryoznu danışmaq istəyirəm. Adınızı da qoymusunuz müəllim... Beləmi tərbiyə...

Mən məktubu alıb, diqqətlə, adresinəcən hər kəlməsini yoxlayaraq oxudum. Heç bir nəzakətsiz söz tapa bilmədim:

– Bağışlayın, əgər məndən bihörmət iş baş vermişsə, üzr istəyirəm, mən...

Səadət xanım daha qətiyyət və qəzəblə sözümü kəsdi:

– Bağışlayası bir şeyim yoxdur. Mən ciddi danışmaq istəyirəm ki, siz özgənin arvadına nə haqq ilə belə məktub yazırsınız. Axı... Mən... Bir başa düşək, görək, bu nə deməkdir?

Mən onun öz xahişinə görə, həm də yoldaşcasına bir məktub yazdığımı deyir və bu hərəkətlərə qarşı təəccüb etdiyimi söyləyirdim. O, üzüklü barmaqları ilə məni yanıyaraq, acıqlı-acıqlı baxırdı:

– Kimi aldadırsan? Onu bil ki, qabağındakı bəbə deyil ha! Sən oxuyanı mən toxumuşam...

Mübahisəmiz dərinləşirdi. O dediyini mən anlamırdım. Mən deyəni o anlamaq istəmirdi. “Mən siz ilə ciddi danışmaq istəyirəm” – deyə şəhər bağına doğru addımlayırdı.

Bağ müsaid idi. Heç olmasa bu biabırçılığı tanış-biliş eşitməsin – deyə xəlvətə çəkilib, məsələni aydın etmək lazım idi. Bağa girdik. Günortanın istisi ağacların arasına dolmuş, havanı ağırlaşdırmışdı. Qarğalar qoca çinarların başında çırpınır, böcəklər kölgəliklərə dolub səslənirdi. Bağın bir bucağında yaşıllıqda oturduq, heç kəs yox idi. Bu sakitlikdə Səadət xanımın təhqirləri mənə o qədər də acı gəlməzdi; çünki özümdən başqa eşidən yoxdu.

Mən bir az özümə toxtaq verdim. Bir sual hazırladım. “Açıq de görüm mən sənə nə yazmışam, məni nə haqq ilə təhqir edirsən?”

Mən bu sualı yoğurub, xamır kündəsi kimi hazır etmişdim ki, bir də gördüm Səadət xanım məni qucaqladı.

– Ox... Ay allah... Bu ki uşaqdır. Qadası... Ölürəm səndən ötrü...

Mən falçı qadının əlində çapalayan göyərçin kimi çırpınırdım. Özümü onun zorba qollarından güclə çıxartdım.

Bu, təhqirin son dərəcəsi idi. O mənə murdar bir cənazə kimi göründü, üz-gözümdən nifrət yağdı. Mən bu canlı meyitin əlindən tezliklə qurtarmaq istədim. O, şişman bədəni ilə böyrümdən sallanaraq dişini ağardırdı.

– Səndə eşq yoxdurmu?.. Ruhun hanı?..

Mən qolumu dartıb onun əlindən çıxaranda bərk bir qışqırtı eşitdim. O üzərinə isti su atılmış donuz kimi çığırıb, yerə yıxıldı, çapaladı... Adamlar töküldülər. Bağın qabağında su satanlar, dondurma yeyən xanımlar, uşaqlar, yoldan ötən qulluqçular gəldilər. Mən qaçmaq istədim. Bir də fikirləşdim: “Yəqin deyəcəklər bu qadına nə etmişsə, qorxudan qaçır”. Dayandım. Nə edəcəyimi bilmirdim.

Səadət xanım lap arxayınca yerə sərilmişdi.

Kimi əlini başına qoyur, kimi qılçasını ovurdu. Dondurmaçı çömbəlib qışqırırdı:

– Ədə, su gətir!

– Doldur ver bəri!

Mən istəsəm də kənar dura bilməzdim; adamlar onu mənimlə görmüşdülər. “Aparın dincəlsin”, “istidəndir, soyuq suda çimizdirin” deyə xeyirli məsləhətlər verirdilər. Bu sözlər məni daha da əsəbiləşdirdi. Qolundan tutub silkələdim. Gözlərini açıb üzümə baxdı. Durdu. Getmək istəyirdi. Əlimi qoluna atanda ağırlığını mən tərəfə saldı. Mən qolunu buraxmaq istəyirdim, qorxurdum yıxıla, qucaqlamaq məcburiyyətində olam.

* * *

Bir müddət gözümə yuxu getmədi. Səadət xanımın qorxusundan ürəyim döyünürdü. Hətta yuxuma girirdi. Dönə-dönə məni qara basırdı. Bu əhvalatın, sevgilimin qulağına çatmasından qorxurdum. Məni belə bir qadınla görənlər nə deyəcəklər?

Şəhərə çıxanda dostlar mənə mübarəkbadlıq edirdilər.

– Mübarək olsun!

– Nə?

– Necə nə? Lotu, toy edirsən, bəs bizi niyə yaddan çıxarırsan?

– Mən and içirəm ki, boş sözdür. Elə bir şey mənim xəyalımdan da keçə bilməz...

Onları inandırmaq çətindir.

– Ay zalım, deyirlər, müvəqqətidir. Beşgünlük kefini sürürsən. Daha niyə utanırsan? Səadət xanım da bir xanımdır... Allah tükü sanı xeyir versin!.. Dul olanda nə olar?

Səadət xanım, elə bil, qapı-qapı mənim tanışlarımı gəzib, muştuluqlamışdı ki, “biz evlənirik”.

## 3

Rayonda ağır işdən sonra mərkəzə qayıdanda ləzzət verir.

Cavan oğlansan. Yağmurlu havalardan, yalnızlıqdan qəlbin qaradır. “O”nu xatırlayırsan. Maşına oturub bir günlüyə də olsa, görüşmək üçün özünü Bakıya salmaq istəyirsən.

İdarəyə gəlib, icazə istəyirsən. Müdir ərizənə baxır, üzünə baxır, başını tovlayır:

– Heç utanırsan?

Kor-peşman qayıdırsan. Yəqindir ki, işini bitirməmiş Bakıya gedə bilməyəcəksən. Bir var ki, təşkilatı-zadı saymayıb, oğurluqca gedəsən. Onda da addımbaşı "töhmət" gəlir durur göz qabağında. Xalq Bakıya düşüb, mərkəz havası udanda, sən də dalınca gələn "töhmətin" qorxusundan sərin-sərin tər gətirirsən.

Əlac ona qalır ki, işini qurtarıb alnıaçıq üzüağ müdirin yanına gedəsən. Belədə müdir əlini sıxır:

– Hə, kişi oğlu, keflər lap sazdır ki?

İcazə üçün ərizəni verirsən. Gülür. Barmaqları ilə işarə edir:

– Üç gün!

Bu da bəsdir. Ərizəni geri alırsan. Kənarında qırmızı xətt ilə yazılmışdır: "Buraxılsın".

* * *

Bakıya çatan kimi hamama qaçdım. Xüsusi təchizat mağazasından aldığım "şəhər" paltarını geydim. Yöndəmə düşdükdən sonra universitetə getdim.

Nə aləm, nə qiyamət ilə "onunla" görüşdük (Bu görüş barədə bir səhifə ötürürəm, özünüz təsəvvür edin). Onu qoltuğuma alıb kinoya qaçdım.

"Proletar" kinosu, "Yad qadın" filmi.

Salonda iynə salmağa yer yoxdu. Salon qaraldı, səhnənin divarı ağardı. Ekran harada isə daha böyük şəhərlərdən birində olan əhvalatı çəkib gətirir, bizə göstərirdi.

Mərkəz şəhəri, çoxmərtəbəli möhtəşəm binaları, uzun və böyük küçələri, universal mağazaları, qarınca kimi görünən avtomobilləri, maşın kimi fırlanan milisləri, səliqə ilə yazılmış lövhələri, qaynaşan adamları, çiçək bağları, qəşəng xanımları, gümüş fəvvarələri, tunc üfüqləri ilə gəlib gözümüzün qarşısından keçdi.

Bunların hamısı bizi – iki sirdaşı o qədər məşğul etmişdi ki, məhəbbət söhbətlərini unutmuşduq.

Elektrik lampaları yandı. Qabaq cərgədən bir yastısifət qadının geri baxdığını gördüm.

Sevgilim pıçıldadı:
– O kimdisə bayaqdan sənə baxır.
Mən bir də baxdım. Boyalı, şişman bir qadın idi. Sifəti tanış gəldi. İxtiyarsız Səadət xanımı xatırladım, qızarıb, üzümü geri çevirdim. Çox keçmədi, onu gördüm ki, bir əl mənim yaxama bənd oldu:
– Vicdansız, məni hamilə qoyub hara qaçırsan, fahişələr ilə gəzirsən? Vicdansız! Cavab ver! Vicdansız!
O, ağır, murdar əli ilə məni şillələmək istədi. Mən onu itələdim.
– Vay, – deyə elə qışqırdı ki, camaat biz tərəfə axışdı. Ayaq səsləri ordu hücumunu andırdı. Qadın məndən əl çəkmək istəmirdi. Adamlar onu qaldırdılar. Kənar elədilər. Sevgilimin qolundan yapışmaq istərkən, qoymadı, özü mənim qoluma girdi. Adamlardan aralandıq. O dayandı. Bir üzümə baxdı. Mən açıb hamısını söyləmək istərkən, əlimi sıxdı:
– Xudahafiz!
Mən onun dalınca yüyürdüm, qolundan yapışdım, buraxmaq istəmədim. Gözlərimdən iki damla yaş düşdü. Sevgilim biləyimdən bir yumruq vurdu:
– Əl çək!
Bu cavab bir zərbə kimi başıma dəydi. Qaranlıqda səndələyib qaldım. O getdikcə gedirdi. Qara, toppuz kimi dolu saçlarını kürəyinə atıb addımlayırdı. Uzaqda, səkiləri gümüşlə suvanan yerdə gözümdən itdi. O gedən getdi...

*1932*

## TƏZƏ TOYUN NƏZAKƏT QAYDALARI

Qardaşlığım kooperativdə işləyirdi.
Anası da mağazaların hansındasa satıcılığa təyin edilmişdi. Vaxtı yox idi, görüşə bilmirdik. Bu axşam ona rast gəldim.
– Soyuq! Etibarsız! – deyə məni çox danladı. Bərk tapşırdı ki, sabah Bəhlulun toyudur, gələrsən.
Mən boyun qaçırtdım:
– Vacib işim olacaqdır, – dedim.
– İstirahət günüdür, – dedi, – kimə yalan satırsan? İş-zad bilmirəm, gələcəksən, vəssalam!

Mən ona bibi deyirdim.

– Sözün açığı, bibi, mən təzə toy-zad görməmişəm. Qaydasını da bilmirəm. Qonaqların yanında qızarmağa təhərim yoxdur.

Bibi barmaqları ilə ağzımı yumdu:

– Kiri, kiri! Dünya gör-götürdür. Gəl otur, öyrən. Bəhlul da kənd uşağı deyilmi? O da sənin kimi utancaq, mağmunun biri idi. Getdi, gəldi, girdi, çıxdı. Maşallah olsun, indi nitq deyir. Belə bir gün sənin üçün də var. Sabah-biri gün, allah qoysa, sən də bir halal süd əmmiş tapıb evlənəcəksən. Xeyir işin olmayacaqmı, tifil!

Bibimin sözündən çıxmağa qorxurdum. Səhər qalxıb, şalvarı döşəyimin altından çəkdim, geyindim. Məktəb yoldaşımın saroçkasını aldım. Gümüş zaponka axtardım. Uşaqlar toya getdiyimi bildilər. "Bəxtəvər", – deyə hərəsi bir tərəfdən köməkləşib, məni yar-yaraşığa salmağa çalışdılar. Tamam-kamal toy adamı kimi yola düşdüm.

Saat yeddidə qardaşlığımgilə çatdım. Vurhavurnan hazırlıq gedirdi. Qazan altına odun qoyan kim, daşıyan kim, düyü arıdan, toyuq yolan, taqhataq qənd doğrayan kim... Bibi məni öz otağına çağırdı. Bəy hamamdan qayıtmamışdı. Onun üçün təzə çay dəmləmək istəyirdilər, kim isə limon doğrayırdı. Bibi dedi:

– Sağdış, soldışla gələcək!

Bibinin xoşuna gəlmədim. Bəhlulun boyun şallarından birini boynuma elə asdı ki, saçaqları at yalı kimi döşümü örtdü. Çəkməmi çəkib ayağımdan çıxartdı. Bir cüt haşiyəli ipək corab geyindirdi. Belimə sümüklü toqqa bağladı. Bir dəmir qarmaqlı qələm gətirib, döş cibimə keçirtdi, üçbucaq şəklində bükülmüş ipək dəsmalı elə qoydu ki, bir küncü göründü. Şalımın saçaqlarını daradı, yaylığın yanlarından salladı. Güzgüyə baxanda mənə elə gəldi ki, bir boyalı qadın tellərini ayırıb, döşümdə oturmuşdur. Bunları gördükcə mən heyrətimdənmi, xəcalətimdənmi dinmirdim. "Adımı oxumuş qoymuşam, bibi məndən çox bilir", – deyə düşündüm. Bibi bununla kifayətlənmədi. Hamı eşiyə çıxandan sonra yanımda oturdu. Zərli balınclara söykənib dedi:

– Tifil, yazıq bala, nə görmüsən dünyada! Kitablar ağzının dadını aparıb. Quruyub, saqqıza dönmüsən. Buna görə deyirəm ki, gəl, get! Bizdə kefin açılar...

Bibim hər cümləni başlayanda dirsəyimə, bitirəndə dizimə vururdu.

– Di qulaq as! Hə, indi toydur. Beş adam içinə çıxacaqsan. Təzə toydur. Başa düş necədir! – O təzə toyun nəzakət qaydalarını bir-bir

saydı: birinci – əsnəmək, hıçqırmaq, öskürmək, asqırmaq, gərnəşmək qadağandır; ikinci – ədəbli otur, çay içəndə marçıldatma, xörəyin yağı dodağında işıldamasın, gül, amma qaqqıldama, yumşaqca irişdin, bəsdir, danış, ancaq qışqırma, dodaqaltı mızıldandın, kifayətdir, elə danış ki, hamıya, hər şeyə, hər vaxta aid olsun; üçüncü – hamı ilə görüş, tanış ol, öpüşmək də olar, o da üzdən yox, dodaqdan; dördüncü – stəkanı nəlbəkiyə yavaş qoy, rumkanı iki barmağınla tut, qaşığı ehmallı tərpət; beşinci – qabını siyirmə, süfrəni batırma, stulu cırıldatma, burnuna əl vurma, qaşınma, qurcuxma; altıncı – yaxanı bağla, başını aç!..

Bibinin sözünü yarımçıq qoyub qalxdım. Boyun şalımı açıb, qayıtmaq istədim:

– Hələ ki, xudahafiz!

Qolumdan tutdu:

– Dayan bir, hara durursan?

– Bibi, sən oğlunun əziz canı, sən vicdanın, məni burax! Mən bacarmayacağam. Razı olma ki... yuxum da gəlir. Sabaha dərsim var. Qoy gedim. Yemişcə varam. Mübarək olsun! Neçə belə toylar...

Səsimə o biri evdən gəldilər. Qollarımdan dartıb oturtdular. Mən qorxu, iztirabla təzə toyun başlanmasını gözləyirdim. Yalvardım ki:

– Camaat yığılmamış məni zala apar. Adamlar gələndən sonra nə lazım, utanıram...

– Bala, yoxsulluğun üzü qara olsun! Xanımnənəgilin zalını bu günlüyə borc almışıq. Kişilər hələ çaylarını yığışdırmayıblar. Bir az da dur. Səni içəri aparmaq, bax, bibinin bu boynuna!

Bəy hamamdan qayıtdı. Pörtmüşdü, üzünün əti sallanmışdı. Qaşqabağı yernən gedirdi. Ömründə gülüşlə işıqlanmamış kimi görünən tutqun sifəti bir az da enlənmişdi. Şəkil kimi susub dururdu. Sağdışı, soldışı ona baxıb, guya göz qırpımından nə dediyini anlayır və anladırdılar.

Onlara çay verdilər. Bəy üst dodağını balıq əti kimi nəlbəkiyə saldı, çayı isti-isti hortuldatdı. Bibinin qulağına pıçıldadım:

– Deyəsən, Bəhlul da bilmir.

O mənə cavab vermədi.

Mən təkrar etdim:

– Qaydaları deyirəm ey... Bəhlul dodağını marçıldadır, ona göz elə!

– Balası, – dedi, bura toy deyil ki! Öz aramızda eybi yoxdur.

* * *

Mən çox utanırdım: bir küncdə oturmuşdum. Qonaqlar bir-bir gəlirdilər. Addım səsi eşidən kimi ürəyim döyünürdü. Təzə toyun nəzakət qaydalarını yadıma salırdım. Elə bil bibim qabağımda və ya çiynimdə oturub, qulağıma pıçıldayırdı: "Belə otur, elə otur!"

Qonaqlar içəri girməmiş mən əllərimi görüşməyə, salamlaşmağa hazırladım. Bibimdən öyrəndiklərimi ürəyimdə əzbərlədim.

Qonaqlar zaldakılarla görüşüb əyləşdilər. Uşaq, dəlləkdən qorxan kimi mən də qonaqlardan çəkinirdim. Onlar mənə tərəf gələndə mən də öz-özümə: "Gözlə ki, nəzakət qaydaları pozulmasın", – deyirdim. Ancaq görüşəndə ayağa qalxıb-qalxmamağın mənasını bilmirdim. Bibim mənə öyrətməmişdi. Başqalarına baxırdım: qalxan da olurdu, oturduğu yerdə əlini uzadıb görüşən də olurdu. Quşbaxışı bu adamları müqayisə etdim. Mənə elə gəldi ki, ayağa qalxıb görüşənlər daha mötəbər adama oxşayırlar. Onları təqlid edib qalxdım. Bir xanımın yumşaq, üzüklü və ağ əlini ovcuma alıb sıxdım.

– Çox xoş gördük! Təbiət sizdən razı olsun! – dedim.

Bəy içəri girdi. Adamlar bir-birinə dəydi. Yuxarı başda üç nəfərlik yer hazırlamaq istəyirdilər. Bibim kəlağayısını yellədərək gəldi, onları geri çağırdı:

– Mən nə vaxt desəm, onda!..

Hazırlanan yerlərdə çalğıçılar oturdular. Dəm tutdular, nə tutdular! Sarı, buxara papaqlı birisi tarı bağrına basıb, özündən getdi. Qaval yox idi. Başıaçıq, boynu şallı, pencəyi çox gödək, qulaqları dik bir oğlan şaxsey dəfini dizləri arasına alıb mal döyəcləyən kimi döyürdü. Birisi də klarnet üfürürdü. Onun nəfəs almadan iki saat üfürməsinə hamı mat qalmışdı. Müğənni özündən getmişdi. Pəncərələrdən küçəyə segah tökülürdü. "Can, ay atam balası, can!" – deyən səslər ucalırdı. "Atam balası" elə bərk döyürdü ki, adamın dümbəyə rəhmi gəlirdi.

Stolun yanları adamla doldu. Mən tanıdığım bir nəfər də yox idi. Ona görə bir küncdə qəribsəyirdim. Nəzakət qaydalarından qorxduğum üçün yanımdakıları dindirməyə də cəsarət etmirdim. Bir də gördüm bəy iri addımlarla otağı ölçüb, yuxarı başa keçdi. Keçdi, nə keçdi! Üç nəfər ayağa qalxdı. Sağdışa, soldışa da yer elədilər. Bəy yenicə oturmuşdu ki:

– Xankişi! – deyə səsləndi:

Tədarük otağından oğru pişik kimi ağzını təmizləyə-təmizləyə başıaçıq, uzunçənə kişi gəldi (toyda başıaçıq adam bir o idi, bir də mən). Bəy ona əmr ilə tapşırdı:

– Yoldaşlar məclisi sənə həvalə edirlər. İşə başla!

– Baş üstə, ay bəy! Mənim kor gözüm üstə! – deyən Xankişi əllərini ətəyinə silib, ətrafa göz gəzdirdi. – Hə... niyə danışmırsınız? Yoldaşlar, domino oynayan var, desin. Kart kimin meyli çəkir? Muşqulat eləyək. Təvəqqe eləyirəm, çalanlar yorulanda qrammofonu oxudasınız.

Bibim o biri evdən dilləndi:

– Oynamaq olsun, Xankişi! Oynat!

Adamlar güldülər.

Xankişi irişə-irişə cavab verdi:

– Nə deyirik! Sahibkar deyir, gərək ola da! Başlayaq oynamağa!

Bəy əlini stula vurub, Xankişiyə acıqlandı:

– Bu nə mövhumatdı eləyirsiniz? Niyə bəs arvadlar bir yanda oturub, kişilər o biri yanda? Bu saat qatma-qarışıq lazımdır. Məhv olsun köhnə qaydalar!

Bəyin sözünü şarpaşarp alqışladılar. Xankişi stullara əl gəzdirməyə başladı. Hamını növbə ilə: bir arvad, bir kişi düzdülər. Elə arvad var idi ki, ərsiz, elə kişi var idi ki, arvadsız gəlmişdi. Bunlar nəzərə alındı. Utancaqlığından tək qalan mən oldum. Xankişi düzdüyü adamlara baxıb, əlini əlinə çırpır, nəşələnirdi:

– Bax, belə ha! Mədəni budur ha!

Onun gözü güldü, məni işarə ilə hamıya göstərdi.

– Binəvaya baxın! Yazıq tək-tənha qalıb!..

Adamlar gülüşdülər. Mən tərlədim. Bibim içəridən səsləndi:

– Onun yanında özüm oturacağam!

Məclis bayram mağazası kimi bəzənmişdi. Allı-güllü zərif paltar geymiş qadınların qulağında sırğalar, par-par parıldayırdı. Sanki onlar satılmaq üçün düzülmüşdü.

Kişilərin burnu, qadınların barmaqları işıldayırdı. Qadınların üzü, kişilərin dişi ağarırdı. Qadınların dodağı, kişilərin boynu qızarırdı... Otağın havasını sorub, klarnetə doldurmaq istəyən adam da rəngbərəng insanların əlvan paltarına bəstələnmiş havalar səpirdi. Özündən gedən müğənnidən gözlənilmədən “Xoruz mahnısı” yüksəldi:

Mənim toyuğum çil-çil idi,
Qanadları pil-pil idi.
Toyuq deyil, bülbül idi;
Səni yanasan, toyuq tutan,
Odlanasan, toyuq tutan!

Xankişi bir qalın-qayım arvadı aralığa saldı. Yanındakılar pıçıldaşırdı ki, “21-də kassirşadır”. Kassirşa doğrudan qəşəng oynadı. Hər ləngərində bir gəminin qərq olmaq təhlükəsi hiss olunurdu. Döşəmənin taxtaları cırıldayır, şüşələr tərpənir, kənardakı stol titrəyirdi. Musiqi coşanda qadın kələfçəni düyün saldı. Nə etdiyini özü də bilmir, atılıb-düşürdü. Bunların hamısı təzə toyun nəzakət qaydalarını pozurdu. Bibimin içəridən qışqırığı bu arvadın rəqsini yarımçıq saxlayacağını güman edirdim. Olmadı. O, hərdən böyrünə biz soxulan fil kimi göyə atılırdı. Hamı baş-gözünü qorumağa başladığından, əl çalan yox idi.

Bundan sonra sanki onun tamam əksinə, qəsdən bir arıq hörümçəyi aralığa saldılar. Atlas paltar, qırmızı çəkmə geymiş bu arıq qızın qaşları mötərizə, burnu sual işarəsinə oxşayırdı. Yerindən qalxan kimi çapalamağa başladı. Onun sürətli, qarışıq hərəkətləri can verən məxluqu andırırdı. Sanki quruya düşmüş balıq özünü yerdən-yerə çırpırdı. Bir az çapaladıqdan sonra stuluna yapışıb qaldı. Sinəsi qalxıb-düşür, nəfəsini dərirdi. Bu da təzə kassirşa imiş!.. Ona macal vermədən qara krepdeşindən çarlston paltar geymiş, pəhləvan kimi enlikürək bir qadın aralığa çıxdı.

Xankişi səsləndi:

– Yoldaş yoldaşı ilə oynasın!

Yuxarı başda müştükdə papiros çəkən və yaxalığı yanakı əyilmiş bir kişi irəli çıxdı. Qaraquş kimi qanad gərib, arvadına kölgə salmağa, dolanbacı getməyə başladı. Qadın isə irişdiyindən dodağı sallanmışdı. Əri fırlanırdı, qadın durduğu yerdə qarmon kimi büzülüb-açılırdı.

Bunlardan sonra çıxan qadınların çoxu durduğu yerdə qanad çalır, sağa-sola dönürdülər. Yalnız bir nəfər (o da deyilənə görə gəlinin qohumu imiş), gözəl oynaması ilə hətta çalğıçıların da heyrətinə səbəb oldu. Qız al geyimi ilə şəfəq kimi parlayır, xumar gözlər kimi süzülüb gedirdi.

Çaylar içildi. Xörək gəldi. Plov nə plov! Buludlar qarlı dağlar kimi ucalmışdı. Camaat xörəyə girişdi. Evdə qulaq batıran bir marçıltı qopdu. Bir dəqiqədə məlum oldu ki, nə aş çatır, nə də qara.

Xankişi ürək verib dedi:

– Nə qədər kefinizdi yeyin, qorxmayın, xörək tapılar!

Məni fikir götürmüşdü. Marçıltıya, işıldayan dodaqlara, ağ boşqablara uzanan qara biləklərə baxdıqca, yanımda oturan bibimə işarə edirdim:

– Ay bibi, toyun nəzakət qaydaları, deyəsən, bir balaca...

Onun ağzı dolu olduğundan dillənmir, yalnız qaşlarını çatıb:

– Yox, – deyirdi.

Çay stəkanları paylandı. Xankişi bir-bir stəkanları şərabla doldurdu. Yuxarı başdan kassirşa ehmallıca baş qaldırdı.

– Yoldaşlar, – dedi, – xahiş eləyirəm ki, biz xoşbəxt olmuşuq. Bəy yoldaş, yəni Bəhlul, bizim 21 nömrənin işçilərindən olmağına görə bu bakalı içək, yoldaş, necə ki, mən xahiş eləyirdim, içilsin!..

Xankişi qışqırdı:

– Əl saxla!

Hamı qapı tərəfə baxdı. Naşı bəzənmiş, yaşlı bir qadın içəri girdi. Xankişi təqdim etdi:

– Qız anası!

O saat nidalar ucaldı:

– Yaşasın bəyimizin qayınanası!

– Təbiətin gizli qüvvələri mübarək eləsin!

– Təbiət hamıya qayınana yetirsin!

Qayınananı bəyin yanına keçirtdilər. Bibim camaatın hörmətinə cavab verdi:

– Təbiətin gizli qüvvələri sizə də qismət eləsin! Sizdən razı olsun!..

Stəkanlar dolur, boşalır, sağlığa içilirdi. Eşitməli sözlər danışılırdı. Bəy danışanda hamı diqqətlə dinlədi. O deyirdi:

– Deməsinlər ki, Bəhluldur. Onverset qurtarsam da... elə bir şeyəm. O daxıl ki, var ha... Buradakıların çoxu həmkarımızdır, başa düşər. O daxıl elə şeydir ki, onverset ondan baş açmaz. Elə onverseti də oradan götürüblər. Görmürsünüz student gəlir, bizə baxıb öyrənir? Mən deyirəm, o daxılın sağlığına içək ki, (bəy əlindəki stəkanı lampoçkaya qədər qaldırdı) bunu bizə yetirən odur. Bunsuz dünya bərqərar olmaz. Jiznimdə belə ləzzətli şey görməmişəm. İçək bunu daxılın sağlığına!

Stəkanlar döyüşdü, şaqhaşaq göyə çıxdı. Bəyin stəkanı qayınananın boş stəkanına dəyəndə, bəy boynunu əyib, geri çəkildi:

– Bu olmadı! Xankişi! Bu arvada nəsihət ver!

Kim isə dilləndi:

– Ədə, dalaşarsız!

Xankişi qayınananın stəkanını doldurdu:

– Kim içməsə, yaxasına tökəcəyik.

– Təklif var: öpüşsünlər...

– Ədə, gəlin ilə öpüşərlər, o ki burada yoxdur.

– Yox, öpüşsünlər...

Xankişi qayınananı qucağına götürüb, Bəhlula tərəf qaldırdı. Bəhlul bir öpüş götürüb, şərabı başına çəkdi. Qadın qızarıb, yerində oturdu, qızın dayısı acıq eləyib getdi. Bəhlul bunu eşidən kimi hirsləndi:

– Kim məni istəmir, gedə bilər!

Başlar xörəyə tərəf endi. Qaşıqlar şaqqıldadı. Birdən Xankişinin səsi gəldi:

– Kim oğurladı?

– Nəyi?

– Kim götürdü?

– Nədir itən?

– Mənim qaramı sən yemisən?

Stəkan Xankişinin kəlləsində çilik-çilik oldu. Şərab şüşəsi bufetə dəydi. Şüşələr töküldü. Mürəbbə bankasının böyrü deşildi. Mürəbbə axdı, töküldü. Qayınana təşvişə düşdü:

– Batdı, batdı! – deyə yeznəsinin ətəyini çəkdi.

Dava qızışdı. Məclis parçalandı, cəbhələr ayrıldı. Bibim özünü aralığa atdı. Qışqırırdı. Mən qulağına pıçıldadım:

– Deyəsən, nəzakət qaydalarını, bir balaca...

Aralıq bir az sakitləşmişdi ki, mən şalı boynumdan açdım. Batinkaları, toqqanı atdım. Öz tələbə paltarımı geyinib, çıxmaq istədim. Bibimin ovqatı təlx olsa da, soruşdum:

– Bağışla, bir dəfə əsnədiyim üçün üzr istəyirəm. Təzə toyun nəzakət qaydalarını pozdum...

Bibim məni bərk-bərk tutub buraxmadı. Hamı dağıldı. Biz o biri otağa keçdik.

Bibim pəncərələrdən qoltuqlayıb aralığa şey tökürdü: konfet qutuları, tort, marmelad...

Mən elə bildim ki, bunları öz aramızda yeməyə saxlamışlar. Bir konfet götürmək istədim. Bibim biləyimdən tutub çəkdi. Corab, şal, kağız, gül dəstəsi, gümüş qaşıqlar, duxi, pudraqabı, krepdeşin, qəndqabı, bəzək qutusu, dəsmal, yaxalıq, düymə... Bir sözlə, elə bil 22 nömrəli mağaza açıldı.

Mən gözləyirdim. Bibim səliqə ilə şeylərin qulağından tutub deyirdi:

– Bu şalı Məmmədin arvadı gətirib. Altı dənə qaşıq, isbatlı şeydir, Minaxanım alıb. Bəzək qutusu, əcəbdir! Kişinin adına layiq, Məşədi Rəhimi deyirəm ey!

Bibim sovqatı əlində saxlayır, bəyin fikrini bildikdən sonra kənara qoyurdu. Bəy əvvəl mülayim görünür və deyirdi:

– Xub... Pis deyil... – Sonra: – Zarafat deyil! Ərinə çörək ağacı düzəltmişəm, hələ o çoxdur? Öt!

Bibim bir kağız gül göstərdi:

– Bu da, – dedi, – dostun Əyyubgildəndir.

Bəy mızıldandı:

– Elə dostu qəbirə qoyum! Heç utanmır da!

Bibim bir cüt corabı göstərdi:

– Bunu Həmzət gətirib.

– Kim?

– Mirsaadın arvadı, Həmzət!

– Çox qələt eləyib, gətirib! Sən də çox qələt eləyib almısan! Məni ələ salıb, ya özünü? Qızı küçükləyəndə mən onu adam bilib, subaylığım ilə qırx manat xərcə düşdüm. İndi mənim əziz günümdə kimə doqquzluq qoyur? Dur apar, at üstünə, gəl! Hələ o qədər ac qalmamışıq. İt uşağı! Corab! Özü də nə corab!

Mən bunları görəndə bildim ki, qardaşlığım məni niyə danışdırmır. Toyun nəzakət qaydasını hamıdan bərk pozan mən idim ki, heç nə gətirməmişdim. Döyülməyimdən qorxdum. Həyətə çıxmaq bəhanəsi ilə gecə vaxtı birbaş Ermənikəndə, yataqxanaya götürüldüm. Odur-budur, belə yerlərə getmirəm. Bir də mən təzə toya gedim! Ay tövbə!

*1934*

# BOSTAN OĞRUSU

1

Gecənin bir aləmində Durmuş kişi yerindən qalxıb, ətrafa göz gəzdirdi. Axşamkı qaranlıq, ayaqlanan palçıq kimi bərkimiş, qatılaşmışdı. Göz gözü görmürdü. Qardaşı Kərbəlayı Tapdığın üzüm bağı bir ləkə kimi güclə seçilirdi. Hava bürkü idi. Hər şey əriyirmiş kimi, göy yerə qarışmışdı.

– İş yiyəsi işdə gərək! – deyən Durmuş kişi çoxdan bəri suvarılmadığından qurumuş və torpağı çatlamış ləklərin arası ilə gedirdi. Quru otlara, yemiş tağlarının süfrə kimi enli yarpaqlarına dəyib, səs salmamaq üçün şalvarını dizinə qədər çırmadı, papağını qoltuğuna vurub, sinə-sinə yeridi. Sonra özünə ürək verməyə başladı: “Heç qorxmaq istəməz! Yatıbsa, işim işdir. Oyaq olsa, deyərəm: “Söhbətə gəlmişəm. Tutdu hənək, tutmadı dəyənək!”

Kərbəlayı Tapdığın dəyəsinə yaxınlaşanda qulağına səs gəldi. Deyəsən, haradansa: “Ey-hey-hey, ey!” çağırırdılar. Qızılgül kollarının bidinə çöküb, qulaqlarını şəklədi. Bir şey xışıldayırdı. Durmuşun fikrinə gəldi ki, “kişi pusquda dayanmış olar, məni oğru bilib, doldurar qırmanı qarnıma”. Bu fikir çəkic kimi onun başına dəydi, bədənini odlandırdı. Kişi diksindi. Ayağa qalxıb, qardaşını səsləmək istədi. Bir dəqiqə də gözlədi. Xışıldayan şeyin kərtənkələ olduğuna inandı.

Heyvan, Durmuşun vedrəyə oxşayan gövdəsini görüb hürkmüş, rahatsız olmuşdu.

Durmuş dəyənin yanında barmaqları üstə yeriyib, xəyal kimi səssizcə Kərbəlayı Tapdığın yatağına yanaşdı. Kişi şirincə yuxuda xoruldayırdı. Əyilib, Tapdığın üzünə diqqətlə baxdı. İnandı ki, “yeddi gün, yeddi gecə!” div yuxusuna gedib. Kərbəlayının plov yeməkdən böyüyən ağzı elə geniş açılmışdı ki, oraya dolan yuxunu yeddi gün, yeddi gecədə ancaq həzm edə bilərdi.

Durmuş özünü tənəklərin arasına verdi...

Kərbəlayı Tapdığın bağında bir lək yaylıq üzüm var idi. Bu xırda, yumrugilə, ağ, şirin, sıxsalxım üzümdür. Tez yetişdiyinə görə novar olur, çox sevilir, az tapılır, baha satılır. Neçə ildir ki, Kərbəlayı Tapdıq altı tənəkdən altı salxım üzüm dərə bilmirdi. Üzümləri gülünü tökər-tökməz ala-qora vaxtında yoluşdurub aparırdılar. Kərbəlayı xəbər tutanadək bir salxım da qalmırdı. Arvad onu çox danlayırdı. Axırda özü də hirsləndi.

– Canım, – dedi, – belə şey olmaz axı, görüm bu zəhrimara dadanan kimdir? Onun qarnını yırtmasam, mən Kərbəlayı Tapdıq deyiləm...

Oğlunu, nökərini də göndərmədi. Üzümlər gül tökəndə iyun ayının axırlarında yorğan-döşəyini götürüb bağda, dəyədə yatardı. Niyə də yatmasın? Qoruya bilsə, tənəkdə bir pud üzümü var. Qol-qanad açıb, isti torpaqlarda yatan tənəklər bulud kimi dolu salxımlar verir. Dolmalıq vaxtını ötən və baş qaldırıb tac kimi şax duran yarpaqlar, sanki günəşin almaz zərrələrini, sabahın ilhamlı təranələrini sorub salxımlara və şəffaf gilələrə doldurur. Yarpaqlar yaşıl ətəkləri ilə salxımları örtüb bəsləyir. Salxımlar isə, pərvazlanmış quş kimi, yuvasına sığmayıb kənara boylanır, quşları çağırır və bəlkə də yoldan ötənlərə zavalına gəlir...

Üzüm, nə üzüm! Şəkər kimi şaqqıldayır, diş vuran kimi şirəsi keçir, ürəyə axır, gözə işıq, dizə taqət verir. Tənəklərdən sallanan salxım deyil, onluq çervonlardır.

Vaqon pəncərələrindən baxan bəzəkli xanımların gözü bu üzümə sataşdımı, deyəcəklər: "Vinoqrad davay!" Belə olanda hansı axmaq güzəştə gedər? Mən də deyəcəyəm: "Kilosuna ədin çervon davay!"

Bu ağıllı fikirlər yalnız Kərbəlayı Tapdığın başına gəlməmişdi. "ürəkdən ürəyə yol var" deyərlər. Bunları Durmuş da yaxşıca kəlləsinə vurmuşdu.

Gecənin bu vaxtında, porsuq kimi tənəklərin arasına soxulub, salxımları şirin yuxusundan oyadan və yoluşduran Durmuş da hər salxımdan "bir çervon" gözləyirdi. Fikirləşdi ki: "Atadan mənə biri çatı da düşmədi, boğazıma salım. Böyük qardaş (Kərbəlayı Tapdıq) mənə kəbin kəsdi, hamısını içəri ötürdü, məni məğmun elədi. Qapısında bir donuzu əskikdir. Bağı özünə bəsdir. Heç olmasa bu yaylıq üzümü də mənə çatmazmı?"

## 2

Durmuş "işini" görüb, bostanına qayıtdı. Üzümü yerbəyer elədi. Bir gilə də ağzına qoyub, şirinliyindən dodağını marçıldatdı. Bu üzüm, cavan vaxtında min bir qorxu və ürək döyüntüsü ilə gecə xəlvət görüşündə nişanlısından aldığı "haram öpüş" kimi ləzzətli idi.

Həmlələr pozmuş, qoşun sındırmış, qala fəth etmiş əsgər sevinci ilə Durmuş yatağına girdi.

Kərbəlayı Tapdığı elə bir yuxudan oyatdılar. Qaranlıq, sakitlik, yalnızlıq idi. Nağıllarda söylənən tilsimli gecələr Tapdığın yadına düşdü. Göyə baxdı. Səliqəsiz səpilmiş ulduzlar ona qızıl onluqları xatırlatdı: "Nə ola, bu qızıllar göydən qopa, qızıl yağışı yağaydı. Nə qapaqap olardı, fələk! Qıllı papağımı başıma basıb, bir yüzcə dənə yığsaydım, bir təhər olardım. Şəhərin göbəyində bir mülk alardım, ya da Namazlıların bağını ələ keçirərdim, ildə on beş-iyirmi min manatlıq təkcə "Təbriz üzümü" satardım. Onda Durmuş da paxıllığından çatlardı... Qoy onda mənimlə ha bəhsə girişsin!.."

Kərbəlayı Tapdıq bu dadlı xəyalını udmamışdı ki, nökər qulağına pıçıldadı:

– Vaxtdır! Vaxt keçir!

O, yerindən qalxdı, işarə ilə nökərə qandırdı: "Sən o yandan gəl!"

Özü ağaxların arasından dərəyə endi. Durmuşun bostanına keçdi.

Bağ da, bostanın yeri də qardaşlara atadan qalmışdı. O zaman ayrılanda nə təhər oldusa, Durmuş xali yer yiyəsi oldu. Atıldı, düşdü, çığır-bağır saldı; şəriət yanında, yüzbaşı yanında sözünü eşitmədilər.

Ovladığı bir qazı ətəyinin altında axunda peşkəş apardı. Sən demə, Kərbəlayı Tapdıq da axunda ağzında bir qızıl onluq göstəribmiş. Bağ davası başlananda axund istiot kimi tündləşdi. Kərbəlayı Tapdığın sözünü təsdiqlədi. Durmuşun üstünə qışqırdı:

– Qaz boynu kimi boynunu uzatma! Kişi ağzında qızıl kimi söz danışır!

Durmuş başını aşağı salıb dedi:

– Eybi yoxdur! Qoy böyük qardaş bağa yiyələnsin, can sağ olar, mən də o xali yerin torpağını qızıla döndərərəm. Heç eybi yoxdur!..

Durmuş doğrudan da dediyini edirdi. Qanqallı, tikanlı, sarmaşıqlı yerin torpağını atım-atım edib, un kimi elədi. Yaxşıca arx çəkdi, su çıxartdı. Yerin ərafına iki cərgə meyvə ağacı əkdi. Yeri isə hər il dirlik bostan edib, çoxlu mənfəət götürürdü. Səliqə ilə əkilmiş, taxtalanmış bostan yaz vaxtı Quba xalçasına bənzəyirdi. Yaşıl, cavan alma, armud, ərik, əncir ağacları saçaq kimi sallanıb sıxlaşırdı.

Durmuşun bostandan dəsmal-dəsmal pul götürməyi, hələ bağ salmaq fikrinə düşməməyi Kərbəlayı Tapdığı narahat edirdi. Fikrinə gəlirdi ki: "Bu gədə məni ötəcək, mənim var-dövlətim yalan olacaq..."

Kərbəlayı Tapdıq bu dərdi sinirə bilmirdi. Durmuşa badalaq qurmağa çalışırdı.

Son zamanlarda gözünü onun yemişlərinə dikmişdi. Dəfələrlə gündüzlər kiçik qardaşının bostanına keçib “əhvalpürsanlıq” bəhanəsi ilə yemişləri belləmişdi. İki-üç kisə yemiş “daş-baş” eləyib satdırmaq, bostanın xeyrindən “feyziyab” olmaq iştahasında idi”.

Gündüzdən nökəri öyrətmişdi ki, kisə götürüb, bağa gəlsin.

Yemiş tağları göyləri əmib, yerləri sormuş, ərköyün oğlan kimi köks gərib, qol-qanad açmışdı.

Tağların hər qolunda bir neçə yemiş böyrünü sərin torpağa verib, kotana qoşulmalı cöngə kimi yatırdı, sanki göyşəyirdi. Qalın və şax yarpaqları, başında boşqab kimi tutan uzun zoğlar deyil, qonaqcıl gəlin biləkləri idi. Yemişlərin bəzisi qaraqabaq adamlar kimi burnunu yerə dikmişdi. Çoxusu ağaran qabarıq gövdəsi ilə yelkənə bənzəyirdi. Eləsi də vardı ki, yupyumru şamama kimi...

Kərbəlayı Tapdıq bellədiyi tağların dibinə sindi. Nökərə him elədi:

– Çırpışdır! Nə durmusan?

Çopur, ağır və böyük yemişlərə əl dəyən kimi tağdan üzülürdü. Bəzi yemişləri tağdan üzmək çətin idi. Toy və bəylik günləri Tapdığın gözü önünə gəldi. Xəncəri çəkib, yemişlərin saplağını kəsdi.

Yemiş, nə yemiş! Öz-özünə tağda cathacat cırılan yemiş!

Tapdıq dayaz ləklərdə sürünə-sürünə yemişləri seçib dərir, nökər isə kisəyə yığıb, dərəyə endirirdi. Çox çəkmədi tağlar boşaldı, kisələr doldu. Dan yeri sökülməkdə idi ki, onlar kolların arasında itdilər.

3

Səhər açılmış, gün xeyli qalxmışdı. Hər gün dan üzü yuxudan duran qardaşların heç biri yatağından qalxmaq istəmirdi. Azar dəymiş kimi, yataqda o yan-bu yana çevrilirdilər. Hətta Kərbəlayı Tapdığın yatağını gün döyürdü. Dözmək mümkün deyildi. Yerini divarın dibinə çəkdi, başını yerə qoydu, gözünü yumdu, qulağını bostana tərəf şəklədi. Ona elə gəlirdi ki, bu saat Durmuşun hay-küyü qopacaq. “Qoy gəlib məni yatan görsün”.

Durmuş da qalxmır, gözləyirdi ki, Tapdıq “üzümlərim vay!” – deyəndə, gümanı bu tərəfə gəlməsin. Gəlsin məni yatağımda görsün. Mən də yuxudan indicə oyanmış kimi, gözümü ovuşdura-ovuşdura qalxım, heyrətdə qalım...”

– Nə olub, dadaş, nə xəbərdir? – deyə o, yoldan ötənlərə baxmaq üçün yerindən boylandı. Yemiş tağları gözünə bir təhər gəldi. Diqqət edəndə şübhəsi artdı. Yerindən sıçradı. Şalvarı dizinə çəkib yüyürdü.

Yanılmırdı, bellədiyi Carco yemişlərindən biri də qalmamışdı. Ləklər ələk-vələk edilmişdi. Tağlar güllələnmiş igid kimi üzü üstə sərilmişdi. Gözünə inanmadı. Bir də yoxladı, əli ilə tağları çevirdi, ayağı ilə torpağı eşələdi. Onun arasına baxdı.

– Yox, – dedi, – bostanı pozublar!

Yoldan ötənlərdən şübhələndi. Yol üstünə qaçdı. Orada gülə-gülə araba sürən və at üstündə qucağına quzu alıb aparan kəndlilərdən başqa kimsəni görmədi. Qayıtdı. Tapdığa xəbər vermək üçün ləkin qırağında səsləndi:

– Dadaş, ay Kərbəlayı dadaş, hey!..

Onun səsini eşidən kimi Tapdığın dodaqlarında təbəssüm oynadı: "Hə, – dedi, – dostumun canına isti keçir ha!.. – O yenə eşitməməzliyə vurub qalxmadı. – Qoy lap özü gəlsin, çağırsın".

Durmuş mərzi keçib gəldi. Qardaşını yatan gördükdə qışqırdı:

– Ay dadaş, nə yatmısan, evimi yıxıblar, dur görək bu nə işdir!

Tapdığı bostana apardı. Ayaqlanan ləkləri, pozulan tağları bir-bir göstərib, yana-yana dedi:

– Gör, bir gör! Gör namərd oğlu malımı nə günə salıb! Buna bax sən allah! Bu tağların hər birində beş-altı yemiş var idi. Biri bir oğula dəyərdi... Saxlamışdım el dağdan qayıdana. Vay köpək oğlu, toxumluqları da yolubdur. Sənin atan gorbagor olsun!

Tapdıq baxırdı, özünü heyrətli göstərməyə çalışaraq dedi:

– Heyif! Heyif zəhmətinə!.. Ay canım, səndə də günah var axı! Bostanda yatmısan, niyə ayıq olmursan? Bilmirsən ki, oğrular gözdən tük çəkirlər? Mən o üzümü güc-bəla ilə saxlamışam. Gecələr yuxunu özümə haram eləmişəm.

Boğazını biçən kədərinə baxmayaraq Durmuş Tapdığın "üzümü güc-bəla ilə saxlamışam" sözünə içində istehza ilə güldü, öz-özünə dedi: "Ay saxladın ha!.."

Tapdıq qardaşına təsəlli verməyə çalışdı:

– Eybi yoxdur, canın sağ olsun!..

– Heç sağ olmasın belə can ki, əməyinin məhsulunu itə-qurda verəcək...

– Eybi yoxdur. Oğru elə həmişə oğrudur. Sən yenə əkəcəksən, yemiş yiyəsi olacaqsan. Amma oğru...

Durmuş onun cümləsini bitirməyə macal vermədi:

– Oğrunun namusu əllərdə qalsın!.. Axı buna zəhmət çəkmişəm, əlim qabar olub bel vurmaqdan. Xalqlar kimi muzdura, əmələyə əkdirməmişəm. Hər yemişə bir gecə yuxusuz qalmışam axı!..

Burada Kərbəlayı Tapdıq diksindi.

Bayaqdan bəri atası, anası söyülürdü. Buna dözürdü, çünki qardaşıdır, söyürsə də, yarısı özünə gedir. Durmuş ağzını açıb, arvad söyüşü söyəndə kişinin namus damarı dimdik durdu, üzü qızardı, dodağı pörtdü, gözü bulandı, bəbəklərində, deyəsən, ildırım çaxdı. Durmuş isə bir də təkrar etdi:

– Oğrunun namusu əllərə düşsün! Demirmi ki, bunun yiyəsi var?!

Kərbəlayı Tapdıq qırx yeddi yaşa çatmışdı, heç vaxt belə üzüyuxarı namus söyüşü eşitməmişdi. Qan başına vurdu, ürəyinə alov doldu. Əlini xəncərin dəstəsinə atıb, qınından siyirmək istəyəndə, bir də qaşlarını çatıb fikirləşdi: "Yaxşı, vursam, deyəcək: "Oho! Oğru sənsən ki!.." Yox, açıb ağartmaq lazım deyil..." Boğulmuş bir səslə dedi:

– Nə lazım yemişdən ötrü namusa söyürsən? Yaxşı deyil! Eşidən olar...

Durmuş gözünü pozulmuş ləklərdən ayırmadan bir az da hirslənib, özündən çıxdı:

– Necə yaxşı deyil! Mənim malımı yeyəni söyərəm də, o yana da keçərəm. Bu nə sözdür?

Bu sözlər kürədə qızardılmış kömür kimi bir-bir Tapdığın ürəyinə dəyir, onu yandırıb yaxırdı. Ayrı vaxt olsaydı, Kərbəlayı Tapdıq ölüb-öldürməklə cavab verərdi. Amma indi vəziyyət elə idi ki, sükutdan başqa çarə yox idi. O, üz döndərib getdi. Bağına keçdi. Ayağının altında bir salxım əzilmiş üzüm görəndə diksindi:

– Niiih!

Elə bildi ki, kim isə üzümü dərib, bağ yiyəsini görəndə tullayıb qaçıb. Bağın ətrafına baxa-baxa tənəklərə yaxınlaşdı. Yaxınlaşdı, nə gördü! Tənəklər sağılmış qoyun kimi durub baxır. Yaylıq üzümü elə təmizləyiblər ki, deyərsən günün günorta çağı buradan bir dəstə oğru keçib. Bir zingirə də üzüm qalmayıb. Salxımlardan qırılan gilələr ləkin içindəki çuxurlara tökülüb. Tənəklərin yoluq yarpaqları sallanır,

budaqlar, soyulmuş adam kimi mat-məyus, boynu çiynində baxır, salxımların saplaq yeri göz yaşı tökür.

Tapdıq, arxası getmiş və evi yıxılmış ata kimi halsızca diz çökdü. Tərpənməyə taqəti qalmadı. Ağır-ağır nəfəs aldı, güclə qışqıra bildi:

– Gəlin hay, gəlin hay! Gəlin!..

4

Zərər görənlər kənd sovetinə gəldilər. Hər ikisi zərərini dedi, əhvalatı danışdı. Katib akt yazdı və soruşdu:

– Kimə gümanınız gedir?

Durmuş Ağcanın oğlunu dedi. Kərbəlayı Tapdıq isə Danqır Abası yazdırdı.

Katib yenə soruşdu:

– Nə bilirsiniz, bəlkə ikisini də bir adam dərib?

Tapdıq etimadla cavab verdi:

– Yox, mənim bağımı ayrı adam dərib.

– Nədən bilirsən?

– Bilirəm!

– Bilirsən, bəs niyə oğrunu açıq göstərmirsən?

– Yox ey, yadımdan çıxdı, bilmirəm! Bilmirəm, yemiş oğurlayanın atasına lənət!

Məsələni aydın etmək çətin oldu. Danqır Abas həbsdə imiş, Ağcanın oğlu isə bir ay imiş ki, kənddə yox imiş. İş sovetə tapşırıldı, təhqiqata verildi.

5

Üç gün sonra, axşamüstü milis Qələndər Quliyev sədrin yanına gəldi.

– Dur bir tez vağzala çıxaq! – dedi.

– Yorulmuşam, yenicə xırmandan gəlmişəm, qılçam gizildəyir, qoy dincəlim, – deyə kənd sovetinin sədri cavab verdi.

– Yox, iş var, gedək!

– Mən ölüm, qoy bir nəfəsimi dərim!

– Yox ey, iş var. Tez ol! Qəribə bir iş görəcəksən.

Sədr çəkməsini ayağına çəkib qalxdı. Onlar bağçanın içi ilə ötüb, çəpərdən aşıb vağzala keçdilər.

Zəng səsləndi, səsi ilə də hamını hərəkətə gətirdi. Kimi adamları basa-basa əlini kassanın pəncərəsinə yetirməyə can atır, kimi çamadan əlində növbətçiyə güc gəlib, dal qapıdan platformaya çıxmaq istəyirdi.

Dəqiqələr keçdikcə hay-küy artırdı. Adamlar bir-birinə qarışmışdı. Ümumi gurultu içində vağzal, istilahları eşidilirdi:

– Plaskart!

– Sürət qatarı.

– Tranzit.

– Birbaşa.

– Hara soxulursan?

Bufetin sağ kənarında balaca bağın qabağındakı vağzal bazarı minikləri, çağırılmış qonaq kimi aramsız gözləyirdi. Üzümü səbətlərə düzən, almanı yüngül-yüngül çəkib, kağız torbaya dolduran, stəkanı təmizləyən kim, bişmiş kotleti stola düzən, yemişi dilimləyən kim...

Qələndər sədrin qolundan tutub, bağın qırağına gətirdi. Barmağı ilə nişan verdi:

– Bax, mən ölüm, bir yaxşı bax!

Tapdıq iki tay Carco yemişini yerə düzməkdə nökərinə kömək edir, göstəriş verir, o yan-bu yana baxıb, nökərinə nə isə deyirdi.

Qaynar su budkasının solunda isə Durmuş qabağına yaylıq üzüm ilə dolu balaca bir səbət qoyub, kisəni qılçası arasına almışdı, qorxa-qorxa səbətin ağzını bəzəyirdi.

Sədr baxdı, baxdı, yandı, töküldü:

– Yazıq Danqır Abas, binəva Ağcanın oğlu!..

– Çaqqal baş qopardır, qurdun adı bədnamdır, – deyə Qələndər onun sözünü təsdiqlədi.

Qatar gəldi. Adamlar vaqondan töküldülər, qırılmış boyunbağı kimi yerə səpələndilər. Yeyənə, içənə, aldığını qoltuğuna vurana, vaqonda gözləyənə, sevgilisinə meyvə aparana bax! Pullular alır, mallılar satır, aralıqda qalanlar tamaşa edirdilər.

Tapdıq on iki-on üç yemiş xırıda vermişdi ki, müştəri azaldı. Üçüncü zəng vurulandan sonra qatar yola düşdü. Yemiş alan olmadı. Boylanıb budka tərəfə baxanda Durmuşun əlində yaylıq üzümü gördü, yerindəcə donub qaldı.

Onların gözü bir-birinə sataşdı: atışan adamlar kimi özlərini yığışdırdılar. Diqqətlə bir-birinin üzünə və matahına baxdılar.

Durmuş səbəti yerə qoyub, özünü ağacların arasına verdi. Kərbəlayı Tapdıq nökərə him elədi:

– Gəldilər..

Özü isə divardan hoppanmaq istəyərkən, bir əlin biləyindən yapışdığını gördü. Bu, sovet sədri idi.

Qələndər isə Durmuşu yaxalayıb gətirirdi.

Onlar bu iki qardaşı üzləşdirməyə və məsuliyyətə almağa gətirirdilər.

*1935*

## DOSTUMUN QONAQLIĞI

### TƏSADÜF

Kənddə, tanışlarımdan birinin evində Mirzə Qulamla tanış oldum. O, şəhərdən gəlmişdi. Deməyinə görə, istəkli dostunun ailəsilə bir yaylaq yerinə getmək istəyirdi. Onu vəkil eləmişdi ki: "Get, yer seç, ev tut, mənə xəbər ver!"

Nədənsə Mirzə Qulam mənə çox hörmət eləyirdi. İlk tanışlığımız olsa da, uzun illərin dostu, yaxın qohum kimi danışırdı. Mən onun hər sözünə "bəli" deyirdim, lakin söhbətimizi uzatmaq istəmirdim. O, yəqin bunu hiss etmişdi. Səsini dəyişdi, mənə yaxınlaşıb, yavaşcadan dedi:

– Qardaşoğluma başağrısı vermirəm ki?

– Yox, – dedim, – xoşdur, söhbətinizə qulaq asıram.

Mənim bu sözüm ona cəsarət verdi; özünə xam məclis tapmış hoqqabazlar kimi sevinə-sevinə danışdı, böyük bir müqəddimə ilə başladı:

– Sizləri görəndə, sizin kimi irəli gedən cavanları görəndə elə bilirəm öz oğlumu, öz kiçik qardaşımı görürəm. Qardaşoğlunun canına and olsun, sənin canına yalandan and içmərəm, məni qəbrə öz əlinlə qoyasan, əgər yalan deyirəmsə, sənin kimi müəllimləri görəndə ürəyim dağlar boyda böyüyür. Çünki görürəm siz qultura barəsində, maa-

rif barəsində, elm-ürfan barəsində doğrudan da mərhaba çalışırsınız. Halal olsun Sovet hökumətinin sizə verdiyi çörək! Halal olsun sizə çəkilən zəhmət!

Mirzə Qulam danışırdı. Ev yiyəsi bizi bostana, yemiş-qarpız yeməyə çağırdı.

Mən ev yiyəsinin əkdiyi, becərib yetirdiyi dirriyə tamaşa edirdim. Gömgöy kəvər, nanə, reyhan ləklərini, uzun yemiş tağlarını, tağlardakı yemişləri gördükcə baxmağım gəlirdi. Mənim fikrim zəhmət sevən, səliqə sevən təsərrüfatçı kəndlilərdə idi. Mirzə Qulam isə danışırdı. O, elmin xeyirli şey olduğundan, oxumağın lüzumundan, özünün qocalmağına baxmayaraq dərsə artan həvəsindən, çoxdan mənim kimi bir dost axtarmağından deyirdi. Ev yiyəsi, görünür, onun xasiyyətini bilirdi, səsləndi:

– Mirzə, qonağı yorma! Sənin çənənə hər adam dözə bilməz axı!

Mirzə ev yiyəsinin sözünü zarafat sayıb güldü.

– Ələkbər, – dedi, – sənin bu qonağın lap mənim ürəyimə yatan oğlanmış. A sağ olmuş, bizi nə üçün indiyəcən tanış eləməmisən? Söhbətimiz elə tutur ki, gəl gör!

Ev yiyəsinin başqa qonaqları da vardı. Hamı evin qabağında qoyulan və üstünə xalça salınan taxda əyləşdi, yemişi kəsib dilimlədilər.

Qonaqlar yemiş yeyirdi. Mirzə Qulam danışırdı. Ancaq indi onun sözünə qulaq asan azdı. Ona görə də danışanda mənim üzümə baxırdı. Mən başımı aşağı salırdım.

Mən tələsirdim. Qalxıb gedəndə, Mirzə Qulam ev yiyəsi ilə bərabər bir qırx-əlli addım məni poçt yoluna qədər ötürdü. Addımbaşı elmdən, mərifətdən, səxavətdən, sədaqətdən dəm vururdu. Əlimi sıxıb ayrılanda, söhbətinin yarımçıq qaldığına heyifsiləndi, çox xahiş etdi ki, şəhərə gedəndə mütləq onu axtarıb tapım. Adresini də dedi. Xahiş elədi ki, dəftərimin qulağına yazım.

– Yadımda qalar, – dedim, – arxayın olun.

Ayrılandan sonra daha mən Mirzə Qulamı görmürdüm və tamamilə unutmuşdum. 1930-cu ilin yayında təzəcə tətilə çıxmışdım. Yay maaşını da almışdım. Cibim dolu, kefim saz idi. Gürcüstan kurortlarından birinə istirahətə getməyə hazırlaşırdım. Şəhərə gəlmişdim. Balaca, səliqəli, sulu, ağaclı, bağlı-bağçalı rayon şəhəri yay vaxtı yaxşı olur. Dost-aşna hər tərəfdən məzuniyyət alıb gəlir. Yar-yoldaşla

görüşüb əhvallaşırsan, şəhər bağının sərin, musiqili, şənlik axşamlarında gəzirsən...

Acmışdım, yeməkxanaya nahar etməyə gedirdim. Fikrimdə tutmuşdum ki, gedib naharımı yeyərəm, qayıdıb mehmanxanada bir saat istirahət edərəm, axşam geyinib-kecinib, yoldaşlarımla vədələşdiyim yerə – kluba gedərəm.

Bir ortaboylu, qarapaltar adamın qarşımda durduğunu hiss etdim: o, dümdüz dayanmışdı, bığlarının altından yüngülcə qımışırdı, əlini də mənə tərəf uzatmışdı.

– Xoş gördük, ay etibarsız qırışmal! – deyə dilləndi.

Mən ilk baxışımda onu tanımadım. O, əlimi sıxdı, bir əli ilə də çiynimdən tutub silkələdi və qayımdan dedi:

– Hələ elə olar... Daha Mirzə Qulam dayını tanımazsan. Böyüklüyün xasiyyəti belədir, səndə günah yoxdur.

Adını çəkəndə, üç il bundan əvvəl kənddəki görüşümüz, Mirzə Qulamla söhbətimiz yadıma düşdü. İstər-istəməz əhvalını soruşdum:

– Necəsiniz, kefiniz, damağınız?

Mirzə Qulam cavab vermək əvəzinə soruşdu:

– Bəs harda düşmüşsən?

– Bu yaxında, mehmanxanada.

Bunu deyəndə Mirzə geri çəkildi, mənə bir tünd baxdı:

– Necə yəni mehmanxanada?

– Necəsiz-zadsız. Yerim də rahatdır.

Mirzə bərkdən dedi:

– Bəyəm mən ölmüşəm? Bəyəm mənim evim-eşiyim yoxdur ki, gəlib ayrı yerdə qalasan?

– Təfavütü nədir, – dedim, – ay Mirzə, bir-iki gün qalacağam. Nə eybi var?

– Çox eybi var. Adam olana, mən öz payımı deyirəm, çox eyibdir. Təvəqqe eləyirəm bunu mənə dedin, daha bir kəsə deməyəsən. Mən də özümə görə bir adamam axı! Mənim də dostum var, düşmənim var. Sabah şəhərdə biri desə ki: “Mirzə Qulamın dostu filankəs gəlib qəstində gecələyir”, onda daha mən gərək el içinə çıxmayım. Eyibdir. Boynuna al qardaşoğlu, çox eyib iş görmüşsən. Gedək, gedək evə!

Mirzə Qulam qolumdan tutub məni evə sarı çəkəndə, dayandım. Fikirləşdim ki, qonaqpərəstlik buralarda çox olsa da, hər evə getmək

yaxşı deyil. Bəlkə kasıb adamdır, niyə xərcə salım. Nə lazımdır. Bəhanə gətirib, ayrılmaq istədim. Mirzə Qulam daha da möhkəm yapışdı:

– Bu da kənd deyil ki, söhbətimizi yarımçıq qoyasan. Bu can ölsün ki, səni əldən buraxdı yoxdur!

O, qolumdan çəkdi; gedəsi oldum. Özüm də bərk acmışdım.

– Gəl, – dedim, – Mirzə, aşxanada nahar eləyək, söhbətə evə gedək.

Mirzə yenə üzümə tərs-tərs baxdı. Bir müddət dinmədi. Sonra başını aşağı salıb dedi:

– Elə zarafatları bir yana qoy ki, aramız dəyər. Xarabamızda sənin qarnını doydurmaq üçün bir tikə çörək tapılar.

Mən onun acıqlandığını görüb, bir söz demədim. Yanına düşüb getdim. “Qoy, – dedim, – qəlbi sınmasın”.

Mirzə Qulam məni bir qəssab dükanının qabağına apardı. Bığı xınalı, dəvərəgöz bir qəssab kötüyün üstündə ət doğrayırdı. Mirzə Qulam məni ona göstərib dedi:

– Məmmədhəsən, bizim bu oğlana bir üç-dörd kilo... – Bunu deyib Mirzə Qulam mənə tərəf döndü. – Nə deyirsən, qardaşoğlu, dörd kilo azlıq eləməz ki?

– Yox, – dedim, – bəs elər.

Mirzə yenə üzünü qəssaba tutdu və barmağı ilə mənə işarə elədi:

– Bizim bu oğlana bir dörd kilo kabablıq erkək əti ver. Məmmədhəsən, xatır üçün əməlli-başlı elə, yağlı tikəsi çox olsun, çünki bizim bu qardaşoğlu şəhərimizdə qonaqdır...

Qəssab kənardan asılan ətləri bir-bir göstərib, məndən soruşdu:

– Bu necədir, burasını bəyənirsinizsə, kəsim?..

Mən razılıq verdim. Qəssab əti çəkib ikiəlli tərəzidən götürdü, mənə tərəf gəldi. Mirzə məndən soruşdu:

– Qabdan-zaddan nə təhər eliyək?

Mən əlimdə bükülmüş qəzeti verdim. O, əti qəzetə bükməkdə idi, qəssab mənim üzümə baxırdı. Baxdı, baxdı və dedi:

– On bir, on bir, elər iyirmi iki, o da iyirmi iki, cəmisi qırx dörd manat. Düz qırx dörd manat!

Mən tez əlimi cibimə atıb, ətin pulunu verdim. Mirzə Qulam əti götürdü. Çıxdıq. Lavaşçı dükanına çatanda Mirzə Qulam gülümsəyərək dedi:

– Kababla bürüştə lavaşın ayrı ləzzəti olur!

– Bəli, – dedim, – ləzzətli olar!

Mən cavabımı qurtarmamış Mirzə Qulam lavaşçıya dedi:

– Bizim bu oğlana bir beş kilo ağ lavaş ver. Bürüştə olsun...

Mirzə məndən soruşdu:

– Beş kilo azlıq eləməz ki?

– Bəsimizdir, – dedim, – neçə adamıq ki!

Söz arası "neçə adamıq", – deyə soruşmaqda mənim məqsədim vardı: bilmək istəyirdim görüm Mirzənin daha neçə nəfər qonağı var? Mirzə buna cavab vermədi. Lavaşı çəkdirib, qoltuğuma vurdu. Mən pulunu verdim, qayıtdıq.

Bazarın başından ötəndə Mirzə içki dükanına girdi. Stolun dalında bir cavan oğlan dururdu. Mirzə onunla ermənicə danışdı. Sonra məni göstərib dedi:

– Bizim bu oğlana bir beş-altı butulka araq, çaxır ver. Lap əlasından ver, özü də cür ver. Məclisi rəngarəng eləyən olsun...

Cavan oğlan göstərdikcə, Mirzə seçdi. Şüşələri də lavaşın üstündən qoltuğuma yığdı. Mən içkinin də pulunu verdim. Çıxdıq.

Mirzə Qulam geriyə döndü, qolumdan çəkdi:

– Yadımızdan çıxıb, – dedi, – burada bir yaxşı qənnadı dükanı var, ətirli konfetlərdən keçmək insafdan deyil!

Mən konfet xoşlamadığımı dedim. Mirzə başa saldı ki: "Konfeti yalxı yeməzlər, ancaq uşaqlar elə yeyər. Amma məclisdə içki ilə, kef-damaqla ayrı ləzzəti var! Xanımlar konfetsiz adama kəlmə verib, kəlmə almazlar!..."

Anladım ki, Mirzənin nahar üçün, deyəsən, böyük məclisi olacaqdır. Tədarükünə mane olmaq yaxşı deyil. Konfetin də pulunu verib çıxanda, cibimə fikir verdim. Pulum azalmışdı. Axşam yeməyinə və mehmanxanaçıya bir gecəlik mənzil pulu verməyə ancaq çatardı. Bir də fikirləşdim ki, Mirzə Qulam qanacaqlı adama oxşayır; nə bilirsən: bəlkə mən xərclədiyim pulların hesabını saxlayır. Bəlkə evə çatan kimi ovcuma sayacaq! Bəlkə kişi hazırlıqsız bazara çıxıbmış, məni gördü, qonaqlıq fikrinə düşdü. Puldan ötrü bir də evə getməmək üçün mənim xərcləməyimə razı oldu, evdə qaytaracaqdır. Bu fikirlərlə məşğul idim. Mirzənin səsi gəldi:

– Fayton, fayton, bəri sür!

Uzunətək, gödərək faytonçu lap yanımıza, səkinin qırağına sürdü. Mirzə məni göstərib dedi:

– Bizim bu oğlanın xatırına elə sürərsən ki, tozun da görünməsin!

Biz faytona oturduq. Mirzə çaparaq gedən faytonun sürətindən nəşələnərək deyirdi:

– Andır evimiz bir balaca şəhərdən qıraqdır, həmişə faytonla gedirəm. Tanış faytonçumuz var, ancaq bu gün xəstədir. Bir damaqlı oğlandır.

Evə çatanda Mirzə Qulam şeyləri qoltuğuna vurub, tez faytondan düşdü, həyətə girdi. Mən faytonçuya bir beşlik verdim. Razı olmadı, "azdır", – dedi. Bir üçlük də verdim, sağ ol da demədi, sürüb getdi. Fayton gedən kimi Mirzə alçaq və nazik torpaq divarlı həyətin köhnə, işdən düşmüş qapısını açıb, içəridən çağırdı:

– Buyur, gəl!

Mən içəri girdim. Balaca su arxının yanlarında əkilmiş qızılgül, ərik, armud ağaclarının arasından keçdik, Mirzə Qulamın evinə girdik. Saat beş, ya altının yarısı olardı. Yorulmuşdum. Aclıq məni dildən salmışdı. Tez stul çəkib oturdum. Mirzə şeyləri o birisi otağa apardı; təxminən bir on dəqiqə heç bir səs-səda eşitmədim. Darıxdığımdan, acımdan yenə saata baxdım. Yoldaşlarımla axşam görüşünə vədə verdiyim vaxt keçmişdi. Yəqin onlar beş-on dəqiqə məni gözləyəcək, pərt olacaq, dalımca deyinəcək, çıxıb gedəcəkdilər. Nə isə, bu Mirzənin, mənim bu təzə dostumun naharı çox uzun çəkdi.

Mən başıaşağı, əlimdəki saatın əqrəbinə baxır, vaxtımı keçirirdim. Mirzə Qulam tələsik içəri girdi:

– Ay filankəs, – dedi, – oradan cibindən bir on beş manat da mənə ver, vacib iş var, bu saat gəlirəm.

Mən lap məəttəl qaldım. Bu pulsuz vaxtımda, Mirzənin kisəmə daş atmağına müəyyən məna verə bilmədim. Fikirləşməyə vaxt yox idi. Mirzə başımın üstünü kəsmişdi, tələsdirirdi:

– Bircə, mən ölüm, tez ol ki, vacib iş var, bu saat gəlirəm!

O bu sözləri elə qəti, elə ərklə, elə etibarla deyirdi ki, hər kəs olsa cibini boşaldıb, var-yoxunu verərdi. Mən onun dəm-dəsgah düzəltdiyini, nə təhər olmuşsa pulunun çatışmadığını zənn etdim, əsirgəyə bilmədim. Cibimdə qalan son iyirmiliyi çıxardıb verdim. Mirzə, iyirmilik olduğuna daha çox heyifsiləndiyimi duyduğu üçün dedi:

– Eybi yoxdur, beş manatını qaytarar. Tez ol görüm!

Pulu əlimdən qapıb, küçə qapısına tərəf qaçdı. Mən aclıqdan, əsəbilikdən, taqətsizlikdən otura bilmədim, qəbahət sayılsa da, yük yerindən balınc alıb, palazın üstünə atdım və uzanıb dirsəkləndim.

Mirzədən səs çıxmadı. Saat yeddiyə işləyirdi, lap içim üzülmüşdü. Bu saat kabab, qovurma, ya da bozbaş iyinin məni vuracağını, o biri otaqdan samovar cızıltısının başlanacağını, Mirzənin başqa qonaqlarının bir-bir gəlib çıxacağını, ev sahibinin məndən üzr istəyəcəyini, geniş və iştahalı bir süfrə açacağını güman edirdim. Gözüm qapıda, qulağım səsdə idi... Nədənsə həyətdə bir ölüm sükutu hökm sürürdü. Mən təəccüb elədim: "Deyəsən Mirzənin xörəyi başqa yerdə hazırlanır, deyəsən heç bu həyətdə adam yoxdur; bəlkə qonaqlar başqa həyətə, başqa otağa yığılmışlar; bəlkə Mirzənin başı bərk qarışmışdır, mən yaddan çıxmışam..."

Pəncərədən boylanıb həyətə baxanda, arxın bulanıq suyundan, divar dibində eşələnən toyuqdan, əncir ağacının altında yatan ağ pişikdən başqa bir şey görmədim. Yan otağın qapısında da kimsə yox idi. O, otaqla mən olan otağın arasında iki taylı qapı vardı. Qapıya yanaşıb, qorxa-qorxa açar yerindən baxdım. Diqqətlə baxdım, qapı ağzında çömbəlib oturan, corab toxuyan bir qadın gördüm. Daha başqa adam yox idi. "Görəsən bu kimdir? Mirzənin arvadıdırsa, bəs nə üçün belə arxayındır? Qonşudursa, nə üçün Mirzə şeyləri o evə apardı? Qulluqçudursa, gərək bu saat əldə-amanda ola, hazırlıq görə..."

Mən donub qalmışdım. Dedim, bəlkə o mənim burada olduğumu bilmir. Qoy bir səs salım, görüm nə olur. Əvvəl yavaş, sonradan bərk öskürdüm. Qulaq asdım, görüm qadın nə deyəcək. Bir səs gəlmədi. Açar yerindən baxdım, qadın öz işində idi, ip corab toxuyurdu. Deyəsən, o qadın, ağac altında yatan pişik, sarı toyuq, evi bürüyən sükut, həyətdə hiss olunan arxayınlıq – hər şey, hər şey tox idi, yuxulayıb rahatlanırdı. Mən isə bütün əsəbiliyimlə, hirsimlə, aclığımla, qaranlıq bir sərgüzəştə düşmüş kimi, çaşıb-qalmışdım. Nə dinə bilirdim, nə otura bilirdim, nə də dura bilirdim. Belə yerdə səbrə, utancaqlığa, xatır-hörmətə lənət oxudum, eyvana çıxdım, qadından soruşdum:

– Bacı, Mirzə hara getdi?

Qadın özünü yığışdırdı, örpəyini çəkib, başını aşağı saldı, nazik səslə cavab verdi:

– Bir söz deməyib, nə bilim!

– Siz onun əyalı deyilsiniz?

– Onun başı batsın, evdəkilərə sözmü deyər? Kim bilsin harda indi başı qumara, çaxıra qızışıb!..

– Bəs gec gələr?

– Nə deyim, ay qardaş, başı qızışsa, getdi gecə yarısına. Nə işiniz var idi?

Mən qadının bu qəribə sualına cavab tapa bilmədim.

– Heç, – dedim, – ürəyim onu çox istəyir.

Qadın dinmədi. Mən kor-peşman qalxıb, evdən çıxdım; uzaq, tozlu, qaranlıq yolları ac qarına yüyürə-yüyürə, güc-bəla ilə özümü mehmanxanaya saldım.

Odur-budur Mirzə Qulam gözümə görünmür. Görünmür ki, soruşam:

– Dostum, iyirmilikdən qalan beş manatı neylədin?

*1936*

# MÜALİCƏ

Sənə kimdən deyim, özümdən. Günlərin bir günündə, qardaş, Bakıda özümə bəzəkli bir otaq düzəltdim.

Vaqona oturub getdim kəndə. Neçə il idi anamı qoyub gəlmişdim. Orada baxanı yox idi. Həmişə şikayətlənirdi ki, saymırsan. Onun haqlı şikayəti bir yana dursun, özümün arzum var idi. Cavanlıqdır, həmişə ürəyimdən keçirdi: gətirim, anam Bakıda, yanımda olsun, Sovet hökumətinin sayəsində bu mərtəbələrə çatan oğlunun bir xeyrini, bəhərini görsün; o hisli ocaq-bucaqdan qurtulsun, ömrünün bu çağında dincəlsin; evdəcə əyləşib mənə sağlıq istəsin.

Anam da çox sevindi. Ev-eşiyini yığışdırdı, yar-yoldaşı ilə vidalaşdı. Qonşumuz Bəsti qarı, Həmzət xala, Gülbadam qarı ilə dönə-dönə öpüşdülər. Halallaşdılar.

– Qonşuluqdur, – dedi, – arada söz-sovumuz olub, Allah şeytana min lənət eləsin. Keç, ay bacı, halallıq ver, işdir, qəzadır, bəlkə də qayıtmadım.

Gülbadam qarı ağzı dualı arvad idi. Dişsiz ağzında xamır kimi yastılanan, saqqız kimi səslənən sözləri ilə bizi yola saldı. Qərəz, nə başını ağrıdım, kənddən çıxdıq. Anamı sağ-salamat gətirdim gəldim. İki gün çəkmədi, vurdu anam xəstə düşdü.

Dostumdan soruşdum:

– Xəstəliyi nə idi?

– Elə məsələ ondadır. Söhbətimin canı da ondadır. Yaxşı qulaq as, görəcəksən nə idi. Xəstə düşdü, bərk düşdü. Durduğu yerdə arvadı qızdırma götürdü. Qapı-bacanı açdırıb, otağı yelə verirdim, olmurdu. Yaxasını, başını söküb bağırırdı. "Çatladım, boğuldum ki, ay oğul!" – deyə qışqırırdı. "Ay oğul, mənə çarə, partladım!" Doğrusu mən özüm də yaman qorxdum. Dedim evim yıxıldı, arvadın başına hava gəlib, arvad əldən getdi. O yandan da qardaşlarım məndən görəcəklər, deyəcəklər: "Anamız rahat oturduğu yerdə niyə qoymadın otursun. Arvadın başına nə oyun açdın a biqeyrət!.." Dünyada bundan da pis işmi olar? Anana qulluq etmək üçün ev düzəldəsən, işdən-filandan izin alıb gedəsən, vaqona əyləşdirib (özü də yumşaq vaqona gətirəsən, birdən belə mərəkə başlana. Məni dərd götürdü. Fikirləşdim ki, arvada nə oldusa, məndən oldu. Kənddə sapsağlam, top kimi arvad idi: mən bədbəxt olmasaydım, rahat yaşayacaq idi. İndi bunun başına bir iş gəlsə, mən el üzünə çıxa bilmərəm, gün işığına baxa bilmərəm, özümü dənizə atmalıyam, ya da tramvay altına yıxılmalıyam.

Yoldaşımın təfsilatına dözə bilmirdim, tez soruşdum:

– Bəs xəstəliyi nə idi, axı?

– Darıxma, dedi, – qulaq as! Anam: "Bağrım çatladı" deyəndə qalxıb, əlimi başına qoyub, hərarətini ölçürdüm. Termometr bir şey göstərə bilmirdi. Tez pəncərələri, qapıları açırdım. Anamın qoluna girib, pəncərə qabağına gətirirdim. O, sağına-soluna göz gəzdirir, yerə baxır, zıqqıldayırdı, mən ha soruşurdum:

– Haran ağrıyır, ay ana, nəyindir, dərdin nədir, ana can?

O, bir cavab vermirdi. Dik-dik üzümə baxırdı.

Buz gətirtdim, camış qatığı tapdırıb ayran elətdim, sərin şeydir, dedim bəlkə ürəyini basa. Qonum-qonşudan gələnlər olurdu. Di su səp, di əl-ayağını ovxala, damcı dərmanı ver... Bir saat, iki saat kiriyirdi. Bir də görürdün yenə başladı.

Həkim çağırdım. Əhvalatı danışdım. Müayinə elədi. Əvvəl ciyərlərinə baxdı. Nəbzini yoxladı, qan dövranını ölçdü, üzümə baxdı, soruşdu:

– Bu ağır işdən-zaddan yapışmayıb ki?

– Yox, – dedim, – doktor beş-altı gündür kənddən gəlib, gələndən evdəcə oturub, heç bir işə əl vurmağa qoymuram; xörəyi, çayı da hazır gətirirəm. Qaldı ki, kənddə olanda işləmirdi. Balaca həyətimizdəcə oturub, tay-tuşları ilə vaxt keçirirdi. Ağır işi harda gördü.

Həkim anamın özündən soruşdu:

– Əsəbi deyilsən ki, ay ana?

Anam mənim üzümə baxdı və soruşdu:

– Bu nə deyir?

– Hirsli deyilsən ki, acığın tutmur ki?

Anam elə bildi ki, həkim onun döş-başına əl vurduğu üçün üzr istəyir. O:

– Nə bilim, – dedi, – acığım niyə tutur. Qiyamətin günündə o da mənim oğlum...

Mən həkimə cavab verdim ki, xasiyyəti mülayimdir.

– Bəlkə qorxubdur?

– Ay ana, bir şeydən qorxub eləməmisən?

Anam başı ilə yox işarəsi verdisə də həkimin sözü ağlıma batdı. Dedim yəqin belə nagahani iztirab ancaq qorxudan ola bilər. Yavaşca həkimə pıçıldadım. O, əsəbləri və ürəyi sakit etmək üçün dərman yazdı. Evdən çıxanda mənə dedi:

– Anan çox sağlam adamdır, haracan desən! O xəstəlik ki, sən deyirsən, doğrusu, mən onda tapa bilmədim. Bu dərmanları verərsən içər. Amma səndən xahiş edirəm nəticəsini mənə deyəsən. Mən özüm bu xəstə ilə maraqlanıram.

* * *

Həkimin yazdığı dərmanı anama çətinliklə içirtdim. Çimçişirdi, ürəyi götürmürdü. Mənim üzümdən keçmirdi. Mən evdə olmayanda bir damcı da içmirdi. Hamısı birdir, içsə də, içməsə də, dərman kar eləmirdi. Anam əvvəlki kimi öz qaydasında iztirab çəkirdi; darıxırdı, yaxasını cırır, tez-tez köksünü ötürürdü; ağır nəfəs alırdı.

Yoldaşlardan biri mənə məşhur həkimin ünvanını verdi. O həkim, deyildiyinə görə, ürək xəstəliklərində ad qazanmışdı. Özü də professor idi. İstədim həmin professoru çağırım. Bir də xəyalıma gəldi ki, əvvəlki həkim məndən xahiş eləmişdi, “maraqlanıram” – demişdi. Yəqin o, anamın xəstəliyindən bir şey bilir. Bəlkə dərmanın kar eləmədiyini desəm, kişi əsil azarı tapacaqdır. Onu çağırmasam da, verdiyi dərmanın nəticələrini ona deməliyəm. Mən bu fikir ilə pilləkənlərdən düşürdüm. Həmin həkimin bizə gəldiyini görüb qayıtdım. Görən kimi soruşdu:

– Ananın halı necədir, dərman kar eləyirmi?

– Edə əvvəlki kimidir, – dedim. Dərmanın kar etmədiyini söyləməyə dilim gəlmədi. Bu, zənnimcə, doktordan ayıb olardı.

Qapını açıb evə girəndə anamın yenə ah-vay eləyə-eləyə bir əli sinəsində evi gəzindiyini gördük. O, həkimi görüb yaşmağını qaldırdı, yaxasını çəkdi, mənim üzümə baxdı.

Həkim bir də müayinə elədi, bu dəfə daha diqqətlə müayinə elədi. Mənə dedi:

– Çətin olmaz ki, ananı bir bizə aparaq?

– Nə var, – dedim, – buyurun gedək.

Anam özü də çıxmaq istəyirdi. Zəng elədim, taksi maşını gəldi. Oturub həkimin evinə gətirdik. Doğrudur, gedirdik, amma mən nə üçün getdiyimizi bilmirdim. Bəlkə həkimin evdə daha mühüm və vacib priborları vardır. Bəlkə anamı rentgenə salacaqdır. Kim bilir, bəlkə ayrı müayinəsi var!

Sanki həkim mənim nə fikirləşdiyimi bilirdi, şoferin yanından mənə tərəf döndü və dedi:

– Bizdə ananı bir də müayinə edərik, amma arxayın olun ki, qorxulu heç bir şey yoxdur, bir az ürək narahatlığı var. Onu da rəf etmək asandır. Təki ananda olan o polad can məndə olaydı!

Anam elə bilirdi həkim mənə təsəlli verir. Dinmirdi. Gözləri düz şoferin kürəklərinə dikilmişdi. O, maşında səliqə ilə oturmuşdu, dümdüz qabağa tərəf baxırdı. Sanki gözünün qırağı ilə yana baxsa, günah olardı.

Həkimin evi dəniz kənarında, böyük beşmərtəbəli bir binada idi. Ana altdan yuxarı uca və uzun pilləkənlərə baxanda, həkim duymuşdu:

– Qorxma, – dedi, – ana, qoymaram bu pilləkənləri piyada çıxasınız, bəri gəlin!

Anam həkimə tərəf döndü. Amma bir şey başa düşmədi. Avtomobilin pilləkənlərə yerləşmədiyini bilirdi. Piyada çıxmamaq üçün, onun fikrincə, bir adamı minmək lazım gələcək idi. Buna da, şübhəsiz, anam razı olmazdı.

– Yox, oğul, – dedi, – zəhmət çəkmə, özüm çıxaram. Həkim düyməçəni basdı. Liftin qapısı açıldı. Biz əyləşdik. Lift bizi göyə qaldırdıqca, anam döyükürdü, uca pilləkənləri, dalanları keçə-keçə mərtəbələri ötüb göyə doğru yüksəldiyimizi gördükcə, ehtimal, anama elə gəlirdi ki, "Həzrət İsa kimi qeyb olmağa" gedirik. Anamın rəngi qızar-

mışdı. Gah sağa, gah sola baxırdı. Hər şeyin yerə çökdüyünü güman etdiyindən vahimələnirdi.

Həkim məni öz kabinetinə apardı, yer göstərdi:

– Əyləş!

Mən oturdum, həkimin kitablarla əhatə olunmuş kabineti mənə müayinə otağı yox, kitabxana kimi görünürdü. Arxayın, olsaydım, əlimi qəfəslərə atıb kitablara baxardım. İndi isə anamdan başqa heç şey gözümə görünmürdü. Gözüm həkimdə idi. Onun hər hərəkətini izləyirdim. O, əvvəlcə kostyumunu soyundu, köynəyinin boğazını açdı. Əllərini yuyub quruladı, gəlib stolun dalında əyləşdi. Onun belə tələsmədən, adi qayda ilə, sanki müayinəyə yox, istirahətə hazırlaşdığını görəndə, o biri evdə isə qulluqçunun cingildəyən şeylər yuduğunu eşidəndə mən yəqin elədim ki, anamın xəstəliyi çox ciddi xəstəlikdir. Ya işığa salınacaq, ya da operasiya olunacaqdır. Ona görə həkim tələsmir, pribor təmizlədir. Mən bunları fikirləşir, ürəyimə çökən qorxuya təslim olmamağa çalışırdım. Birdən həkim dilləndi:

– Əzizim, – dedi, – açığı sənin ananda heç bir xəstəlik yoxdur, heç bir dava-dərman müalicəsinə, ya xəstəxanaya ehtiyacı yoxdur. Amma bununla belə ona salamat demək olmaz. Mənim gümanım gələn bir diaqnozu bu gün yoxlamaq istəyirəm, istəyirəm sənin özün də müşahidə edəsən, inanasan. Bu saat sənin anan nənəmin yanında əyləşmişdir. Onların yanında heç kəs yoxdur. Onlar üz-üzə əyləşib söhbət edirlər. Buyur, burada pərdəli pəncərənin dalında əylə, dinlə, gör ananın halı necədir, gör o özünü necə hiss edir.

Bu tapşırıq mənə qəribə gəldi. Bu nə deməkdir? Onun nənəsinin anamın xəstəliyinə nə dəxli var? Ancaq qəribə gəlsə də, bu tapşırığını yerinə yetirməyə tələsdim ki, görüm axırı nə olur.

Nazik cuna pərdəli balaca pəncərənin dalında oturub baxanda qarıları hər ikisinin döşəmədə bardaş qurub, qabaq-qabağa oturduğunu və üfürə-üfürə çay içdiyini gördüm. Anam nəlbəkiyə tökdüyü çayı içə-içə söhbət edirdi:

– Allah köçənlərinizə rəhmət eləsin, mənim bir qayınxatınım var idi, ayrı cür şey idi. Məni elə istərdi ki, indi istəməsin, can bir ciyər kimi; mənsiz addımını bayıra qoymazdı; mənsiz bir tikə yeməzdi, dinməzdi, bir danışmaq, bir qaqqıltı, bir şaqqıltı... Ay məşədi bacı, daha nə deyim!

Anamın sözünü dinləyən qarı başını əyib, "bəli" deyirdi. Ancaq dözmürdü, əli ilə işarə verib, onun sözünü kəsmək, özü danışmaq istəyirdi:

– Sözünün dalınca oğlanların dursun, elə mənim İsmət bacılığımı görəsən, bizimkinə bacılıq demə, vallahi heç bir bacı belə mehriban...

Anam onu susdurdu:

– Heç yadımdan çıxmaz gəlin getməyim. Sözünü də kəsirəm, bacımla məni, üzüm də səndən qara, lap bir tikə boyda olanda köçürtdülər. Oğlan demişdi görmüşəm, bəyənmişəm, vəssalam! Axı bizlərdə kəhrizə suya gedərlər. Lap balaca idim, sənəyi götürə bilmirdim, hıqqanırdım. Bir də gördüm bir oğlan sənəyi əlimdən aldı, mən biabır oldum ki!..

Qarı başını tərpədə-tərpədə təsdiq elədi:

– Mənim özüm bəyəm indikilər kimi gördüm, getdim? Bacı canı, heç bir şey qanmırdım. İnandığımıza and olsun, paltar gələndə...

Anam yerindən ona tərəf boylanıb, bərkdən dedi:

– Paltar, mənə bir qanavuz arxalıq...

Qarı qulaq asmaq istəmədi, başını aşağı salıb, söhbətinə davam etdi:

– Paltar gələndə mən həyətdə qum-qum oynayan bir parça uşaq idim. Heç yadımdan çıxmaz, dayım məni qucağına...

Anam dözə bilmədi, əlini uzadıb ovcu ilə qarının ağzını örtmək istədi:

– Bir gör nə deyirəm, ay qız, neçə taxtadan bir tuman çıxardı. Ay allah, tumanımı sürüyənəcən mənimki mənə dəyərdi.

– Sən öləsən, mən də elə idim! Tuman da ki, bir yorğan-döşəkdi! Özü də dəstə-dəstə təzə idi, yeriyəndə xış-xış, xış-xış!

– A qız, cehiz var, cehiz var!

– Yorğan-döşəyi mənim anam haçandan tutmuşdu. Nə bilim. Mən gözümü açanda oğlan evində cehizimi hazır gördüm, deynən bir necə!

– Ağız, cehiz var, cehiz var!

Özünü tərifləyən anam dedi:

– Kiri, kiri, bəyəm mənim cehizimi görmüsən ki, elə deyirsən? And olsun aramızda olan bacılığa, and olsun...

Bir də gördüm həkim mənə him eləyir:

– Bir qapıdan ananın halını soruş.

Mən gəldim, qapını açıb dedim:

– Ay ana, kefin necədir, özünü necə hiss eləyirsən?

Mənə dilucu cavab verdi:

– Çox yaxşıyam, oğul!

Müsahibilə söhbətini davam etdirdi.

– Darıxmırsan ki, ana?

– Yox, oğul, arxayın ol!

– Bəs naxoşluğundan, zaddan...

O iki əlini sevinclə yuxarı qaldırdı:

– Oğul, deyəsən axı lap yaxşılaşmışam. Ürəyim də sakit olub, məşədi bacı ilə söhbət eləyirik. İşin varsa, sən get!

Mən nə isə demək istəyirdim, həkim qolumdan tutub çəkdi.

– Bəri gəl, – dedi, – mən deyəndir, tapmışam onun azarını. O, çox danışandır. Çənəsi öyrənib, sən onu, yəqin həmsöhbətlərindən ayırmısan. Görürsən nənəm ilə bir saat oturanda necə kefi sazlandı! Budur ki, var! Onun azarı söz-söhbət azarıdır. Onun çənəsinin altına belə bir qarı arvad sal ki, qulaq asmağa tabı olsun, ayrı heç bir dərman lazım deyil.

Həkimin təcrübəsi mənə çox qəribə və yeni bir icad kimi gəldi. Heyran qaldım. Anamın kənd müsahiblərini, güc ilə yadıma sala bildiyim Gülbadam qarını xatırladım. Pəncərədən içəri qışqırdım:

– Ay ana, Gülbadam xala gəlib, xəbərin varmı?

Anam əlindəki stəkanı yerə elə bərk çırpıb qalxdı ki, az qaldı stəkan çilik-çilik ola. Qalxmağı ilə eyvana çıxmağı bir oldu. Məni danışdırmadı, sevincək, ayaqyalın, qollarını ata-ata, qızarmış gözləri böyümüş halda, gülümsəyə-gülümsəyə düz pilləkənlərə tərəf yüyürdü. Qapının cırıltısını eşidər-eşitməz dilləndi:

– Ay ərkansız arvad, harda qalmısan, çatladım ki, harda qalmısan, ürəyim partladı ki! Gəlsənə, bir gəlsənə görüm nə var, nə yox!..

Pilləkənlərdən çıxan bir ucaboy nabələd kişini görəndə anam kül kimi söndü. Gözlərini çevirib mənə baxdı. Baxışı ilə sanki soruşurdu: “Hanı Gülbadam?”

– Darıxma, – dedim, – ay ana, gələr. Sən başmaqlarını geyin, hazırlaş gedirik!

Mən həkimin əlini sıxdım, razılıq etdim. Tezliklə ya Gülbadam qarını anama, ya da anamı Gülbadam qarıya yetirməyi qət etdim.

Həkim mənə məsləhət elədi:

– Sonra onların hər ikisinin ictimai müalicəsi ilə məşğul olmaq lazım gələcək, bunun yolunu sən məndən yaxşı bilirsən. Yavaş-yavaş

onları kinoya dadandır. Bir dəfə gördükləri kinodan bir il söhbət eləyəcəklər. Bu, onların şüuruna təsir etmək üçün əldə vasitə ola bilər. Əlbət ki, müalicə müvəqqəti vasitələrdən ustayana istifadə etməyi bacarmaqdan asılıdır. Mən isə sizin bacarığınıza əminəm.

Mən həkimdən ayrıldım, anam isə qarıdan ayrıla bilmirdi.

* * *

Dostum söhbətini bitirməmiş mən həmin həkimin məharətinə əhsən dedim. Dostumun anasının ictimai müalicəsi ilə maraqlandım, müalicənin nə ilə nəticələndiyini bilmək istədim:

– De görüm, anan ilə rəftarın necə oldu? Onu kəndə apardın, ya Gülbadamı gətirdin?

Dostum dedi:

– Heç birini eləmədim. Anamı bir dəfə kinoya apardım və aldatmağa məcbur oldum. Bilirsən, dedim, ana, heç səni kinoya gətirməzdim, mömin adamsan, üz vurmazdım, ancaq mənə iş yerimdən tapşırıblar ki, gərək kinoya baxasan, orada nə olub, gəlib idarə yoldaşlarına daklad eləyəsən. Mən özüm baxıram, amma fikrim dağınıqdır. Hamısı yadımda qalmır. Sən bax, sonra mənə deyərsən...

Anam bir az çətinlik çəkdi:

– Mən nə bilirəm, nə deyim! Dil bilmirəm ki...

– Yox, – dedim, – ancaq fikir ver, gör kim gəlir, kim gedir, kim nə eləyir, niyə eləyir. Sonra mənə deyərsən, yadıma düşər.

Nə isə, anamı razı saldım. Anam düşdü kinolara. Bax, indi yenə anam kinodadır, azca qalıb, indi qayıdar.

Dostum söhbətini qurtarmamışdı ki, şüşəbənd qapısının çalındığını gördüm. Çox çəkmədi sarafan geymiş, saçını peysərinə yığmış qıvraq bir qadın içəri girdi, gülümsər halda mənə baxdı:

– Xoş gəlibsiniz!

Dostum işarə elədi:

– Tanış olun anam ilə! Ay ana, bir danış görək necə kinodur!

Qadın oturdu, gördüklərini vəcd ilə, şirin-şirin danışmağa başladı. Mən dostum dediyi kimi qarının söhbətinə maraqla qulaq asırdım.

*1938*

# KƏMTƏROVLAR AİLƏSİ

*Hörmətli ədibimiz Ə.Haqverdiyevə*

1

– Yallah, yallah! Haradasan? Kefin necədir?
– Sən nə təhərsən?
– Göz dəyməsin, qıvraqlaşmısan, rəngin açılıb.
– Bir qıvraqlığım yoxdu. İşdən baş açıram ki.
– Neyləyək ki, bir görüşək?
– Bu vıxodnoy zanitəm. Gələn vıxodnoy bəlkə...
– Sən evdə olacaqsan?
– Söz versən, gözlərəm.
– Gözlə, birtəhər eləyib gələrəm.

Bir-birinin əlini hərarətlə sıxan, əhvallaşan bu əziz dostlar görəsən kimdir?

Desəm onların ikisi də bir şəhərdə yaşayır, inanmayacaqsınız... Desəm onlar bir evdə yaşayırlar, heç inanmayacaqsınız. "Necə ola bilər ki, bir yerdə yaşayasan, bir-birindən xəbərsiz olasan?" – deyəcəksiniz. Desəm onlar ər-arvaddırlar, təəccüb edib, deyəcəksiniz: "Nə danışır bu!"

Nəyə deyirsiniz and içim ki, belədir: Qulam Kəmtərovla arvadı Leylanın həyatı belədir. Deyəcəksiniz yəqin Kəmtərovla Leyla keçmişdə, bir zaman ər-arvad olublar, sonradan xasiyyətləri tutmayıb ayrılıblar, bir yerdə yaşamaları da mənzilsizlik bəlasıdır. Xeyr, sizin bu gümanınız da düz deyil. Nə Kəmtərov Leylanı boşayıb, nə Leyla Kəmtərovdan boşanıb. Əgər günü bu gün mənzil idarəsinin müdiri Kəmtərovu, ya Leylanı çağırıb, üçüncü qatda dörd otaqdan ibarət bir qurulu mənzilin açarını verə, təklif edə ki, biriniz köhnə mənzildə qalın, biriniz köçün, heç biri köçməz. Birbaş qayıdıb, öz evlərinə gələrlər. Mənzil idarəsinin də zəhməti hədər gedər.

Məsələ bunda deyil.

Bəs nədədir?

Kəmtərovu sizə tanıtmaq üçün gərək bir az vaxtınızı alam.

Kəmtərov Qulamla Leyla, bayaq dediyim kimi, ər-arvaddırlar. Özü də "xala-xatirin qalmasın" yox. Lap istəkli, şairlər demişkən, aşiq-məşuqdurlar. Cəmi iki il olmaz ki, toy ediblər. Asanlıqla da toy etməyiblər. Leyla Qulamın ucundan bir il ata-anası ilə küsülü qalıb.

Qulam Leylanın uğrunda İçərişəhərdə bıçaqlanıb, qulağının dibində yaranın yeri indi də durur və ölənəcən duracaq.

Qış da onları bir-birindən soyuda bilməz. Qulamın şorgöz oğlanlardan acığı gəlir. Leyla da könlü-gözü tox qızdır. Yer üzündə Qulamdan başqa kişi olduğuna inanmaz.

Bəs bu istəklilər niyə belə çətin görüşür, az-az görüşürlər? Mümkün deyil ki, ər-arvad olasan, istəkli olasan, bir evdə yaşayasan, həftə ilə görüşməyəsən. Ürəyinizə şübhə gələ bilər: “Bəlkə açıq deyilməsi ayıb olan səbəblər üçün görüşməyə ehtiyac duymurlar”.

Yox, heç yox!

Onu da bilin ki, nə Qulamın, nə Leylanın qulluğu uzaq – kənarguşə yerdə və ya namünasib qulluq deyil. İkisi də şəhərdə çalışır. Onların qulluğunda olan minlərlə qız, oğlan, ər, arvad, qəşəngcə yaşayır, günün çoxunu evdə öz külfətləri ilə olurlar.

Bəs bizim qəhrəmanların azarı nədir?

Bu, bir az köhnədən qalma azardır.

Başdan danışaq. Deyə bilərəm dünyada beş nəfər arvadını sevən varsa, biri Qulam Kəmtərovdur. Kəmtərovun nə eşqlə, nə sevda, nə həvəslə toy edib, Leylanı evinə gətirdiyini qələm yazmaqdan acizdir. Ona elə gəlirdi ki, dünyanın bütün naz-neməti, kef və ləzzəti Leylanın üzündə cəmlənmişdir. Leylanı alsa, həyatda bir arzu-kamı qalmayacaq, tamam xoşbəxt olacaq.

Kəmtərov düşünürdü ki: “Bu mənim ən ağır və ən son çətinliyimdir. Toy dəsgahını tamam-kamal düzəldib, xeyir işimi başa versəm, daha ömür-billah arxayın olaram. Sonra bir tikə yavan çörək də tapsam, sevgilimlə qabaq-qabağa əyləşib, ağız ləzzəti, iştaha ilə yeyərəm”.

Ancaq, necə deyərlər, insanın gözünü torpaqdan savay heç nə doyurmaz. Kəmtərov xeyir işini bitirəndən, dünyada ən böyük arzusuna çatandan sonra bir də gördü ki, xeyr indi də ürəyi yeni-yeni şeylər istəyir. Könlü min bir eşqə düşür. Hardansa, baharda bitki kimi göyərib baş verən arzu və ehtiyaclar kişini məşğul etməyə başladı. Dünya gör-götür dünyasıdır.

Leyla görürdü ki, artist Əyyubun arvadı barmağında cüt-cüt brilyant üzük, qulağında bahalı sırğa qırğı kimi gəzir. Görürdü ki, qıyıq Ələkbərin üçmərtəbə evinə hamballar piano çıxarır; qoz ağacından düzəlmə mebel daşınır; bədənnüma güzgü, Varşava çarpayısı, Quba xalçası gəlir. Leyla bunların hamısını görürdü və Kəmtərova danışırdı. Kəmtərov qaşlarını çatır, başını tərpədib arvadını inandırırdı:

– Bilirsən nə var, Leyla can, biz gərək işləyək! İşləyək. Lap möhkəmcə işləyək! Mənim də qeyrətim qəbul eləməz. Qıyıq Ələkbərin nəyi məndən artıqdır? Özümüzü oda-közə vursaq da, gərək bir dəsgahlı ev-eşik düzəldək. Qonşular baxsın, yana-yana qalsın.

Leyla ərinin məsləhətindən çıxan deyildi. Təki pul olsun...

Kəmtərov əvvəlcə Leylaya bir iş soraqlaşdı. Leyla qızlığında maşinistkalıq etmişdi. Bu sənəti pis bilmirdi. Kəmtərov arvadına iki yerdə iş tapdı: Azərittifaqda və Ünvanlar bürosunda. Bir çox götür-qoydan sonra hələlik, rast gəlmişkən, hər iki yeri əldə saxlamağı məsləhət bildilər. Azərittifaqda iş səhər səkkizdən dördə qədər, Ünvanlar bürosunda axşam saat beşdən on birə qədər idi. Leyla iki növbə ilə işləməyə razı oldu. Kəmtərov, onu ev işindən, sil-süpürdən tamam azad etdi.

Leyladan arxayın olandan sonra Kəmtərov özünün boş vaxtlarını “doldurmağa” başladı. Kəmtərov zirək və savadlı adam idi. İş tapmaq onun üçün su içmək kimi asan bir şey idi. Özü nəşriyyatda tərcüməçi idi. Səhər saat ondan gedib, altıda çıxırdı. Bir saat dincini alandan sonra, yəni saat səkkizdən on ikiyədək layihə idarəsində olurdu. Fikirləşib gördü ki, iki növbədə işləsə də, arada yenə boş vaxtı var: “Səhər saat onadək yatmaq bu zəmanənin adamına, xüsusən “roskoşni” güzəran qurmaq istəyən bir abırlı kişiyə heç yaraşmaz. Yarım, ya bir növbə işi rahat apara bilərəm. Beş-altı yüz manat alsam, əlimi qaraltmaz ki...”

Kəmtərov daha bir yeni iş tapdı. Gecə saat on ikidən dördədək “İşıq” mətbəəsində korrektor vəzifəsi var idi. Ayın səkkizindən Qulam mətbəədə yeni əlavə qulluğa düzəldi.

Bu gün Kəmtərov toy gecəsindəkindən az sevinməmişdi. Haqq-hesaba vurub görürdü ki, özünün üç qulluğunu, Leylanın iki qulluğunu, bir az da “o yan-bu yandan” gələn əl xərcliyini yığıb-yığışdıranda bir neçə minə çıxır. İki-üç il belə getsə, çervonu yığıb-yığışdırmaq olmaz. Di qoy Ələkbər gəlsin, qıyıq gözü ilə gətir-götürümüzə baxsın!

2

Payızın soyuq günlərində ağzından buğ çıxa-çıxa Kommunist küçəsilə başıaşağı yeyin gedən boz paltolu adamı kim görməmişdir? Onun üzündən, gözündən, baxışından, yerişindən tələsmək yağır. Elə gedir ki, deyərsən: yerə dəysə, min parça olar. Sürtülməkdən rəngi dəyişmiş köhnə və “hamilə” portfelini bu qoltuğundan o birinə verir;

gah əlini cibinə qoyur, gah damağındakı papirosu barmaqları arasına alıb sıxır, gah çəkməsinin sallanan bağına baxır, məna vermir, daha da yeyinləyir. Bəzən görürsən Kəmtərov qopdu, nə qopdu! Tramvay sürətlə ötdüyü halda quş kimi atılıb minir, milis ağzını açmamış çıxardıb bir üçlük verir, qəbz almaq istəmir. Uzaq tanışlarına bir işarə ilə salam verir. Yaxın tanışlarını görür, görməzliyə vurur. "Müftə yerə niyə vaxt itsin?" Vaxt alan hər bir əyləncə Kəmtərovun düşmənidir. Onu ictimai yerlərdə görməzsən. İş yerində ancaq vacib, ad yoxlanan iclaslara gələr, adını qeyd etdirib, xəyal kimi gözdən itər. Teatr, kinolar barədə yoldaşlardan eşitdiyilə kifayətlənər.

Bəzi yazıçılarla şəxsən tanış olduğundan, əsər oxumağa ehtiyac duymaz. Qohum-əqrəbası rayondadır. Buradakılar isə Kəmtərovun ünvanını ələ keçirə bilmirlər. Kəmtərovun şəxsi, ictimai həyatı beləcə öz qaydasındadır.

O, ailədə daha ciddi, daha səliqəlidir. Bir adam onun evindən səs-küy, qalmaqal eşitməyib. Qapı açıq olanda olur, olmayanda girvənkəlik qıfıl qarovul çəkir, evə quş səkmir. Kəmtərov səhər saat onda yuxudan qalxır. Deyəcəksiniz, onda işə gedən adam heç olmasa bir saat tez durmalıdır. Doğrudur, durmalıdır, amma unutmayın ki, yazıq Qulam mətbəədən, təshih işindən tez qayıdanda gecə saat dörddə, beşin yarısında qayıdır. Necə qayıtdığından özünün də xəbəri olmur. Qəzetin axır səhifələrini mürgüləyə-mürgüləyə, alnı tıqqıltı ilə stola dəyə-dəyə oxuyur. Birtəhər özünü evə salır, çul kimi düşür.

Qulam olmasın, siz olun, saat doqquzda dura bilərsinizmi?

Kəmtərovun səslənən bir stol saatı var. Qulağının dibində qoyur. Vaxta on dəqiqə qalmış saat qışqırır. Kəmtərov dəli kimi yuxudan qalxır, tələm-tələsik geyinir, qapını bağlayıb qaçır.

Leylanın da işi Qulamınkından əskik deyildi.

Atalar deyib: "Arvad ərinə oxşayar". Xülasə, baş elə qarışmışdı ki, Qulamın Leyladan, Leylanın Qulamdan xəbəri olmurdu. Qulam gecə mətbəədən qayıdanda sevgilisini yatmış görürdü. Leyla səhər işə gedəndə Qulamı şirin yuxuda qoyub gedirdi. Vacib sözü olanda balaca kağız yazıb, stolun üstünə qoyurdu: "Qulam, qayğanaq bişirəsi olsan, yumurta bufetin alt gözündədir, yağ da taxçada".

Qulam da gedəndə Leyla üçün kağız qoyub gedirdi. Onların arasında əməlli-başlı bir məktublaşma var idi. Ancaq markasız, poçtalyonsuz ötüşürdülər.

Leylanın məktubları bu məzmunda idi: "Dəyişiklərini tiyanın içinə tulla, paltaryuyana göndərəcəyəm!" "Açarı asma. Çarhovuzun üstündəki kərpicin altına qoy, görən olmasın". "Redaksiyadan dalınca gəlmişdilər, zəng vur".

Qulamın məktublarından ələ keçən bunlardır: "Qadası, mənim soyuz kitabçamı görməmisən? Tapsan, stolun yeşiyinə qoy". "Maşinkada yazmağa vaxtın olsa, bizim idarədə xaltura var, gətirim", "Adama cavab niyə yazmırsan? Dediyim məsələ necə oldu?"

Bu qısa və gündəlik məktublar Kəmtərovlar ailəsində yeganə və əsas münasibət idi.

Qulamla Leylanın sevgi və məhəbbəti bu məktubların qara, dolaşıq, tələsik xətlərindən keçirdi. İnsan hər şeyə alışarmış! Bu sevgili ər-arvad qurduqları yeni yaşayışa elə öyrənmişdilər ki, "köhnə" həyatı tamam unutmuşdular. Onlar indi belə güman edirdilər ki, dəmdəsgahlı ev qurmaq istəyənlərin, oxumuşluğun, qarşılıqlı sevgi ilə qurulmuş ailənin qaydası belədir ki, var.

Doğrudur, Leyla yazırdı ki: "Açarı kərpicin altına qoy, görən olmasın", Qulam da çalışırdı ki, istəklisinin tapşırığını yerinə yetirsin; amma olacağa çarə yoxdur, açarı görən olmuşdu...

Bir Sarıköynək qadının hər gün saat ondan, Qulam gedəndən sonra gəlib, qayda ilə kərpicin altından açarı götürdüyünü, öz evi kimi Kəmtərovların otağını açdığını və tər-təmiz silib-süpürdükdən sonra çıxıb getdiyini qonşular görmüşdülər. Onları şübhədən çıxarmaq üçün Sarıköynək qadın deyirdi: "Mənə özləri tapşırıb, bacılar, ürəyinizə bir şey gəlməsin".

Dili dinc durmayan qonşu qadınlardan biri Sarıköynək qadının gəlib-getdiyini Qulama dedi. Qulam güman etdi ki, Leylanın gətirdiyi qulluqçu qadın olacaq. Leyla da düşünürdü ki, Sarıköynək qadını Qulam çağırıb, səliqə-sahman üçün çağırıb. Eşidən kimi qonşuya sualı bu oldu:

– Cavandı, ya qoca?

– Ahıl adamdır, bir nazik...

Leyla Qulamın pis niyyətə düşmədiyini bilib, arxayın oldu. Daha bu barədə söhbəti artıq sayıb, qapıdan çıxdı.

Bu günlərdə belə məktublar yazılırdı: "Mənim ipək paltarımı hara qoymusan?". "Zayomları tapa bilmədim. Çıxart yoxlayaq, yenə uduş var". "Gümüş qaşıqlar haradadır?", "Dünən bir qadının başında, lap səninkinə oxşar bir şal gördüm. Az qalmışdım səni dəyişik salam".

Sarıköynək qadın isə öz işində idi. Hər gün gəlib evi süpürür, zəhmət haqqı üçün də ağlı kəsən, evdə gözə dəyən şeylərdən birini sarı köynəyinin altına vurub, soldat bazarına aparırdı. O, Qulamın da, Leylanın da iş-peşəsini, üst-alt paltarlarını, qulluq vaxtlarını yaxşıca öyrənmişdi. Odur ki, evə çox arxayın gəlib-gedirdi. Hətta bir dəfə "köhnə paltar alan" pullu müştərilərdən bir-ikisini özü ilə lap evə gətirmişdi. Qulamın bufetindəki şüşələrdən pivə töküb, bir-birinin sağlığına və bu pivəni bazardan alıb gətirənin sağlığına içmişdilər. Sonra yük yerindən yorğanlardan soyduqları ipəyi, çarpayı xalçasını, sandıq şeylərindən dəyərlisini ortaya töküb sövdələşmişdilər.

Pullu müştərilərlə yollaşandan, çervonları alıb yerbəyer edəndən sonra Sarıköynək qadın Qulamın məscidə dönmüş evinə baxıb, ürəyində demişdi: "Yox, balam, daha mən bir də bura nə üzlə gələ bilərəm!.. Həmişəlik xudahafiz!"

3

– De görüm, bir korrektor kimi səhifəni oxuyub, qol çəkmisən, ya yox?

– Bu nə sözdü, yoldaş redaktor? Siz məni o qədər məsuliyyətsiz sayırsınız ki, guya oxumamış da qol çəkərəm?

– Demək, oxumusunuz?

– Əlbəttə, özü də kəlmə-kəlmə!

– Bəs bu nədir: "işləyirlər" əvəzinə "dişləyirlər" gedib?

Qulam qəzetin o yerinə diqqətlə baxdı. Ciddi vəziyyətini pozub dedi:

– Bu heç, buna səhv deməzlər! Gözdən qaçıb, yoldaş redaktor. Bir də, işləyib, dişləyib, ikisi də bir sözdür. Yəni düz gəlir. Bizim qaydamıza lap tuş gəlir ki, işləyən dişləyər, işləməyən dişləməz!

Redaktor qəzeti çəkib, Qulamın əlindən aldı:

– Neçə yerdə işləyirsən?

Qulam dik-dik baxdı:

– Bunun məsələyə nə dəxli var?

– Soruşuram, neçə yerdə işləyirsən?

– Cəmisi bir-iki...

– Nəşriyyatda çalışırsan?

– O heç... səhərdi o.

– Layihə idarəsi necə?

– Cəmisi bir altı saat.

– Zaqotzernoda necə?

– Yoldaş redaktor, o zdelnidir!

Redaktor hirsləndi:

– Yaraşarmı sizə, yaraşarmı bu qədər yerdə...

– Yaraşmasın o adamlara ki, işləmirlər. Biz ki gecə-gündüz çalışırıq, tər tökürük, bu da mükafatımızdırmı?

Redaktor ayağa qalxdı:

– Sizin bugünkü səhvinizin üstündən keçmək olar. Saydığım yerlərdən azad olunmasanız, sabah işə buraxılmayacaqsınız. Yorğun başla, üzgün zehinlə mətbuat işinə xeyir vermək olmaz!

Qulam qalxıb ətəklərini tovlaya-tovlaya, fikir içində yeni və pullu qulluq xəyalı ilə evə gəldi.

O axşam Leylanın da gözünə yuxu getmədi. Pambıq kimi atım-atım edilmiş evdə, əli qoynunda oturub Qulamı gözlədi. Ürəyinə min cür fikir gəlirdi: "Bu nə işdir! Yoxsa Qulam özgə bir arvad alıb, mənə kələk gəlmək istəyir? Yoxsa şeyləri yarı bölüb, öz payını aparmaq istəyir? Bəlkə də heç bu zalım oğlu işləmir, bəlkə də vaxtını restoranlarda keçirir? Var-yoxunu şəraba, qumara qoyur?.. İnsanı nə tanımaq olar!"

Gecə də orucluq ayı kimi uzanırdı. Leyla gah durub yük yerini töküşdürür, anasının cehiz verdiyi ipək yorğanı, xalçanı axtarır, şaraqqıltı ilə bufetin gözlərini açıb, örtür, işıldayan hər şeyi götürüb diqqətlə baxır, gümüş qaşıqların itdiyinə inana bilmirdi.

Aləm yıxılıb yatdı. Radio susdu. Tramvaylar dayandı. Xoruzlar bir ağız səsləndi. Haçandan-haçana birdən həyətdə ayaq səsi eşidildi. Qulam içəri girib, Leylanı əli qoynunda, məyus oturmuş görəndə, əvvəl bir duruxdu, soruşmaq istədi ki: "Əzizim, niyə bu zamanacan yatmamısan?"

Gözü evin ortasına tökülmüş şeylərə sataşdı.

Leyla macal vermədən. Sökülmüş pərdələri, tökülmüş yükü iki əli ilə göstərib dedi:

– Bu nədir? Bu nə hərrac bazarıdır?

Qulamın dili dolaşdı:

– Necə bəyəm, nə gedib?

– Mənim cer-cehizim hanı? Hanı mənim ev-eşiyim, paltarlarım, ata-ana yadigarlarım?..

Bunu deyib Leyla hönkür-hönkür ağladı. Qulamın rəngi saraldı.

– Bəs kim açıb bu qapını? – deyə təəccüblə soruşdu. Onların səsinə qonşular çıxdılar.

Sarıköynək qadından kim nə bilirdisə dedi. Leyla bir tərəfdə yıxılıb, hissiz qaldı. Qulam qonşulardan iki nəfər şahid götürüb, milis idarəsinə yollandı.

O, sinəsindən ah qopa-qopa, ürəyində peşmançılıq qaynaya-qaynaya gedirdi. Ancaq bilmirdi kimdən şikayət etsin. Sarıköynək qadındanmı, qonşularındanmı, yoxsa özünün dəm-dəsgah hərisliyindənmi?!

*1939*

## SUSUZLUQ

Payız yeni girmişdi. Ancaq yayın yandırıcı istisi, boğucu bürküsü davam edirdi. Biz şəhərdən çıxmış, yaxın kəndlərin birinə doğru yol almışdıq. Yolun hər iki tərəfi də quraqlıq və bomboş idi. Uzaq dağların döşündə saralan küləşli zəmilərdən, boz və sıldırım yarğanlardan başqa heç nə görünmürdü.

Ətrafda göyərti adında heç şey qalmamışdı. İsti bitkiləri qurumuşdu. Sanki ətraf bu saat alışıb-yanacaqdı. Quraqlıq ucundan bu çöllərdə həyat əlaməti görünmürdü. Arabir daş və ya kol dibindən qalxan quşlar havada dayana bilməyib, dərhal yerə enirdilər. Onların uçuşu oda düşmüş, yanmaq qorxusundan çırpınan, çapalayan bir məxluqu xatırladırdı. Yalnız cırcıramaların səsi eşidilirdi ki, bu səs də adama nədənsə "yandım-yandım!" fəryadı kimi gəlirdi. Qaynayan hava təndirdən qalxan alov kimi titrək dalğalarla göyə çəkilirdi. Sanki bu saat yerdə hava qurtaracaqdı.

Burada, bu mənzərə qarşısında adamı yaxalayan susuzluq adi susuzluğa bənzəmir, burada ümumi bir atəş vücudu bəla kimi bürüyür, adamın dili deyil, baxışları, hərəkətləri də su istəyir.

Biz nabələd olduğumuzdan su gətirməmişdik, yoldaşım ustam Şahnəzər idi. O, gözəl bir rəssam idi. Xan evlərinin incə və zərif naxışları, məscidlərin mehrabında şirlə yazılan yazılar, bəy eyvanlarını bəzəyən şəkillər hamısı onun əsərləri idi.

Mən Şahnəzərin sənətini sevmiş, onun yolunu tutmağı, böyüyəndə rəssam olmağı məqsəd seçmişdim. O mənə bir şagird kimi yox, oğul kimi baxırdı. Sənətinin bütün sirlərini, sadə görünən rənglərdən insanı düşündürən gözəl mənzərələri yaratmağı mənə öyrədirdi. Hərdən bir ah çəkib, dizinə çırpırdı ki: "Nə edim, savadsızam, elmsizəm! Kitabdan başım çıxmadı, o qara sətirlər mənimlə danışaydı! Allahın qabağına çıxıb yeni və daha gözəl aləm yaratmasaydım, adımı dəyişərdim".

Doğrudan da ustamın belə bir qüdrət sahibi olduğuna ürəkdən inanmışdım. O, sənətindən söhbət edəndə rəngi qızarır, gözləri gülür, səsi ucalırdı. Elə eşqlə danışırdı ki, qulağımın dibində top da atılsaydı eşitməzdim. Hərdən üzünü aydın səhərin açıq üfüqlərinə tutub mənə deyərdi:

– Kitab oxuya bilməsək də bunu ki, oxuya bilərik! Bütün kitabları buradan götürüblər. Səhərin rəngi məni çox düşündürür. Bu rəngi çəkə bilsəydik! Həmişə belə səhərlər olmur. Bunlar bənövşə kimi tez açılır, tez də solur. Bunu solmaqdan qorumaq üçün bir ipəkdə çəkmək, yaratmaq lazımdır.

– Usta, səhərə pul verən kimdir?! Xozeyinlər həzrət Abbası çəkdirirlər, Rüstəmi istəyirlər.

– Eybi yoxdur, bala, qoy verməsinlər. Səhəri də özümüz üçün çəkərik.

Ustam bu arzusunu hələ yerinə yetirə bilməmişdi. Həmişə çalışır, evləri gəzib sifariş alır, işləyirdi. Dava düşən il bizə sifariş verən olmadı. Xozeyinlərin hansını dindirəndə deyirdilər:

– Rəhmətlik uşağı, göydən top gülləsi yağır, siz də şəkil çəkmək hayındasınız?

"Sənətkarın əli işindən üzüləndə ağzı da çörəkdən üzülər. Bu sözü eşitmişdim, anlamamışdım. İndi isə gözümlə gördüm ki, ustam nə çəkir. İki abbasıya aldığı bir girvənkə çörəyi qabağımıza qoyub yeyəndə, mən xəcalət çəkirdim. Ürəyimdə deyirdim ki: "Kişi özünə papiros pulu tapmır. Bu pis və bahalıq ildə mən nə üçün buna boğaz ortağı olum? Bəlkə şagird saxlamaq istəmir, bəlkə mənim rüsxətimi vermək istəyir, üzündən gəlmir..."

Bunları düşündükcə boğazımdan çörək getmirdi. Bir gün ustamdan xahiş etdim:

– Usta, iki il sizə zəhmət verdiyim bəsdir. Güzəran da pis olub. İzin verin evimizə gedim. Az-çox öyrənmişəm. Sağ olun, mənim boynumda haqqınız çoxdur.

Ağzımdan bu sözlər çıxar-çıxmaz ustam uşaq kimi ağlamağa başladı. Mən böyüklərin ancaq məsciddə, bir də ölü üstündə ağladıqlarını bilirdim. Şahnəzər ustanın gözlərindən axan yaş məni də kövrəltdi. Özümü saxlaya bilmədim, dediyimə peşman oldum.

Ustam nə üçün ağlayırdı? Bunu özü dedi:

– Oğul, düşünmə ki, mən pis gün çəkdiyim üçün, ya sənə haqq vermədiyim üçün ağlayıram, yox! Mən onun üçün ağlayıram ki, sənə korluq, yoxsulluq peşəsi öyrətdim. Atan səni mənə tapşıranda güman etmişdi ki, səni mahir bir usta yetirərəm. Axırda böyük bir sifarişi sənin özünə tapşıraram, işlərsən, sonra atanı, bütün dost-aşnanı yığıb, sənin əsərinin tamaşasına gətirərəm. Sən öz əsərin, mən də öz əməyimə sevinərik. Atan da övladını bu yerdə görüb şad olar... – Ustam danışığını dəyişdi, səsini ucaltdı. – Yox, səni buraxa bilmərəm. Sən mənim bu günümdə getsən ömrüm boyu şəklə də, şəkil çəkənə də nifrət etməyə haqlı olacaqsan. Getmə! Sən gəl, mənə vəfalı çıxmasan da dalısınca düşdüyün sənətə etibar bağla. Bu sənət öləcəksə, qoy bizi də öldürsün.

Ustamın sözlərinə heç bir cavab vermədim. Başımı aşağı salıb dayandım. Etirazına qulaq asıb getmədiyimi görəndə ustam sevindi. Ayağa qalxıb, heybəsini götürdü.

– Gedək, kəndlərə gedək! – dedi.

Həmin gün biz kəndlərə çıxdıq.

İsti və susuzluq bizi taqətdən salmışdı. Buna baxmayaraq getdikcə yeyinləyirdik. Kəndə çatmasaq da, quraq və şoran çölləri keçib, özümüzü bir dərəyə, bulağa, heç olmazsa bir kölgəyə salmağa can atırdıq. Amma nə edəsən ki, isti daha da bərkiyir. Günəş lap günorta yerində dayanıb, od tökmək istəyirdi. Şahnəzər ustamın dil-dodağı qurumuşdu. Danışmırdı. Bütün qüvvəsini dizlərinə yığıb yerimək, qarşıdakı təpəni aşmaq istəyirdi. Mənə təsəlli vermək üçün işarə ilə "Az qalıb" deyirdi.

Təpəni aşandan sonra yamacda bir çoban gördük. O, sürüsünü qoruqdan, əkindən uzaq olan dağ döşünə buraxmış, özü isə bir daşın üstündə oturub, bayatı deyirdi. Onun təbii və yanıqlı səsi dağlara düşüb, təkrar qayıdırdı. Qayaların cingiltili səsindən qoyunlar vahimələnmiş

kimi dayanıb geriyə, yollara baxırdılar. Mən dağın ətrafına fikir verdim. Buralarda bir dərə və ya bulaq olmamış deyildi. Yoxsa burada sürü otarılmazdı. Təpənin şoran torpağına, bozaran yovşan kollarına diqqət edəndə çobanın qoyunu şora gətirdiyini anladım. Belə yerdə sürünü çox saxlamazlar. Bir az yedimi, qaytarıb həqiqi otlağa apararlar...

Çoban özü üçün ehtiyat götürməmiş olmazdı. Ustamdan icazə almaq, çobandan su istəməyə getmək istədim.

Ustam razı olmadı:

– Onda su haradandır?– dedi.

Artıq Obalı kəndinin damları görünürdü. Həyətlərin bəzisində bitən tut, əncir ağaclarını görəndə sanki ürəyimə su səpildi. O, ağacların altındakı kölgəlikdə palaz salıb oturmaq, saxsı qabdan su töküb, doyunca içmək arzusu ilə ürəyim döyündü. Bu gündəlik adi və hər kəsə müyəssər olan nemətlər mənə bir xəyal kimi gəlirdi. Ustamın çoxdan söylədiyi bir söz indi mənə kar edirdi:

"İnsan, əlində olan nemətin qədrini, ancaq əlindən çıxanda bilər".

Bu saat mən hər bir şeyi unutmuşdum. Ancaq su, sərinlik, kölgəlik arzulayırdım. Ona görə də təpədən aşağıya enişlə bərk yeriyirdim. Nəzərim kənddən ayrılanda yollara, qabağımdakı torpaqlara dikilirdi. Az qalırdım dayanam, dırnaqlarımla yeri deşib, yaş torpaq tapam, susuzluqdan yanan sinəmi ora sürtəm.

Ustam muştuluq xəbəri verdi:

– Çatmışıq, budur evlərə az qalıbdır. – Bir az sükutdan sonra əlavə etdi: – Əgər biçinçi, rəncbər olsaydıq, bizi əzizlərdilər. İş də tapardıq. Ancaq bizim sənətimiz burada kimin nəyinə lazımdır?!

Ustam düz deyirdi. Bura nə sənət, nə sənətkar yeri idi. Ancaq hələ bu sonranın işidir. Bizə yanğıdan, susuzluqdan qurtarmaq lazım idi.

Evlərə çatdıqda sevincdənmi, ürəyimdəki yanğının təsirindənmi, ustamdan qabağa yeridim. İlk rast gəldiyim qapının rəzəsini taqqıldatdım. Başı, yaxasıaçıq bir kişi çıxdı. Dinmədim, ustamın üzünə baxdım. O, ev sahibinə dedi:

– Bir içim su verin, qəribik.

Ev sahibi qapını daha da geniş açıb:

– Buyurun içəri, buyurun, – dedi.

O bunu deyərək, əli ilə həyət tərəfi göstərdi. Biz baxanda qəribə bir aləm gördük. Gözəl və bağçalıq bir həyət idi. Ortada ağacın kölgəsi altında göz yaşı kimi dumduru su ilə dolu hovuzdan fəvvarə qal-

xırdı. Kənardan isə mis cam qoyulmuşdu. Mən qara və gödərək kənd-lidən bu səliqəni görəndə heyran qaldım. Susuzluğum daha da artdı. Özümü pallı-paltarlı hovuzun içinə atmaq istədim. Ustamın ehtiramını saxlayıb, əvvəlcə onun su içməsini gözlədim. O, yüyürüb camı götür-mək istəyəndə yerində donub qaldı. Heyran-heyran hovuza baxdı, sonra da məni çağırdı:

– Yaxın gəl!

Mən yaxın gedəndə bu mənzərənin rəssam lövhəsi olduğunu an-ladım. Buna nə ustam inana bilirdi, nə mən. Çargül və qalın parça üzə-rində çəkilmiş bu gözəl sənət əsəri bizi heyran etmişdi. Əlində bir kasa su gətirən və bizim heyrətimizə gülümsəyən ev sahibi üzr istədi:

– Bağışlayın, mən yoxlamaq istəyirəm.

– Nəyi yoxlayırsınız?

– Yoxlayıram görüm çəkdiyim şəkil bir şeyə oxşayır, ya yox?

Ustamın heyrəti birə yüz artdı.

– Məgər bunu siz çəkmişsiniz?

Ev sahibi utana-utana cavab verdi:

– Bəli, qonaq qabağına çıxarılası ləyaqəti olmasa da, bağışlayın.

– Bu lap sizin öz əlinizdən çıxıb?

Ev sahibi şübhəmizi görəndə bizi qonaq otağına apardı, divarları bəzəyən rəngbərəng, cürbəcür şəkilləri göstərdi.

Ev sahibi çay hazırlamağa gedəndə Şahnəzər mənim əlimdən tutub, pəncərə qabağına çəkdi.

– Xırmana gedən, kotandan qayıdan, çırpı gətirən, saman daşıyan adamlara da diqqət elə! Qəribə nə görürsən? – dedi.

– Qəribə bir şey görmürəm!

– Hamısı çox sadə görünür. Ancaq sənət də elə bunlardadır. Bu adamlardadır. Gəl boynumuza alaq. Mən iyirmi ilin ustası, sən iki ilin şagirdisən. Heç birimiz bu qonaqcıl kişinin yaratdığını yaratmamışıq. Amma bizə sənətkar, ona kəndli deyirlər.

Mən ustamın dediklərini diqqətlə dinləyirdim. O, çöhrəsində par-layan heyrətini ifadə edərək danışırdı:

– Ən böyük sənətkar bunlar – həyat adamlarıdır. Əlini bunların ətəyindən üzənin vay halına!

Ustam yoldakı söhbətimizdə yanıldığını mənə başa salmaq istəyirdi.

*1941*

## VƏTƏN YARALARI

Səngərimdən çıxanda, üzgüçü suya atılan kimi, ön xəttin atəşinə atılmışdım. Nə gurultu, nə alov, nə də, sanki dəhşətləri örtmək istəyən toz, duman mənə qəribə gəlirdi. Güman edirdim ki, bu atılan güllələrin biri də mənəm, gurultunu qopardan da mənəm, gündüzün boz və kəsif üfüqlərinə bir bayraq kimi açılıb-örtülən alov da mənəm. Döyüş sürəti və hərarətində özümdən xəbərsiz kimi yanırdım. Qan gözümü örtəndə, qılçalarım hərəkətdən qalanda kökü vurulmuş bir ağac kimi yerə sərildim. Sanki bir səs mənə deyirdi: "Bəsdir! Burax!" Lakin mən bunu eşitmək istəmirəm. Diqqətlə yaralarımı duymaq, özümə gəlmək istəyirəm; bacarmıram. İsti mayenin vücuduma axdığını və axdıqca məni xoş və sakit bir rahatlığa apardığını, olduğum aləmdən ayırdığını hiss edirəm. Ayrılmaq istəmirəm. Görmək, eşitmək, düşünmək istəyirəm. Hansı bir qüvvənin əli iləsə gözlərim örtülür, bayaqdan bəri dəmirçi kürəsi kimi səslənən qulaqlarım tutulur, başımdakı ağrı məni alıb aparır. Birdən-birə aləm sükuta dalır, hava qaralır, ətrafımızdakılar əvvəlcə gülləyə, sonra daşa dönür, get-gedə kiçilir, sularda əriyib, yox olurlar.

Məndən qabaq yaralanmış yoldaşlarım danışardılar: birisi həsrətlərini, birisi əziyyətlərini, bəzisi ölüm təhlükəsini necə keçirdiyini deyirdi. Mən bunları xəyalıma gətirmədim. Bəlkə də buna görə bunları keçirə də bilmədim. Mən gözümü açanda, özümü isti, təmiz və sakit bir otaqda, rahat yataqda görəndən sonra başım üstə dayanan ağsaçlı həkimin təbəssümünü, gənc bir qızın tərimi sildiyini, su içirtmək istədiyini görəndən sonra duydum ki, həyata qayıdıram. Deyəsən məni bunlar, qalın kitabların mənası ilə silahlanmış həkimlər, şəfqət və mərhəmətdən yoğurulmuş qızlar qaytarırlar? Haraya qaytarırlar? Mən qapandığım, tapındığım hissiz sükut aləmindən qayıdıram.

Ürəyimdə bir şadlıq var: dodaqlarım qaçdı, üzülmüş, qanını itirmiş, dəri ilə sümükdən ibarət sifətimə ilk təbəssüm işığı düşdü. Sonra, hardansa məni bir düşüncə yaxaladı. Haraya qayıdıram? 15 il ömür keçirdiyim, doğulduğum, böyüdüyüm, yorulduğum, dincəldiyim, dərd çəkdiyim, sevindiyim həyata qayıdıram! Orada hələ görmədiyim nələr var?

Bunu nə kitabda oxumuşam, nə həkimdən eşitmişəm. Amma mənə elə gəlir ki, xəstənin fiziki həyatından çox mənəvi həyatı var. Onu möhkəm addımlar, taqətli ayaqlar, bükülməz dizlər yox, zəif və zərif xəyallar aparır. Bu xəyallar bəlkə də sağlamlıq zamanında adamın

başına yol tapmır. Həyatın kəşməkəşləri onlara növbə, yol, imkan vermir. İndi isə əl-qolunu boş qoyub, yatağa uzanmış bədən tamamilə onların, qanadlı düşüncələrin ixtiyarındadır. Düşünürəm, görürəm ki, mən həyata azğın bir maraq üçün qayıtmıram, oynamağa gəlmirəm. Dolu süfrələr başında oturub yeməyə, qədəh sındırmağa, tərif deyib, tərif eşitməyə gəlmirəm. Məxmər stol dalında tabelərimin üstünə qışqırmağa, əmrlərə, fərmanlara qırmızı mürəkkəblə qol çəkməyə gəlmirəm. Nə qızlar, nə qayıq gəzintiləri, nə məzhəkədən qabaq başlayan, sonra da bitməyən qəhqəhələr...

Məndə qəribə bir arzu dinlənir: iki ömür istəyirəm. İstəyirəm ki, ilk ömrüm – təcrübə dərsi olsun; bu mürəkkəb dünyanı, qapalı adamları öyrənməyə sərf olunsun. İmtahandan çıxa bilsəm, mənə ikinci həqiqi ömür imkanı verilsin. Belə ömrün qədrini bilərəm. Mən yenidən bir körpə olum, anamın, o mehriban xilqətin qucağına atılım, isti nəvazişlərinə tutulum. Atamın sərin torpaq astanasında iməkləyim. Səsim gəlsin. Yıxıla-dura yeriyim, ağı qaradan, şirini acıdan, istini soyuqdan seçən, qayğısız körpəlik günləri başlasın...

O günlər... məgər xəyal onları gətirib yetirə bilərmi?.. Qapımızdan keçən su arxının başında oynardım, söyüd yarpaqlarından əsən xəfif küləklər daraq görməmiş saçaq kimi dolaşıq saçlarımı üzümə tökərdi...

Hanı mənim tay-tuşum? Aşıq atan, top oynayan, gizlənqaç yoldaşlarım? Vuruşub-barışdığım, atıb-tutduğum, ayrılıb-birləşdiyim yaşıdlarım?

Bax, bunlardan doymamışam.

Ömrüm yüz gündürsə, doxsan doqquzunu yurdumda, torpağımda yaşamışam. Doymamışam.

Nəyini deyim? Xoş saatları, əziz günləri, munis axşamları...

Heç bir zaman bu xatirələr cəbhədəki qədər şirin olmur. Əsgər onları arxada qoyub gəlmişdir. Onları qorumağa, onları hədələyən təhlükəni yox etməyə gəlmişdir.

Səhra xəstəxanasından arxaya göndərilməli olduğumu eşidib, yoldaşlarımdan ikisi yanıma gəlmişdi. Biri mənim yaşıdım, məktəb yoldaşım Nəsrəddin idi. Bizi universitetdən, tələbəlikdən çağırmışdılar. Onu görəndə həmişə məktəbli uşaqların kitab çantası yadıma düşür. Nəsrəddinin belə yaraşıqlı bir çantası var idi. Özü də qayışla belinə bağlardı. Bəzən onun çantasından tutub çəkişdirərdik, ha dönmək istərdi ki, görsün kimdir, bacarmazdı. İndi Nəsrəddin bizim komandirin köməkçisidir. Komandir sirrini ona deyir, bərk yerlərə onu özü ilə aparır.

İkincisini cəbhədə tanımışam. Kolayır kəndindəndir. Mina arvadın oğlu Lətifdir. Atası çoxdan ölüb. Anası kənddə nümayəndə idi. Qadınlar yığıncaqlarında onu stol başında, ayaq üstə durub, açarı mürəkkəbqabına döyən, sükut istəyən görərdin. Yaraşmasa da, həmişə sədrlik etmək istərdi.

Lətif anasına oxşamır. Başıaşağı, üzüyola oğlandır. İki yaş bizdən kiçik olduğu üçün yüngülayaqlıq edər. Hər işə gedər, bəzən suyumuzu, çörəyimizi də hazırlar. Yürüşlərdə, gecə istirahət əmri veriləndə, bir də görərdin Lətif çəkməsinin dabanı ilə yeri döyür. O, torpağı hamarlayıb, üç adam üçün "yataq" düzəldərdi. Əleyhqazlarımızı başımızın altına qoyub tirtap düşərdik.

Bunlar mənim yanıma həm görüşə, həm sifarişə gəlmişlər. Mənim nə danışmağa, nə də əsəblərimə toxunacaq bir xəbər almağıma icazə var idi. Mən bu səhra xəstəxanasında 7 gün ərzində həkimdən başqa yalnız bir şəfqət bacısını görürdüm. Yanıma gələn, məni dindirən olmadığına darıxırdım. Ancaq onu da duyurdum ki, mənə yaxınlaşmaq istəyənləri şəfqət bacısı buraxmır. Bəzilərini qaytarır, bəzilərinə də yalan satır ki, "xəstə yuxudadır". Bu dəfə mən çadır örtüsünün dalından Nəsrəddinin üzünü gördüm. Dərhal bacının səsi gəldi:

– Yoldaş əsgərlər, xəstə yuxudadır, oyada bilmərəm.

Mən dözmədim:

– Oyanmışam, – dedim, – bacı, burax gəlsin.

Bunu dedim, sevindiyimdən dikəlmək, dirsəklənmək istədim. Çarpayıya sarındığım, ya ağrıdan qorxduğum üçün dikələ bilmədim. Başım, ümidsiz kimi, balışa yapışıb qaldı.

Yoldaşlar bir üzü xətir, bir üzü zor-güc özlərini mənim yanıma saldılar. Bacı onlara yalvarırdı:

– Həkim bilsə, mənim atamı yandırar. Aman günüdür, tez gedin!

Nəsrəddin ona təsəlli verdi:

– Tez, arxayın ol, tez gedəcəyik.

Lətif dedi:

– İki-üç dəqiqə, artıq yox.

Çadıra girəndən sonra Nəsrəddin nə bacıya baxır, nə də onun sözünü eşidirdi. Mənim alnımdan öpüb, zəif əlimi ovcunun içinə almış, illər ayrısı kimi, həsrətlə söhbətə başlamışdı...

Onlar yaralarımdan sarı mənə təsəlli verirdilər:

– Güllə yarası əti bişirir, tez sağalır. Anan dua eləyir, yaxşı ötüşmüşsən, on-on beş günə duracaqsan.

Mən ağrılardan şikayət edəndə Nəsrəddin bir ədib kimi cavab verdi:

– İnanıram, sən daha çox ağrı duyarsan. Həyatla dolu adamlara, bütün hissləri ilə mükəmməl həyat keçirən adamlara hər yara əzabdır. Sən yorulmuş qoca, ya çox şeylərdən əl üzmüş bədbin deyilsən. Qoca ağacların gövdəsini yarıb içində ocaq qalayırsan, halına təfavüt eləmir. Sağlam, ucaboylu qovaq ağaclarının gövdəsinə bir bıçaq vurulsa, o saat yaşardığını görərsən. Belə ağacların həyatı sağlam gənclərin həyatı kimi mükəmməldir, əsl həyatdır. Sən belə gənclərdənsən. Ancaq onu da bil ki, bir neçə ay sonra qovaq ağacının bıçaq vurulan yerini möhkəmlənmiş, bərkimiş görərsən. Sağlıq olsa, sən həm müalicə olunacaq, həm dincələcəksən, həm də ki...

Lətif Nəsrəddinin ürəyindən xəbər verdi:

– Həm də ki, vətənə gedəcəksən.

Bu sözü deyəndə onların hər ikisi qızardı, gülümsədi, mənim gözlərimə baxdı. Mən bunun mənasını yaxşı anlayırdım. Onlar on illərə bərabər olan bir neçə aylıq cəbhə həyatından aldıqları duyğu və təsəvvürlərini yaxın adamlarına çatdırmaq istəyirdilər.

Bacı Nəsrəddinin qarşısında dayanıb, xahiş edirdi. Nəsrəddin isə gözünü məndən ayırmırdı:

– Səndən, – deyirdi, – heç nə istəmirəm. Bizim evə get, mənim yazı stolumun başında otur, kitablarıma, kağızlarıma fikir ver, gör qoyub gəldiyim kimidirmi? Gör mənə kağız-zad yazan, itirib-axtaran olurmu? Küçəmizdən bir neçə dəfə o yan-bu yana keç, anamın sözünü-sorğusunu qulağında yaxşı saxla. Səndən hər şeyi təfsilatı ilə soruşacağam... Universitetə, bilirəm gedəcəksən. Uşaqlara bir-bir salam de. Mənim əvəzimdə bir lektoriyada sükut içində otur. Bu gördüyün gurultuları orada xatırla. Yəqin mənim abunə vərəqim durur, onu bir al, bax gör kitabxanaçı deyirmi ki: “Bu oğlan niyə kitab götürmür?”.

Lətif Nəsrəddinə macal vermədi:

– Özün bilirsən də, nə deyim. Arvad eşitsə, birbaş yanına gələcək. Bu şəkli ver, deyinən nigaran olmasın. Bacarsan, bir bizim məktəbə dəy. Gör Ədil müəllim oradadırmı? Gör yenə dərslər qaydasındadırmı? Uşaqlarını yadına salırmı? Gedən kim, qalan kim? Mənim adresimi direktora, Ədil müəllimə ver, bəlkə məktub yazan oldu.

Nəsrəddin bir şey xatırlamış kimi Lətifə mane oldu:

– Get bizdə də bir-iki gün qal. Qoy anam da oğul səsi eşitsin. Yəqin hazırlıq görəcək. Nahardan sonra mənim tarımı al, tozunu sil,

bağrına bas, bir çargah başla. İnan ki, üstümə yüz topdan güllə yağsa da, mən burada çargahın səsini eşidəcəyəm...

Lətif tapşırırdı:

– Kəndə gələndə kövşənə, Dişli qaya tərəfə çıx. Durnagözlü bulaqdan ovucla, mənim əvəzimə iç. Yazdır. Otur, bir quşları dinlə. Gör onlar nə deyir: dünyanın bu işləri onların mahnısına kar eləyir, ya yox? Yaşıl yamacdan dəstə tut. Lalə, bənövşə, nərgiz, nanə, xətmi, nilufər, nə desən taparsan. Yaş yarpaqları tök dəftərinin arasına, qurusunu bizə gətir. Torpağın ətrini oradan alarıq. Ax, o yerlər!.. Səcdəsinə düşmək, öpüb yalamaq, ürəyimi o torpağa, daşa sürtmək istəyirəm.

* * *

Anama qabaqcadan heç nə yazmadım. Vağzalda düşüb yavaş-yavaş evimizə gəlirdim. Anamı görməyə tələsirdimsə də, çoxdan ayrıldığım bu küçələri, yolları, bu məhrəm binaları, ağacları, hasarları diqqətlə nəzərdən keçirmək həvəsi ilə yaşayırdım. Çalışırdım görüm nə dəyişmişdir. Mənim qoyub getdiyim yerlərin nəyi və necə dəyişmişdir? Mənə elə gəlirdi ki, hər şey öz qaydasındadır. Yenə də həmin sentyabr axşamıdır. Şəhərimiz möhkəm inam və etimadla ömrünü sürür. Uca çinarlar, yaşıl təpələr baş əyərək, cəbhədən gələn oğullarını salamlayır, cəbhəyə gedən oğullarına xeyir-dua verir.

Anamı evdə tapmadım. Açarı bir-birimizə bələdlədiyimiz yerdən götürdüm, qapını açıb, evdə rahatlandım.

Bu evdə nə təzəlik var?

Mənim əsgər şəklim stolun üstündədir. Məktublarım üst-üstə səliqə ilə qoyulmuşdur. Sanki anam bunları hər gün oxuyur. Pəncərənin ağzında balaca və üzü bezlə tikilmiş bir qutu var. Yəqin etdim ki, anam yenə nəsə göndərir, istədim anamın cəbhə sovqatını açım, dəymədim. Kitab şkafının şüşələri tərtəmiz silinmişdi. Gələn qəzet və jurnallar sahmanla şkafın bir gözünə yığılmışdı. Anladım ki, anam bunları mənə saxlayır, – oxumamış qəzeti o, tərk etməz.

Evin hər tərəfində bir qayğı əli gəzirdi. Bu, əməksevən və zəhmətdən həzz alan əsgər anasının əli idi. O, hər qədəmi oğul yolunda atırdı.

Bunların hamısı mənə aydın idi. Lakin anlaya bilmədim ki, anam evin açarını nə üçün həyətdə, xəlvət bir yerdə qoyub gedir. Qapını özündən başqa kimsə açmayacaq, bəs açarı kimə etibar edir?

...Anam mənim bu sualıma köksünü ötürərək, cavab verdi:

– Bala, – dedi, – çox vaxt səninlə oturub, söhbət eləyirdim. Sən cəbhədə bəlkə də atışmadasan. Mən burada bardaş qurub, səni körpə çağında görürəm, dindirirəm, danışırsan, oynayırsan... Açar orada dursun. Mən onu yaxşı niyyətlə qoyuram. Elə bilirəm evimizdəsən. Sənin səfərin uğurlu səfərdir. Ürəyim mənə deyir ki: "Sən işdən qayıdanacan oğlun gələr, qapıda qalar. Açarı qoy get..." Gördün ki, niyyətim düz çıxdı, Allah düz adama niyyətinə görə verər. Şükür ki, gəldin çıxdın!

Anam danışdıqca mənim ürəyim genişlənir, iftixar hissim alovlanırdı. Ürəyimdə deyirdim: "Bəşəriyyət hamısı analar qəlbi ilə yaşasaydı, dünya başdan-başa bir cənnət olardı. Bunların duyğusu, arzusu, xeyirxahlıq və mərhəmət dolu ürəkləri həmişə bizimlə, cəbhəçilərlədir. Bu müqəddəs qəlb sahiblərinin keşiyində durana zaval yoxdur!"

Vətənin hava və sularındanmı, adamlarımızın "cəbhəçidir",– deyə mənə göstərdikləri qonaqpərəstlikdənmi, görüş sevincindənmi, nədənsə, mən çox tez dirçəldim. Özümü əvvəlkindən də möhkəm hiss etdim. Sağaldıqca, qüvvətə gəldikcə təkrar cəbhəyə qayıtmaq arzusu məndə alovlanırdı. Nəhayət, anam məni yola salmalı olduğuna inanandan sonra Nəsrəddinin də, Lətifin də anasını çağırdı. İstirahət günü bizim evimiz səfər evinə oxşayırdı. Hərə bir sovqat bağlayıb gətirmişdi. Mən ha yalvardım ki: "Canım, bunların heç birinə ehtiyac yoxdur, bunu aparmaq özü çətin işdir", buraxmırdılar. Corab gətirən, papiros alan, fətir bişirən, xörək hazırlayan kim... Anam məndən xəlvəti bir qutu bağlamışdı.

– Bala, – deyirdi, – bu, üçünüzün payıdır, açmazsan. Yetirən kimi Nəsrəddini, Lətifi çağırarsan, açarsınız. Bu, üç ananın səliqəsidir. Bir açın, bir oturun, bir yeyin, bir gəzin, bir vuruşun!

* * *

Cəbhəyə qayıdanda hərbi mütəxəssislər məni böyütmək, başqa yerə, yeni vəzifəyə göndərmək fikrində idilər. Mən yoldaşlarımdan ayrılmayım deyə, bundan yayındım, öz hissəmizə gəldim. Təəssüf ki, yoldaşlarımın heç birini yerində tapmadım.

Nəsrəddinin iki gün əvvəl yaralandığını, səhra xəstəxanasına götürüldüyünü deyirdilərsə, Lətif haqqında açıq danışmırdılar. Mən dərhal

komissarın yanına getdim, təlaşımı görüb, mənə iki sətirlik bir yazı göstərdi. Orada savadlı bir əl rusca yazmışdı: "Demişdim, elə də oldu: döyüşçü ölməyəcəkdir!" Mən yazını oxuyub komissarın üzünə baxdım. Nəzərlərimlə soruşurdum. Nə soruşduğumu komissar bilmirdi:

– Həkim yazır, – dedi, – Lətifin sağalmağına ümidimiz yox idi. Köks qəfəsinə iki güllə, bir mina qəlpəsi dəyib, ciyərinin başı zədələnib. Amma həkim Qiyaslı ümid verirdi. İndi isə Lətifin sağalmağı müəyyəndir.

İki ay əvvəl mənim yanıma gələn yoldaşlarımı axtarıb, görüşmək üçün icazə aldım. Ən əziz sovqatı, anaların verdiyi bağlamanı səhra xəstəxanasına gedən maşınların birinə atdım.

Əvvəl Nəsrəddini tapdım. O, isti bir xalat geymiş, həyətdə gəzinirdi. Yarası qolundan idi, həm də yüngül idi. Mənim gəlməyim onun üçün yox, xəstə yoldaşlarım üçün də bir bayram oldu. Şəhərimizdən, yollardan, əkindən, məhsuldan suallar verirdilər. Nəsrəddin ikilikdə söhbət üçün məni çəkib, palataların kənarına gətirdi. Torpaq üstündə dirsəklənib oturduq. Mən gördüklərimin hamısını nağıl etdim. Bıçağı çıxarıb, bağlamanı açmaq istədim. Nəsrəddin mane oldu:

– Qoymaram, – dedi.

– Yeməli şeydir, xarab ola bilər.

– Lətifsiz açmayacaqsan.

Nəsrəddinin sözü qabağımı kəsdi, bıçağı qatlayıb cibimə qoydum.

– Elə isə dur, – dedi, – dur, onun yanına gedək.

Nəsrəddinin ucaboylu, zabitəli bir həkimi var idi. Başqaları həkim olub orduya gəlmişdilər, bu adam tibb təhsilindən əvvəl mükəmməl hərb adamı, böyük komandir imiş. Rəsmiyyəti çox sevirdi. Xəstələr və ya bacılar ondan bir güzəşt xahiş etməli olanda ümidsiz əllərini tovlayırdılar. Buna görə də Nəsrəddin xahiş etmək istəmirdi.

Mən həkimi "yumşaltmağı" boynuma aldım. Gözlədim. O, otağından çıxanda rəsmi vəziyyət alıb, məqsədimizi söylədim.

– Sabah nahardan sonra yarım saat gedə bilər, – deyə o, icazə verdi.

Həkim bunu deyib ötdü. Mən sabaha qala bilməyəcəyimi deməyə israr etməyə macal tapmadım.

Mən bu gün Lətifin yanına getdim. Lətif ağır xəstəlikdən təzə ayılırdı. Rəngi-rufu qalmamışdı. Məni görəndə sevincindən ağladı. Məni də qəhərləndirdi. Narahat etməyim deyə, tez durdum. Bağlamanı onun yanına qoyub çıxdım.

Lətifin sağalıb hissəmizə qayıtmağı iki ay yarım çəkdi. Bu müddətdə anaların bağlaması gah onun çarpayısı başında, gah təcili yardım arabasında, gah istehkamda qaldı. Lakin açılmadı. Ancaq Lətif gələndən sonra üç səmimi yoldaş oturub, sovqatı açdıq. Burada albuxara, kişmiş, fındıqdan tutmuş Ordubad almasına qədər vardı. Yeməli şeylərin altında adama bir əl dəsmalı, bir ətirli sabun, adama bir cüt toxunma əlcək var idi.

Əlcəkləri əlimizə taxdıq. Anamın sözü mənim qulağımda cingildədi: "Bir oturun, bir gəzin, bir vuruşun!"

– Uşaqlar, – dedim, – bu əlcəklərdə analarımızın mehribanlıq istisi, vətənimizin dostluq sədaqətinin, birliyinin hərarəti var. Əllərimizə baxıb, analarımızın bizimlə, yanımızda olduqlarını hiss edirik. Onların mehriban ana nəfəsi bizi bəsləmiş, böyütmüşdür, bizi döyüşə də, qələbəyə də aparacaqdır.

Lətif də, Nəsrəddin də ananın sözlərini təkrar etdilər:

– Bir gəzək, bir vuruşaq!

– Qoyun, – dedim, analarımızın surəti gözümüzün önündə, səsi qulağımızda, əli ürəyimizdə olsun. Qoyun onlar oxşayıcı, məhrəm əllərini həmişə bizim yaralarımızın üstünə çəkib sağaltsınlar. Sağ olaq, torpağımıza soxulan təcavüzkarları məhv edək! Analarımız sevinsin, arxayın yaşasınlar. Ana Vətən bizdən razı qalsın.

*1942*

## LEYLA

*Gözləyən qızlarımız, gəlinlərimiz,*
*bacılarımız, analarımıza hədiyyə*

1

Bir müddət onun ayağı tramvaydan kəsilmədi. Şəhərə yaxın düşərgələrin birində əsgəri hissədə vuruşmaq öyrənən sevgili əri Mir Əlinin görüşünə gedər, əlinə düşəndə hədiyyə aparardı. Axırıncı dəfə vidalaşandan, Mir Əli cəbhəyə yola düşəndən sonra da gəlini yollarda görmək olardı. Sevgilisindən xəbər almayanda səbri tükənər, darıxardı; heç bir şeydən təsəlli tapmayanda baş alıb çölə, Mir Əlini yola saldığı

yerlərə gedər, sanki hər addımda bir xatirə axtarardı. Orada, əsgərlərin keçmiş düşərgəsində indi küləklər əsirdi. Məşq üçün qazılan səngərdən, basdırılan nişan ağaclarından, dar cığırlardan, sökülmüş çadır yerlərindən, sökük ağaclardan, konserv qutularından başqa heç nə qalmamışdı.

İntizarlı gəlin kənarda dayanıb, ziyarətinə gəldiyi yerin hər tərəfinə diqqətlə tamaşa edərdi. Mir Əli ilə görüşdüyü səmtdə durar, uzanıb gedən nəhayətsiz qoşa dəmirlərə baxar, baxar, ahəstə səslənərdi:

– Mir Əli! Mir Əli, sənin dalınca gəlmişəm!..

Heç nədən və heç kəsdən cavab gəlməzdi. Gəlinin çağırışı dərin və sirli sükut içində əriyərdi. Tənha yerlərin sükutu müdhiş olur. Ağaclar yenə küləyin səmtinə əyilir, quşlar günəşin, havanın feyzindən faydalanmağa can atır, dəniz həmişəki ahəngi ilə çağlayıb durur, torpaq, oxunmuş, lakin hələ layiqincə anlaşılmamış kitablar kimi görünürdü...

İndi, soyuq payız axşamında Leyla yenə səfərə, həmin yerlərin ziyarətinə hazırlaşır. Yüz dəfələrlə axtarıb tapmadığı, arayıb görmədiyi Mir Əlinin getmiş olduğuna hələ də inanmaq istəmir. Onsuz heç nə boğazından keçmir, zehnən bir dəqiqə də ondan ayrılmır, ayrıla bilmir. Həmişə dolu aparıb dolu qaytardığı hədiyyə dəsmalını yenə xüsusi sahmanda hazırlayır, yenə bacısı Zibaya belə deməkdən həzz alır.

– Mir Əlinin yanına gedirəm, ev-eşikdən muğayat ol!

Bu zahiri sevinclərin arxasında bir səhra kimi dayanan ümidsizlik onun yaralı qəlbini gəmirir, sanki ona gülürlər, öz-özünü aldadan bu arvadın ağlına şübhə edirlər. Sanki bir səs, bütün gücü ilə onun qulaqlarına qışqırır ki: “Haraya gedirsən?” Quru çöldə Mir Əli nə gəzir, yorulmadınmı?”

Leyla daxili çırpıntılar içində özünü unudub dayanmışkən, poçtalyon qapıdan bir zərf atıb ötdü.

Leyla quş kimi qapıya atıldı. Zərfi açıb, bərkdən oxudu:

“Hörmətli bacım, Ziba! Salamlar olsun. Tanımadığınız bir əsgərin sizə kağız yazmağından təəccüblənməyin. Mən Mir Əlinin cəbhə yoldaşıyam. Onun söhbətindən sizi tanımışam. Bu saat Tbilisidə 8 nömrəli xəstəxanada yatıram. Sizə deməli vacib sözüm var. Mümkün etsəniz, buraya zəhmət çəkmənizi xahiş edirəm. Ayaqdan salamat olsaydım bu zəhməti verməzdim. Bacınıza və qohumlarınıza Mir Əlinin və mənim dilimdən salam! Mürsəl Babayev”.

Düzdür, Leyla əvvəlcə məktubu səslə başladı, ancaq ilk sətirdəcə səsini və sürətini dayandırıb, düşüncəyə daldı. “Mürsəl kimdir? Ziba hara, o hara? Mir Əlinin yoldaşı bəs Mir Əlidən niyə yaramasın?..”

Leyla Zibanın məktəbdən qayıtmasını gözləyə bilmədi. Qonşusu Səriyyənin qızını çağırıb dalınca göndərdi:

– Zibaya deyinən bu saat evdə olsun! Deyinən vacib iş var, bacın səni gözləyir.

Qız o yana getdi. Leyla məktubu başdan-ayağa ayaqdan-başa təkrar-təkrar oxudu. Hər sözün düzünə mənasını, məcazi mənasını axtardı. Zənnini bir yerə qərarlaşdıra bilmədi:

“Bəlkə məndən gizlədir, qızın əlaqəsi varmış! Yox, gizli əlaqə saxlayana belə aşkar yazmazlar. Bəlkə bu adamın qıza meyli qonub, gözü düşüb, görüşə çağırır. Yox, yaralının belə şeylərlə uğraşmasına macalı hanı. Elə vicdansız əsgər olarmı ki, bacı dediyi qıza əyri gözlə baxsın. Bəlkə bu tamam ayrı Zibadır, kağızı səhv gətiriblər?.. Yox! Adres – filan yerli yerindədir. Üstəlik Mir Əlinin də dostu...

Yaxşı, tutaq ki, bu yazılanların hamısı doğrudur, bu adam bizi Mir Əli vasitəsilə cəbhədən tanıyır. Bəs elə isə nə üçün Zibaya müraciət etsin? Nə üçün dost saydığı Mir Əlinin arvadına bir kəlmə xoş xəbər deməsin?! Buna nə ad qoymaq olar?”

Yarım saat çəkmədi ki, Ziba kitablar qoltuğunda, təngnəfəs, pörtmüş, qızarmış özünü evə saldı.

– Nə var, ay bacı, xeyir ola? Yeznəmdən xəbərin var?

Leyla onun sözünü kəsdi:

– Ay qız, sənin Mürsəl adlı tanışın varmı?

– Mürsəl?

– Mürsəl Babayev!

– Yox!

– Yaxşı fikirləş!

Ziba bacısının simasındakı ciddiyyəti görüb, fikrə getdi:

– Mürsəl, Mürsəl, biri var, bizim yeddinci sinifdə. Elə belə məktəbdən tanıyıram.

– 7-ci sinif yox ey, əsgər!

– Mən Mürsəl adlı əsgər tanımıram.

– Babayev! Yaxşı fikirləş, tanımasan sənə kağız yazmaz. Bəlkə bir vaxt olub, sonra yadından çıxıb?

Leyla bunu deyib, zərfi Zibaya verdi. Ziba bacısının son sözündən daha da təsirlənib qızardı. Kağızı oxuyub dodağını büzdü:

– Bu adı birinci dəfədir eşidirəm. Mürsəl kimdir, zad kimdir? Bu necə işdir?

Leyla kağızı onun əlindən aldı. Sanki xəlvət bir söz demək üçün içəri otağa keçdi və Zibanı da çağırdı:

– Bura gəl, söz deyirəm.

Ziba bu işdən bir şey başa düşə bilmədiyindən və bacısının şübhəsindən o qədər qüssələnmiş, tutulmuşdu ki, çırtıq vursan qanı çıxardı. Leyla isə məktubun əsil mənasını anlamışdı. Ona görə də sanki əli hər şeydən üzülüb, əlacsız qalmışdı.

İçəri otaqda ayaq üstə dura bilməyib, diz çökdü:

– Bacım, – dedi, – bu kağız yaxşı kağıza oxşamır. Bilmirəm fələk başımda nə oyunlar oynayır. Evi, uşağı sənə tapşırıb gedirəm.

Leyla Zibanın səsindən və ahəngindən anladı ki, bacısı Mir Əlidən nigarandır. Salamat adam haqqında belə danışmazlar. İllah da ki, dost ola!..

Leyla yarımca saatın içində, yasa batmış kimi, qapqara qaralmışdı. O, aldığı məktuba belə məna verirdi:

"Kağız yazan Mir Əlinin yoldaşıdır. Yəqin, yaman bir xəbərlə gəlib, məndən gizlədir. Zibanı çağırıb, ona demək istəyir..."

Leyla bu zənnini həqiqətə yaxın sayırdısa da ürəkdən inanmaq istəmirdi. Düşüncələrinin belə dəhşətli bir ehtimalla nəticələndiyini görüb bütün vücudu ilə alışıb-yanırdı. Çalışırdı düşünsün ki, bu düzəltmə məktubdur. Çalışırdı inansın ki, bəzəmə xəbərdir. Yaxud da bu Ziba ayrı Zibadır. Mir Əli ayrı Mir Əlidir...

İntizar və nigarançılıq isə amansız bir qızdırma kimi gəlini taqətdən salırdı. Ürəyi qəfəsdəki quş kimi çırpınırdı.

– Bacım, – dedi, gedirəm. Gedim, görüm, bəlkə bədbəxtin başında, dilim-ağzım qurusun, bir iş var...

Bacılar qüssələrini bölüşdürəndə, balaca, iki yaşlı Tofiq də yuxudan durmuş, dinməz-söyləməz səs gələn otağa keçmişdi. Pişik balası kimi qapı ağzında dayanmış, anasının pərişan, müztərib vəziyyətinə baxır, ahəngini dəyişmiş, qəhərli səsinə qulaq asırdı.

– ...Bəlkə bədbəxtin başında bir iş var!..

Bu söz ağzından çıxar-çıxmaz Leylanın gözü Tofiqin gözlərinə sataşdı. Özünü güclə saxladı, uşağın başını sığalladı.

* * *

Leyla xəstəxana xidmətçisinə deyəndə ki:

– Mürsəl Babayev!

Xidmətçi soruşdu:

– Qılçası kəsilənimi deyirsən?

Leyla duruxdu:

– Babayev Mürsəli zəhmət çək, çağır!

Xidmətçi öz qəbahətini anlamış kimi, heç bir söz demədən içəri getdi. Beş dəqiqə çəkmədi ki, qoltuq ağacı ilə yeriyən uzun, qalınsaç bir oğlan palatadan çıxıb, qapıya göz gəzdirdi. Bir baş Leyla tərəfə yeridi:

– Bağışlayın, Babayevi axtaran sizsiniz?

– Bağışlayın, Mürsəl sizsiniz?

– Mənəm!!! Siz yəqin ki, Ziba xanımsınız!

– Bəli!

– Xoş gəlmişsiniz! – Bunu deyib Mürsəl görüşmək üçün əlini Leylaya tərəf uzatdı. Leyla da ona əl verdi.

Mürsəl Leylanı palatadan bağçaya baxan pəncərələrinə tərəf apardı. Skamyalardan birini göstərdi.

– Buyurun, əyləşin, – dedi.

Leyla oturan kimi əlindəki sovqat bağlamasını yaralının qabağına qoydu:

– Bağışlayın, – dedi, – xəstə yanına gəlməyə adam xəcalət çəkir. Bir-iki dənə fətir gətirmişəm. Layiq olmasa da...

Mürsəl başını aşağı salmış halda:

– Var olun, – dedi, – burada bizə hər şey verirlər. Ehtiyacımız yoxdur, zəhmət çəkməyin!

Deyəsən Mürsəl gəlinin uzaq yol gəldiyindən və sifətindəki iztirabdan həyəcan çəkdiyini duymuşdu. Dərhal mətləbə keçdi:

– Ziba xanım, – dedi, – yəqin ki, məktubu almısınız. Mən onu qəsdən sizə yazdım. – Mürsəl başını aşağı saldı. İri və uzunbarmaqlı əllərini bir-birinə çataqladı, sanki əsəblərini ələ almaq üçün daha nəsə düşündü. Bir qədər sükutdan sonra ifadəsinə başqa ahəng verdi: – Dünyada heç dostun, yaxşı dostun olmasın! Bu bir dərd deyil! Dərd odur ki, beləsi ola! Ünsiyyət bağlayasan, sonra da... Ziba xanım görürsünüz, sağ qıçımı itirmişəm. Bir dəfə kəsiblər, bəlkə yenə kəsdilər.

Buna mən dözərəm, iş igid başına gələr. Amma Mir Əli, yox! O gündən elə bilirəm bir tərəfimi çapıblar. Ziba xanım, Mir Əli ayrı oğlan idi. Onun üçün biz nə qədər qəm çəksək, azdır. Sizdən xahişim budur ki, Leyla xanım bilməsin. Mən onların məhəbbətinə bələdəm, qızı da, uşağı da bədbəxt edərsiniz, bu sirri heç olmasa dava bitənə qədər saxlayın! Deyin ki, bir xəbər yoxdur, qabaq xətdədir!..

Mürsəl bir tərəfdən Zibaya nəsihət, tapşırıq verir, o biri tərəfdən cəbhədəki mənzərəni xatırına gətirirdi.

Hissələrimiz düşmən mövqelərinə lap yaxınlaşmışdı. Hücumda onu dəstənin qabağında, "irəli" deyə qışqıranda gördüm, başından dəyən güllə zireh papağını kənara atdı, yazıq üzü üstə düşdü. Mən pulemyotu idarə edirdim, qoyub gedə bilmədim. Onlardan sonra biz yeridik. İki saat sonra mən necə yaralanmışdımsa heç nədən xəbərim olmayıb, gözümü açıb özümü sarğı məntəqəsində gördüm.

Mir Əli qəhrəman idi, qəhrəman kimi də vətən borcunu verdi. Bizim vəzifəmiz isə onun intiqamını almaq, heç bir zaman onu unutmamaqdır!

Mürsəl sözünü tamamlamadan cibindən balaca dəsmala bükülü bir şey çıxartdı:

– Buyurun, – dedi, – Ziba xanım, mərhumun saatıdır, sanitarlar mənə verib, qəbz aldılar. Sən bunu əlbət ki, Leyladan gizlətməlisən! Sizə zəhmət verməkdən qəsdim bu idi.

Mürsəl belə bir xəbərdən sonra Zibanın simasına nəzər saldı, birdən oturduğu yerdən dik atıldı, qız çoxdan özündən gedib, huşsuz düşmüşdü. Mürsəl bacıları səslədi, həkim istədi. Leylanı götürüb palataya apardılar. Mürsəl isə dediyinə peşman oldu.

## 2

Mürsəl Mir Əlini od içində tərk etmişdi. Daha doğrusu tərk etməyə məcbur olmuşdu. Ayılandan sonra sarğı məntəqəsinə hay salıb soraqlaşmışdı. Belə bir yaralı tapılmadığından yoldaşının ölümünü yəqin etmişdi. Ancaq Mir Əlinin vəziyyəti Mürsəl düşündüyü kimi yox, bir az başqa cür idi. Həmin gün Mir Əli başından ağır yaralanandan sonra top gülləsinin açdığı çalanın kənarında vücudunun yarısı torpaqda örtülü halda, huşsuz düşüb qalmışdı. Sərin yay gecəsinin nəsimi onun əsəblərinə toxunanda oyanmış, özünü meyitlər arasında görmüşdü.

“Çıxmayan cana ümid yoxdur” demişlər. İnsan, vücudundakı zəngin həyat imkanlarını ancaq ağır xəstəlik məqamında duyur. Mir Əli gözlərini açıb aydın fəzaya baxanda, güman etdi ki, axır nəfəsidir, hər şey bitmişdir. Bu baxış yalnız sönmək üzrə olan həyat qığılcımının son parıltısıdır. Bunun ardınca zülmət gələcək, ağırlaşan göz qapaqları əbədi bir qaranlıq gətirəcəkdir... “Of! Həyat!”

Mir Əli vücuduna hərəkət vermiş, tükənməkdə olan taqətini diz qapaqlarına toplayaraq, şərqə-səngərə tərəf yollanmışdı. Hər işıldayanı su bilib yönəlmiş, ağaclar altında sərin torpaq arayıb, sinəsini sürtmüşdü...

Bir gün sonra sanitar əsgərlər Mir Əlini yarımcan meşədən tapıb aparmışdılar. Ay yarım məntəqədən-məntəqəyə, xəstəxanadan-xəstəxanaya keçirilərək, getdikcə arxanın dərinliklərinə aparıldı. Son bölgü məntəqəsində yarası uzun sürənlərin Novosibirsk şəhərinə göndəriləcəyini bir şəfqət bacısından öyrəndi, həkimlərdən və xəstəxana müdirindən xahiş edib, özünü vətəninə – Bakı xəstəxanalarına yollanan qatara saldı.

Eyni gündə, eyni saatda şimaldan cənuba gələn qatar Mir Əlini gətirdi: cənubdan şimala gedən qatar isə Leylanı və Mürsəli gətirdi.

Can bir qəlblə olan bu üç adamın, bu üç əzizin bir-birindən xəbəri yox idi. Müharibə, qəfildən qopan bir ruzigar kimi, onları ayırıb o qədər uzağa atmışdı ki, heç biri o birisinin halını təsəvvür edə bilmir, sağlığına xatircəm ola bilmirdi.

Uzun ayrılıqdan və təhlükələrdən sonra doğma yurduna, öz ailəsinin yanına, Leylanın, Tofiqin yanına qayıdan Mir Əlinin halını mən yazmasam da oxucu bilir.

Tbilisi şəhərində Mürsəli görəndən sonra Leylanın necə pərişan hala düşdüyü, nə iztirab içində qayıtdığı da oxucuya məlumdur.

Mürsəl isə Leylanı belə vəziyyətdə tək buraxa bilməmişdi. Şikəst olsa da, iki günlüyə icazə alıb, özü gətirmişdi.

Mürsəl tanış olduğu, müşayiət etdiyi qızı hələ də Ziba bilir, Ziba çağırırdı. Ona görə də təsəlli verir, evdə, Leylanın yanında ah-zardan tamam əl çəkməsini xahiş edirdi. Deyirdi, ancaq bunun mümkün olacağına özü də inanmırdı. Yəqin etmişdi ki, fəlakətli xəbərdən bulud kimi tutulan bu matəmli qız Mir Əlinin evinə sakitliklə girməyəcək, bəlkə də bütün qüssələrini ifadə edən yanıqlı bir fəryadla yeddi qapı-qonşu başına yığacaqdır.

Bu vəziyyəti gözü önünə gətirən Mürsəl heç evə, Leylanın yanına getmək istəmirdi.

– Ziba bacı, – deyirdi, – mənim sizə getməyim yaxşı düşməz. Ürəyim pisdir. Mərhumun uşağını görsəm, özümü saxlaya bilməyəcəyəm. Gəlin, siz rüsxət verin, mən vağzaldan qayıdım, onsuz da...

Bu xahiş Leylanın qəlbinə dəydi:

– Mir Əlinin sizin kimi əziz dostu qapımızı açmaq istəmirsə, bundan sonra yoluxub-yoxlayanımız kim olacaq?!

Mürsəlin deməyə sözü qalmadı.

Onlar vaqondan düşüb, evə yollananda səhər yenicə açılırdı. Şəhər təzəcə yuxudan qalxır, günəş yenicə Xəzərdə çimib çıxır, fəzalar seyrinə hazırlaşırdı.

Vağzalın kənar tərəfində dayanan səhiyyə maşınları vaqonlardan düşən xəstələri qəbul edirdi. Mürsəl bu maşınlarda o qədər uzanaqlı qalmışdı ki, onları görəndə gözü ağrıyırdı. O bilsəydi ki, əziz dostu və həlak olmuş saydığı Mir Əli də bu xəstələrin içindədir, sevincindən qışqırıb, nə bilim, nə deyərdi.

Səhiyyə maşınının yollanmasını gözləyən və şəhərə gələnlər içində, demək olar ki, ən sevincəyi olan Mir Əli vaqonlardan düşüb tramvaylara tələsən camaata baxırdı. Səki dolusu izdihamla yeriyənlər içində bəlkə də onun tanışları, qohumları, ürəyinin bəndi – Leylası var idi. Mir Əli də bunu görmədi, seçmədi. Ancaq Mir Əlinin qəlbi döyünürdü. Xəstəxanaya tələsirdi. O, briqadirə yanaşıb, icazə istəmişdi. “Evimizə dəyməsəm, ailəmi görməsəm, mən nə xəstəxanada yata bilərəm, nə də müalicə olunaram. İkicə saat mənə vaxt!”.

Briqadir də:

– “Get, – demişdi, – ancaq vaxtında qayıt!”

Maşın xəstəxana qabağında dayananda birinci çıxan başısarıqlı Mir Əli oldu. Qolunda şinel, başı, yaxasıaçıq, elə sevincək və sürətlə evlərinə yüyürürdü ki, deyirdin kişinin yağı daşır. Ev qapısına çatanda baş Mir Əlinin, baş Leylanın! Bunun əlində şinel, onun əlində çamadan...

– Leyla!

– Mir Əli!

– Səsinə qurban!

Mir Əlinin səsi Leylanın çöhrəsini örtən qəm və matəm pərdəsini yırtdı.

Sevgililər qucaqlaşdılar. İçəridən, Zibanın, sonra da Tofiqin səsi eşidildi. Uşağı tələsik oyatmışdılar. O, yalınqat köynəkdə balaca yumruğu ilə yuxulu gözünü ovaraq qapıya qaçır və qışqırırdı:

– Atam gəldi!

Tofiq, o şirindil uşaq o gün qələbə bayrağı kimi əllərdən düşmədi, başlarda gəzdi.

*1943*

## ƏR VƏ ARVAD

Qarovul batalyonunda üç aydan artıq idi ki, təlim keçirdik. Bir gün komandir məni çağırdı:

– Sənə, – dedi, – tapşırıq var. Şəhərə adam aparacaqsan!

Apardıqlarımın əsir olduğunu biləndə sevindim. Nədənsə mən, bunları, Hitler ağlına uyub gələn bu sarı qulları görmək istəyirdim. Alman dilini bilməsəm də, onlarla maraqlanırdım. Güman edirdim ki, onları anlamaq üçün dindirmək o qədər də lazım deyil. Sifətlərindən çox şey oxumaq olar.

Birinci səfərdən sonra daha bir də mən öz batalyonumuza qayıtmadım. Sənətim cəbhədən arxaya, düşərgəyə əsir daşımaq oldu. Almanların sifətində axtardığımı da oxudum. Onlar göygöz, uzun və iri çənəli, müstəqim və yekə burunlu, qaşqabaqlı, yerəbaxan adamlardır. Gözlərindən əlamət yağır, deyirsən bu, əlində bıçaq, kəsməyə getdiyi ətliyi əlindən qaçırmış və bir də tutacağından ümidini kəsmiş bir qəssabdır.

Vaxtı ilə maraqlandığım əsirlər, indi mənə eyni ölçü və qəlibdən çıxmış, fris adlanan kibrit qutuları kimi bir-birinə oxşar, adi, quru görünürlər. Mən onların yalnız sayını yadımda saxlayıram.

Ancaq birini və onunla əlaqədar bir mənzərəni unutmamışam, unutmayacağam.

Mən bütün müharibə boyu heç vaxt bu qədər işləməmişdim. Biz hər vasitədən, hər dəqiqədən istifadə edib əsirləri lazımi yerlərə gətirdik. Əsir də ki, qurtarmırdı. Göydən yağan qarın sayı vardı, ön cəbhədən bizə tərəf ötürülən əsirlərin sayı yox idi. İndi mən düşmən ölüsünü əsirdən faydalı sayırdım. “Heç olmasa, – deyirdim, – bu lənətə gəlmiş oğlu bizə başağrısı vermir”.

Şiddətli yanvar şaxtası kəsib tökürdü. Elə bürünmüşdük ki, ancaq gözlərimiz işıldayırdı. Tonyarımlıq maşında 11 nəfər əsir gətirirdik. Yol qarovulu, deyəsən təkər səsindən bizi tanımışdı. Maşını dayandırdı. Yeni və topal bir alman soldatını maşına çıxartdı, getməyimizə icazə verdi. Topal özünü maşının küncünə yıxdı. Mən dil bilməsəm də, dərhal soruşardım ki: "Ay həpənd, bir qıçla Berlindən bura gəlmisən, bəlkə sənin iki qıçın olaydı, onda neylərdin?" Adətən əsir düşənlər yemək istəyir, soyuqdan şikayətlənir, yalvarırlar. Topalda bunu görmədim. O, yalın olsa da, aylardan bəri qırxılmamış üzündə və sıx saqqalında buz bağlansa da, əzab çəkdiyini hiss etdirmirdi. Güman edirdim ki, bu, möhkəmlikdən, ya məğrurluqdandır. Sonra bildim ki, bunların heç biri deyil, topalın işlərində ayrı sirr var.

Topal kürəklərini maşının divarına söykəmiş, bir qıçı ilə çömbəltmə oturmuş, ayıq və iri gözlərini mənim üzümə dikmişdi. Belə baxışları biz tez seçirik və gözdən qoymuruq. Ürəyimə gəldi ki: "Bəlkə bu hərif məni xamlamaq, qaranlıqda cumub, əlimdən silahı qapmaq istəyir. Bəlkə o özünü maşından yerə atmaq niyyətindədir".

Bunlar inanmalı zənlər deyil. Tək tutulmuş topal bir soldat nəyə ümid edib silaha tamah sala bilər? Özünü maşından atması isə ölümü satın almaqdır. Əksinə, bəlkə də onun belə ayıq-sayıq dayanması sevincdəndir. Komandirinin əlindən qurtarıb, qurbağa ilan əlindən qurtaran kimi, görəsən haçan qollarını qaldırıb, özünü bizim səngərə atıb.

Olmadı, uzun və şaxtalı yolda topal məni rahat buraxmadı. Hətta ona müraciət edib acdığını, papirosdan korluq çəkib-çəkmədiyini soruşdum. Başı ilə rədd etdi.

Maşınımız artıq gurultu və atışma səslərindən uzaqda, demək olar ki, dərin arxada idi. Gecənin və qışın lap oğlan vaxtı idi. Qarı xışıldadaraq, ötən maşını və arabir öskürək səslərini nəzərə almasaq, kainat donmuş buz parçasına bənzəyirdi. Qəhrəmanlarımıza arxalanaraq, səssiz yatan sovet kəndləri sanki yenicə azad olduqları faşizm zülmünün acılarını unutmaq üçün dincəlirdilər. Bu ağaclıq həyətlər içində, kirəmitli evlərdə yaşayanları xəyalıma gətirib, ürəyimdə deyirdim: "Dincəlin, dincəlin, analar, atalar, balalar! Üstümüzə gələn yağıları tutmuşuq, budur, mənim qarşımda yazıq-yazıq dayanıblar. Sovet qanunu icazə versəydi, bu gecə, elə lap bu saat mən hamımızın acığını, keçirdiyiniz təhlükəli günlərin, yuxusuz gecələrin, yanan xanimanların, qarətlərin heyifini, öldürülən ata və oğulların hamısının

qanını alardım...” Onlar – cəbhəyə xidmət üçün bütün günü zəhmət çəkib tər tökən sovet kəndliləri mənim bu xitabımı eşitməsələr də, arxayındırlar. Onlar öz talelərini Kommunist partiyasına, Stalinə, Qızıl Orduya tapşırandan bəri fədakar çalışmağa, arxayın və qayğısız dincəlməyə adət etmişdilər. Ehtimal ki, onlar bu saat mənim əsir aparan maşınımın səsini eşidir, ürəklərinə ancaq bu gəlir: “Əsgərlərimizdir, nə lazımsa edirlər”.

Topal rahatlanmırdı. Ayağını qabağına qoyub, qurdalanırdı. Ondan sorğu-sual edir, ona yalvarır, ya canını aradan çıxardığı üçün təşəkkürmü edirdi? Bəlkə don vurmağından qorxurdu, şaxta kəsik yerə daha bərk təsir edir. Bu adam kəsik qıçının yerini tutmalı, sızıldamalı idi. Soyuqdan qorunanlar şinellə ayaqlarını örtür, saman içinə soxulurdular. Topal isə ayağını qabağına qoyub nə isə qurdalanırdı. Mən əyilib işarə ilə ondan soruşdum: “Nə olub ayağına? Bəlkə döyənəyin-zadın var? Tısbağa başını qınına çəkən kimi topal dərhal qıçını altına çəkib gizlətdi. Elə mahir oturdu ki, kənardan baxan deyər: “Yazığın iki qıçı da kəsilib”. Bəlkə qorxudan elədi? Mən onunla artıq məşğul olduğumu qəbahət bilib, özümü danladım: “Şikəst adamdır, – dedim, – nə işin var!” – Üzümü o biri yana çevirdim, topalı öz öhdəsinə buraxan kimi dayandım. Yarım saat çəkmədi ki, yenə topalın qurcuxduğunu sezdim. Silaha söykənib altdan fikir verirdim. Bu dəfə topalın qıçı qabağa çıxmamışdı. Sağ əli dala getmişdi, nə isə qurdalanır, saman xışıltısı içində hərdən ayaqqabısının altından üzülən mıxların səsi təkrar olunduqca, hərif ara verib, mənə və ətrafındakılarına baxınırdı. Artıq topalın nə ilə məşğul olduğu mənə məlum idi. İşarə ilə qarovul yoldaşımı çağırdım. Hərə bir yandan tutub, topalın qollarını sarıdıq, sonra çəkməni çıxardıb yoxladıq. Padoş altından bir büküm kağız çıxarıb, fənər işığında baxdıq. Alman hərfləri ilə yazılmışdı. Yoldaşım almanca bilsə də, heç bir şey demədi. Yəni axıra qədər oxumağa macal da olmadı. Kağız içindən bir cüt mirvari qaşlı qızıl sırğa çıxdı. Yoldaşım kağızı büküb, hamısını mənə tapşırdı: “Bunu, – dedi, – uzağa aparmaq lazım deyil, səhra xəstəxanasına təhvil verərsən...”

Deyəsən, topal müalicə olunası idi. Ürəyimdə dedim: “Bu əsir bizə ucuz başa gəlməyəcək, qorx ki, həkimlərdən qıç iddia eləyə!” Səhər açılhaaçılda G. şəhərindən on iki kilometr aralı, səhra xəstəxanasına getmək üçün biz topalla düşməli olduq. Topalı qabağıma qatıb, aparıram. Əlbəttə ki, padoşun arasından yalnız kağızlar çıxsaydı,

bu adamın böyük xəfiyyə, ya kəşfiyyat işləri ilə məşğul olduğunu zənn edərdim. Sırğaları görən kimi hərifin "fəziləti" məlum oldu. Gündə tutduğumuz qarətkərin biri də budur. Sırğaları da ya qızına, ya arvadına, kim bilsin, bəlkə də, bir qıçı ilə təşrif aparacağı Berlin fahişəxanalarında ilk rast gəldiyi mütrübə verəcək idi. Bu gümandan, ya hansı bir duyğudansa darıxırdım. Sənətim mənə qəribə gəldi. Tez qayıtmaq arzusu ilə yeyinlədim, topalı da tərpətdim. O, qoltuq ağacı ilə iri addımlar atır, nə buzdan, nə qardan qorxurdu. Sanki mənim süngümdən qurtulmaq üçün bacardıqca yeyin, bacardıqca aralı gedirdi:

– Urus!

Mən bu səsi eşidəndə döyükdüm. Çağıran kimdir, haradan, kimi çağırır! Cığır kimi dar yolda heç kəs yox idi.

– Urus, səndən xahiş edirəm!

Daha da təəccübləndim. Topal rusca bilirmiş!

Mən ona geri dönməyə və dayanmağa icazə vermədim. Topal yerişinin sürətini və ahəngini dayandırmadan xahişini mənə söyləyirdi. Üç addım aralı arxada getsəm də, topalın sözlərini yaxşı eşidirdim. Bu anda kənardan baxan deyərdi: "Topal arxadakına yox, yanınca gedən görünməz bir adama xitab edir".

– Rus, səndən xahiş edirəm ki, məni özün öldür!

– Faşist, buna mən boyun oluram, ştabda işinə baxarlar. O dünyalıq olsan, xahişinə əməl olunar!

– Sırğalar sənin halalın, gəl sən məni öldür.

Əvvəl gülməyim gəldi, sonra da hirsim tutdu:

– Belə danışsan, – dedim, – avtomatla cavab alacaqsan! Meyitini cığırda qoyacağam!

Mən çaxmağı tərpədəndə topal diksindi, geri baxıb yalvardı:

– Əl saxla, qələt elədim!

Mən topalı daha da yeyin getməyə, susmağa məcbur etdim.

Xəstəxanaya çatanacan o, nə bir kəlmə danışdı, nə öskürdü, nə də asqırdı.

Əsiri həyətdə, darvaza ağzında saxlamışdım. Təhvil gözləyirdim. Başı sarıqlı bir qadının "Vaqner" deyə qışqırıb, həyətə atıldığını gördüm. Topal bu səsdən diksindi. Almanca nə isə tələsik bəzi sözlər dedi və qadını özündən kənar etməyə çalışdı. Nəzarətçi qadını tutub, içəri apardı. Mən də topalı kənara çağırıb saxladım. Beş dəqiqə çəkmədi ki, xəstəxana rəisi çıxdı. Mən əsiri də, onun ayaqqabısının

altından çıxan şeyləri də təhvil verdim. Bildiklərimi danışdım, qayıtmağa icazə istədim. Rəis mane oldu:

– Dayanın, – dedi, – bu matahınız bizə lazım olmayacaq. Sabaha qədər gözləyin, bəlkə aparmalı oldunuz.

* * *

Mənə bir gecə istirahət verilmişdi.

Dünyada çox ləzzətli şeylər var ki, adam onların qədrini ancaq əldən çıxanda bilir. Əsgərlikdə, cəbhə həyatında yuxudan alınan ləzzəti heç şeydən almaq mümkün deyil. Yuxu, həsrətlə adı çəkilən şeylərdən biridir. Doğrudur, topalın taleyi ilə, onunla görüşə gələn yaralı qadın ilə, rəisin qəbul etmək istədiyi "matah" ilə maraqlanırdım. Bilmək istəyirdim ki, görəsən bu nə əhvalatdır. Tutduğumuz adam nəçidir? Ancaq yuxu, istirahət bu marağıma üstün gəldi. Qarovul otağında başımı əleyhqaz çantasının üstünə qoyduğumu bildim, bir də səhər qarovul rəisinin səsinə oyandım. Xəstəxana siyasi işçiləri topalın xasiyyətnaməsini müəyyən etmişdilər. Sən demə, həmin bu topalın adı Vaqnerdir. Özü Berlində eses deyilən jandarm dəstələrində "adam döymək vəzifəsində" çalışarmış. Sonra Hitler onu Stalinqrada göndərmişdir ki, orada döyülməli adamlar çoxdur, arvadı – həmin bu başı sarıqlı qadın onu davaya yola salanda çox tapşırıqlar vermişdi:

– Vaqner, – demişdi, – kimi döyəcəksən, çoxmu, azmı döyəcəksən mənə dəxli yoxdur. İstəyirsən gündə yüz adam döy, öldür. Bundan xanımına bir şey çıxmırsa, zəhmətin hədərdir. Yeddi ildir sənin evində arvadam, bu yeddi ildə azı bir yeddi yüz adam döymüşsən, çoxunun nəfəsini kəsmişsən, mənə nə mənfəəti çıxıb? Söz olanda da bəhanə gətirirsən ki: "Dustaqdır, dustaqdan nə qopardım!" Di buyur, bu da əsir, bu da urus! Gedirsən, qulluğun öz yerində, evinə, arvadına da bir gün ağla! Bax bu mənim üst-başım, bu da boyun-boğazım. Üzüyə, sırğaya, saata həsrətəm. Daha bu gündə də məni bəzəməsən, bizimki getdi! Açığını deyirəm, cəbhədən mənə hədiyyə göndərməsən, sənə dua eləməyəcəyəm. Allah səni partizan gülləsindən qorumayacaq!

Vaqner arvadına vədə vermişdi:

– Mariya! Mənim əlləşdiyim, çarpışdığım hamısı sənin üçün deyilmi? Özümə qalsa yeddi yüz nədir, yeddi adam döyüb çörəyimi çıxardaram. Sənin güzəranını yaxşılaşdırmaq, tələblərini ödəmək üçün

mən bu peşəni tutmuşam. Doğrudur, indiyəcən korluq olub, amma daha bundan sonra yox! Odur, qoşunumuz basıb Asiyanın lap sərhədlərinə gedib. Oralarda o qədər yağlı adamlar var ki, Allah canıma dəyməsə, kötək altında hamısının dərisini soyacağam. Sənin bir ayağın poçtda olacaq! Həftədə bir bağlama alacaqsan! Parçasından, qızılından, qumaşından... Rusiya dəryadır – yemək, dağıtmaqla qurtaran deyil, kefini kök elə!

Bu söhbətlər Mariyanın ürəyinə yatmışdı. Ərinin sinəsinə yaslanmış, əzizlənmişdi:

– Bir cüt qızıl sırğa göndərəcəksənmi?

– Mütləq taparam.

– İpək parça da istəyirəm.

– Arxayın ol! Stalinqrad Özbəkistanın qapısıdır. Özbəklərin ipəyini sən də geyməyəcəksən, bəs kim geyəcək!

– Saatsız qayıtma ha!

– Saat nədir, qızıl qolbaq da olacaq!

– İnanım sənə?

– Etiqadını möhkəm elə!

– Vaqner, bəlkə bunları alanacan sənə güllə dəydi.

– Mariya, əmin ol, mənə urus gülləsi kar etməz! Sən bağlama gözlə!

– Mən də sənə vaqon-vaqon salam, öpüş göndərərəm!

Deyəsən, bu yerdə Vaqnerin yadına vacib bir şey düşdü: qayıdıb Mariyasının alnından öpdü:

– Əzizim, – dedi, – Rusiya çox soyuq olur. Salamla, öpüşlə qızışmaq olmaz. Bacarsan, rast gəlsə, əlinə keçsə, sən də mənə bir cüt uzunboğaz çəkmə tədarük elə.

– Özün oradan taparsan!

– Deyirlər zabitlər macal vermir. Ayaqqabını özləri götürürlər. Mənim rütbəm balacadır. Qorxuram verməyələr. Sən gözdə-qulaqda ol!

Ər-arvad öpüşüb-görüşüb ayrılmışdılar.

* * *

Vaqner xanımına vəfalı çıxmışdı. Səfərindən ay yarım sonra Mariyaya bir cüt ipək corab göndərmiş, üzr istəmişdi: "Mariya, bu siftəsidir, Kislovodskdan bir fəhlənin ayağından çıxarmışam. Çək ayağına, dalısını gözlə!"

Bundan sonra Mariya tamam bir ay gözləmiş, ərindən bir xəbər almamışdı. Ünvanına təcili teleqram vurmuş, sifarişləri haqqında soruşmuşdu. Vaqner cavab verirdi ki: "Sırğa hazırdır, gələn tapıb, göndərə bilmirəm!" Mariya bu şad xəbəri eşidən kimi komandirdən izin alıb, ərini ziyarətə gəldi. Ürəyində dedi: "Həm ziyarət, həm ticarət! Kişinin əl-ayaq elədiyi şeyləri gətirərəm. Soldatlar səliqəsiz olurlar. İndi Urusyət kəndlərində yığışdırmalı çox ev şeyi var. Bir-iki çamadan doldurub gətirsəm, qənimətdir".

Bu iştahla səfərə çıxan xanım, Stalinqrad yolunda faciə xəbərini eşitdi. Vəziyyət necə idisə, Mariya gedən vaqonu stansiyaların birində açıb qoydular. Qatarlar ağzını qərbə çevirmişdi. Düzü-dünyanı tutan qarın sayı var idi, Stalinqrad cəbhəsindən qaçan zabitin, soldatın sayı yox idi. Mariya ərinin yoldaşlarını bir gündə gördü ki, görməsə idi ondan yaxşı idi. İndi o, sırğanı yaddan çıxarmışdı, başının hayında idi. Haman axşamkı şaxta Mariyanın qulaqlarını ixtisar edib, sırğa qayğısından qurtardı. Ayağını qoruyan, əri üçün gətirdiyi boğazlı çəkmə oldu. Mariyanın hər dəqiqəsi: "Neyləyim – necə eləyim?" ilə keçirdi ki, Sovet qoşunları bir həmlə ilə stansiyanı əhatə edib, soldatları və Mariyanı əsir tutdular. Mariyanı qulaqlarını müalicə üçün xəstəxanaya aparmışdılar.

Mariya Vaqnerə çəkmə gətirmişdir. Halbuki Vaqner özünə qıç axtarır. Vaqner arvadına sırğa gətirmişdir; arvadı isə qulaq hayındadır. Mən bunların – bu qarətçi ər-arvadın gözlərində yanıb-sönən canavar iştahına tamaşa eləmək istəyirdim.

*1943*

## İKİ ANANIN BİR OĞLU

O zaman bizim şəhərdə idarələr yerlərini tez-tez dəyişərdi. Uzun müddət bir binada qalan idarə az olurdu. Belə idarələrdən biri də çay kənarında, balaca bağ içindəki uşaq bağçası idi. Bu bağça mənim yolumun üstündə idi. Hər səhər-axşam buradan ötərdim. Ərik və gilas ağaclarının altında oynaşan quşlar kimi budaqdan-budağa, səkidən-səkiyə hoppanan uşaqlara tamaşa etməkdən doymazdım. Uşaqlıqda bağçada yaşamadığımdanmı, keçən günlərin şirin xatirəsindənmi, nədənsə buradakılara qibtə edər, saatlarla taxta məhəccərə söykənib baxardım.

Bir dəfə evə qayıdanda, bağça qabağında izdiham gördüm. Hamıda bir həyəcan, təəssüf qarışıq sevinc duyulurdu. Adamlar bağçaya baxırdılar. Bağça həyəti isə izdihamdan görünmürdü. Hər kəsdən soruşdumsa, müəyyən cavab demədilər. Səslər gəlirdi:

– Su verin!

– Anasının bəxti üzdə imiş.

– Dayan bir görək!

Mən qapı ağzından səkiyə çıxıb, həyətə baxdım. İki qadın oturmuşdu. Biri yaşlı, başına ağ dəsmal örtmüş xidmətçi idi. O birisi, tirmə şallı, cavan və yaraşıqlı bir gəlin idi. Deyəsən hər ikisi ağlayırdı. Tirməli gəlin lap cavan idi. Qucağında uşaq olmasaydı, ona hamı on səkkiz yaşlı qız deyərdi. Halbuki, o, neçə bala böyütmüş təcrübəli qadınlar kimi uşağı öpüb əzizləyir, bu qolundan o qoluna verir, bir tərəfdən ovutmaq istəyir, o biri tərəfdən də özü ağlayırdı. Bağrına basır, öpür, hərdən başını qaldırıb adamlara baxır, ipək dəsmalla gözünün yaşını silirdi. O birisi, ağ dəsmal örtmüş qadın, uşağı gəlinin əlindən almaq istəyirdi, ala bilmirdi.

İçəridən gələn çeşməkli bir kişi hər iki qadının qolundan tutub qaldırdı. Onlar pilləkənlərdən çıxıb otaqlara girəndən sonra, adamlar dağılışmağa başladılar. Mən tərbiyəçiyə yanaşıb soruşdum:

– Bacı, o qadınlara nə olub?

– Heç nə, – dedi, – şükür allaha ki, xata sovuşdu.

– Nə xata idi?

Tərbiyəçi mənim marağımı görüb yer göstərdi. Mən pilləkən ağzındakı kürsüdə oturdum. O nə üçünsə aşağı həyətə düşdü və tez qayıtdı. Sanki bayaq dediklərinin ardını danışırdı:

– Şükür ki, xata sovuşdu. O gördüyün tirməli gəlin uşağın anasıdır. Neçə gündür kənddə imiş. Bu gün qayıdıb oğlunu görmək üçün bağçaya gələndə, uşaqlar yuxarı mərtəbədə nahar yeyirlərmiş. Uşaq anasının “İdris”, – deyə səsini eşitcək, sevincək eyvana qaçıb, məhəccərə dırmaşanda, təpəsi üstə yerə gəlib.

– Bir şey olmayıb ki? Salamatdırmı?

– Necə bir şey olmayıb? O hündürlükdə eyvandan daş səkilərə düşən necə salamat qalar? Uşaq yerə dəysə idi, o saat canı çıxacaqdı. Xoşbəxtlik olub ki, Nazimə arvad görüb...

– Göydən yerə gələn uşağı görməyin bir faydası varmı?

– Arvadın igidliyinə bax da! Görüb də, uşağı ölümdən qurtarıb da!

– Kimi dediniz?

– Nazimə! Burada tərbiyəçidir. Nazimə kənardan bunlara baxırmış, uşağın yıxıldığını görəndə, arvad özünü irəli atıb, göydə onu top kimi tutub. Özü yıxılıbsa da, uşağa bir şey olmayıb.

– Deməli salamatdır?

– Bəli, salamatdır, ona heç nə olmayıb.

– Bəs gəlin nə üçün ağlayırdı?

– Necə ağlamasın? Uşağın düşdüyünü görən kimi özündən gedib. Ağlamazmı? Mənim ürəyim hələ yerinə gəlməyib. Uşaq salamat qurtaranda, elə bil, dünya bizim oldu. Adam istəyir yaxşılıq olsun, ürəklər xoş olsun!

"Nazimə!" Bu ad mənə tanış idi, ancaq mən tanıdığım Nazimənin buralarda olacağını güman etməzdim. Tərbiyəçi sözünü qurtarıbmış kimi, əllərini önlüyünün cibinə qoydu və içəriyə baxıb, yavaşca mənə işarə elədi:

– Budur, Nazimə özü gəlir.

Mən dönəndə gördüm ki, odur, özüdür.

– Nazimə, siz hara, bura hara? – deyə soruşdum.

O gülümsədi:

– Mənim əsil yerimdir, burada işlədiyim az qala beş il olur.

– Bu gün, – dedim, – hamı sizin igidliyinizdən danışır...

– Uşağı bir xoşbəxt təsadüf saxladı, mən də bir səbəb oldum.

Neçə il əvvəl, biz Ozan küçəsində yaşayanda, həmin bu Nazimə qonşumuz idi. Ucaboy, üzü xallı, qarayağız, həmişə yeyin yeriyən bir qadın idi. Bəzən qapımızı bərk-bərk döyər, sanki vacib bir iş üçün tələsik evə girib, üzünü anama tutar, mərhəmət uman bir səslə deyərdi:

– Xeyransa, darıxıram, darıxıram, ay bacı!

Mən tez patefonu götürər, ya tarı əlimə alardım. Anam məni danlardı ki, sən öz işinə get!

Sonralar bildim ki, Nazimə ancaq öz evlərində darıxır, anam da, başqa qonşular kimi, uşaqlarını onun gözündən yayındırır.

Qadının dərdi nə idi?

Nazimə on beş ildən artıq idi ki ərə getmişdi. Əri saatsaz Əli arvadını sevirdi; özü başıaşağı, dinc və pul qazanan bir kişi idi. Demək olar ki, iki nəfərdən ibarət olan bu ailənin heç zaman və heç nədən korluğu olmamışdı. Əli evini zəmanəyə layiq qurtarmaqdan başqa, Naziməyə də hər cür paltar və zinət şeyləri almışdı. Hər qış onu kəndə, atası

evinə qonaq göndərər, hər yayı Şimali Qafqaza, mədən sularına müalicəyə aparardı. Ancaq bunların heç biri Naziməyə təsəlli deyildi. Çünki Nazimənin övladı yox idi. O, evdə oturduğu zaman döşənmiş, bəzəkli otağını dərin və daimi bir sükut içinə batmış görərdi və bu zaman bilməzdi nə etsin. Öz əli, öz səliqəsi ilə düzdüyü ev şeyləri – çarpayıdan tutmuş sandığa, xalçalardan tutmuş gümüş qablara qədər, hər şey dərin sükut içində sahibinə baxıb, sanki soruşurdu:

– Bizi kimə tapşırırsan? Hanı sənin balaların? İllər ötdükcə Nazimə bu hissin ağırlığını daha artıq duyurdu. Bədənnüma güzgü qabağında dayanıb başını darayanda, saçlarındakı ağ tükləri görəndə sinəsindən sərin və dərin bir ah qopurdu. Ona elə gəlirdi ki, bura, bu bəzənmiş və həmişə öz səliqəsində qalan otaq ev deyil, qocalmaq, ölümü gözləmək üçün bir tənhalıq guşəsidir. Eyvana çıxar, çiçəyini təzəcə töküb, meyvələrini böyütməkdə olan ərik ağacı gözünə sataşardı. Dayanıb ətrafı dinləyəndə, haradansa gülən, ya oynayan uşaqların səsi ucalanda, Nazimə saatlarla dinləmək istərdi. Səslər sönüb uzaqlaşanda Nazimə tez həyətdən çıxar, şəhər küçəsinin izdihamına səssizcə qarışardı.

Naziməni uşaq bağçasında xidmətə məcbur edəndə də ancaq bu ehtiyac olmuşdu. O burada, uşaqlar arasında bir tərbiyəçi kimi keçirdiyi vaxtda özünü ana kimi duyur və xoşbəxt hiss edirdi.

Qohumlarımızdan birinin uşağını yoxlamaq üçün bağçaya getmişdim. Naziməni görmədən qayıtmaq istədim. Mən onu balaca otaqda ahıl bir kişi ilə oturub söhbət edən gördüm. Bu onun əri idi. Hər ikisi ayağa qalxıb, məni çağırdı:

– Buyurun!

Qadın nə qədər israr etdisə, içəri girmədim.

– Buyurun, nə qulluğunuz var?

– Xoşbəxt olasınız, sizdən xahişim budur ki, gözünüz bu uşağın üstündə olsun, – deyə dil tökdüm.

– Arxayın olun, mən ona öz balam kimi baxıram.

Nazimə "bala" sözünü elə şirin, eyni zamanda elə bir həsrətlə dedi ki, özü də utandı.

Mən razılıq elədim.

– Sizin qayğıkeşliyinizi görmüşəm, – dedim. – Siz baxan uşaq ana qüssəsi çəkməz.

Nazimə başını aşağı saldı, üzü dalana baxdı. Mən gördüyüm hadisəni xatırlatmaq istəyirdim.

– Eyvandan yıxılan uşağı xilas etdiyiniz yadınızdadırmı?

Nazimə fərəhləndi, üzündə təbəssüm oynadı, gözləri parıldadı.

– Oğulluğa götürmüşəm, – dedi. – İdrisi oğulluğa götürmüşəm. Hər həftə uşağı bizə gətirirlər.

– Necədir? Sizə "ana" deyib yovuşurmu?

Bu sualdan qadının üzündəki təbəssüm küləkdən sönən bir şam kimi söndü. Simasına kədərli bir qaranlıq çökdü, kirpikləri uzun gözlərini yerə dikmiş halda, soyuq bir ah çəkib, "bəli!"dedi və qapını açıb, ərinə baxdı:

– Vaxtdır ha!

– Bu saat.

Kişi bu sözü deməmişdi ki, tənəffüsün bitdiyini bildirən zəng səsi bütün binanı başına aldı.

Mən sualımdan peşman oldum.

– Hər birimiz sənə oğuluq, – deyə Nazimənin kədərinə cavab vermək istədim.

– Əlbəttə ki, – dedi, – böyütdüklərimin hərəsi mənə bir oğul kimi əzizdir.

Zəng səsinə yerlərindən qalxıb həyətə tökülən, əl-ələ verib oynayan uşaqları görən kimi Nazimənin bütün ələmləri dağıldı; üzü güldü. Çoxlarının bezdiyi və uzaq qaçdığı inadlı, şıltaqçı və ağlağan uşaqları Nazimə sanki əfsunla ələ alır, sakit edir, yoluna qoyurdu. Tərbiyəçi və xidmətçilər çox uşağın anasından qabaq Naziməni çağırır, onunla danışırdılar. Evində və kənarda bəzən əsəbi, qaraqabaq, qaradinməz görünən bu qadının burada, bağçada kədərləndiyini, ya hirsləndiyini görən olmamışdı. "Uşaq səsi mənim ürəyimi açır", – deyərdi. Müxtəlif yaşlı, müxtəlif xasiyyətli, müxtəlif tələbli uşaqların bir-birinə qarışan səs-küyü başqalarının qulağını qıdıqladığı halda, Naziməyə nəşə verərdi. Bəzən o, qanadını açmış cücəli toyuq kimi həyətin ortasında dayanar, ətəklərində sallanan balalarının sözlərinə, qışqırtılı söhbətlərinə sakitcə qulaq asardı. Onların nazı ilə oynamaqdan, onların qarşısında, yeri gələndə, bir uşaq kimi kiçilməkdən çəkinməzdi. O, uşağın sakit baxmasından, dil açıb danışmasından, gülümsəməsindən, oynamasından, hətta ağlamasından böyük bir həzz alardı. Birisini razı salıb susdurduqdan sonra, başqa şıltaqçıya yaxınlaşar, indi başqa bir dil, başqa bir üsulla onun könlünü açmaq istərdi.

* * *

Dünən biz dəstə ilə vağzala, əsgərləri qarşılamağa getmişdik. Hərə bir hədiyyə götürmüşdü. Mənim də əlimdə bir dəstə gül var idi. Bunu kimə təqdim edəcəyimi bilmirdim; çünki gələnlərin arasında nə qohumum, nə də şəxsi dostum var idi. Onların hamısına eyni hiss və münasibət bəslədiyim halda, bir dəstə gülü kimə verə idim?

Düşündüm ki, "hansının döşündə çox nişan olsa, ona verəcəyəm. Sonra dedim: "Yox! Gözləyəcəyəm, hansının adamı olmasa, hansına hədiyyə düşməsə, gülü ona verəcəyəm..." Bu da xoşuma gəlmədi. Əvvəlcədən belə şeyi kəsdirməyin lüzumsuz olduğunu zənn etdim. "Gülü mənim əlimdən alan bir zirək tapılmamış olmaz", – dedim.

Zəng çalındı, hamımız vağzal səkilərindən ötüb, yolun qırağında dayandıq. Çox çəkmədi, bayram mərasimini andıran bəzəkli qatar gəldi, ağır və əzəmətli nəfəsi ilə aləmə səs saldı, sinə dolusu köksünü ötürüb dayandı. Pəncərədən boylananları salamlayan musiqi və alqış səsləri bir-birinə qarışdı. Hamımız vaqon qapılarına yönəldik. Gələnlər əsgərlərin yerə enməsinə macal vermirdilər: qucaqlaşan kim, öpüşən kim, ikiqat olub var gücü ilə bir-birinin əlini sıxan kim... Dərhal əsgərlərin döşü gül dəstələri ilə doldu. Dördüncü vaqonun pəncərəsindən boylanıb gələnlərə baxan bir əsgər mənim gözümə sataşdı. Güman etdim ki, o burada düşməyəcəkdir, sadəcə tamaşa edir.

Birdən onun: "Ana!" – deyə səsləndiyini və əli ilə adamlar arasında kimə isə işarə etdiyini gördüm. Çəhrayı paltarlı, başıaçıq bir qadın: "İdris!" – deyib özünü irəli atdı. Ana-bala bir anda elə qucaqlaşıb, bir-birinə sarıldılar ki, hamının nəzəri onlara tərəf çevrildi. Uzun ayrılıq, intizar və təhlükələrdən salamat və qalib çıxıb, belə bir gündə bir-birinə qovuşan ana-balaya baxmaq hamıya xoş idi. Adama elə gəlirdi ki, bunlar, indiyəcən aralarında maneələr, məsafələr olan bu istəklilər artıq heç bir vaxt bir-birindən ayrılmayacaqlar. Mən gül dəstəsini bu oğlana, hamıdan, hər kəsdən qabaq anasını axtarıb tapan oğula verməyi kəsdirdim. Daha irəli yeridim, onların yanında müntəzir dayandım, ayrılmalarını gözlədim.

Qadın oğlunu öpüb, sevincindən ağlayırdı.

Nədənsə bu görüş və bu göz yaşı vaxtilə uşaq bağçasında gördüyüm mənzərəni yadıma saldı. Tirməli gəlin bütün sadəliyi və gözəlliyilə gəlib gözümün qabağında dayandı.

Mən gülü İdrisə təqdim edəndə, razılıq edib əlimi sıxdı. Biz izdihamla vağzal qapılarına yaxınlaşıb, yavaş-yavaş pilləkənlərdən endik. Maşına oturduq. İdris anasından soruşdu:

– Atam hanı?

– Rayondadır.

– Evdə nə var, nə yox?

– Salamatlıqdır, hamı səni gözləyir, gəldiyindən heç kəsin xəbəri yoxdur.

Sanki İdrisin yadına bir şey düşdü:

– Nazimə nənədən mənə bir xəbər!

– Salamatdır. Hər gün soruşur.

– Yenə bağçadamı olur? Onu yuxuda görmüşəm.

Qadının gözünə diqqətlə baxanda, barmağımı dişlədim: "Odur, özüdür". Mən belə bir oğlanın Naziməyə, o sonsuz qadına nənə deməsinə sevindim. İyirmi il əvvəlki ipək dəsmalla göz yaşını silən cavan gəlin, odur, təmkinli bir əsgər anasıdır. Onun saçlarına dən düşsə, gözləri bir o qədər dərinləşsə, dodaqları solsa da, gəncliyindəki məlahət itməmişdir. O zaman Nazimənin qarşısında minnətdarlıqla göz yaşları tökən ana, indi alicənablıqla oğlunu ilk dəfə ona təqdim edir. İdrisin bir dəfə nənə dediyi sonsuz qadını xoşbəxt etmək istəyir. Mən bunları xatırlayıb, açıq ana ürəyinin qapalı aləmini düşünürdüm.

– Nazimə sizin nəyinizdir? – deyə soruşdum.

İdris dedi:

– Nənəmdir!

Anası əlavə etdi:

– Uşaqlıqda buna oğul deyib.

– Yoxsa, eyvandan özünü atan uşaq...

Qadın mənim üzümə baxdı:

– Deyəsən İdrisi tanıyırsınız?

– İdrisi yox, Nazimə xalanı tanıyıram.

İdris dedi:

– Özümü danışıb sizə? Düz deyirsiniz, eyvandan özünü atan mən olmuşam.

Mən əhvalatı danışanda, İdris zarafata saldı.

– Körpəlikdən, – dedi, – mən ana yolunda canımdan keçən olmuşam. Qədrimi bilən gərək!

Bunu deyib şoferə tapşırdım:

– Qardaş oğlu, onları evə qoy, uşaq bağçasına sür, Nazimə ananı götürək.

Maşın dayanan kimi cəld düşdüm. Şoferlə bağçaya muştuluq aparmağa getdim. Nazimə xalanın saçı ağarmış, qəddi bir qədər əyilmiş, səsi də boyu kimi alçalmışdı.

– Xala, – dedim, – gəl əyləş maşına, oğlun İdris səni çağırır.

Qadın diksinmiş kimi, düzəlib şax durdu.

– Doğrumu deyirsiniz?

Şofer israr edəndə, inandı.

– Neçə ildir ondan xəbər yox idi.

– İndi özü gəlib.

Qadın az qaldı qanadlanıb uçsun.

Biz Naziməni İdrisgilə gətirdik. Bütün ailə onun ayağına qalxdı; onu yuxarı başa keçirtdilər. İdris onunla uzun-uzadı qucaqlaşdı.

Nazimə İdrisin çiyinlərindən tutub üzünə baxır, sanki vuruşmalarda keçirtdiyi macəraları onun gözündə oxumaq istəyirdi.

– O ağır günlərdə heç yadına düşürdümmü?

İdris doğma oğul kimi danışırdı:

– Bir gün də yadımdan çıxmamışsınız!

Nazimə əllərini göyə qaldırıb şükür edirdi.

– Mənim də oğlum var! Mən də əsgər böyütmüşəm...

Bunu deyib, İdrisi təkrar qucaqlayırdı.

*1945*

## BADAM AĞACLARI

*Ədalət! Yaşıdlarınla gəlin-gəlin oynamalı vaxtında səni çöllərə salanları, vətənini, xanimanını, şərəfini tapdayanları tanıyırsanmı, qızım?*

1

Ağarzanın evindən tappatap səsi gəlirdi. Dünəndən bəri evin ortasında, təndir başında salınmış təlisin üstündə badam döyürdülər. Bu il badamın məhsul ili idi. Ağacın birindən 7-8 batmanacan badam dəril-

mişdi. Evdəkilər badam sındırır, iç hazırlayırdılar. Deyirlər şəhərdə iç yaxşı pula gedir, bayramqabağıdır. Ağarza bir yük iç aparacaq, bir azını taxıla dəyişəcək, bir azını da uşaqlara əyin-baş alacaq.

Altı yaşlı Ədalət də iş görür, kömək edirdi. Atasının sındırıb tökdüyü badam içini qabıqdan təmizləyib nimçəyə yığırdı. Hərdən, atasından xəlvət, birini ağzına atır və birdən yeyə bilmirdi. Oğurluq şeyi yemək nə çətin olur! Badam Ədalətin ağzında böyüyürdü. Süfrədə yığılan ağlı-sarılı, təmiz, ətirli badam içinə baxıb həsrət çəkir, bunları doyunca yeyənlərin kim olduğunu düşünür və atasına sual verirdi:

– Ata, bunları hara aparacaqsan?

– Bazara, şəhərə aparacağam, qızım.

– Kimə satırsan orda?

– Müştəriyə.

– Müştəri kimdir?

– O da bir adamdır da, qızım.

– Yaxşı adamdırmı?

– Yaxşısı da var, pisi də var!

– Yox, ata, pis adama vermə, heyifdir, yaxşı adama ver!

Ağarzanı maraq götürdü. "Uşağın yaşından böyük danışmağına baxırsanmı?" – deyə düşündü.

– Qızım, – dedi, – müftə vermirəm ki, puluna minnət! Kim çox versə, ona satıram.

Ədalət etirazında davam edirdi:

– Yox! Pis adam çox pul versə də satma! Badamı ona vermə, heyifdir! Pis adama qismət olmasın, ata!

Ədalətin dedikləri uşaq sözü olsa da, bir həqiqətdən xəbər verirdi. Ağarza badam içinin balacalarından üç-dörd dənə götürüb, Ədalətin ovcuna qoydu, sonra mülayim, mehriban bir dillə təsəlli verdi:

– Qızım, bizə pul lazımdır. Allah qoysa, məhsulun alıcısı olsa, bu dəfə əlimə pul gəlsə, ərbabın borcunu, xumsu, zəkatı çıxandan sonra, taxıldan artıq qalsa, qədək alacağam. Bacarsam sənə də bir cüt təzə başmaq alacağam, qotazlı başmaq, lap onun özündən alacağam ki, bayramda geyəsən!

Dalandan ayaq səsi eşidildi, dərhal evin qapısı zərblə açıldı. Ağarzanın qonşusu Əlican, güllə dəymiş quş kimi özünü içəri atdı:

– Ay rəhmətlik oğlu, nə oturmusan, badamlığı kəsdilər! – deyə həyəcanla xəbər verdi.

Ağarza sağ əlində daş, sol ovcunda badam olduğu halda çömbəldiyi yerdən dik qalxdı və:

– O nə sözdür, Əlican? – deyə soruşdu.

– Sənə deyirəm badamlığı kəsirlər.

– Səfeh-səfeh danışma, elə şey olmaz!

– Bu saat oradan gəlirəm, kəsirlər.

Ağarza qonşusunun üzündəki ciddiyyəti, baxışlarındakı vahiməni duyub, çarığını ayağına çəkdi.

– Axı kim kəsir, nə deyib kəsir?

– Əmələ töküblər, odur, kəndxudadan soruş!

– Kəndxudanın nə haqqı var, öz əlimlə əkib-becərdiyim ağacı kəsə, bəyəm mən ona bağça satmışam? Gəl otur!

– Ay sağ olmuş, oturası vaxtdır? Mən də yoncalığın hayındayam. Onu da sürəcəklər. Müşavirin yanına getmək istəyirəm. Görüm nə çarə taparam.

Əlican qapıdan çıxmaq istəyəndə Ağarza kəmərini bağlayıb, onun dalınca tələsdi. İtə rast gələcəyini düşünüb, əl ağacı götürmək istədi, bir də fikirləşdi ki: "Ərbabın adamları bunu görüb bir az da hirslənərlər. Yaxşısı budur əliyalın get!"

Ağarza özünü badamlığa o zaman yetirdi ki, müşavirin adamları daş hasarı uçurub çaya tökürdülər. Hasar ağzından kəsilib atılmış ağacları görəndə elə bil Ağarzanın qolunu qələm elədilər, qıçlarını peylədilər. Vücudu od tutub yandı, qan başına vurdu. Bütün köyşən dəyirman daşı kimi onun başına dolandı. Havaxt çaydan hoppanıb, birisinin yaxasından yapışdığını özü də bilmədi.

– Niyə dağıdırsan, a bayquş? – deyə qışqırdı. – Bu divarı çəkənəcən mənim kürəyim qabar olub, niyə sökürsən?

Alnından tər daman ortaboy soldat dartınıb onun əlindən çıxmaq istəyir və dil-ağız eləyirdi:

– Boşla yaxamı, buyruq quluyam! Məndən nə yapışmısan?

Ağarza onu kənara itələyib qışqırdı:

– Çıxın mənim bağçamdan!

Xaki pencək geyinmiş bir amerikan zabiti ona yanaşıb, əlini tapançasının dəstəyinə qoydu, ehmal səslə, lakin hədəli əda ilə dedi:

– Bu köyşənləri sizin ağalarınız bizə satıblar. "Marşal planı" üzrə biz buraya köməyə gəlmişik. Şikayətinizi ərbabınıza eləyin, işə mane olmayın!

## 2

Son zamanlarda qoca və izdihamlı şəhərin dar, qaranlıq və dolaşıq küçələrində ucaboy, uzunqol, üz-gözünü tük basmış, qaşqabaqlı, əli ağaclı, ayağı çarıqlı bir kəndlinin səkidən-səkiyə addımladığını görənlər çox idi. Kənardan gəldiyi, nabələd adam olduğu, nə iş üçün isə qapılar gəzməyə məcbur bir müsafir olduğu ilk baxışdan məlum idi. Güman gəldiyinə o, əl boyda bir kağız göstərir, ünvan soruşur, dərdini demək istəyir, baş əyib yoluna davam edirdi. Yorulsa, taqətdən düşsə də, yağışa, küləyə, vaxt-bivaxta baxmadan küçələri addımlayırdı.

Bu müsafirin kim olduğunu oxucular yaxşı bilirlər. Kənddə ümidi üzülən Ağarza bununla üçüncü dəfə idi ki, şəhər küçələrində gəzə-gəzə badamlığının haqqını müdafiə edən adam axtarırdı. Kəndliləri Mirzəməmmədə bir “tutarlı” ərizə yazdırıb, ərbabın hüzuruna apardı. Uca hasarlı bir həyətin qapısını ehtiyatla taqqıldatdı. Cavan bir oğlan çıxıb onun üzünə baxdı. Ağarza salam verib sözünü dedi:

– Bizim ərbabın evi buradırmı? Kəmərli kəndindən gəlmişəm. Ağaya ərzim var.

Cavan oğlan qayıdıb getdi, bir az keçməmiş qapını açdılar. Ağarza: “Bismillah!” – deyib içəri daxil oldu. Hovuzdan su gətirən bir qarı ona işarə elədi: “Ağa ibadətdədir, gözlə!”

Ağarza daş səkinin yanındakı sütuna söykənib dayandı. Əvvəl, ətəyinin altında gizlətdiyi hədiyyəni yerə qoymaq istədi. Sonra düşündü ki: “Yox, ağanın özü gələndə verərəm”. Ağarza heyrət və həsrətli gözləri ilə ərbabın imarətini seyr etməmişdi ki, eyvanın başındakı qapıdan əli təsbehli, beli əyri, kosa, arıq bir kişinin çıxdığını, ona tərəf gəldiyini gördü.

Ağarza, ərbabı axund libasında, əli təsbehli, ağzı dualı görəndə xeyli sevindi: “Allah adamıdır, – dedi, – rəhmi gələcək”. Özünü itirmiş halda bir addım irəliyə yeridi. Layiqsiz hədiyyə sayıb gətirdiyi iki beçəni bağlı qıçlarından tutub, səkinin kənarına qoyandan sonra ətəklərini silkələyib düzəldi. Əllərini döşünə qoyub salam verdi, baş endirdi... Qoltuğundan çıxardığı əl boyda ərizəni təqdim etdi, təkrar baş əydi. Ağ araxçınlı, kosasaqqal, qadın başmaqlı, cindara oxşayan adam isə əlindəki yüsür təsbehi çevirə-çevirə dinməz-söyləməz Ağarzanın ərizəsinə baxırdı. O gah kağıza, gah da qarşısında itaətkar vəziyyətdə duran kəndlisinə baxırdı. Ancaq heç nə demirdi. O nə üçün

dinmirdi? Ağzındakı duanımı bitirmək niyyətində idi? Cındır içində batan kəndlisinin üst-başınamı tamaşa edirdi? Ağarzanın halınamı acıyırdı, ya da şikayətçini diqqətlə eşitməkmi istəyirdi? Ərbabın sükutu Ağarzaya bir qədər də cürət verdi. O, başına gələni – amerikalı müşavirdən gördüyü zülmü danışmaq istəyirdi ki, ərbab kağızı qatlayıb sahibinə qaytardı. Onun batıq səsi eşidildi:

– Kişi, nəyə gəlmisən?

– Ağa, şikayətim var!

– Kənddəkiləri, mübaşiri qoyub bu əkin-tikin vaxtında bura niyə gəlmisən?

– Ağa, mənə zülm eləyənin biri də mübaşir özüdür.

– Nə olub, yenə şikayət dəftərini açmısan?

Ağarza özünü tanıtmaq istədi:

– Ağa, kənd camaatı bilir, mən ömrümdə şikayətə gəlməmişəm. Amma indi gör necə əlacım kəsilib ki, sizə başağrısı verirəm. Ağa, mənim öz əlimlə əkib-becərdiyim badamlığı kəsirlər. Sizə pənah gətirmişəm!

Ağarza çox şeylər danışmaq istəyirdi. Lakin araxçınlı kişi onun sözünü kəsdi:

– Kişi, şükür eləmək əvəzinə şikayətə niyə gəlirsən?

Ağarzanı təəccüb götürdü. “Bu nədən yana danışır? Mən nə üçün şükür eləməliyəm, niyə eləməliyəm?”

Ağarzaya elə gəldi ki, ərizə yaxşı yazılmayıb. Araxçınlı kişi onun dediklərindən də bir şey eşitmədi. Güman etdi ki, bəlkə kişinin gözü pis görür, qulağı ağır eşidir, qocalıqdan ola bilər, bir az qayımdan danışmaq lazımdır.

Ağarza bir addım da irəli yeriyib, sözlərini ucadan təkrar edəndə, araxçınlı kişi bir addım geri çəkildi və səsini ucaltdı.

– A kişi, qışqırığa salma, kar adam yoxdur burada! Deyirəm, badamlığı kəsirlərsə, sənin xeyrinə kəsirlər.

Ağarza təəccübdən çiynini çəkdi, ona toxunan bir şeyi rədd edirmiş kimi, əllərini qabağa tərəf açdı:

– Ağa, mənim çörək ağacımı kəsirlər, evim yıxılır. Evi yıxılan adam niyə gərək şükür eləsin?

– Şükür elə ki, müşavirlər gəlib səni-məni qoruyurlar.

– Ağa, məni kimdən, nədən qoruyurlar?

– Necə nədən, kommunistlərdən! Bəli, başa düşməlisən ki, amerikalılar bizim torpaqda təyyarə meydanı tikirlər ki, sabah kommunistlər sənin başına bomba tökməsinlər.

– Ağa, mən kommunistləri dava vaxtı kəndimizdə görmüşəm. Onlar kasıb-kusubun əlindən tutan adamlardır. Mən onlardan bir pislik görməmişəm. Bomba-filan nə söhbətdir!..

Ağarza bunu dediyini gördü. Araxçınlı kişi irəli yeridi, təsbehi bir kənara atıb, ağacı Ağarzanın əlindən almaq, onun başına çırpmaq istədi. Ağarza əvvəl ərbabın niyyətini başa düşmədi. Onun ağaca əl atdığını görəndə, yatıbmış kimi ayıldı. Ərbab ağzına gələn söyüşü deyib, nökərlərini çağırdı.

– Qovun bu mürtəd oğlunu! – deyə bağırdı. – İtilsin, hansı cəhənnəmə gedir-getsin! Mənim kəndimdə oturmasın! Gör nə qələt eləyir! Təbliğat aparmağına bir bax! Ayağı çarıqlının biri! Ay çörək tutsun sizin kimi nadürüstləri!..

Ağarza özünü qapıdan çölə atdı, birbaş onu ərbab yanına göndərən həmyerlisi Mirzəməmmədin yanına getdi.

Mirzəməmməd də Ağarzanı danladı.

– Ay bədbəxt oğlu, – dedi, – bu yaşa çatmısan, ərbabla danışmağı da bacarmırsan. Ərbab söz götürməz. Bilmirsən iki yoluq cücə ilə ağa yanına getməzlər? Sən nə hesab eləyirsən! Hamı Mirzəməmməd olmaz ki, sənə müftə ərizə yaza.

Ağarza yerlisi ilə razılaşmadı:

– Mirzəməmməd, axı, dostum, nə üçün elə deyirsən? Ərbab gərək özü razı olmuya! Mən öz əlimin əməyi ilə əkdiyim ağacların bahasını istəyirəm. Bu, fitrə, sədəqə zad deyil. Qardaş, müşavirdi, amerikandı, ingilisdi, hər kəsdi, ona yer lazımdır, ayrı torpaqdan götürsün! Köyşən doludur. Mənim badamlığım olmasa, bu təyyarə yerə enə bilməz bəyəm! Onu görüm heç sağ enməsin! Mahalda meydan qurtarmışdı ki, mənim bir tikə badamlığımı kəsirlər?

Ağarza dostunun məsləhəti ilə təkrar kəndə qayıtdı. Deyirlər müşavirdən kağız gətirsən, o kağızı dövlət bankına təqdim etsən, ziyanın bir payını alarsan.

Müşavir doğrudan da ona bir kağız verdi. Təsdiq etdi ki, filan mahalda, filan kənddə Ağarza Baba oğlunun otuz bir ağaclıq badamlığı, “Marşal planı” əsasında kəsilib, müəyyən məqsəd üçün düzəldi.

Ağarzanın kənddə bu kağızı oxutmadığı savadlı qalmadı. Orada yazılanların hamısı aydın idi. Hər şey ona aydın idi. Ancaq "Marşal planı", "marşallaşma" deyilən sözdən bir şey başa düşmürdü. Kağızı oxuyanlara macal vermir, barmağını yazının həmin yerinə qoyub soruşurdu:

– O nə sözdür, qardaş? "Marşallaşma" – yəni kim barəsində yazır? Mənə təəllüqü var o sözün, ya yox? Yəni o adam kimdir, görüm mənim ağaclarımı kəsən adamdır, ya buna əmr verən, pul buraxan adamdır? O kimdir axı?

Oxumuşlar qəzetdən, siyasətdən söhbət salıb çox söz deyirdilər. Ancaq Ağarza daha da hirslənirdi:

– Qardaş, hər nə planı-filanı var aparsın şahla, vəzirlə danışsın. Mənim ağaclarıma nə dəxli var axı! Plana düşür, qoy mülkədarların xalvar-xalvar yerləri düşsün. Mənim canamaz boyda badamlığımı bilmirəm kim plana salır axı!

Mirzəməmməd Ağarzanı başa salıb deyirdi:

– Ay rəhmətlik oğlu, bu "Marşal planı" o yandan – Amerikadan gəlir. Bir bizim vətənə deyil, odur, türkə də, yunana da, ərəbə də gəlir. Vergi-tövcü kimi bir şeydir. Əvvəllər İrana vəba gələrdi, taun, çəyirtkə gələrdi. İndi də "Marşallaşma" gəlir, Amerika soldatı gəlir, çürük mal, tısbağa yumurtası gəlir. Dünən bir kəndlinin cilovunda bir arıq at var idi, üfürsəydin yıxılardı. Soruşdum ki: "Kəndli qardaş, at niyə bu kökə düşüb?" Kəndli gülüb dedi: "Marşallaşıb". Belə yekə bir kəndin bağ-bağatını kəsib tökürlər; soruşursan: bu nə həngamədir? Deyirlər: "Marşallaşırıq". Şəhər küçələrində dilənçi əlindən keçmək olmur. Deyirsən: canım, bu nədir? Deyirlər: səsini çıxarma, "marşallaşırıq!" Kəndlilər bir-birini lüt, möhtac görəndə deyirlər: "Sən "marşallaşıb" qurtarmısan!" Heç bir zəlzələ, sel, heç bir səmum yeli kəndləri "marşallaşma" qədər yaman günə qoymamışdı...

Ağarza dostunun dediyindən nəticə çıxartdı:

– Yaxşı, qardaş, nə vacib olub? Olmaz ki, "marşallaşmayaq?" İndi ki, "marşallaşma" bizi bu kökə salır, gəlin "marşallaşmayaq"da!

Mirzəməmməd qəhqəhə çəkib güldü.

– Sən, – dedi, – doğrudan da lap avam imişsən. Görünür, Kəmərli dağlarının arasından kənarı görmürsən. Ay rəhmətlik oğlu, ölünü öz kefinə qoysan, şıllaq atıb kəfəni yırtar. Sənin nə ixtiyarın var "marşallaşmayasan?" Sən "marşallaşmayasan", bəs bu amerikan zabitlərinin qazancı haradan gəlsin? Yeddi iqlim, yeddi dərya basa-

basa buraya əbəs yerə keçməyiblər axı! Yazıqsan, get, bəlkə müşavirdən bir kağız ala bildin, bəlkə yerin bahasından bir az verdilər. Yenə qənimətdir, lənət heçə?

Müşavirin kağızına şəhərdə güldülər. Bu kağız, – dedilər, – sənin bağçan haqqında yoxlamadır, ayrı bir şey deyil. Heç bir iddia üçün sənə əsas vermir.

– Mən ayrı iddia eləmirəm. Hökumətlə hökumətlik eləmirəm. Torpaq divana lazım olub, buyursun mənim ziyanımı versin. Bu iş qanunda var.

– Qanunda nə var?

– Qanunda var ki, kəndlinin əlindən alınan malın, ya mülkün bahası verilə gərək.

– Kəndli var, kəndli var.

Bank dəftərdarı, dazbaş, çeşməkli kişi Ağarzanı daha da heyrətə saldı.

– Necə yəni, mən necə kəndliyəm bəyəm? – deyə gözləri alacalandı.

– Necə kəndlisən, özün bilirsən, amma ixtiyaratın ərbabdır.

– Ərbab məndən vergi alır, maliyat alır, bağçamın da sahibi deyil ki.

Dəftərdar kağızı Ağarzaya tərəf uzadıb, içəri qayıtdı.

– Sənin, – dedi, – işin məhkəməlikdir. Get orada baxsınlar, gör nə deyirlər.

Məhkəmədə Ağarzanı bəlkə iyirmi dəfə dindirib danışdırdılar. Yazıb pozdular. Şahid, sübut istədilər. Müşavirin iştirakı olmadan işə baxmadılar. Çox xahişdən, tələbdən sonra günün birində müşavirin vəkili gəlib çıxdı, məhkəməni inandırdı ki, Ağarzanın bağça yeri əvvəldən ərbabın olub, kəndlinin iddia üçün əlində nə kağızı, nə sübutu var. Ona görə də bir şahı tələb etməyə haqqı yoxdur!

Ağarzanı danışmağa qoymadılar. İddiasını rədd etdilər. Vəkil çaldığı qələbənin iftixarı ilə Ağarzanın yanından ötüb getmək istəyəndə Ağarza onu saxlamaq istədi.

– Bura baxın, ağayi vəkil! – deyə müraciət etdi.

Vəkil qulaq asmadı. Ağarza bərk addımlayıb onun çiynindən tutdu, geriyə çəkdi:

– Sənnənəm axı!

Kəndlini hirsindən qızarmış görən vəkil özünü itirdi. Ağarza da tünd və kefli nəzəri ilə ona baxıb düşündü: “Deməli, işi-gücü qaldı, eləmi? Di, al gəldi!”

Ağarza bunu deyib, vəkilə elə bir sillə çəkdi ki, üç dəfə fırlanıb fəryad çəkdi, yıxıldı. Ağarza çıxmaq istəyəndə, kimsə qapını bərk itələdi, qapı onun alnına toxunub yaraladı. Ağarza aradan çıxdısa da, onu təqib edənləri görüb qabaqdakı döngəyə buruldu. Uçuq bir divardan hoppanıb kiçik həyətə, oradan isə ağaclı bir yerə keçdi. Bura xəstəxana imiş. Ağ xalatlı bir həkim onu qarşılayanda, Ağarza alnının yarasını göstərdi. Onu sarğı otağına apardılar. Ağarzanın yarası bağlanıb qurtarmışdı ki, xəstəxana qapısında izdiham göründü. Müdir qapıya çıxdı. Qorxu və təəccüblə qapıdakılara baxdı. Müşavirin adamları müdirdən Ağarzanı tələb edirdilər.

– Ağa, nə buyurursunuz? – deyə xəstəxana müdiri soruşdu.

– Buranın müdiri lazımdır! – deyə müşavirin adamlarından biri donquldandı.

– Buyurun görək!

– Deməli, müdir sizsiniz?

– Belə görünür.

– Burada gizlənən düşməni istəyirik.

– Ağa, bura müalicəxanadır! Fərqi yoxdur, hər kəs olursa olsa, vəzifəmiz naxoşları müalicə etməkdir.

– Burada yaralı varmı?

– Yaralı da var, şikəst də var, qızdırmalı da...

– Biz buraya qaçıb gizlənən...

Vəkil sözünü bitirməmişdi ki, Ağarza camaatı yarıb, heykəl kimi onun qabağında dayandı.

– Ağayi vəkil, pis olmazdı sən gedib öz yerində, Amerikada vəkil olaydın. Burada nə Amerika torpağı var, nə təbəəsi. Sizi bura çağıran da yoxdur. Bilmək olmur dünyanın o başından atıla-atıla gəlib, burada nə sülənirsiniz! Kəndlinin qanı sizə də şirin gəlib... eləmi?

Ağarza hirslə irəli çıxdı. Hiddətindən gözləri böyümüş, gicgah damarları şişmişdi, sifəti mis kimi qızarmış halda dişlərini qıcayaraq, yumruğunu düyərək, sözünü bərkdən təkrar etdi:

– Şirin gəlib, eləmi?

Ağarzanın odlu baxışları ətrafa ildırım saçırdı. Yumruğunu göyə qaldırdı, vəkil bu saat başına enəcək zərbənin dəhşətindən ürkərək, geriləmək istədi. Səndələdi, özünü saxlaya bilmədi. Qollarını kənara açıb, dırmaşdığı uca yerdən düşən toyuq kimi ləngər vurdu. Arxadan tutmasaydılar, tirlənəcək idi. Ağarza hərifin çəkildiyini gördükdə,

sanki zərbəsini endirməyə hədəf axtarırdı. Yumruğu ilə havanı yardı, sinəsində yanan nifrət, qəzəb alovu ilə dedi:

– Zəlilər! Əqrəblər!

Ağarza irəli cumanda, vəkil də, adamları da cəld çəkildi, izdiham parçalanıb qolu çirməkli, saçı dağınıq kəndliyə yol verdi. O, bir neçə addım atandan sonra dönüb vəkilə baxdı. Sanki baxışı süngü idi və bununla da özünə yol açdı. Vəkilin ətrafındakılar dağılışdılar. Vəkil yolun ortasında qanqal kolu kimi tənha göründü. İzdiham Ağarzanı bir qəhrəman kimi qucağına alıb, gözdən itənəcən müşayiət etdi.

3

Doğrudur, kənddə Əlican, Ağarzanın uşağına, atasının tapşırdığı balaca Ədalətə öz övladı kimi baxırdı: onu gözdən qoymurdu. Ancaq Ədalətdən arxayın ola bilmirdi. Çünki Ədalət hər gün oğurlanıb kənd üstünə, badamlığa gedirdi, təzəcə puçurlayan nəhəng ağacların doğranıb töküldüyünə, bağça hasarının yerində bünövrələr salındığına diqqət və ürək ağrısı ilə tamaşa edirdi. O, baxırdı, müşavirin adamlarının nə iş gördüklərinə diqqət yetirirdi ki, atası gələndə danışsın. Bağçada Ədalətin öz əli ilə toxumunu basdırdığı iki yaşlı bir badam ağacı adam boyu ucalmışdı. Qız bu ağacı həmişə əli ilə suvarır, dibini alaqdan, gövdəsini qarışqadan təmizləyirdi. Bağçanın sökülüb dağıldığını görsə də, Ədalət o körpə ağaca baxmaqda davam edirdi. O, buraya gələndə əziz yoldaşını – kimsəsiz qalmış, qohum-əqrəbasından uzaq düşmüş bir yetimi görən kimi qəhərlənirdi. Sanki körpə ağacın yenicə puçurlayan, həyat, günəş arzusu ilə baş qaldıran zərif, zümrüd yarpaqları Ədalətin gəlişindən hərəkətə gəlir, nə isə dil açıb demək istəyirdi. Ədalət nə etsin? Badamın dibinə torpaq yığsın, ətrafına çəpər çəksin? Dağ kimi divarları vurub dağıdan, təpələri düzə çevirən bu silahlı müşavirələrin, gurultulu maşınların qabağında Ədalət nədir ki, çəpər də çəkə! Heç yerdə Ədalət buradakı qədər gücsüz, əlacsız olmamışdı. Sanki bunu körpə ağac da hiss etmişdi. Ədalətə tərəf əyilərək yalvarmaq, ağlamaq, arxalanmaqmı istəyirdi, ya qıza məlum olmayan bir sirr deməkmi istəyirdi? Bəlkə deyirdi: “Bu qansızlardan uzaq ol!” O demək istəyirdi ki: “Məni apar!” Qız onu hara apara bilərdi? Ədalət əlində balaca bel körpə ağacın yanına gəlir, ağ əlcəkli bir zabit onu istehza ilə qarşılayır, ağaca işarə edirdi: “Qızım, bu sənindirmi?”

Ədalət cavab verməmiş, zabit bıçağı ilə ağacı kəsib Ədalətə tərəf uzadırdı! Ağac kəsiləndə Ədalətdən odlu hıçqırıq çıxırdı. Özünü dəhşət almış, gözləri böyümüş uşaq yerindəcə donub qalır və bilmirdi ki, nə etsin. Əlcəkli zabit "səhvini" anlayıbmış kimi, ağacı böyrü üstə tutur, şərq adəti ilə ikiəlli, peşkəş təqdim edən kimi bir vəziyyət alır və:

– Buyurun! – deyirdi.

Ədalət canavara tuş gəlmiş quzu kimi naçar nəzərlərlə aşağıdan yuxarı zabitə baxırdı. Zabit badam şivini əlinə alıb, qızın çılpaq baldırlarına döyür, qışqırırdı:

– Haydı, meymun balası!

Uşaq ağlayıb qaçanda əlcəkli zabit qəhqəhə çəkib durur, təpiyini yerə vurub uşağı hədələyir, baxanlar gülüşürdülər.

4

Ədalət gözlərindən almaz yaşlar tökərək, başıaşağı dərəyə qaçırdı. Yenicə göyərən çəmənləri, yoncalıqları ayaqlayaraq, kollardan, hasarlardan, arxlardan ötərək, yaralı bir quş kimi çırpınaraq qaçırdı. O, birbaş şəhərə yol almışdı, atasının dalınca gedirdi. Əlindəki badam şivini bərk-bərk tutub ehtiyatla aparırdı. Aparırdı ki, atasına göstərsin, böyüklərə şikayət etsin.

Bu yerlər – bağçalar, kövşənlər körpə qızın həmişə oynadığı, çiçək yığdığı, sünbül dəstələdiyi, quş yuvası axtardığı, quzu otardığı, çırpı topladığı yerlər idi. İndi isə Ədalət heç nə düşünmürdü. Cənuba, uzaqda ağaran qarlı dağlar arxasına, şəhər yoluna doğru üz tutaraq qaçırdı. Anasından qalma köhnə başmaqlar çoxdan ayağından çıxmışdı. Soyuqda gah qızaran, gah göyərən balaca ayaqları keyimiş kimi, nə daş, nə tikan, nə palçıq hiss edirdi. Qız hərdən hıçqırığını boğaraq: "Atacan!" – deyə fəryad edir, əlindəki ağaca baxırdı. Uşağı bu kökdə görən kəndlilər müşavirin qorxusundan ona yanaşmasalar da, ağaclar arxasından haylayır, uşağı saxlamaq istəyirdilər. Ədalət qulaq asmır, yoluna davam edirdi.

Bütün ümidləri puça çıxmış, müşavirin, mübaşirin, ərbabın, məhkəmələrin qapısından naümid olan, əl üzən Ağarza həmin bu axşam da həmin yolla kəndə qayıdırdı. O buradan gedəndə cibində pul, əlində ərizə, ürəyində ümid aparmışdı. Qayıdanda isə bunların hamısını itirmişdi. Ancaq ürəyindən daş kimi asılan və get-gedə ağırlaşan bir intiqam hissi gətirmişdi.

Qəribədir, ürəyini ağrıdan bu hiss ona nələr deyir, nələr öyrədirdi? O, uzun və qayım addımları ilə kəndə doğru yaxınlaşdıqca qəlbi tərpənir və tərpəndikcə də sanki ondan çox sirlər soruşurdu: “Sən Kəmərlidə yenəmi qalacaqsan! Yenədəmi müşavirlə üz-üzə gələcəksən? Bağça yerində dikələn daş binalar sənə göz dağı deyilmi?” Sonra öz-özünə sual verirdi: “Əlimdən nə gələr? Odur, göz qabağındadır. Neçələri həbsdə, sürgündə çürüyür. Bu gəlmə zabitlər ərbaba köməyə gəliblər. Kəndlini soyub-talamağa gəliblər”.

Ağarza fikirləşirdi ki, olub keçəni yaddan çıxarsın, dağların döşünü bel, kərki ilə qaraldıb bir-iki batman arpa səpməklə güzəran keçirsin, yeganə balası Ədaləti böyüdüb başa çatdırsın. Görürdü ki, yox, o, müşavirin zülmünü heç cürə unuda bilməyəcək. O görürdü ki, cəllad əli ilə kəsilib atılan o igid badam ağacları qalxıb baş-başa veriblər, bir sirr kimi onun qarşısında dayanıb sual edirlər, təkidlə soruşurlar: “Bizim günahımız nə idi? Bizi bahara həsrət qoyanlardan sorğu-sual olacaqmı?”

Ağarza ürəyində onlara cavab verirdi: “Yox, ey mənim bərəkətli ağaclarım, sizin qatilinizdən sorğu-sual edən olmadı. Mən şəhərdə qapı qalmadı döydüm, məhkəmə qalmadı dəydim, oxum daşa dəydi...”

Ağarza bu sözü min bir nisgil və ürək ağrısı ilə deyirdi. Birdən başını qaldırıb ucadan əlavə etdi: “Ancaq mənim oxum qurtarmamışdır. Mənim bir oxum, bəlkə də axırıncı oxum lap hədəfə dəyməlidir. Şikayətdən haray yox imiş. Mən öz gücümə güvənməliyəm!”

Onun bu sözlərini qabaqda gələn, titrəyərək, qorxaraq, kollara sığınaraq gələn Ədaləti eşidirdi. Birdən:

– Atacan! – deyən Ədalətin səsi eşidildi.

Ağarza yuxu görürmüş kimi döyüküb dayandı, ətrafını dinlədi. Addım səsləri yaxınlaşırdı. Uşaq səsi təkrar olundu:

– Atacan!

– Qızım, Ədalət!

– Ay ata!

– Can, qızım, haradasan?

– Ata, səni axtarıram. Badam ağacımı da kəsdilər. Məni döydülər, ata!

Uşaq qaranlıqda özünü atasının qucağına atdı. Ağarza badam şivini qızının əlindən alıb şəfəqdə ona baxdı, uşağın yalın ayaqlarını qoltuğunda sıxdı. Xəcalətdən başını aşağı saldı. Axı o, qızına söz vermişdi: şəhərdən belə qayıtmayacaq, hədiyyələri ilə Ədaləti sevindirəcəkdi.

Nəvazişli bir səslə qızına dediyi sözlər atanın qulağında təkrar səsləndi: “Qızım, Allah qoysa, məhsulun alıcısı olsa, bu dəfə əlimə pul gəlsə, ərbabın borcunu, xumsu, zəkatı çıxandan sonra, taxıldan artıq qalsa... sənə bir cüt təzə başmaq alacağam, qotazlı başmaq. Lap onun özündən alacağam ki, bayramda geyəsən!..”

Ağarza yoldan kənara çəkilib, böyük və soyuq bir daş üstündə oturdu. Ədalət müşavirin adamlarından gördüklərini ağlaya-ağlaya, yanıqlı dildə kəsmə-kəsmə danışdı.

Gözü təmiz yay göylərinin dərinliklərinə dikildiyi halda Ağarza Ədalətin məsum, məzlum səsini bir fəryad kimi eşidirdi. Eşidir, ancaq cavab vermirdi. O bilmirdi uşağına nə ilə və necə təsəlli versin. Onun gözü şimalda parlayan və gur işığı ilə diqqətləri çəkən qızıl ulduza dikilmişdi. Ata şəhadət barmağı ilə göstərərək, Ədalətə təsəlli verirdi:

– Görürsən, qızım! Biz o ulduzun dalınca getməliyik, onun işığı və gücü bizə də nicat verəcəkdir. Qalx gedək!

Ata-bala əl-ələ verib qaranlıq çöllərdən parlaq şimal ulduzuna doğru yol aldılar.

*1953*

## GƏRƏK OLAR

Elə düşüb ki, qonşum işdən gələndə mən işə gedirəm. O, gündüzlər işləyir, mən axşamlar. O, zavodların birində mühəndis, mən də məktəblərin birində müəlliməm. Doğrudur, qonşuluğumuzun on beş ildən artıq tarixi var, ancaq Mürsəllə yaxın əlaqəmiz, get-gəlimiz yoxdur. Demək olar ki, bizim tanışlıq və ya dostluğumuz qonşuluqla başlanır və qonşuluqla bitir.

İlk dəfə mən onu müharibədən əvvəl küçəmizdəki on bir nömrəli evə köçəndə görüb təbrik etmişəm. O da mənə ya qapıda rast gəlir, salamlaşır, ya ümumşəhər yığıncaqlarında görüşüb əhvallaşırıq. Yaxın münasibətimiz olmadığından bizim əhvallaşmağımız da dilucu və rəsmi olur. Söhbətimiz, bir-biri ilə o qədər də maraqlanmayan, ancaq qəbul olunmuş nəzakət qaydalarına riayət üçün edilən və qəlib şəklinə düşmüş müxtəsər və mülayim sual-cavabdan ibarət olur:

– Salam!

– Əleykəssalam!

– Necəsiniz?
– Sağ olun, duaçı varıq. Siz necəsiniz?
– Çox sağ olun!
– Ayrı nə var, nə yox.
– Sağlığınız.
– Havalar da pis deyil.
– Bəli xoş keçir.
– Daha nə var, nə yox?
– Daha səlamətlik, bu yana tələsirəm.
– Di hələlik!
– Xoş getdiniz!

Deyə bilərəm ki, bu mükalimə Mürsəllə mənim aramda, yalan olmasın, hər görüşdə təkrar olunur. Bəzən bir-iki kəlmə o yan-bu yana olsa da, məzmun dəyişmir.

Bəs nə üçün biz söhbəti dərinləşdirmir, ya uzatmırıq. Bəlkə bizim bir-birimizlə danışmağa sözümüz yoxdur.

Belə deyil, danışmağa söz var.

Bəlkə işə tələsirik, bundan artıq dayanmağa vaxtımız olmur.

Belə də deyil. Ürəyin istəyən adamla danışmağa, əhvallaşmağa vaxt tapılar. Axşam işi də ki, ləğv olunub.

Bəlkə bir-birimizi istəmirik, yaxınlıq etməyə meylimiz yoxdur.

Bunu da deyə bilmərəm. Çünki Mürsəl mənim üçün həm qonşu, həm də yaxşı bir mütəxəssisdir. Mənim texnika sahəsində çalışan mütəxəssislərin işinə və söhbətinə meylim, marağım çoxdur. Ola bilər ki, Mürsəlin məndən acığı gəlir, xoşlanmır. Haqqı danışmaq lazımdır, bunu mən hiss etməmişəm, kişiyə şər ata bilmərəm.

Soruşacaqsınız ki, yaxşı, bəs sizin aranıza daş dığırlayan kimdir. Niyə yaxınlaşmırsınız.

Bunun səbəbini, əslinə baxsan, özüm də yaxşı bilmirəm. Ancaq son zamanlar Mürsəllə mənim aramızdakı bu sərinlik birdən-birə gözlənmədən çəkildi. Buna da səbəb bir hadisə oldu ki, bu hekayədə onu sizə danışmaq istəyirəm.

Mürsəl orta yaşlı, boydan uca, candan sağlam, xoşsifət, ağbəniz, qalınqaş bir kişidir. Mən qapıdan çıxıb trolleybus ayağına yönəlməkdə, Mürsəl də trolleybusdan düşüb on bir nömrəli evin daş pilləkənlərinə tərəf gəlməkdə.

Onu da deyim ki, Mürsəlin qazancı yaxşıdır. Çox yaxşıdır. Bunu mən nədən bilirəm. Əlbəttə ki, onun idarəsindən, vəzifəsindən, həm-

karlar ittifaqı kitabçasından xəbərim yoxdur. Ondan bilirəm ki, Mürsəl işdən evə qayıdanda əlidolu gəlir. Gözümlə görmüşəm. Xüsusən hər il, hökumət qərarilə mallar ucuzlaşandan sonra, Mürsəlin bazarlığı çox olur. O, qoltuğu dolu, tər basmış bir halda özünü evə salır. Qapını ayağı ilə açır. Mürsəlin aldığı ərzaq şeyləri ilə işim yoxdur. Məni maraqlandıran bu olub ki, Mürsəl nə olsa (bahalı, ucuzlu, böyük, xırda) küçə qapısında açıb tökür, sanki bazarlığını qonum-qonşuya, yoldan ötənlərə göstərmək istəyir. Deyəsən kişi bunu şöhrət bilir, bundan zövq alır. Görürsən qapıya yetişən kimi əlindəki iri qutunun kəndirini qırdı, ağzını açdı, oradan bir parıldayan elektrik çayniki, stol lampası, ya uşaq kino cihazı, ventilyator çıxartdı; qutunu kağızları ilə qapıda qoyub içəri getdi. Ya görürsən çəkmə, papaq, üst köynəyi, yazı cihazı, stol saatı... Bunların da kağızını açıb tökəndən sonra içəriyə apardı.

Doğrusu, qonşumun bu xasiyyəti mənə qəribə gəlmişdi. Çünki belə bir hərəkət, yəni aldığı şeyləri camaat qabağında açıb tökmək, hamıya göstərmək, mənim fikrimcə, yaxşı deyil. Buna görməmişlik deyərlər.

Dünyada əlbəttə ki, elə adamlar da var. Elə adamlar var ki, təzə paltosunu, kostyumunu göstərmək üçün şəhəri küçə-küçə gəzir, qaranlıqlaşana qədər gəzir. Yorulub dildən düşsə də, gəzir.

Nədənsə mənə elə gəlirdi ki, bu xasiyyət Mürsələ yaraşmır, heç yaraşmır. Bir adam gəlib qonşum haqqında bunları danışsaydı, mən inanmazdım və o adamı bəlkə də bir az danlardım.

İndi bunları mən öz gözümlə görürəm. Mürsəl içəri girəndə qapıda qoyub getdiyi, kənara atdığı cürbəcür biçimli, markalı rəngli qutuları, iri qalın kağızları, bağlama kəndirlərini öz gözümlə görürəm, yenə də gözümə inanmağım gəlmir. Ona görə inanmağım gəlmir ki, belə bir “görməmişliyi”, ya “şöhrətpərəstliyi” Mürsələ yaraşdıra bilmirəm.

Deyirlər, söz adamın ürəyini dələr. Günün birində qət etdim ki, bu işi hökmən qonşumun nəzərinə çatdıracağam. Acığı da gəlsə deyəcəyəm. Qoy bilsin ki, kənardan baxanlar danışırlar, onun bu xasiyyətinə yaxşı demirlər. Qoy bilsin ki, bazardan bol-bol ev ləvazimatı, sənaye malları alan minlərlə adam var. Amma heç kəs aldığını küçədə açıb elan etmir. Bu, mədəni adama yaraşan xasiyyət deyil. Bu, adamı hörmətdən salar.

Söz vaxtına çəkər. Aprelin əvvəlləri idi. Saat beş, ya altı olardı. Evdən çıxıb trolleybusa tərəf gedirdim. Mürsəlin yenə, öz qaydasında

qapıda bir bağlamanı, kub şəklində, yaraşıqlı və üstü yazılı qutunu açdığını, içindən çıxartdığı uzun büllur vazaların kağızını soyub tökdüyünü gördüm. O, işarə ilə mənə salam verdi. Vazaları qucağına alıb içəri gedəndə mən onu haqladım.

– Mübarəkdir, büllur almışsınız! – dedim.

– Bəli, güldanlardan xoşum gəlir.

Mürsəl mənim ötəcəyimi güman edirdi. Mən isə səsimin ahəngini bir qədər dəyişdim:

– Qonşu, sizə bir söz deyəcəyəm, gərək acığınız tutmasın. Ya ərk bilin, ya də özünütənqid sayın. Çoxdan ürəyimdə gəzən bir sözü sizə deməyi qət etmişəm.

Mürsəl gözləmədiyi bir söhbətə müntəzir, həm də xeyli maraq etdiyini gizlədə bilməyən bir tövrlə dayandı. Sonra qolumdan tutub içəri çağırdı:

– Buyurun, buyurun! Acığım tutmaz. Yaxşı məsləhətinizi eşitməyə hazıram. İllah da ki, siz kimi bir müəllim yoldaşdan ola.

– Qonşu, görürəm siz doğrudan da əsil qayğıkeş, ailəcanlı bir yoldaşsınız. Mən hər dəfə sizi qoltuğu dolu görəndə sevinirəm. Sevinirəm ki, bizim yaxşı ziyalılarımız bütün sevinc və şənliklərini, bayramlarını məhz ailələri ilə birlikdə keçirirlər. Amma bir şey mənə qaranlıqdır ki, onu sizinlə, elə-belə sual şəklində məsləhətləşmək pis olmaz.

Mənim sözüm, deyəsən Mürsəldə maraq oyatmışdır. O, müntəzir gözlərini diqqətlə mənə zilləmişdi. Mətləbi hara gətirəcəyimi aramsız gözləyirdi. Mən tənqidimə sual rəngi verdim:

– Bu ki siz aldığınız şeyləri qapıda hər dəfə açıb tökür, qutudan, qəzetdən çıxarırsınız ha, doğrusu, bunun mənası mənə bir qədər aydın deyil axı. Şükür, sizin gözəl eviniz, otaqlarınız, ailəniz. Nə olar ki, aldıqlarınızı açmamış evə gətirəsiniz. Evdəkilərin özü də bir az maraqlanar, sonra mübarək deyərlər. Mən görürəm ki, siz bazarlığı, şübhəli sovqat kimi, lap qapı ağzında açırsınız, hamının gözü qabağında! Uşaqlar buradan həmişə qutu daşıyırlar. Bir dəfə ananızın onlara acıqlandığını da eşitmişəm...

Mən illərdən bəri ürəyimdə bir ağrı kimi yatıb qalan və qaldıqca ağırlaşan bu sözləri dedikcə, bir yüngüllük, rahatlıq duyurdum. Mənə elə gəlirdi ki, haçandan bəri zehnimə yüklənən bu ağırlıqdan indicə qurtarmışam. Qəddimi düzəldib ətrafıma bir baxdım. Mürsəllə daha müfəssəl danışa bilərdim. Ancaq buna ehtiyac görmədim. Çünki mənim

ilk işarəmin hərifə kifayət etdiyi məlum idi. Mürsəl qucağındakı vazaları ehmallıca taxtın üstünə qoyub fikirli-fikirli mənə baxır, daha nələr deyəcəyimi gözləyirdi. Mən isə əlavə bir söz deyəsi deyildim. Çünki oxum lap hədəfə dəymişdi. Qonşum rəngdən-rəngə düşürdü. Mənim susduğumu yəqin edəndən sonra göz qapaqlarını aşağı endirir, yerə, lap çəkmələrinin ucuna baxırdı. O, çətin suallara tutulan hazırlıqsız bir məktəbli vəziyyəti almışdı. Başını qaldırıb xoş bir nəzərlə dedi:

– Qonşu, gəl bu söhbəti ayrı vaxta qoyaq. Görürəm siz işə tələsirsiniz.

– Nə eybi var.

– Mən zəhmət verib sizi çağıracağam. Ərkim çatarmı?

– Xoşdur, xoşdur.

Mürsəl doğrudan da məni çağırdı. Mətləbi açıb danışdı. Budur mən onun dediklərini onun öz sözü ilə sizə danışıram:

“Mənim anamda köhnədənqalma bir xasiyyət var. O, çox yığımcıl qadındır. Əlinə keçən bir çöpü, mismarı, bir taxta parçasını, konserv qutusunu götürüb evə gətirər ki, “gərək olar”. Bizim evdə olan qutu, karton, kağız, köhnə paltar, çəkmə, qaloş, qalstuk, stul qıçı, butulka, dərman şüşəsi, çatdaq boşqab, qırıq nəlbəki, xarab lampoçka, yazılı uşaq dəftəri, sınıq qələm, sökük zənbil... heç kəsin evində yoxdur. Yalan olmasın, anamın bəlkə lap gəlinlik günlərində geyib dağıtdığı başmaqları, parça-parça etdiyi koftalar da evimizdə, sandıqların, yeşiklərin hansı küncündəsə durur. Mən hərdən cəsarət edib onları atmaq istəyəndə anam acıqlanır:

– Sənə bir maneçiliyi yoxdur ki!

– Axı bu zir-zibili niyə rədd eləmirsən ki, əl-ayaq açılsın, yer genişlənsin.

– Bunlar hamısı gərək olur.

Bəzən mən lap hövsələdən çıxıram, evi ütil daxmasına oxşadan bu qadınla az qalıram bir yad kimi rəftar edəm. Anam mənalı-mənalı üzümə baxır. Sonra başımı sığallayır.

– Oğul, – deyir, – ev-eşik yığmaq asan deyil. Sən hələ uşaqsan, hələ dabanınla qapı açmamışsan. Sən bilmirsən ki, adam hər bir mismar üçün, bir iynə, bir şüşə üçün məəttəl qalır. Adam öz şeyinin qədrini bilər! Nə olar köhnə olanda. Köhnənin köhnə, sınığın sınıq yeri

var, təzənin də təzə. Niyə atıram, dəli-zad olmamışam ki, malımı çölə atam! Bir kənarda durub, məndən kira-zad istəmir ki, təzə nəlbəkini qonaq qabağına qoyaram, ucuzunda özüm çay içərəm, köhnəsini də bağda işlədərəm...

Mən görürəm ki, qadın lap dağılıb heçə döndərdiyi paltarından da əl çəkmir. O, bunlarla sanki qırılmaz bir ünsiyyət bağlamışdır. Sanki onun nəyi isə qiymətli bir şeyi bunlara bağlıdır. O, bu paltar, ya ayaqqabıda keçirtdiyi günlərdən, ömrünün ötüb gedən günlərindən ayrılmaq istəmir. Qadının qəribə xasiyyəti var. Haçandan qalma köhnə qalstukları səliqə ilə yığıb saxlayır, yumurta bişirmək üçün aldığım təzə tayqulpa qıymır, konserv qutusunda bişirir.

Mən özümü saxlaya bilmirəm. Hirslənirəm, qutunu götürüb küçəyə atıram.

O mənim əsəbi vəziyyətimi görüb heç nə demir. Sakit görünür. Ancaq bir dəqiqə keçmədən xəlvəti oğurlanıb küçəyə getdiyini, qutunu götürüb ətəyinin altında gətirdiyini duyuram. O, bu qutunu gizlədib qiymətli şey kimi qoruyur.

Mən belə bir naxoşluğa tutulan adamın müalicəsini bilmirəm. Əlacım ona qalıb ki, bundan sonra evə qutu-qapaq gətirməyim. Qət etmişəm ki, evə alınan şeylərin qutusunu, kağızını, kəndirini qapıdaca rədd edim ki, ev zibilxanaya dönməsin".

Danışdıqlarından yüngüllük duymuş kimi Mürsəlin rəngi açıldı. O, bir qədər sükutdan sonra davam etdi:

– Sizi təəccübləndirən işlərim də ancaq bunun üçündür, yoxsa mənim də şöhrətpərəstdən zəhləm gedər.

Mürsəlgilin ailə sirrini biləndən sonra məni heyrət götürdü:

– Bəlkə, – dedim, – qadının bu xasiyyəti irsidir, nəsildən gəlmədir.

– Necə irsidir ki, bu yazıq heç ata-ana görməyib, əmisinin evində qulluqçu böyüyüb.

– Yəqin, əmisi yaxşı saxlamırmış.

– Bəli, ona öz uşaqlarının köhnəsini geydirirmiş.

– Daha sən qadını niyə qınayırsan. Uşaqlıqdan həsrət gözü var.

Mürsəl güldü:

– Uşaqlıq yaşından qırx il keçir. Çobanlar gəlib alim olub. İndi ki, həsrət deyil! İndi onun nəyi çatışmır. Görmür ki, mənim bütün qazancım evə, onun əlinə gəlir...

– Adəti unutmaq naxoşluğuna səbəb olur.

O köhnə məsəldir.

– Anan da köhnə adam deyilmi.

Hər ikimiz çox danışandan sonra qadının köhnə azarına müalicə tədbiri düşündük.

Mürsəl bu yaxınlarda təzə evə köçməli idi. Güman edirdi ki, "anamın barxanasını da qoyub gedirik". Ancaq qadın deyəsən, bunu duymuşdu. Düyünçələrini bir-bir sahmanlayıb yığırdı: "Orada, deyirdi, – mənə otaqdan-zaddan verərsən, öz şeylərimi yığım, əl-ayağa dolaşmasın..."

Mən Mürsələ bir məsləhət gördüm: "Elə vaxtda köçməlisən ki, anan şəhərdə olmasın!" Mürsəl bu tədbiri xoşladı və əməl etdi: avqustun ortalarında qadın bağda olan zaman uşaqları futbola gətirmək məqsədilə şəhərə gəldi. Həmin günün səhəri, tezdən də köçdü.

Ancaq köçəndə iki yük maşını çağırtdı: biri ev əşyasını təzə evə aparırdı, o biri də lüzumsuz şeyləri şəhər kənarına atmağa aparırdı.

Köçəndən bir həftə sonra anasını maşına qoyub təzə otaqlara gətirmişdi. O, parket döşəməsi parıldayan geniş, işıqlı otaqları gəzdikcə "pəh-pəh, – deyirdi, – oğul, sağlığına qismət olsun!"

Otaqları gəzdikcə gözü nəyi isə axtarırdı: – "Hanı bəs mənim şeylərim. Hara yığmışsınız onları".

– Hansı şeylərini.

– Köhnə pal-paltarımı, dür-düyünçəmi!

– Odur, sandığında!

– Sandıq o qədər şey tutmazdı, köhnələri deyirəm!

– Köhnələri köhnə evdə qoyduq.

– Ədə, boş danışma, şeyləri göstər. Kağız qutunu görmürəm!

– Ana, o şeyləri buraya gətirmək olardımı.

Qadın birbaş köhnə evə cumdu. Evi bağlı gördü, sahibi bağda idi.

Bir müddət qadın dabanlarını çəkib köhnə evə ayaq döydü. Axırda təngə gəlib yerində oturdu. Dilindən düşməyən bircə şikayəti bu idi:

– Köhnə evdə mənim çox şeyim getdi. Mənə çox ağır oturdu...

Oğul da deyirdi:

– Düz deyirsən, ana, o ev səndən çox şey apardı. Amma yaxşı ki, apardı, səni yüngüllətdi.

*1953*

# ÖZÜNDƏN NAXOŞ

*Людей одиноких по натуре, которые как рак-отщельник или улитка, стараются уйти в свою скорлупу, их на этом свете немало.*

***Антон Чехов***

– Naxoş-maxoş bilmirəm. Kim getməsə, məsələsini ümumi iclasa qoyacağam!”

– Bu nə danışır e!

Mirzə Əsgər Abasəlinin dalınca baxa-baxa qaldı. “Ümumi iclasa qoyacağam!” sözlərini zehnində təkrar etdi, vahiməsi bir az da artdı.

Mirzə Əsgər Abasəlini yaxşı tanıyırdı. Bilirdi ki, dediyini eləyəndir. Onun adını evdə söyüşlə çəkəndə arvadı soruşurdu:

– Necə adamdır o.

– Əvvəla, demaqoqdur, lap yekəsindən. İkincisi, nanəcibdir. Üçüncüsü, həyasızdır. Dördüncüsü...

Arvadı onun sözünü kəsdi:

– Sayma, bəsdir, həyasızdan nə desən çıxar.

Abasəli trestdə yerli komitə sədri idi. Keçən həftə qərara alınmışdı ki, istirahət günü bütün işçilər yığışıb stansiyaya getsinlər, vaqonlardan tökülən taxta dirəyi maşınlara yükləməkdə vağzal fəhlələrinə kömək etsinlər. Tikinti materialı o qədər tökülmüşdü ki, yığıb-yığışdırmaq üçün kollektivin bu qərarı elan olunanda Mirzə Əsgər adəti üzrə etirazını bildirdi:

– Əlbəttə ki, iməciliyə getmək məsələsində naxoşlar nəzərə alınmalıdır!

Bu söz Abasəlinin qulağına çatanda cin başına vurdu. “Belə də xeyrə-şərə yaramaz adam olarmı” – deyə düşündü və üzünü hesabdarın otağına tutub ucadan dedi:

– Naxoş-maxoş bilmirəm. Kim getməsə, məsələsini ümumi iclasa qoyacağam!

* * *

Mirzə Əsgər iyirmi ildi trestdə hesabdar vəzifəsində çalışırdı. Bu iyirmi il müddətində bir gün olmayıb ki, o, başını qaldırıb desin. “Bu gün kefim sazdır, yaxşıyam!” Onu həmişə səhhətdən şikayət edən,

boyun-başını tutub ufuldayan görərsiniz. Biri baş ağrısından danışanda Mirzə Əsgər şərik olardı: “Mənim başımın ağrısı kəsmir”. Biri ürəkdən, bir başqası mədədən şikayətləndimi, Mirzə Əsgər qələmi yerə qoyar, çeşməyi çıxarar və deyərdi:

– Siz, deyəsən mənim naxoşluğumdan xəbər verirsiniz. O şeylər məndə artıqlaması ilə baş verir. Dərman atmaqdan yorulmuşam.

Mirzə Əsgər həyatında çox ehtiyatlıdır. Yeməyinin, istirahətinin vaxtını keçirməz. Az qala özü yaşda bir stəkanı, qalaylanmış qaşığı, qəlyanaltı üçün ayırdığı xüsusi bir yeşiyi var. O yeşikdən butulka ilə qaynanmış su, kəklikotu, aspirin, cürbəcür vitaminlər çıxar.

“Qrip” sözünü yazanda dəsmalla ağzını tutar, səhər-axşam qoltuğuna termometr qoyub, hərarətini yoxlayar.

Bir dəfə tramvayda evinə gedəndə yanında oturan bir xanım şübhələndi.

– Yoldaş, – dedi, – sumkanızda toyuq var, nədi.

– Xeyr, mənim sumkam boşdur, bazara getməmişəm.

– Bəs bu qurultu səsi nədir ki, mən eşidirəm.

Mirzə Əsgər başa saldı:

– Qoltuğumda qrelka var. Ağrını kəsmək üçün məsləhət görüblər. Tramvay tərpənəndə zəhrimar yırğalanır. Suyun səsidir!

Axşamlar istirahət vaxtı adamlar kinoya, teatra, stadiona gedəndə Mirzə Əsgər çarpayısında uzanıb özünü yoxlayardı. Uzunmüddətli və ağır işdən sonra təmirə gəlmiş maşını usta necə yoxlayarsa, o da özünü eləcə diqqətlə yoxlayardı. Termometrdə bir şey görməyəndə, güzgü qabağına keçər, rənginə baxardı. Qoluna, qıçına nəzər salar, ağzını açıb boğazına baxar, “a” səsi çıxarardı. Evdəkilərin hamısının başına toplanmasını, onunla maraqlanmasını çox sevərdi. Qapı, pəncərənin düşməni idi. İstidə, küləkdə, qarda, yağışda evdən çıxmaq istəməzdi. Küçədə də kostyumunun boynunu qaldırar, belini əyər, divarların dibi ilə yeriyərdi. Çayı soyudub, suyu da qızdırıb içərdi. Vitamin yox idi ki, Mirzə Əsgər onun kimyəvi tərkibini bilməsin, dadını yoxlamasın. Onun getmədiyi yaylaq qalmamışdı. Bağ qalmayıb ayaqlamasın, palata qalmayıb yatmasın, sanatoriya qalmayıb yaşamasın. Putyovkalar elə tez-tez yazılıb möhürlənərdi ki, deyərdin bu yumru, yağlı gövdəli, çeşməkli kişinin vücuduna, allah eləməsin, bir sədəmə toxunsa, dünya alt-üst olar. Həkimlər də onu tanımışdılar. Diaqnoz qoymaq üçün çox əziyyət çəkirdilər. Daxili üzvlərin birini “şıltaqçı” yazar və soruşardılar.

– Gərək siz böyrəkdən şikayətli idiniz.

– Doktor, indi mədəm də, ürəyim də şıltaqlıq edir.

Mirzə Əsgər istədiyi kurortlara gedirsə, hamısından da narazı gələrdi. “Necə şeydirsə, mənə düşmür – gün-gündən geri gedirəm” – deyə şikayətlənərdi.

* * *

İndi Abasəli də üzünü tutub belə bir adama deyirdi:

– Naxoş-maxoş bilmirəm.

Mirzə Əsgər bu dəfə məəttəl qalmışdı ki, getsin, ya getməsin. Güman edirdi ki, onu iməciliyə çağıranlar o qədər də nainsaf olmazlar. Onu taxta-şalban daşımağa qoymazlar. Olsa-olsa ondan öz sənətindən istifadə edərlər. Orada da yazı-pozu, hesab-kitab var axı. Orada da görülən işin hesabını aparan lazımdır, ya yox! “Məni ancaq bu məqsədlə apara bilərlər, ayrı cürə olmaz” – deyə düşündü.

Hərdən Mirzə Əsgəri qəzəbli vahimə basırdı: “Həyasızdan nə desən çıxar! Qorxuram ümumi iclasa qoya, özü də lap pis danışa. Ona məndə tab hanı? Oradaca ürəyim gedər...”

Bir də görürdün ki, Mirzə Əsgər vücudunda qalan cəsarəti yığıb öz-özünə belə düşünür:

– Dəli şeytan deyir ki, gəl get! Qoy səni lap iməciliyə aparsınlar. Naxoş bədən də dözməsin, yıxılıb ölsün. Qanın tökülsün belələrinin – Abasəli kimi vicdansızların üstünə. Azı beş il həbs versinlər. Eybi yoxdur, mən qəbirdə yatanda o da getsin dustaqxanaların küncündə sürünsün! Dəli şeytan deyir ki, elə gəl get, qoy axır əncamı belə olsun!

Səhər tezdən üstü örtülü avtobus gəlib evin qabağında dayandı. Abasəlinin səsi eşidildi:

– Sabahın xeyir, mirzə! Maşın sizi gözləyir!

Avtobusun içindən deyib-gülmək səsi gəlirdi. Deyəsən adam çox idi, – deyəsən camaatın hamısı gedirdi. Mirzə Əsgər köynəkcək durub pəncərədən bir eşiyə baxdı, şikayətli bir dillə arvadına dedi:

– Görürsən də! Bu da mənim istirahət günüm.

– Kefin yoxdur, getmə!

– Necə getməyim, görmürsən aləmi yığıb qapıya! Bu vicdansızlığın hələ hamısını görmürsən, bunlar hamısı mənim üçün qurulub, getməsəm bəyəm canım rahat olacaq.

Qəlyanaltısını, dərmanlarını, borjom butulkasını sumkaya yığınca, geyinib çıxınca bir xeyli vaxt çəkdi. Avtobusdan səs gəlirdi:

– Ay mirzə, tez ol, gün-günorta oldu ki!..

Mirzə Əsgərin əlindən yapışıb içəriyə saldılar. Avtobus sürətlə yoluna davam etdi. Mirzə Əsgər sağa-sola yırğalanaraq düşünürdü. "Necə eləyim ki, uçot işini mənə versinlər!"

* * *

Stansiya tikinti ləvazimatı yol boyu dağ kimi tökülmüşdü. İdarələrdən səfərbərliyə alınmış dörd tonluq maşınlar nəfəs almadan dolub şəhərə yollanırdılar.

Abasəli trest işçilərini sahələrə paylaşdıranda, hərəyə bir iş tapşıranda Mirzə Əsgər sevinirdi. Görürdü ki, bunu çağıran, taxta daşımağa göndərən yoxdur. "Deyəsən elə mənimki uçot olacaq" – deyə şadlanırdı.

O, bu fikirdə ikən Abasəli uzun bir dirəyin başından tutub çağırdı:

– Mirzə, bura gəl, yapış, ataq maşına!

Mirzə Əsgərin gözü bərələ qaldı. "Onu götürməyə məndə can hanı" – deyə həyəcanla düşündü:

Abasəli macal vermədi:

– Qolum düşdü, tez ol, ay mirzə!

Mirzə Əsgər istər-istəməz dirəyi götürməli oldu. Beş addımlıqda dayanan maşına aparanacan bəlkə ürəyində yüz dəfə Abasəliyə söydü. Dirəyi qoyandan sonra ona elə gəldi ki, bu saat yıxılıb özündən gedəcəkdir! Özünü yoxlamaq istəyirdi ki, Abasəlinin səsi eşidildi:

– Mirzə, tez ol, bizim maşın geri qalır, biabır olarıq, yaxın gəl!

Mirzə Əsgər dirəyin ikincisini, üçüncüsünü də götürüb maşına tullamalı oldu.

Axşam yorğun, əzgin bir vəziyyətdə evə dönən kimi zarıldadı:

– Arvad, mənim yerimi sal! Məndən bir də adam olmaz! Baisin evi yıxılsın!

Yatağa uzanan kimi onu şirin yuxu apardı. Arvad onun qoltuğuna termometr qoydu. Nəbzini yoxladı. Bircə şeyə heyran idi ki, həmişə yuxuya həsrət olan, yuxusuzluqdan şikayətlənən adam, indi, deyəsən div yuxusuna getmişdir!

Neçə saatdan sonra Mirzə Əsgər yuxudan qalxdı, yemək stoluna yanaşıb tələb elədi:

– Arvad, mənə yemək ver, yaman acmışam!

Qadın kişisinin ömründə görmədiyi şirin bir iştahla xörək yediyini görüb sevindi.

– Ay Mirzə, – dedi, – ağır iş sənə düşüb, gəlsənə hesab-kitabı buraxıb, stansiyada iş götürəsən?

*1954*

## İCLAS QURUSU

Əncir qurusu, ərik qurusu, zoğal qurusu – bunlar çox olur, iclas qurusu isə tək-tək olur.

Bir var ki, gün altında quruyan, bir də var ki, iclaslarda quruyan, suyunu çəkən, həyat hisslərini itirən.

İclas qurusunu siz tanıyırsınız. Adını bilməsəniz də, özünü yaxşı tanıyırsınız. Arıq bədənini qabağa əyib, dizini bükərək sürətli addımlarla gedən adamı siz küçədə, idarə qapılarında, pilləkənlərdə çox görürsünüz.

O haraya tələsir. İclasa!

Qoltuğundakı boz, sürtülmüş qovluq səliqəsiz yığılmış kağız-kuğuzla doludur.

Bunlar nədir. Protokol! O bütün ömrü boyu başı aşağı, dünyadan bixəbər, qaşqabaqlı, sifəti bulud kimi tutulmuş, fikirli gəzir.

Nəyi düşünür. Qərarı!..

İclas qurusu üçün gecənin-gündüzün, yazın-payızın, istinin-soyuğun, yerin-göyün heç bir fərqi, əhəmiyyəti yoxdur. Suların səsindən, çiçəklərin ətrindən, quşların mahnısından, musiqidən, gülüşdən, şənlikdən uzaq olan bu qaradinməz adamı görəndə kimisi heyrət edir, çoxunun da acığı gəlir.

Güman etməyin ki, iclas qurusu ancaq ictimai yerlərdə belədir. Siz düşünürsünüz ki, evinə qayıdıb papağını çıxardanda, arvadı, uşağı ilə görüşəndə iclas qurusunun halı dəyişmiş olur, üzündə işıq, dodağında təbəssüm doğur.

Yox! Səhv edirsiniz! O iradəli, prinsipli, müstəqim adamdır. Onun şəxsi ailə həyatı özü də bir növ iclasdır. O, bir dəfə qət etmişdir ki, iclas üçün yaranmışıq, başımız qərar hazırlamaq, barmaqlarımız protokol yazmaq, əllərimiz çəpik çalmaq, səsimiz çıxış etmək üçün bizə verilmişdir. Onun fikrincə, bütün kainat da mühüm bir iclasdan sonra yaranmış və imzalanmış bir qərar üstündə dayanır. İnanmırsan, başını qaldır göyə bax. Gör neçə milyonlarla ulduzlar sədrlik edən ayın başına toplanmışdır. Min illərdən bəri göydə elə qızğın iclas gedir ki, bəzən gurultusu yerdə qulaqlara düşür.

İclas qurusu arvadı Meyransa ilə belə danışır:

– Yoldaş Meyransa, təklif var ki, mənim corablarımı yuyub qurudasınız!

Meyransa dinməyəndə o ayağa qalxır, qələmin küt ucunu stola döyüb danışır:

– Cavab üçün söz verilir yoldaş Meyransaya!

İclas qurusunun iclaslar, qərarlar, nitqlər içində keçən və asanlıqla keçməyən həyatı neçə dəfə ailədə də silkələnmişdir.

On səkkiz il əvvəl Quru, axşam, iclasdan qayıdanda arvadını evdə görmədi. “Bu hansı iclasdadır gecənin bu vaxtında” – deyə ürəyində fikirləşdi. Çox keçmədi qonşu qadın gəlib Qurunu təbrik etdi:

– Quru qardaş, gözünüz aydın, bir yaxşı qızınız oldu. Meyransa xanım xəstəxanada sizi gözləyir.

Quru qadına nə muştuluq verdi, nə də cavab. Qəzəb və dəhşət yağan üzü bir az da qaraldı, gözündə ildırımlar oynadı: “Bu nəyə lazımdır. Görəsən bu barədə nə qərar olacaq. Eşidənlər nə deyəcəklər”.

Uşağı bələyib evə gətirdilər. Quru kağızlar aləmindən baş qaldırıb baxmadı da. Meyransa ərindən xahiş etdi ki, bir yaxşı ad tapsın. İclas qurusu bu məsələni kluba iclasa keçirdi. Orada çox ad təklif olundu, ata razı olmadı, öz təklifində təkid etdi:

– Məruzə!

İclasdakılar qəhqəhə çəkib gülüşdülər və sonra çəpik çaldılar.

Qızın adı qaldı Məruzə.

Məruzə bəsləndi, Məruzə böyüdü. Məruzə oxumağa, nəhayət, diqqətləri cəlb etməyə başladı.

Məruzəyə kitab, dəftər almaq lazım gələndə İclas qurusu bütün rəsmiyyəti gözləyirdi. Əvvəlcə qız atasına ərizə yazırdı. Sonra ərizə

məktəbə, müəllimin təsdiqinə göndərilirdi. Daha sonra Meyransa qol çəkirdi. Nəhayət, İclas qurusu mağazindən kitab, dəftər alıb gətirir, qıza qol çəkdirəndən sonra siyahı ilə verir və vaxt qoyurdu. "Gələn ayın ikinci həftəsinin sonuna qədər", həmin siyahının bir surətini idarəyə, "nəzarət üçün" müdirə göndərir, bir üzünü də öz arxivində ehtiyat üçün saxlayırdı. Gələcəkdə yoxlasalar lazım olar.

Məktəb müdiri bir neçə dəfə Məruzəyə demişdi:

– Qızım, atanı çağır, vacib söz deyəcəyəm!

Quru cavab vermişdi:

– Mən iclasda olacağam!

Qız böyüyəndən sonra İclas qurusunun başağrısı daha da artdı. Qızı çox yerdən istədilər.

Elçilərin hamısına bir cavab verilirdi:

– Anket doldurun, yoxlayıb baxarıq.

Elçilər anket adını eşidib dağılışırdılar.

Ancaq məhəbbətində sadiq olan Əsgər adlı bir şofer İclas qurusundan əl çəkmədi. Meyransa Əsgərlə qohum olmağa razı idi. Kişinin qılığına girmək istədi:

– Kişi, Məruzəni istəyirlər axı.

– Konkret danış, kim istəyir və hansı şərtlərlə.

– Şofer Əsgər.

– Ərizəsi yoxdur.

– Bəs niyə havayı danışırsan? Meydanda nə ərizə var, nə anket, nə zəmanət. Niyə bəs gəlib başımı ağrıdırsan?

Meyransa xahiş ədası ilə dedi:

– Bəlkə vaxt verəsən, iclasın olmayanda elçilər gəlsin, danışasınız.

– Elçini neyləyirəm. Qız istəyən adam şəxsi işini, şəklini göndərsin, tanış olum, sonra müzakirə edib baxarıq.

İclas qurusu oğlanın adını bir-iki dəfə təkrar edib Meyransaya baxdı, başını buladı:

– Adı köhnədir, çox köhnədir. Məruzəni almaq istəyənin adı Məruzəyə layiq olsun gərək!

– Sən deyərsən dəyişər!

İclas qurusu öz qərarını təkrar etdi:

– Dedim şəxsi işini göndərsin, baxıb müzakirə edərik, artıq danışmaq lazım deyil!

Meyransa bir söz deməyib çıxdı.

İclas qurusunun sözlərini Əsgərə çatdırdılar. Əsgər dedi:

– Anketimi getsin idarədən öyrənsin, ancaq mən bu işin daha asan yolla həllini bilirəm. O özünü belə zəhmətlərə nahaq salıb.

* * *

Bu axşam İclas qurusu oturub protokolları sahmana salırdı. Meyransa da şkafı açıb təzə paltarlarını geyinirdi. Kişi başını qaldıranda arvadını ayrı bir həvəs, ayrı bir sevinclə, tələsə-tələsə geyinib-kecinən gördü.

– Hara belə, ay arvad, – deyə təəccüblə soruşdu.

– Heç, balaca iclasımız var!

– Bəs Məruzə haradadır.

– O da öz iclasına gedib, sənə də kağız göndərib.

Meyransa stolun üstündəki kitabın altından əl boyda bir kağız çıxarıb ərinə verdi:

– Deyirsən, uşaqların qərarı var. Oxu gör necədir.

İclas qurusu kağızı oxuyanda gözü kəlləsinə çıxdı: – "Ata, biz çox müzakirə elədik, düşündük, daşındıq. Sizə zəhmət vermədən ZAQS-a getdik. Sabah toyumuzdur, oğlan evində olacaq, iclasdan sonra vaxtın olsa, buyurub gələrsən. Qızın Məruzə."

İclas qurusu daha da qurudu. Quru uzandı, dik ayağa qalxdı:

– Necə, necə... Özbaşına qərar çıxarıblar... Bu qərarı kim təsdiq edib.

Meyransa təmkinini və mülayimliyini pozmadan cavab verdi.

– Gərək sən təsdiq edəsən də!

İclas qurusu özündən çıxdı:

– Mən onun anketini oxumamış, işini yoxlamamış, müzakirə etməmiş belə qərarı necə təsdiq edə bilərəm, bu nə intizamsızlıqdır...

Meyransa çəkməsini ayağına çəkib son sözünü dedi:

– Edərsən, etməzsən, özün bilərsən. Mən Əsgərgildə toyda olacağam, evdən muğayat ol. Qapı-bacanı açıq qoyma! – Meyransa bunu dedi, qapını çırpıb çıxdı.

Ev dəyirman daşı kimi İclas qurusunun başına dolandı.

*1954*

## PLOVDAN SONRA

Bu axşam vağzalda çox get-gəl var idi. Kənardan baxan düşünərdi ki, adamlar hörmətli bir qonağı qarşılamağa, ya da yola salmağa toplanıblar. Vəziyyət qarşılamaq yox, yola salmaq mərasiminə daha çox bənzəyirdi. Əvvələn ona görə ki, əlində şey olan adamlar tələsə-tələsə vaqonlara tərəf gedirdilər. İkincisi, ona görə ki, parovozun, vaqonların səmti, duruşu qatarın məhz getməyə müntəzir olduğunu göstərirdi. Üçüncüsü...

Nə başınızı ağrıdım, vaqon ağzında komalaşanlar, hörmətli müsafirləri yola salırdılar. Qatar boyunca uzanan təmiz, asfalt səkilərdə hərbi adamlardan, müəllimdən tutmuş, əlvan geyimli, ağır gövdəli xanımlara qədər çoxlarını görmək olardı.

Yumşaq vaqonun qabağında dayanan daha çox idi. Yola çıxan bu hörmətli müsafir kim ola?

Bu, Moskvaya oxumağa gedən tələbələrdən, bəlkə də bizim bəzi alim, şair, ya nazir uşaqlarından biri olacaq.

Adamlar yumşaq vaqonun qabağında Ramizi – onilliyi bu il bitirmiş təzə tələbəni mehribanlıqla əhatə etmişdilər. Kimi şokolad qutusu təqdim edir, kimi səbətdə üzüm, kimi kağız torbada başqa meyvələr gətirir, kimi də cüt-cüt limonad şüşələrini pəncərədə dayananlara verib, Ramizin kupesinə ötürürdü. Kabardin palto və ağ şlyapa, ağ əlcək və ağ çəkmə geymiş alçaqboylu, kök bir qadın isə hərdən irəli çıxıb, Ramizin yaxasına qonan tükü götürür, onun dağınıq saçını əli ilə geri daramaq istəyirdi. Oğlan isə ipək köynəyinin parıldayan metal açarını gah yuxarı, gah aşağı aparır, anasının sual və söhbətinə könülsüz, dilucu cavab verməklə kifayətlənirdi. Görünür, adam içində ailə söhbətlərindən, ana nəvazişlərindən xoşu gəlmirdi.

Ərknaz xanım hərdən ətrafa boylanır, belə bir oğul anası olduğunu hər vasitə ilə gözə verməyə çalışırdı. Hətta atalıq hüququndan istifadə etmək istəyən ərinə də macal vermirdi.

Papirosuna yüngül bir qullab vuran Namazov, oğluna belə tapşırıq verirdi:

– Nə azuqə lazımsa, indidən alaq, daha yollarda düşməyə ehtiyacın olmasın! Ramiz, gör ürəyin daha nə istəyir!

Ərknaz xanım kişisinə etiraz edirdi:

– Sən də danışdın ha! Ramiz sənə qız uşağı-zad deyil ki, qaxılıb vaqonda otursun, kənara çıxmasın. Yoldur, səyahətdir. Düşəcək də, minəcək də! Yolda, məsələn, xoşuna gələn bir meyvə oldu, alacaq da. Sən niyə indidən uşağı sinsidirsən, yoxsa pulun xəsisliyini eləyirsən?!

Namazovun rəngi dəyişdi. Dediyinə peşman oldu. Ramiz də: "Heç nə lazım deyil" – dedi, başını aşağı saldı. Ətrafındakılar güldülər. Ərknaz xanım özü də güldü. İrəli yeriyib, oğlunun kürəyindən bir şapalaq vurdu:

– Qorxma, oğul, puldan özünə korluq vermə. Anan ölməyib ki! Vallah, öz canım üçün düz deyirəm!

Axırıncı zəng vurulana yaxın bir gödək, çalbaş kişi, bir də ortaboylu qoca qadın tələsik özlərini səkiyə yetirdilər. İri bir bağlamanı ehtiyatla vaqona çıxarıb, Ramizin yerinə apardılar. Onların dalınca Ərknaz xanım da çıxdı. "Uşağın" kupesini, rahatlığını bir də yoxladı. Çox çəkmədi ki, axırıncı zəng çalındı, yola salanlar vaqondan düşdülər. Ramiz əvvəl kənardakılarla, sonra da valideyni ilə əl verdi, öpüşdü. Ərknaz xanım həyəcan keçirirdi:

– Qadan alım, Ramiz, qalarsan, tez ol!

Ramiz qatarın hərəkətini görən kimi cəld vaqonun pilləsinə atıldı. Dəsmal eləyə-eləyə vidalaşdı. Vaqon bir an içində onu götürüb getdi. Qohumlar, tanışlar, yoldaşlar – hamısı vaqon gözdən itənəcən Ramizə əl eləyir, xeyir-dua verirdilər. Yalnız Ərknaz xanım gah qırmızı haşiyəli balaca ipək dəsmalını gözünə basıb ağlayır, gah da sağ əlini havada tərpədirdi.

## 1

Kim desə ki, mən övladımı istəmirəm, inanmayın. O, yalan deyir. Elə adam ola bilməz ki, doğma balasını istəməsin. Övlad şirin şeydir. Nəinki insan, hətta bütün yaranmışlar balasını istəyir, əziz tutur. Amma istəmək var, istəmək var.

Ərknaz xanımın oğluna məhəbbəti ayrı bir məhəbbətdir. Qardaş görmədiyindənmi, tək bir oğul anası olduğundanmı, Ramizin göz qabağında necə tez boy atıb böyüməyini yoldaşlar arasında fərəhlə dönüb-dolaşmasını, oxumasını, çalmasını, oynamasını gördüyündənmi, nədənsə, söz və söhbətinin əvvəli də, axırı da Ramizdir. Məclis olmaz ki, Ramizdən danışmasın. Hər yerdə deyir ki:

– Ramiz çox qeyrətli, fərasətli uşaqdır. Çox qanacaqlı, mərifətli uşaqdır. Çox rəhmli, qabiliyyətli uşaqdır. Onun telefonla ibarəli danışmağını, cürbəcür kino artistlərinin təqlidini çıxarmağını, şəkil çəkməyini, maşın sürməyini, qəşəng-qəşəng məktub yazmağını, kostyum seçməyinimi deyim, səliqə-sahmanınımı, kefi gələndə çalmağını, oxumağınımı, oynamağımı handa bir dəvətnamə ilə konsertlərə getməyinimi, lap baş cərgədə handa bir qızla oturmağınımı deyim, ədəb-ərkanını, mərifətini, qanacağınımı, hansını deyim!..

Münasib məclisin münasib bir yerində söhbət düşəndə Ərknaz xanım oğlundan həvəslə, şirin-şirin danışır. Həmişə eyni sözləri danışsa da, elə bir vəcdlə danışır ki, deyərsən bu sözlər “xoruz səsi eşitməmiş” təzə xəbərlərdir. “Söhbət düşəndə” dedik. Əslinə baxsan söhbət düşmür, onu Ərknaz xanım özü salır. Özü də yeri oldu, olmadı baxmır. Bəlkə ayrı bir adam bunu bacarmaz. Ayrı bir mətləb danışılan zaman, yuyulmamış qaşıq kimi, aralığa girmək hər adamın işi deyil, “nə dəxli var!” Amma Ərknaz xanım bunu demir və düşünmür. O, Ramiz söhbətini elə ustalıqla başqa mətləblərə qatır ki, danışanda, bir də görürsən Ərknaz xanım aralığa girdi:

– Balam, indikilərə paltar bəyəndirmək olmur. Ramiz iki dəst xalis baston, triko kostyum tikdirmiş, bir dəst də atası Tiflisdə komissiyonnudan alıb, lap əcərri! Di gəl heç birini bəyənmir. Neyləyəsən, məcbursan ayrısını alasan. Cavandır...

Adamlar Qubanın alma bağlarından, bu il meyvəcatın bol gəlməyindən danışanda Ərknaz xanım şikayətini başlayır:

– Bizim Ramiz bazardan alınan meyvəyə məhəl qoymur. Vallah, öz canım üçün, məhəl qoymur. O deyir: gərək üzümü, özü də ağ şanını ya dərbəndini meynədən özüm dərəm: almanı, ağacdan özüm üzəm. Atası ona keçən il Qusarda bir bağ tutmuşdu, iki minə. Başdan-ayağa almalıq, armudluq...

Camaat beynəlxalq vəziyyətdən, hökumətlər arasında sülh yaranmasından danışıb, şükür eləyəndə, Ərknaz xanım fikrini belə bildirir:

– Bə nədi, o gün hamınınkını Allah saxlasın, Ramiz qəzeti almışdı əlinə, sülhün barəsində bülbül kimi elə oxuyurdu, elə oxuyurdu, adamın canına yağ kimi yayılırdı. Qonum-qonşu tökülüb, deyəsən lap leksiyadı. Gədənin döşündə də mərmər göyərçin qanad açıb, elə bilərsən bu saat uçub taxtapuşa qonacaq, öz canım üçün!

Məktəbdən söhbət açılanda, Ərknaz xanımın dəftər-kitabı lap uzanır:

– Bizimki ayrı cür uşaqdır! Müəllimlər danışa, görəsən! Belə, bir özgə cür uşaqdı. Direktorlar lap məəttəl qalıblar. Bu yaşda uşaqda belə fərasət! Görünməyib axı. Professorlar indidən Ramizin üstündə dava salıblar. Biri deyir: mənim institutuma gələcək, o biri deyir: yox, onu özüm dərs verəcəyəm. Biri deyir: gərək akademiyalar yanında dərs ala. Səs-sədası şəhəri götürüb, bilmirəm necə olacaq, öz canım üçün. Nənəsi gədənin köynəyinə gözmuncığı tikməkdən yorulub. Özü qoymur, billəndə söküb atır bir qırağa. Görmüşdük oğlan üstündə qızlar sözə gələr, indi daha professorların gözü qalıb gədədə! Vallah, öz canım üçün, elə biləsən bənd olublar...

– Ərknaz xanım, hansı dərsə Ramizin meyli çoxdur?

– Elə hamısına! Dərs var ki, o bilməsin? Kitab var ki, oxumasın? Müəllimlər heyrandır ki, aya, bu yaşda belə baş!.. Belə lap özgə cürdür, allah hamınınkını saxlasın...

* * *

Vaqona əyləşəndə adamları zəfəran iyi vurdu. Zəfəran iyi gəlirdi, amma birtəhər gəlirdi. Deyəsən bu zəfəran ya qaynanmış, ya qovrulmuş, ya da yağ içinə qoyulmuşdu. Sərnişinlər soruşurdular:

– Bu nə ətir ola, yoldaş konduktor?

– Mənim də burnuma dəyir.

– Yoxsa vaqon-restorandan gəlir bu?

– Xeyr, vaqon-restoranda belə şey yoxdur

Konduktor vaqonun o biri başına yaxınlaşanda, zəfəran iyinin daha da tündləşdiyini duyanda düşündü ki, bu təzə müsafirin, oxumağa gedən tələbənin kupesindən gəlir. Ötəndə gözucu nəzər saldı. Pəncərə qabağında baş-başa verən, konyak stəkanlarını çaqqıldadan iki gəncin zəfəran-plov yediyini görüb, tez ötdü. Çalışdı ki, gənclər onun nəzər yetirdiyini görüb, narahat olmasınlar.

2

Doğrudur, Ərknaz xanım hər yerdə oğlunu ağız dolusu tərifləməkdən doymurdu. Tərifli cavanların heç birindən əskik saymırdı ki, artıq sayırdı. Amma buna onun əsası yox idi. Ramiz orta məktəbdə miyana və bəlkə miyanadan bir pillə aşağı oxuyan uşaqlardan idi. Ərknaz bunu bilməmiş deyildi. Bilsə də, Ramizi tərifləməkdən əl çəkmirdi. Ona

görə əl çəkmirdi ki, "Dedi-dedi ev yıxır! O müəllim pis deyər, bu müəllim pis deyər, valideyn də onlara qoşulub pis deyəndə, uşağın adı doğrudan da pisə çıxar, sabah ali məktəbə gedəndə onu qapıda dayandırarlar..."

İkinci tərəfdən Ərknaz xanım Ramizin dərsdən aldığı qiymətləri doğru saymırdı. Bu qiymətlər bəzən onu təbindən çıxarır, əsəbiləşdirirdi:

– Nə olmuşdu bəyəm? Çoğrafiyadan da zəif? Yəni Ramiz o qədər əfəl oldu ki, dağların, dəryaların adını da saya bilmədi? Mənim oğlum həmin dağları aşıb, dəryaları ötüb dönə-dönə gəzməli yerlərə gedəndə, çoxları heç Bakıdan qırağa çıxmamışdı. Kislovodskə, Soçiyə, Moskvaya onu atası neçə dəfə özü aparıb, indi götürüb coğrafiyadan uşağa iki yazıblar. Yox! Gözləri götürmür! Məktəbdəkilər bizim uşağı uşkar gözümçıxdıya salmaq istəyirlər, ögey baxırlar, ögey!..

Əri mane olmasaydı, bəlkə Ərknaz xanım coğrafiya müəllimi ilə savaşacaq, kim bilir necə ağır sözlər deyəcəkdi.

Üçüncüsü də bu idi ki, Ərknaz xanım oğlunun ali məktəbə düzələcəyinə arxayın idi. Xəyalına qoymuşdu ki: "İmtahan zamanı müəllim tutub hazırlaşdıraram, atası da sözü keçəndir, tapşırar. Bir də Moskva məktəblərinə gedən az olur. Ramizdən yaxşı kimi götürəcəklər..."

Həmin il Moskva məktəblərində respublikalardan gələnlərə çox yer ayrılmışdı. İmtahan da, Ramizin bəxtindən yerli komissiyalarda olurdu. Bu komissiyalarda da Ramizin atasını tanımayan kim idi.

Vəziyyət belə olsa da, Ramiz imtahanda kifayət qiymətlər yığa bilmədi.

Oğlunun adını qəbul olunanlar siyahısında görməyəndə Ərknaz xanım təcili bilet alıb oğlu ilə birbaşa Moskvaya yola düşdü. Neçə qapı döyəndən sonra mərkəzi qəbul komissiyasının məsul katibinin yanına getdi. Ərinin məsul işlərdə ömrünü qoyduğunu, oğlunun naxoş vəziyyətdə həyəcan keçirərək imtahan verdiyini, yerli komissiyada "ədalətsizlik olduğunu", yeganə oğlu Ramizin ərizəsi rədd edilərsə, özünü bədbəxt ana hesab edəcəyini xüsusi bir həyəcan və hiddətlə, təkid və cürətlə danışdı. Haçandansa Ramizin məktəb dram dərnəyindən aldığı təşəkkürnaməni paketdən çıxarıb göstərdi:

– Qabiliyyətsiz uşağa belə təşəkkürnamə verməzlər!

Çox haray-həşir salandan, dönə-dönə dilindən zəmanət verəndən sonra inşaat institutunda hələ tutulmayan yerlərdən birini Ramiz aldı. Təqaüdsüz və yataqxanasız olaraq oxumağına icazə verdilər.

Ərknaz xanım bu icazə kağızını alıb Bakıya qayıdandan sonra daha yerə-göyə sığışmırdı. Müəllimlərin, komissiyaların ünvanına acı-acı sözlər deyir, daş-qaş parıldayan şəhadət barmağını silkələyərək, Ramizin qeyrətinə, biliyinə məhz yuxarı təşkilatlarda "lazımi və layiqli qiymət aldığını" bir daha iddia və təsdiq edir, bədxahlarına sanki acıq verməkdən həzz alırdı.

Ramiz oxumağa gedəndən Ərknaz xanımın yarı canı da onunla getmişdi. İndi oğul sözü-söhbətini əvvəlkindən də beşqat artıq iştaha və həvəslə danışsa da, ürəyini sakit edə bilmirdi. Ramizə halva, şəkərçörək bişirir, səbət-səbət meyvə göndərir, həftəbaşı bir bağlama yola salırdı. Söz yox ki, bu bağlamaları poçtla, adi qayda ilə göndərsə, gecikəcəyini, bəlkə xarab olacağını güman edirdi. Ona görə hər dəfə Moskva qatarını yola salmağa çıxır, bağlamanın ya xörəyi tanışlardan birinin kupesinə qoyur, oğluna teleqram vururdu ki: "Ramiz, ayın filanında 19-cu qatarı qarşıla. Vaqon nömrə filan, dostumuz filankəsdə əmanətin var! Öpürəm. Anan!"

Ramiz qəbul olunandan sonra poçtalyonlar inşaat institutuna çox get-gəl eləyirdilər. Görürdün bu qarabuğdayı oğlana hey kağız, teleqram, bağlamalar gəlir. Poçtalyonlar onu dərsdə, idman meydançasında, konsert zalında tapır, tələsik qol çəkdirib gedirdilər. Səhərlər saat doqquzda-onda isə Ramizi arıq, büzüşmüş bir oğlanla vağzalda – vaqon ayağında "əmanətini" almağa gələn görərdin. Bu əmanətlər onu, demək olar ki, təngə gətirmişdi. Gələn əmanəti alıb minik tapmaq, evə gətirmək, açıb yerbəyer eləmək, taxtanı, torbanı, kağızı aparıb zibilxanaya atmaq özü bir iş idi. Ramizdə bu səliqəyə hövsələ yox idi. Bir dəfə üzüm səbətini vaqondan götürüb aparmaq istəyəndə milçəklər boğanaq kimi koma ilə uçdu. Səbətin altından axan su isə Ramizin təzəcə geyindiyi triko kostyumu buladı.

Ramiz anasına dönə-dönə yazır, telefonla deyirdi ki: "Göndərməyin, heç şey lazım deyil, xörək də, meyvə də xarab olur, nahaq yerə zəhmət çəkməyin!"

Buna baxmadan "əmanətlərin" sayı nəinki azalmırdı, hətta günü-gündən artırdı. Haçandansa, institutda oxuyan, qurtara bilməyən, möhlət alıb, arxivdə kargüzar vəzifəsi daşıyan köhnə bir tələbə İbiş Məsimov Ramizə bu işlərdə yaxın köməkçi idi. Hər səhər-axşam İbiş Ramizin mənzilinin əziz qonağı idi. Onu otaqda kolbasa doğrayan, çay

dəmləyən, butulka ağzı açan, yaxmac düzəldən, teatr kassasına zəng vuran görərdin. İbiş Ramizin bazarlığına gedir, bələdçiliyini eləyir, paltarını yudurdur, münasib qiymətlə çertyojlarının, konspektlərinin surətini çıxartdırırdı. Kinoya, teatra, stadiona aparırdı. Mənzil sahibilə sözü çəpləşəndə təzə otaq tapırdı. Ramiz oxumağa gələndən üç dəfə otağını dəyişmişdi. Atası ünvanların belə tez-tez dəyişməyinə təəccüb edəndə, Ramiz belə cavab verirdi:

– Birincisində telefon yox idi, ikincisinin hamamxanası xarab idi, üçüncüsünün radiosu işləmirdi...

– Ola bilməzmi ki, əvvəlcədən bu şərtləri yoxlayasan, ay oğul?

– Bundan sonra yoxlayacağam, yaxşısını tutacağam, ata!

Əlbəttə ki, bu cavabları Ramizə İbiş öyrətmişdi. Ramiz heç vaxt otaq dəyişmək istəmirdi, buna hövsələsi də, bacarığı, vaxtı da yox idi. Onu otaqlardan ev sahibləri qovurdular. Ona görə qovurdular ki, gəlib-getməyinin vaxtı yox idi. Gecə yarısı bir də görürdün İbişlə başmaq seyrinə çıxdılar, səhərə yaxın qayıtdılar.

Ramizin etirazlarına atası da, anası da təvazökarlıq adı qoyurdular. Göndərilən xörəklərin, meyvələrin yolda xarab olmamasına isə çarə axtarırdılar.

Axşam Ərknaz xanım ərinə, necə deyərlər, göydəndüşmə bir sual verdi:

– Kişi, təzə təyyarə çıxıb, xəbərin var?

– Nə təyyarədir?

– Adını bir təhər deyirlər ey!

– Reaktiv təyyarə?

– Həri, aktiv təyyarə, eşitmisən?

– O təzə deyil, neçə ildi var!

– Var, bəs mənə niyə demirsən?

– Sənə nə deyəsiyəm ki?

– De görüm o aktiv təyyarə buradan Moskvaya neçə saata gedir?

– Gərək ki, iki saata gedir.

– Bu yaxşı, belə iş var, mənə niyə demirsən, a sağ olmuş?

– Neyləmək istəyirsən bəyəm?

İki saata mən Ramizə paxla-plov çatdıraram ki, lap buğlana-buğlana!

Ərinin gülməyi, müəyyən bir cavab verməməyi Ərknaz xanımı hirsləndirdi:

– Burada gülməli nə var, sən gülürsən? Düyü daş kimi olandan sonra uşağa çatmaq hara, plov isti-isti çatmaq hara! Bu gün sədri düyüsü isladım, sabah danış o təyyarələrdən birində uşağa bir qazan isti plov göndərək.

– Elə şey mümkün olmaz!

Ərknaz xanım alt dodağını dişlədi. Namazovun üzünə dik-dik baxdı:

– Necə məsul işçisən ki, beş kilo şeyi təyyarədə göndərə bilmirsən?

– Beş nədi, on beş də göndərə bilərəm. Amma, ay arvad, reaktiv təyyarə yük üçün deyil, ayrı məqsəd üçündür. Şey qəbul eləməzlər!

Ərknaz xanım ərinə hirsləndi:

– Sənin bəd niyyətini bilirəm, indiyəcən bu təyyarəni məndən gizlətməyin də əbəs deyilmiş. Sən övlad istəyən ata deyilsən. Dənizə göndərsələr də, suyunu qurudub gələrsən. Ata olan kəs bir demirsən, axı mənim balamdır, həftələrlə dilinə plov dəymir, ev xörəyi görmür...

Noyabrın axırlarında Namazov Moskvadan bir səliqəli məktub aldı. Oxuyub məəttəl qaldı: "Bu nə işdir?"

* * *

Ramizin sinif yoldaşları yazırdılar. Salam və nəzakət sözlərindən sonra yazırdılar ki: "Ramiz çətinliklə instituta qəbul olunmuşdur. Düşünürdük ki, bunu nəzərə alar, dərslərinə fəal çalışar, yoldaşlarından geri qalmaz. Təəssüf ki, belə deyil. Təkcə onun iki aydı buraxdığı dərslər bütün qrupdakı 25 nəfərin hamısının buraxdığı dərslərin cəmisindən çoxdur. Ramiz çox seminarlarda iştirak etmir. Öz çertyojlarında qoyulan suallara cavab verə bilmir. Kömək üçün onu qrupumuzun əlaçısı Fikrət Ağayevə təhkim etdik. Fikrətlə cəmisi bir dəfə məşğələ keçib, "vaxtım yoxdur" – deyə gəlmir. Görünür yaxın adamları da onun xeyirxahı deyildir.

Ramizin təhsil vəziyyətini Sizə bildirir, atalıq nüfuz və təsirinizi xahiş edirik. Semestrin axırına az qalmışdır. Ramizin sessiyalardan zəif çıxması bütün qrupumuzun hörmətini və dərəcəsini aşağı salacaqdır. Əminik ki, bütün bunları nəzərə alacaqsınız.

*Baqi hörmət!"*

Qrup adından qol çəkən tələbələrdən sonra, dekan da onların fikrinə şərik olduğunu bildirmişdi.

Kişi məktubu Ərknaz xanıma verdi. Ərknaz xanım diqqətlə oxuyandan sonra adətincə, dodağını gəmirib, gözünü ərinin üzünə zillədi:

– Sən buna inanırsan?

– İnanmamağa nə əsas var?

Ərknaz xanım səsini ucaltdı və qətiyyətlə dedi:

– Böhtandır, iftiradır, paxıllıqdır!

– Tələbələrə nə düşüb sənin oğluna böhtan deyələr?

– Buradakıların işidir! Uşaq hələ təzəcə dərsə gedib, qoysalar bir yerini rahatlasın, qoysalar bir nəfəs alsın! Nə qaçhaqaçdır, nə olub bəyəm? Hələ Ramizin qabaqda beş il vaxtı var!

– Beş ilə baxmır, hər semestrdə dərsini yoxlayırlar.

– Yoxlasınlar da. Bəyəm bir bizimkidir. Elələri var illərlə orada ilişib qalıb. Odur, İbiş altı ildir oradadır, hələ də möhlət alıb, heç onun anası belə kağız almır. Ramizi nə gördü gözləri bunların, canım!

Namazov Ərknaz xanımın hirsləndiyini, təbdən çıxdığını görüb susdu, o biri otağa keçdi. Ərknaz xanım isə dəstəyi götürüb, oğlunu telefona çağırdı.

Kişi Ərknaz xanımdan xəlvət oğluna bir nəsihət məktubu yazdı, institutdan gələn xəbərlərin hamısını bildirdi və təkid etdi ki, dərslərinə yaxşı fikir versin, vaxtını hədər keçirməsin, oraya oxumağa gedib...

Ərknaz xanım isə şəkərbura, paxla-plov tədarükü görüb, yaxın günlərdə Moskvaya getməyə hazırlaşırdı.

3

Vaxt gözləmir deyirlər, heç kəsi, heç yerdə və heç nə üçün gözləmir, zaman əvvəli, axırı görünməyən güclü bir sel kimi heç nə ilə hesablaşmadan axıb gedir.

Vaxt gəlib çatdı, semestrə yekun vuran yoxlama və imtahanlar cədvəli institutun divarlarından asıldı. Tələbə də, müəllim də işlərini bu cədvələ uyğunlaşdırmağa səy etdi.

Ərknaz xanım aerodromda yumşaq minik təyyarəsindən düşüb, oğluna gətirdiyi sovqatları sevinclə taksi maşınına yığanda Ramiz 21-ci auditoriyada yer quruluşu fənnindən yoxlama imtahanı verirdi. O, yazı taxtasının qarşısında, əlində tabaşir donub qalmışdı.

Çeşməkli professor İvanov əlində qələm Ramizin üzünə mənalı-mənalı baxırdı:

– Bəs niyə belə?

– ...

– Bəlkə hazırlaşmamısan?

– Xeyr, professor, bilirəm, soruşun!

Professor İvanov fənnin lap əlifbası sayılan suallardan birini də, ikisini də təkrar etdi. Ramiz gözlərini döyməkdə davam etdi. Professora yəqin oldu ki, bu tələbə nə orta məktəbdən hazır gəlib, nə də institutda dərslərə hazırlaşıb.

– Heç gözləməzdim! Uzaq yerdən gəlmisiniz, siz gərək...

Ərknaz xanım oğlunun imtahana getdiyini eşidəndə ildırım kimi özünü instituta saldı. Ramiz anası ilə dilucu görüşüb, qulağına pıçıldadı:

– Odur ey, gedir, o qoca professor məni kəsib, hələ vərəqəni təhvil verməyib, gör nə eləyirsən, ay ana! Başına dönüm, qurbanın olum!

Ramiz bu yalvarış sözlərini professora da demişdi, ancaq bir nəticə görməmişdi: "Başına dönüm, qurbanın olum!.." Yenə ümidini kəsmir, anasının əncam çəkəcəyini zənn edirdi.

Ərknaz xanım professor İvanovu qapı ağzında haqladı:

– Yoldaş professor, bir dəqiqə!

İvanov başı ilə ehtiram işarəsi verdi:

– Buyurun, xanım, buyurun!

Ərknaz xanım bir qədər kənara çəkildi. İvanov da yaxına gəlib dayandı.

– Mən sizi eşitməyə hazıram.

Ərknaz xanım İvanovun əlindəki portfelə baxdı:

– Verin mən saxlayım, sizə zəhmət olar!

Bu söz professora təəccüb gəlsə də, mülayim cavab verdi:

– Eybi yoxdur, siz sözünüzü deyin, eşidirəm!

– Bəlkə bu otaqların birində yer tapıb əyləşdiniz. Sizə ayaq üstə zəhmət olar.

Professor yaxındakı otağa tərəf getməyi Ərknaz xanıma işarə etdi. Ərknaz xanıma yer göstərdi, sonra da özü oturdu. Burada söhbətə mane ola bilən bir kəs yox idi. Dib tərəfdə bir qız oturub nəsə siyahı tutur, hərdən telefonla danışırdı. Ərknaz xanım alçaq səs və xahiş ədası ilə İvanova belə müraciət etdi:

– Əvvəla, mən özümü xoşbəxt hesab eləyirəm ki, sizin kimi böyük bir alim ilə tanış oldum. Əlbəttə ki, bunlar bizləri çox başı ucalıqdır...

İvanov onun bu istiqamətdə danışmağına yol verməmək üçün qolundakı saata baxıb dedi:

– Buyurun, mənə aid sözünüzü buyurun, xahiş edirəm, buyurun!

Ərknaz xanım mətləbə keçdi:

– Yoldaş professor İvanov, Sizin tələbəniz Ramizin atası məsul işçidir. Vaxtı yoxdur. Çox mühüm tapşırıqlar ilə məşğuldur. Gələ bilmədi, xahiş etdi ki, sizə çox-çox salam-dua yetirəm...

Professor bu sözlərə də bir cavab tapmaqda çətinlik çəkən kimi susurdu. Saata baxdı, təkrar soruşdu:

– Rica edirəm, buyurun görüm mənə aid qulluq...

Ərknaz xanım davam etdi:

– Oğlum Ramizin sizin dərsdən yaxşı qiymət almamağını eşidib, mən özüm gəlmişəm...

Professor tələbənin qrupunu, sinfini, familiyasını soruşdu, xatırladı:

– Hə! O mənim dərsimdən zəifdir.

– Atası məsul işçidir...

– Məsul, ya qeyri-məsul, xanım, bizə tələbə lazımdır, oxuyan tələbə!

– Orası düzdür, yoldaş professor, indi bu uşağın işinə bir əncam çəkmək lazımdır.

Professor başı ilə təsdiq etdi:

– Əlbəttə ki, əlbəttə ki, lazımdır, bu vəziyyətdə qoymaq olmaz. Əlbəttə ki, əncam çəkmək vacibdir!

Ərknaz xanımın gözləri parıldadı, ürəyi yerinə gəldi: “Düzələcək”.

– Çox sağ olun, çox var olun, bir təhər düzəldin!

İvanov bir qədər fikirli kimi başını aşağı saldı. Çeşməyini çıxartdı, təzədən gözünə taxdı:

– Məncə, Ramizin işini orada, yaşadığınız şəhərdə daha tez və yaxşı düzəldə bilərsiniz.

Ərknaz xanımın sifəti ciddiləşdi, gözləri böyüdü:

– Necə?

– Necəsi budur ki, onuncu sinfə qaytarmaq, müəllimlərdən xahiş etmək olar ki, ciddi tələbkarlıqla oxutsunlar, proqramı kamil öyrətsinlər. Özünüzün də gözünüz üstündə olar. Kontrol lazımdır hər gün, hər saat...

Elə bil Ərknaz xanımın qabarıq sinəsindən iti bir ox vurdular. Ürəyində professora qarğış tökdü: "Ay səni görüm "onuncu sinif" deyən dilin qurusun!"

İçini çəkdi, rəngi dəyişdi, oturduğu yerdən dik qalxdı, hirslə, bir az da ucadan dedi:

– Bəs geriyə qayıtmaq, ay professor, tələbənin, belə igid bir oğlanın qeyrətinə toxunmazmı! İnsaf harda qaldı?

Professor İvanov çiyinlərini çəkdi, bir söz demədi. Qeyrət məsələsindən demək istəyirdi, ancaq demədi. Qarşısındakı qadın olduğu üçün, ana olduğu üçün demədi, o demək istəyirdi ki: "Qeyrəti olan tələbəyə əlbəttə ki, toxunar. Amma qeyrəti olan tələbə heç bu hala düşməz! Burası da var axı, qızım!.."

Bu dəqiqə İbiş mənzildə süfrə tədarük edir, təzə gəlmiş plov qazanını ocaq üstünə qoyurdu.

*1955*

## ELÇİLƏR QAYITDI

*Qız ağacı, qoz ağacı,*
*Hər yetən bir daş atar.*

***Atalar sözü***

1

Bu məsəl Şərəbanı xalanın dilindən düşməzdi; çünki halına yaxın, münasib idi. Güman etməyin ki, Şərəbanı xala öz cavanlığını, nişanlanmaq, ya ərə getmək günlərini xatırladırdı. Yox! Söhbət onun yeganə nəvəsi məktəbli qız Nəcibədən gedir.

Bəli, indi bu saat Nəcibənin elə vaxtıdır ki, yer yerişinə, dağ duruşuna həsrət, minnət çəkir.

Səhər saat səkkizdə məktəb paltarı əynində, ağ lent hörüklərində, qəhvəyi portfel əlində, "salam!" – deyib sinif qapısından girəndə, kim bilir neçə-neçələri onun tamaşasına durur. Qız da, oğlan da onun yaryaraşığına küsənir. Bəziləri onun səliqəli geyinməyi bacardığı üçün qəşəng göründüyünü, bəziləri də əslində Nəcibənin gözəl olduğunu iddia edirdilər. Gözəl qız al da geysə yaraşır, şal da geysə yaraşır!

Nəcibə isə həmişə sadə geyinməyə, adi görünməyə, diqqətlərdən uzaq olmağa çalışırdı.

Nəcibənin nənəsi Şərəbanı xala müəllim institutunda xadimə idi. Övlad adından onun bir oğlu, bir də qız nəvəsi var idi. Oğlu iyirmi-iyirmi beş il idi ki, kənddə evlənmiş, külfət sahibi olmuşdu, qoyunçuluq fermasında çalışırdı. Anası ilə ildə bir dəfə görüşür, ya görüşmürdü. Qız nəvəsi isə Şərəbanı xalanın yanında idi; çünki onun anası ölənəcən Şərəbanı xaladan ayrılmadı. Bir yaşadılar, bir oldular. Əri onu atıb gedəndən sonra qızı sarılıq azarı tutdu. Altı ay xəstəxanada yatdı, rəhmətə getdi; doqquz yaşlı Nəcibə isə Şərəbanı xalanın himayəsində böyüdü:

"Bir yandan bağlayan fələk, o biri yandan açar!" – deyiblər. Həyətdə-bacada "yetim!" çağırılan, anasından qalma köhnələri geyən, kasıblıq, ehtiyac ilə böyüyəndən sonra məktəb pansionunda yeyib-içən Nəcibənin işi lap əntiqə oldu. Bu qız, deyəsən, adi qayda ilə, başqaları kimi böyümürdü. Deyəsən, ona hayandansa hansı bir qüvvə isə, başqa uşaqların acığına xüsusi pərvəriş verirdi. Qız gündən-günə tənək zoğu kimi boy atır, pardaqlanır, qızılgül kimi gülüb açılırdı. Camaat bir də gözünü açıb gördü ki, Şərəbanı xalanın "yetim nəvəsi" şəhərin handa bir barmaq ilə göstərilən görkəmli qızlarından olub. Məktəbə gedəndə, məktəbdən gələndə, nümayişdə, konsertdə görünəndə görürsən tamaşa kimi bir şey əmələ gəlirdi. Adamlar ona ha baxır, bir-birindən ha soruşurdular:

– Nə qiyamətdi, ə!

– Bu ceyran balası hardan azıb?

– Adı nədir?

– Görəsən hansı bəxtəvərə meyl salacaq!

Nəcibə bizim məhəllədə gözə dəyən qızlardan biridir. Hələ ərə getməyib. Bilinmir niyə getməyib, ya niyə getmir. Amma adam yoxdur onun sözünü danışmasın. Biri deyir istəyən çoxdur, ona görə getmir; yəni bilmir hansına getsin. Gün olmaz ki, qızın özünə, ya nənəsinə deyən olmasın ki: "Daha vaxtdır, bir halal süd əmmiş ilə tapışın a, Allah xeyir versin, sövdalaşın a!"

Nə Şərəbanı xala, nə də Nəcibə istər ki, başqaları onların işinə qarışsın. Amma di gəl ki, yetən-ötən qarışır. Deyəsən, adamlarda da günah yoxdur, çünki dünyada elə mətləblər var ki, özü-özünü qabağa verir, hamını danışmağa məcbur eləyir.

Nəcibənin də məsələsi elə məsələ olub. Oxumuş, yetişmiş, ağıllı-başlı bir zəmanə qızıdır. Qonşuda, məktəbdə, işdə də oğlanlar var. Lap münasib oğlanlar da var. Amma görürsən Nəcibə ərə getmir. İndi onun iyirmi üç yaşı var, amma ərə getmir. Deyim istəyən yoxdur, xeyr. Ay olmaz ki, Şərəbanı xalanın qoşa qapısını taqqıldadan olmasın. Ha güman eləyirsən ki, bəli, daha bu dəfə deyəsən xeyir iş baş tutur, toy yaxınlaşır. Görürsən külək əsdi, hava soyudu, nə o yandan, nə bu yandan səs-səda çıxdı.

Xülasə, bizim məhəllədə ən çox söz-söhbəti olan Nəcibədir. Şərəbanı xaladır.

Nəcibə də bir ayrı cür Nəcibədir. Alagöz, ağbəniz, qırmızıyanaq, qara şəvə saç, ucaboy, şəkilli-şəmayilli, ceyran kimi bir qızdır. Bir görən deyir bir də görüm. Onunla kəlmə verib kəlmə almaq özü bir səadətdir.

Neçə dəfə böyük fotoqraflar gəlib ki, qızın şəklini kinoya çəksinlər. Şərəbanı xala hamısını söyüb qovalayıb: “Mənim qızım tamaşaqabaqdı bəyəm teatrlarda aləmə görsədəsiniz? Bir də buralara dolanmayın, bizə pul-zad lazım deyil, özünüzə qalsın!”

Nəcibə onilliyi qurtarandan sonra ali məktəb sevdasına düşdü: tibb institutuna ərizə verdi, imtahana getdi. Ancaq tələb olunan dərs qiyməti yığa bilmədiyi üçün daxil ola bilmədi.

Şərəbanı xala hərçənd aşkar demirdi, ancaq əslində qızın instituta düşməyinə heç razı deyildi. Ona görə razı deyildi ki, Nəcibə daha uşaq deyil ki, məktəb paltarı ilə kifayətlənə idi. Ali məktəbdə onu əməlli-başlı geyindirmək, yar-yoldaş içində başı aşağı olmasına yol verməmək üçün vəsait lazım idi. Bir dənə abırlı palto-filan qədər pul tutur. Xadiməlik maaşı, ya tələbə təqaüdü ilə öhdəsindən gəlmək çətin olur. İkinci tərəfdən də Şərəbanı xala bilirdi ki, qız məktəbi qurtaran kimi rayonlara, lap uzaq yerlərə göndərəcəklər. Orda da birisilə tapışacaq... Şərəbanı xala oğlundan ayrı düşdüyü kimi, Nəcibədən də əli çıxacaq, qoca qarı vaxtında tək-tənha qalacaqdır.

Qonşuluqda Şərif adlı bir xalçaçı usta var idi. Savadlı qızlardan xalça fabrikinə adam yığırdı. Şərəbanı xala Nəcibənin adını çəkəndə, Şərif razılıq verdi:

– Göndər gəlsin, saat on ikidə idarədə olacağam!

Nəcibənin xalça toxuyan olmağını Şərəbanı xala yalnız maaşına görə istəmirdi. O bilirdi ki, bu sənət təmiz sənətdir. Böyüklər, oxu-

muşlar yanında hörmətli sənətdir. Bir də ki, qız uşağının əldən qabil olmağı lazımdır. Sabah nişanlısının köynəyinə bir naxış vurmağı dünyalara dəyər!

Nəcibə beş ayın içində xalça fabrikində sənət öyrəndi, ayda altı-yeddi yüz manat da evə pul gətirməyə başladı. Nənə-bala mehriban və sakit yaşamaqda idilər. Elçilər də öz qaydası ilə gedib-gəlməkdə idilər. Xalça fabrikinin böyük və yeni binasının elektrikləşməsinə rəhbərlik edən Nazim adlı bir cavan oğlan Nəcibəni tanıyandan sonra dalınca elçi salmışdı. Qız yoldaşları oğlanı Nəcibəyə təriflədikləri kimi, qızı da oğlana tərifləyirdilər. Yəni Nəcibənin tərifə ehtiyacı yox idi. Bunu Nazim yaxşı bilirdi. Hansı idarədənsə fabrikə ceyran şəkilli bir divar xalçası toxumaq sifarişi verilmişdi. Bu xalçanı Nəcibə toxuyurdu. Özü də çox diqqətlə toxuyurdu. Nazim bu işin tamaşasına dayanıb xeyli baxdı:

– Çox zəhmətli işdir, – dedi.

Nəcibə şəklə işarə edib, cavab verdi:

– Çalışıram gözəl çıxsın!

– Gözəl çıxmağını istəyirsənsə, ceyranı at kənara, öz şəklini toxu, qurtarsın getsin!

Nazimin bu sözünə Nəcibə pul kimi qızardı, utandığından cavab vermədi, başını da yuxarı qaldırmadı.

Bu hadisədən üç gün sonra Nazimin elçiləri qoşa qapının dəmir rəzəsini tərpətdilər.

## 2

Şərəbanı xalanın evi şəhərin yuxarı tərəfində, Mirzə Fətəli küçəsində idi. Bu, bir köhnə həyət idi. Darvazası çoxdan laxlamış, əyilmişdi. Həyətə gedən dalan yarımçıq qalmışdı. Küçədən ötənlər həyətin içini görürdülər. Ancaq sonralar qapı təmir olundu. Həyətin ortasına sement töküldü, balaca bir bağça salındı. Burada gül-çiçək əkilir, ağac basdırılırdı. Yaşıllıqdan, gözəllikdən başqa bu bağça həyət uşaqlarına bir məşğuliyyət idi. Hərə orada yeni bir ağac basdırmaq, bəsləmək istəyirdi. Həmin həyətə, Şərəbanı xalanın nəvəsinə çox elçilər gəlmişdi. Şərəbanı xala onların heç birini ümid ilə yola salmamışdı; çünki qızı vermək fikrində deyildi. Əlbəttə ki, açıq-açığına: “Vermirəm” – demirdi. Qızın uşaq olmağını deyir, dərsini qurtarmamış ərə getmək istəmədiyini, ya bir başqasına “dil verdiyini” bəhanə gətirərdi.

Ancaq bugünkü elçilərin işi ayrı cür idi, qarşılanmağı da ayrı cür idi. Qızın işarəsindən sonra Şərəbanı xala idarədən izn alıb, bütün günü evdə qaldı, başını daradı, paltarını dəyişdi, aralığı yığışdırdı, otaqları sahmana saldı, hazırlıq gördü. Qonşulara da xəbər verdi ki: "Adam gələcək!"

Həyətdə səkiləri süpürən, xalça çırpan, toz tökən, samovar sürtən, cuna pərdələrə bağ salan, güldanları sulayan və kağızlayan, qapı zəngini düzəldən, divan üstünə döşəkcə salan, süfrə açan kimi... Həyətin qız-gəlini hamısı Nəcibənin elçilərini qarşılamağa hazırlaşırdı.

Nazim də Nəcibə kimi atasız-anasız böyümüş bir oğlan idi. Ancaq dayısı Mirzərəhman kitab mağazında çalışırdı. Görüb-götürmüş, təcrübəli kişi idi. Bacısı oğlunun xeyir işində çirmənib qabağa düşmüşdü. İki nəfər öz yoldaşlarından çağırmışdı. Nazimin xatirini istəyən İlyas müəllim də Mirzərəhmanın xahişini qəbul etmişdi. Bəli, aprelin axırlarında, mülayim yaz günlərindən birində, gün günorta yerindən ağzı aşağı enəndə, elçilər qoşa qapının rəzəsini tərpətdilər. İçəridən bir qadın səsi gəldi:

– Buyurun, buyurun!

Mirzərəhman: "Bismillah" deyib, həyətə girdi, onun dalınca da yoldaşları daxil oldular. Mirzərəhman hələ evdən çıxmamış elçilik qaydalarından söhbət salıb məsləhətləşmişdi. O istəyirdi ki, məclisdə söhbəti İlyas müəllim açsın. İlyas müəllim boynuna almadı.

– Bu şəhər qayda-qanununu mən yaxşı bilmirəm. Bir də ki, oğlanın atası yerində Mirzərəhmanın danışmağı münasib olar. Elə söhbəti siz başlayın, biz də köməkləşərik, – dedi.

Mirzərəhman elçilik işinin şərəfini də, məsuliyyətini də bilirdi. Zarafat deyil, iki canın birləşməyi, ailə qurmağı, məhəbbətin qələbəsi kimi bir işə bais olmaq bizim zəmanəmizdə hər bir insan üçün xeyir işdir. Burada gərək söz biləsən, fənd biləsən, mərifət, ədəb-ərkan ilə danışmaq biləsən. Gərək elə olsun ki, müqabil tərəfdə oğlana rəğbət, hörmət oyansın...

İlyas müəllim kimi kamil bir adamın bu işi öhdəsinə götürməməyi Mirzərəhmanın əndişəsini daha da artırdı. İndi o, ürəyində fikirləşir, plan tökür, söz öyrənirdi ki, məclisdə qabiliyyətli çıxsın.

Mirzərəhman yol boyu yavaş addımlarla yeriyərək, fikirləşirdi ki, mətləbi necə başlasın: "Söz yox, çatan kimi ev sahibi salam-kalam ilə bizim qabağımıza çıxacaq. Əyləşən kimi qənd-çay da gələcək. Qızın

adamlarından da gəlib stol başında əyləşəcəklər. Bəs sonra? Elə məsələ də buradan başlanacaq, sonra nə deyəsən, necə deyəsən?"

– Necə məsləhət bilirsiniz, istəyirəm elə mətləbdən başlayam. Bu ağır vəzifəni ki, öhdəmə qoyursunuz, istəyirəm çayı içməmiş xahiş eləyəm: qızın hərisini almamış stəkana əl vurmayacağıq. Ev sahibindən iki cavanın birləşib, məqsədinə çatmağını xahiş eləməyə gəlmişik. Necə deyərlər, bu qapıya təmənnaya gəlmişik, hamılıqca!..

İlyas müəllim bunu məsləhət bilmədi:

– Yox – dedi, – Mirzərəhman, münasib düşməz, hər halda bir müqəddimə lazımdır. Kiçik də olsa, lazımdır. O yandan-bu yandan, havaların xoş keçməsindən-zaddan...

Mirzərəhmanın qonşusu Əsəd də müəllimin sözünə qüvvət verdi:

– İlyas müəllim düz deyir. Əvvəl başdan gərək bir söhbət salaq. Güman ki, oğlan barədə, Nazim barədə. Hərçənd tanıyırlar, qız onu tanımamış deyil, amma yenə beş-üç kəlmə söz açmaq pis olmaz. Kimdir, kimin oğludur, nə sənətin sahibidir, səriştəsi nəyədir, filan...

Mirzərəhman şərik oldu:

– Əsəd, onu mən unutmamışam. Nazimə, əlbət ki, necə lazımdır, xasiyyətnamə verəcəyəm. Düşünmüşəm. Amma istəyirəm söhbət açılandan sonra eləyəm, çünki damdandüşdü olmasın.

– Damdandüşdü olmaz. Bilirlər ki, qız almağa gəlmişik və qızı da Nazim Əliyevə istəyirik. Bunu bilirlər, oğlan barədə də çox maraqlanacaqlar.

İlyas müəllim də Əsədin sözünə tərəfdar idi:

– Sual verəcəklər. Mümkündür ki, oğlanın lap tərcümeyi-halını da soruşacaqlar.

– Soruşmağa da ixtiyarları var, çünki xalq qız böyüdüb, özü də tərifli bir qız! Xalq bilmək istəyəcək ki, görək qızı kimə veririk, necə veririk.

Mirzərəhman sözün uzandığını görüb yekunlaşdırdı:

– Qardaş, belə yerdə ehtiyat lazım deyil. Necə sorğu-suala tutsalar, cavabımız var. Şükür ki, oğlumuz qızlarından əskik adam deyil. Mərifətli, əsil-nəsəbi, zəmanəyə görə... Nə soruşsalar, cavabını verərik, müzayiqə yoxdur!

Mirzərəhman doğrudan da qız evində rastlaşacağı sorğu-suala cavab hazırlamışdı. O, yəqin bilirdi ki, əvvəlcə oğlanın ailəsini, əsilnəsibini soruşacaqlar. Qızın nənəsi köhnəpərəst adamdır. Yəqin deyəcək

görüm atası kim imiş, anası hardan imiş. Zatı, südü... Sonra ev-eşiyini, var-dövlət babətindən halını soruşacaq, qohum-əqrəbasından, yerindən, yurdundan xəbər tutmaq istəyəcək. Bunların hamısına cavab vermək gərək...

3

Bəli, elçilər həyət qapısında ehtiram ilə qarşılandılar. "Buyur-buyur!" ilə otaqlara üz qoydular. Şərəbanı xala özü bir-bir stul çəkib, onları əyləşdirdi, xoş gəldin elədi. Qız evinin də yaxın adamlarından bir neçəsi gəlib əyləşdi. Bir dəqiqə çəkməmiş mis məcməyidə təraş stəkanlarda buğlanan rəngli çay verildi, doğranmış kəllə qənd qoyuldu, mürəbbə qabları ortalığa gəldi. Söhbət açıldı. Özü də elə açıldı ki, kimin ilk danışdığını seçmək heç mümkün olmadı. Mirzərəhman bir zaman onu gördü ki, Şərəbanı xala üzünü ona tərəf tutub deyir:

– Allah sizinkiləri də saxlasın, indi bu zəmanədə cavanlar tez böyüyür, tez yetişir, tez də boya-başa çatırlar. Məsələn, mənim özümdən soruşsalar, deyərəm: o bir dənə indi həm oğuldur, həm ərdir, həm qızdır. Məndən soruşsalar, deyərəm: onu dünən beşikdən qaldırmışam. Lap elə bil dünən idi. Handa ki, uşaq, maşallah, kim demiş, sizinkilərdən artıq olmasın, görürsən...

Mirzərəhman qız tərəfin belə fəal tərpəşməsini, qarının lap qabağa düşüb, mətləbdən danışmasını öz acizliyinə dəlalət gətirdi, stulunu bir az qabağa çəkib, yerindən qalxdı, təzədən oturdu, oturanlara göz gəzdirib, sinəsini arıtdı, sözə başladı:

– Şərəbanı xala çox yaxşı deyir ki, indiki cavanlar tez boya-başa çatırlar. Bəli, zəmanənin buna təsiri olmamış deyil. Hökumət uşaqları atadan-anadan da artıq əzizləyib oxudur, öyrədir, böyüdüb adam eləyir. Görürsən dünənki çolpa bu gün bir idarədə oturub iş aparır. Məsələn, bizim Nazim, vaxtında yetim bir uşaq idi, məktəb ona lap ata oldu. İki il deyil ali məktəbi qurtarıb...

Şərəbanı xala qonağın sözünü kəsdi:

– Siz buyurduğunuz oğlan, yəni Nazim ali dərsini qurtarıb?

– Bəli, iki ildir ali dərsi qurtarıb.

– Zaştası necə, varmı?

– Var, səriştəsi var, çoxdan işləyir.

– Yox, onu demirəm.

Mirzərəhman duruxdu:

– Nəyi soruşdunuz, mültəfit olmadım?

Şərəbanı xala da stulunu irəli çəkib, əlini ağzına apardı, ehmalca bir öskürdü və sonra soruşdu:

– Onu soruşdum ki, a qadan alım, oğlanın zaştası necə, varmı?

Mirzərəhmandan səs çıxmadı, yoldaşlarının üzünə baxdı. Şərəbanı xala izah etdi:

– O ki deyirsiniz oxumuşdur, dərsini də qurtarıb, çox əcəb, zaştası necə, varmı? Qurtarıbmı?

Mirzərəhman İlyas müəllimə, İlyas müəllim Əsədə baxdı. Şərəbanı xala suallı nəzəri ilə elçiləri süzdü. Bir an məclisdə intizarlı sükut oldu. İlyas müəllim üzünü Mirzərəhmana tutub dedi:

– Şərəbanı xala soruşur ki, Nazim dissertasiya yazıb, zaşişat eləyibmi? Yəni...

– Bəli, mən onu soruşuram ki, zaşitası varmı oğlanın? Nazimin?

Mirzərəhman belə bir sual gözləmirdi və gözləməzdi də.

– Yoxdur, xeyr, yoxdur! – dedi.

Şərəbanı xala təəccüb elədi:

– Bəs elə oxumuş, ali dərs qurtarmış oğlan nə əcəb zaştasızdır?

Mirzərəhman üzr gətirdi:

– Yəni qabil oğlandı, dalınca düşsə əlbət ki, heç vaxt dissertasiya yazanlardan əskik deyil. Ancaq başı işə qarışıb, tikintidə çox əmək qoyur, vaxtı yoxdur. Elektrik aparatları düzəldir, yoxlayır, elmində, sənətində yaxşı qabildir. Ancaq dissertasiyası hələ ki, yoxdur!

Şərəbanı xala bu cavabdan məmnun qalmadı, dübarə soruşdu:

– Həftəreferatı necə, varmı?

– Xeyr, yoxdur.

– Oğlanın ki, siz deyirsiniz dərsi var, nə əcəb bəs dərsini başa vurmur?

– Başa vurmağına vurub. Diplomu cibindədir. Amma dissertasiya yazmır. Mühəndislik eləyir. Özü də tikintidə elektrik işlərinə baxır. Təzə şəhərdə – Sumqayıtda onu yaxşı tanıyırlar. Yaxşı da hörməti var.

Şərəbanı xala qonaqları məyus eləməmək üçün başı ilə razılıq işarəsi verirdi:

– Olsun, təki olsun. Ev tikən də lazımdır, elektrik işi də vacibdir. Hamısı bunlar xeyir işdir, olsun, niyə də olmasın! Amma bizim institutda

dərs qurtaran zaşta dalınca gedir, zaşta eləyən çox olur. Mən görürəm, çox da sevinirəm ki, bizim cavanların çoxu indi olub zaşta sahibi...

Şərəbanı xalanın bu qədər dissertasiya sevdasına düşməyi təəccüblü görünməsin. O, müəllim institutundakı klubun hər səliqəsinə, təmizliyinə, qapı-pəncərəsinə, şüşələrinə, kürsülərinə, stol üstünün örtüyünə, qrafininə, su stəkanınacan hamısına nəzarət edir. Şərəbanı xala həm səliqəli, həm də vəzifəsinə diqqətli olduğu üçün vaxt-bivaxt bu klubdan uzağa getmir. Klubda isə maraqlı, tamaşalı işlər çox olur. Kino tamaşasından, iclasdan, mühazirədən, konsertdən başqa burada çoxlu "zaşta" olur. Bu "tamaşa" Şərəbanı xalanın çox xoşuna gəlir. Görürsən bir neçə nəfər keçib oturdu kürsünün dalında. Qoltuğunda qalın kitab olan bir oğlan da çıxdı danışmağa. Oğlan oturandan sonra qoca müəllimlər həmin qalın kitabı varaqlayır, çıxır, başlayır həmin oğlanı tərifləməyə. Biri tərifləyir, beşi tərifləyir... İclasın axırında da həmin oğlanın əlini sıxır, onu təbrik edir. Qızlar da dəstə-dəstə gül gətirib verirlər. Sonra da oğlan adamları yığıb aparır qonaqlığa. Hələ o qəribədir ki, kassirin deməyinə görə, iclasın səhərisi günü danışan oğlanın məvacibi ikiqat artır.

Nə isə, bu çox ürəkaçan tamaşa idi.

Şərəbanı xala bu şadlıq mərasimini çox görmüşdü, ürəyində çox da arzulamışdı. Əlbət ki, özü üçün, yaşı keçmiş oğlu üçün yox, başqa yaxın adamlar üçün arzulamışdı.

Bəlkə Nəcibə üçün arzulamışdı? Yox! Şərəbanı xala Nəcibə kimi utancaq bir qızın bu işə qoşulmağına inanmırdı. Bilirdi ki, onun gücü çatmaz. Amma onun nişanlısı? Onu alan oğlan dissertasiya sahibi olsa, çox yaxşı olardı! Keçmişdə evlənən oğlandan mülk, mal, başlıq istərdilər. İndi heç olmasa bir dissertasiya istəməyə qızın, əlbət ki, haqqı var! Ağlı başında olan qız bunu istəməmiş olmaz; çünki dissertasiya indi çətin bir iş deyil. Görürsən, dalınca düşən düzəldir.

Şərəbanı xalanın sözü bu yerdən başlaması Mirzərəhmanın planlarını alt-üst etmişdi. Onun hazırladığı xasiyyətnamə, demək olar ki, işə keçmədi; çünki oğlanın nə ata-anası, nə zatı-südü ilə, nə qohum-qardaşı ilə maraqlanan var; qız evini, yəni Şərəbanı arvadı bircə şey maraqlandırır: "dissertasiya", o da ki, Nazimdə yox! Bəs bu iş nə sayaq olacaq? Hərifə nə cavab vermək, nə tədbir tökmək?.. Mirzərəhman neylim, necə eləyim hayında idi ki, İlyas müəllimin səsi eşidildi. O, üzünü qızın nənəsinə tutub dedi:

– Şərəbanı xala, düzdür siz dissertasiya barəsində deyirsiniz, Mirzərəhman da utancaqlığa salıb dinmir. Amma Nazimi elə aciz bilməyin. Onun da başqa cavanlar kimi dissertasiyası var!

Mirzərəhman İlyas müəllimi başa düşmədi, sözün ardını gözlədi. Şərəbanı xala isə bu sözdən sevinmiş kimi cəld sual verdi:

– Varıdırmı?

– Bəli, onun da varıdır. Onun dissertasiyası heç başqalarınkından əskik deyil!

– Zaştası da var?

– Yox, müdafiəsi bu yaxınlarda olacaqdır. Mənim özüm də, hərçənd elektrikdən başım çıxmaz, amma iştirak edəcəyəm!

– Olacaqmı?

– Bəli, lap bu yaxınlarda olacaq.

– Təki olsun, təki olsun, çünki zaşta hər barədən yaxşı işdir!..

4

Şərəbanı xala elçilərə qəti cavab verməsə də, rədd cavabı da vermədi:

– Sağlıq olsun, Nazim zaştasını qurtarar, nə deyirəm. Bir qız bir oğlanındır. O məqamda biz tərəfdən bir maneçilik olmaz. Qızın özünün də ağzını araşdırarıq, nə eybi var, sağlıq olsun, bir qız bir oğlanındır...

Elçilər durmağa məcbur oldular. Məsələ açıq qalsa da, durdular.

Qapıdan çıxanda, Mirzərəhman İlyas müəllimi danladı:

– Ay pəhmətlik oğlu, işin içində olan mən, sən hardan götürüb deyirsən oğlanın dissertasiyası var? Nazim heç yatsa yuxusuna da dissertasiya gəlməz. Aldatmaq, yalan nə üçün?

İlyas müəllim onu sakit elədi:

– Mirzərəhman, heç narahat olma! Bir həftəyəcən Nazim müdafiə eləsin, sən də tamaşa elə!

– Axı nəyi müdafiə eləyəcək?

– Görərsən nəyi! Sən bu işi mənə həvalə elə!

– A kişi, sən Şərəbanı xala kimi əjdahanı aldadacaqsan?

– Aldatmaq-zad yox! Lap onun gözünün qabağında Nazim müdafiə eləsin, qoy o da tamaşa eləsin!

– Mən başa düşmürəm...

– Başa düşməli bir şey yoxdur. Sən bir günlüyə, bir axşam institutun klubunu bizim üçün, Mühəndis Cəmiyyətinin iclası üçün al!

– O asan şeydir!

– Qalan hər şey mənim boynuma!

İlyas müəllim dediyinin üstündə duran adam idi. Elçilikdən belə qayıtmağın Nazimi məyus edəcəyini, ləngiməyin işi korlaya biləcəyini düşünüb, həmin gecə Nazimi yanına çağırdı.

– Oğlum, – dedi, doğrudur, sənin dissertasiyan yoxdur, amma nə biliyin, nə işin ondan əskikdir. Şərəbanı xala da avam qadındır. "Zaşta" – deyib durur. Onu da yaxşı bilirsən ki, nə üçün deyir. İxtiraçılar bürosuna verdiyin o layihələrin ikisini də mən oxumuşam. Hər biri bir dissertasiyadan artıqdır. Büronun qərarı var ki, onlar şuranın yaxın iclasında müzakirəyə qoyulsun. Sən hazırlaş, çertyojları da sahmana sal, gətir!

Nazim iki il idi trestdə elektrik mühəndisi idi. Əmək prosesini mexanikləşdirmək yolunda gördüyü tədbirlərə görə iki dəfə mükafat almışdı. İndi isə kərpickəsən maşının məhsuldarlıq sürətini artırmaq, suvaq işini elektrik aparatı ilə keçirmək üçün yeni layihələr təqdim etmişdi. Bu layihələrin hər ikisinin təsdiqi və tətbiqi tikinti işini sürətləndirməkdən başqa ayda yüz manat qənaət verirdi.

Nazimin layihələrini doğrudan da İlyas müəllim deyən yerdə, dissertasiyalar müdafiə olunan zalda, müəllimlər institutunun zalında müzakirə etdilər. Yenə böyük müəllimlər keçib stol dalında oturdu. Nazim çıxıb fikirlərini dedi, kərpickəsən maşının modelini, cədvəlini də gətirib göstərdi.

Kürsüyə çıxıb danışan mühəndislərin, professorların hamısı bu təklifin çox ağıllı, faydalı olduğunu dedilər və müəllifi təbrik etdilər. Tikinti trestinin rəisi, Nazimin üç min manat pul ilə mükafatlanmağı haqqında əmr oxudu. Adamlar bir-bir əlini sıxıb təbrik edəndə, Nazim bərk, isti və balaca bir əlin əlinə toxunduğunu hiss etdi. Diqqətlə baxanda, balaca boylu Şərəbanı xalanı gördü. Qadın onun əlini bərk-bərk sıxdı, lakin əl çəkmədi. Üzünə baxa-baxa dedi:

– Oğul, bəri dön, üzündən öpüm! Halal olsun sənə, oğul, Nazim! Halal olsun sizə!

Kənardan baxanlar güman edirdi ki, xadimə qadın "Halal olsun" – deyə Nazimin mükafatına işarə edir. Əslində isə Şərəbanı xala Nazimə mənalı baxır, xəyalında Nəcibəni tutur, ürəkdən deyirdi:

– Halal olsun!

Buna görə də əvvəl “sənə” dedi, sonra Nazimi qucaqlayıb öpəndə, hər iki cavanı, onların xoşbəxt həyatını nəzərinə gətirib:

– Halal olsun sizə! – dedi.

Bunu lap ürəkdən dedi.

Mirzərəhman da, İlyas müəllim də, Əsəd də bu mənzərəyə baxıb gülüşdülər. Nazim utandığından tez aradan çıxdı.

*1956*

# NAZİK MƏTLƏB

1

– Niyə gəlmisən?

– Nə gəzirsən burada?

– Sənə kim icazə verib?

Maarif müdiri məni görəndə təəccüb elədi. Bir ay olmaz ki, özü təyinnamə verib Yarpızlı kəndinə göndərmişdi. Çox böyük ümid və etimad ilə göndərmişdi. Müdirin də, başqa təşkilatların da bizə ümid bəsləməyə əsası, həm də möhkəm əsası var idi, çünki biz, bu il pedaqoji təhsili bitirən cavanlar odlu həvəs və uca bir ideal ilə kəndlərə gedirdik.

Buraxılış gecəsində hökumətin kənd müəllimlərinə təbrik müraciətini oxudular. Respublika maarif komissarı bizə öz övladı kimi üz tutur, ata nəsihəti verirdi:

– Cavan müəllimlərimiz, – deyirdi, – cəhalət və savadsızlıq ilə mübarizə cəbhəsinə gedirlər. Onlar uzaq kəndlərimizdə maarif işığı yandırmağa, şura hökumətinin gətirdiyi yeni həyatı camaata başa salmağa gedirlər. Gərək unutmasınlar ki, zəhmətkeş kəndlinin hörmətini qazanmaq birinci vəzifədir. Kəndli sizə inanmasa, nə sözünüzə məna verər, nə də ixtiyarınıza uşaq verər. Gərək onun qəlbinə girəsiniz, özünüzü sevdirəsiniz. O da nə ilə olar? Xoş rəftar ilə. Kəndlinin uşağına öz uşağın kimi bax! Təmiz, mərifətli, dərrakəli, təvazökar dolan! Müəllim kəndlinin əli qələmli dostudur. Kəndli ona həm uşaq tapşıracaq, həm məsləhət eləyəcək, həm də çoxlarına demədiyi dərdini

deyəcək. Ən xırda, ehtiyatsız bir hərəkət onu kəndlinin gözündən elə sala bilər ki, gənc müəllim baş götürüb qaçmağa məcbur olar. Kəndə gedənlərimizin birinci vəzifəsi hörmət, etibar qazanmaqdır. Sizin maarif xadimi kimi nüfuz qazanmanız hampanı, mollanı, falçını tamam nüfuzdan salacaq, kəndlinin gözünü açacaq. Bu da maarifin vacib işidir. Sizə bu yolda uğurlar olsun! Gedin, balalarım!

Komissarın sözləri bizə elə təsir etmişdi ki, gecəni də rahat yatmır, həyəcan keçirirdik. İstəyirdik səhər tez açılsın, qatara oturub təyinat yerimizə gedək, böyüklərimizin ümidinə layiq iş görək.

Təkcə biz yox, maarif şöbəsinin işçiləri də həyəcan keçirirdilər. Biz yürüşə gedən əsgər idiksə, onlar cəbhəyə qoşun aparan zabit vəzifəsində idilər. İdarə xalis bir sərbəstlik ştabı idi. Gecə də çıraqlar yanır, telefonlar səslənir, maşınkada əmrlər, müraciətlər, məktublar, proqramlar çap olunurdu. Tərəddüd kəsilmirdi...

Belə həyəcan ilə getmiş, həm də uzaq kəndə getmiş bir gənc müəllimin bu tezliklə qəfildən qayıdıb gəlməsi əlbət ki, təəccüblü idi. Maarif müdiri məni idarəsində görən kimi sorğu-suala basdı:

– Niyə gəlmisən? Nə gəzirsən burada? Kim icazə verib?

O zaman belə hadisələr olmurdu. Daha doğrusu çox nadir olurdu. O da mənim başıma gəlmişdi.

Maarif müdirinin təhdidli və təkidli suallarına necə, nə cavab verdiyimi deməzdən qabaq istəyirəm söhbətimizin əvvəlinə, kəndə getdiyim günlərə qayıdam.

Mənim təyin olunduğum Yarpızlı kəndi təbiətin ən gözəl guşəsi idi. İki təpə arasında yerləşmişdi. Ortadan, dərin dərədən göz yaşı kimi duru, buz kimi soyuq çay axırdı. Bəri yamacda dərə başı yuxarı sıralanmış kənd evləri uzanıb gedirdi, o biri yamacda da qarağac, palıd meşəsi. Bəri yamac açıq. O biri yamac uca və qoca ağaclarla örtülü idi. Bəri yamac güney, o birisi quzey idi... Dərədən qalxaraq meşəyə girən, cığıra bənzər oğrun yollar sıx ağaclar içində itib gedirdi. O yollara ancaq yerlilər bələd idi. Kənar, nabələd adam getməyə ehtiyat edərdi.

Kəndlilər müəllimi çox mehriban qarşılayırdılar. Yetirən kimi bizə mənzil düzəltdilər. Dəstə-dəstə görüşümüzə gəlib, xoş gəldin elədilər.

Min bir arzu, min bir həvəslə mən kənd məktəbinin səkkizinci sinfində hesab dərsi deməyə başladım.

Nə olaydı, insanın ilk əmək günlərinin eşqi, həvəsi həmişə qalaydı! Yorulmaq, usanmaq bilmədən gecəni gündüzə qatıb, dərs dediyim

günlərin hərarəti heç bir zaman damağımdan getməz. Sinif jurnalını qoltuğuma vurub, məğrur addımlarla dərs otağına girəndə, 40-45 uşağın gurultu ilə ayağa qalxdığını, gülər üzlə öz müəllimlərini süzdüyünü görəndə, bir işarə ilə hamının quzu kimi sükuta dalıb əyləşdiyini görəndə mən özümü dünyanın ən bəxtiyar adamı sayırdım.

O biri tərəfdən də, etiraf edim ki, dizlərim əsir, ürəyim qəfəs quşu kimi çırpınırdı. Qarşımda əyləşən uşaqların hərəsi bir evdən gəlib, hərəsi bir kişinin övladıdır. Hərəsi mənə bir nəzər ilə baxır, hərəsində bir fikir oyanır. Mümkündür ki, bunlar axşam evlərinə qayıdanda mənim söhbətimi salacaqlar. Valideynlərinin "təzə müəllim" haqqında sorğularına kim bilir nə cavablar deyəcək, nə xasiyyətnamə verəcəklər?

"Ən xırda, ehtiyatsız bir hərəkət onu kəndlinin gözündən elə sala bilər ki, gənc müəllim baş götürüb qaçmağa məcbur olar..."

Bu böyük sözlər mənim qulağımda daha qüvvətlə yenidən səslənirdi. Ona görə yerişimə də diqqət edir, sinifdə uşaqlar qarşısında gülməyə də ehtiyat edirdim. Bütün günü və gecəni şəhərdən gətirdiyim məsələ və misal kitablarını qabağıma töküb varaqlayır, dərs hazırlayırdım. Çalışırdım ki, dediyim dərs təzə, həm də nöqtəsinəcən uşaqlara aydın olsun.

O zaman müəllim az idi. Seminariya bitirmiş müəllimi təcrübəli müəllimlərdən üstün tuturdular. O vaxt elə idi, bilmirəm niyə elə idi, amma elə idi.

İlk dəfə sinfə girməyin, gurultu ilə ayağa qalxan məktəblilərə salam verməyin nə demək olduğunu ancaq müəllimlər bilərlər. Kim desə ki, o günkü sevincin həddi-hüdudu var, yalan deyir.

Özü də sinif nə sinif! Cərgələnmiş sıralarda bostan şamaması kimi sağlam, əlvan, bir-birindən ədəbli, sakit, yaraşıqlı uşaqlar əyləşib, təzə müəllimlərinin nə deyəcəyini, necə deyəcəyini aramsız gözləyirlər. Mən bu uşaqlara cəbr, həndəsə dərsi, riyazi düsturlar öyrədəcəyəm. Qocaman müəllimlərdən, qalın-qalın kitablardan öyrəndiklərimin hamısını nöqtəbənöqtə, lap elə indi, birinci dərsdə uşaqlara demək, öyrətmək istəyirəm. Taxtada yazdığım düsturları həll edərək, nəticəsini söylədikcə intizarla əyləşən uşaqların simasında maraq işığını görməyə tələsirdim. Bir diqqət, bir sevinc, bir təbəssüm hiss etdikcə, böyük hünər göstərmiş kimi qürur ilə sinifdə var-gəl edir, rəqəmlərin, kəmiyyətlərin sirlərini, "neylərik" cavabını şirin-şirin danışmaq istəyirdim.

Qabaq sıralarda ucaboy, ağbəniz, uzunsaç, qaragöz bir qız əyləşmişdi. Zivər, sanki bu 40 uşağın içində Kəhkəşanda parlaq bir ulduz kimi seçilirdi. Mən onun adını jurnalda oxuyanda xüsusi bir həzz alırdım. Mənə elə gəlirdi ki, bu qıza ən münasib ad qoymuşlar.

Bir gün, iki gün, üç gün...

Yox, mən bu ucaboy qızı başqaları kimi görə bilmirəm, başqalarına baxdığım kimi baxa bilmirəm. Zivərin hər sözü, hər hərəkəti mənə ideal görünür. O, suala cavab vermək üçün ayağa qalxıb iki kəlmə danışanda yanaqları pul kimi qızarır, qız təhərdən-təhərə düşür, bir günah işləmiş kimi özünü itirir, taxtada yazdığı düsturları dürüst və cəld həll etsə, nəticəni gözəl danışsa da, başını qaldırıb üzümə dik baxmır, xəcalətli kimi yerə baxa-baxa keçib sırada əyləşirdi. Zivərin ağ, enli üzü, cazibəli olması, badam gözləri nəinki dərsdə, evdə, istirahətdə, yamacda, təbiət seyrinə daldığım vaxtda da məni tərk etmir, sanki izləyirdi. Aşkar görürdüm ki, bu qızın adı gələndə mənim halım dəyişir. Zivər ürkək ceyran kimi başını çevirərək, o yan-bu yana baxdıqca xurmayı, qalın hörükləri kürəyində, ağ ipək köynəyinin üstündə yol axtaran əfi ilan kimi qıvrılırdı. Bu isə qıza xüsusi məlahət verirdi. Dərsdə nəzərlərimiz rastlaşanda bilmirdim nə hala düşürəm. Şimşək çaxmış, ildırım vurmuş kimi, sinif başıma dolanırdı.

Tənəffüsdə, müəllimlər zarafatlaşdığı yerdə mənim gözlərim eyvandan yığışmırdı.

Az qalırdım bu beyti oxuyam:

Səndən ayrı yüz qəmü dərdü məlamətdir mənə.
Nə xoşam, nə naxoşam, bilməm nə halətdir mənə!

Hansı bir hiss isə mənə deyirdi ki, Zivərin halı səninkindən qalan deyil.

Biz rastlaşanda hər ikimiz rəng verib rəng alırdıq. O baxanda mən, mən baxanda o, gözünü yayındırırdı. Lap bu dəqiqələrdə müəllimlərimizin böyük sözü qulaqlarımda daha ucadan səslənirdi: "Ən xırda, ehtiyatsız bir hərəkət onu kəndlinin gözündən elə sala bilər ki, gənc müəllim baş götürüb qaçmağa məcbur olar!.."

Mən indi çətin bir işə düşmüşdüm. Od ilə su arasında, vəzifə ilə arzu, şüur ilə hiss arasında mat-məəttəl qalmışdım. Güman edirdim ki, bəzi uşaqlar da bizim münasibətimizdəki qeyri-adiliyi duymuşlar. Gah

mənə və gah Zivərə baxan bir uşağın yanındakına nəsə pıçıldadığını bir dəfə aşkar gördüm.

Mənim üçün bundan ağır töhmət, məzəmmət ola bizməzdi. "Rüsvay oldum, ilahi!" Müəllimin öz tələbəsilə bu rəftarını eşitsələr, aləm yığılıb mənim üzümə tüpürməzmi?.. Xeyr, mən burada işləyə bilmərəm. Oxum daşa dəydi. Mən getməliyəm!

Deyə bilərəm ki, ömrümün ən xəcalətli dəqiqələrini yaşayırdım. Qəlbim od ilə, köz ilə dolmuşdu ki, bu saat vücudumun yanıb külə dönəcəyini zənn edirdim. Başımdan tüstülər, dumanlar qalxırdı. Xəyalımda bir adı ən böyük hərflərlə yazır, pozur, təkrar yazırdım. Bildiyim əlifbaların hamısı ilə, ən zərif, ən əlvan xətlərlə yazır, sonra da bir kəs bilməsin deyə, amansızlıqla pozurdum. Yanımda nə anam, nə bacım, nə bir ürək sirdaşım! Dərdimi bir kəsə deməyə cürət etmir, dərsdən sonra havalı kimi dinməz-söyləməz kənd küçələrində hərlənirdim. Görən də yəqin ki, rişxənd ilə baxıb deyirdi: "Riyaziyyatçı!"

Kaş mən Yarpızlıya üz döndərməyə idim, səkkizinci sinfə ayaq basmaya idim!..

– Yox, mən getməliyəm!.

Təcili iş üçün müdirdən izin aldığım tutqun bir payız səhərində Kaqorun məxməri faytonuna oturub, yeknəsəq zınqırov səslərinin ahəngilə dağları tərk edirdim. Əzizindən, vətənindən ayrılmağa məcbur edilənlərin əhval-ruhiyyəsilə kor-peşman şəhərə qayıdırdım. Bulud kimi tutulmuş, qış günü kimi qaralmışdım. Deyəsən kürəyimdən, ürəyimdən iti xəncər vurmuşdular. İsti yaramı bağlamağa, sağalmağa, bəlkə də daha belə yaralar almağa gedirdim.

Nə olur olsun mən vəzifəmin ləyaqətini saxlamaq üçün qəlbimin səsini boğmalı, Zivəri unutmağa çalışmalıyam.

Bu, əlbəttə çətin idi. Ancaq müqəddəs müəllimlik vəzifəsinə yenicə qədəm qoyan bir cavan üçün zəruri idi. Gedirdim, ancaq gözlərimi arxamda qoyub gedirdim. Qəlbimi, arzumu, hissimi, gələcəyimi, bəlkə də bütün varlığımı dağlarda qoyub gedirdim. Arxadan qarlı təpələrin, qara meşələrin, qıvrım yolların dalında bulaq sularının mülayim şırıltıları arasından məni həzin bir çağırış, bir nida səsləyirdi. Bu, həya və ismətindən pul kimi qızaran gözəl bir mələyin məyus gileyi, şikayəti idi. Mən bu səsi hər dəqiqə eşidirdim. Zehnimdə iki hiss çarpışırdı. Biri deyirdi: qayıt, toxta, işlə, məhəbbətinə çarə, yol axtar. Biri də deyirdi: yox, özünü də, Zivəri də rüsvay etmə, adını, müəllimlərinin nəsihətini uca tut!

* * *

Şəhərə qayıdandan sonra maarif müdiri məni uşaq kimi qabağına qoyub danladı.

– Niyə gəlmisən?

– Nə gəzirsən burada?

– Sənə kim icazə verib, kim?

Müdir hiddət və heyrətlə üzümə baxır, qayıtmağımın səbəbini təkidlə soruşur, cavab gözləmədən hökmünü verirdi:

Bəzi cavanlar görəsən niyə bir yerdə bənd almırlar? Bunlar nə istəyir, nə axtarırlar? Təyinat dəyişməkdən yorulduq. Bilmirəm nə sayaq eləyək!..

– Mən kənddən qaçmıram, daha uzaq yerlərə getməyə razıyam!

Əlbət ki, mənim dilim qısa idi. Açıq danışmağa, sirrimi deməyə də üzüm yox idi. İndi hara göndərsələr, gedəsi idim. Elə də oldu. Müdirdən təzə vəsiqə alandan sonra bir kömürçünün qatırını kirayə elədim. Qabaq təpə dağlarına üz tutub, arxama baxmadan getdim. O gedən getdim...

Həyatın təbii qanunları sakit axan sel kimi hər bir istəkdən, arzudan, ehtirasdan güclü olur. Fəsillərin dövrünü dayandırmaq mümkün olmadığı kimi, bu qanunların da məcrasını dəyişmək mümkün olmur.

Oddan götürülmüş köz kimi mənim Zivərə olan məhəbbətim zaman-zaman soyudu, söndü, nəhayət, unuduldu. Ömrün sərt ruzgarı bizim hərəmizi bir tərəfə yönəltdi, həyatın mürəkkəb, dolaşıq, çətin yollarında atıb-tutdu, sınaqlara saldı, böyütdü, bərkitdi.

Nə mən onu axtarır, nə o məni soruşurdu. İlk və son görüşümüz həzin bir xatirə olaraq qalırdı.

## 2

İndi bu hadisədən otuz il keçmişdir. Mən indi böyük bir ailənin başçısıyam. Zivər haqqındakı xatirələrim nə qədər əziz, nə qədər şirin olsa da, bunları dilə gətirməzdim, əgər bir münasibət olmasaydı.

Qapının zəngi çalındı. Kiçik oğlum qapını açan kimi qonaqları içəri buraxdı, cəld otağıma qaçdı:

– Ata, qonaq gəlib!

Uşaq evimizə gəlib-gedənləri tanıyırdı. Tanımadığı adamlar gələndə qabaqcadan mənə xəbər verməyi adət etmişdi: “Filan əmi, filan

xala". Yox, "qonaq gəlib" – deyəndə bildim ki, nabələd adam olacaq. Gələnlər iki qadın, iki kişi idi. Dəhlizdə dayanıb, ev sahibindən rüsxət istəyirdilər. Mən onları qarşılayıb əl verdim, xoş gəldin eləyib dedim:

– Buyurun, buyurun içəri!

Qonaqlar əyləşdilər, ətrafa nəzər saldılar. Onlar məni, mən onları seyr etdiyim dəqiqələrdə evdə uzun sürməsi mümkün olmayan soyuq bir sükut hiss olundu. Deməyə bir söz tapmaqda çətinlik çəksəm də, sükutu pozmağı lazım bildim:

– Necəsiniz, əhvalınız necədir, təzə xəbərdən-zaddan nə var, nə yox?

Mən bu ümumi, bəlkə də mətləbsiz, mənasız suallarımla qonaqları dindirmək istəyirdim.

Güləşqabaq qadın cavab verdi:

– Əhvalınız yaxşı olsun!

Qadın sanki mənim sualımı gözləyirmiş. Dərhal səsinin ahəngini dəyişərək, gözlənilmədən mənə sual verdi:

– Müəllim, yəqin ki, bizi tanımadınız?

Bu sözdən sonra mən qonaqlara diqqətlə baxmağa məcbur oldum.

Müəllimlik sənətinin bir gözəlliyi də budur ki, böyüyüb ərsəyə gələn gənclər arasında həmişə, hər yerdə şagirdlərinə rast gəlirsən. Sən unutmuş olsan da, gənclər hafizəli olur, səni unutmurlar.

Mən qonağın üzünə diqqətlə baxanda dumanlı xəyal, ya yuxumu, nəsə bir şey xatirimdə işıq kimi cilvələndi:

– Deyəsən sizi...

– Bəli, siz bizə dərs demisiniz.

"Dərs" sözünü deyəndə qadının səsindən, ahəngindən, otuz il əvvəlki bakir gənclik xatirələrinin nisgilindənmi, nədənsə, hər şey nəzərimdə canlandı:

– Sizin adınız, bağışlayın, Zivər deyilmi, Zivər xanım?

– Bəli, yaxşı tanıdınız, şükür ki, hafizəniz kəsərlidir!

Qadın, adına əlavə etdiyim "xanım" sözünün məhz əlavə olunduğunun mənasını yaxşı başa düşdü.

Doğrudur, mən qonağın adını soruşdum, zənnim də düz çıxdı, amma nədənsə, ürəyim döyünməyə, yenə də otuz il əvvəlki kimi halım dəyişməyə başladı:

– Mən şagirdlərimi, sinfimdə bir dəfə oturub dərsimi dinləyənləri adı ilə olmasa da, simasından fövrən tanıyıram. Hələ ki, tanıya bilirəm...

Bəli, bu həmin gözəl qız səkkizincidə oxuyan ucaboy, ağbəniz, uzunsaç, qaragöz qızın özü idi. Bu həmin Zivər idi. Üçdə bir əsrlik zamanın uzun və tozlu yollarından keçib gəlmiş Zivər idi. Zivər indi ahıllaşmış ana, kübar, abırlı bir qadın idi. Daha o xurmayı hörüklər yox idi. Kəsilmiş xınalı saçlarını yana ayırmış, başına tirmə şal salmış, ağır, təmkinli, nurani bir görkəm almışdı. Rəngi qaralmış, sifəti kiçilmişdi. Zamanın qələmi oraya çox yazıb-pozmuşdu. Gərdəni nazilmiş, qabağa doğru bir qədər əyilmişdi. İşığını saxlamış, mənası bəlkə bir az da dərinləşmiş qara gözlər həmin gözlər idi. Baxışı və xüsusən ani təbəssümü həmin idi.

Mən, məsum simasında ilk məhəbbətin qığılcımlarını gördüyüm bu adam ilə görüşdən çox məmnun idim. Onu dinlədikcə güman edirdim ki, otuz il əvvəlki maarif müdirinin məzəmmətini təkrar-təkrar eşidirəm. Bunların, bu sözlərin indi mənim üçün məzmunu dəyişmişdi. Töhmət yox, şirin xatirə kimi mənə ləzzət verirdi.

Zivər xanım bizim evə elçi gəlmişdi. Yoldaşlarının müxtəsər dediyi xahişdən sonra özü gənclərin gələcəyindən xeyli sevinc, arzukam ilə danışdı, oğlunu mənə təqdim etdi:

– Urfan da Həqiqət ilə bir yerdə oxuyur. Hər ikisi neft mühəndisi olacaq, hər ikisi komsomolda, hər ikisi həmdərs, ürəkləri bir-birini tutub, ulduzları barışıb, tale gözəl gətirib, xoş görüşdürüb. Biz valideynlərin də borcudur ki, xeyir-dua verək. Bu bir təklif üçün cəsarət eləyib, hörmətli müəllimin qapısına gəlmişik. Ümidvarıq ki...

Mən qonaqlardan icazə alıb çıxdım. Həqiqətin anasını çağırdım. Qızın rəyini soruşdum...

...Zivər xanım dik-dik mənim üzümə baxdı. Sanki hamı bunu gözləyirdi. Bütün məclis mənə tərəf döndü.

Zivər xanım daha utancaq kənd qızı deyil, təcrübələrilə tanınmış olan bir kimyaçı idi. Onun xahişini də, tələbini də dinləmək mənə xoş idi.

Mən düşünürdüm ki, həya, ismət, tərbiyə naminə vaxtilə gizli qalan məhəbbətdən sonra bir cüt gözəl fidan göyərmişdir. Bunların təmiz, təbii istək, məhəbbətlərinə müqabil nə demək olar?!

– Xoşbəxt olsunlar!

Hamı ucadan bu sözü təkrar etdi:

– Çox mübarək!

*1958*

# İNSANLIQ FƏLSƏFƏSİ

## 1

Bəzi adamın adı heç özünə yaraşmır. Amma bu qızın adını, deyəsən sonradan qəddinə, qamətinə, məlahətinə baxıb qoyublar. Ağca! Qubanın ağ alması!

Heç tanımayan, bilməyən bir adam da rast gəlsə, yəqin ki, özgə ad deməz, bunu deyər: Ağca!

Ağca yaraşıqlı bir qız idi, tamaşasından doymazdın. Həmişə dik və düz baxan iri, ala gözləri, ağ sifəti dairələyən qara tellər, qulac saçlar, şumal, göyərçini gərdən, sakit yeriş.

Başının ipək yaylığı ağ, döşünün sancağı, donunun düyməsi, çəkməsinin qotazı da ağ; sadəcə ağ yox, bir növ bahalı, may şənliklərini andıran təravətli ağ! Çoxları qızı məktəb həyətində, nümayiş sırasında, tarla düşərgələrində, küçə-bacada görəndə, baxa-baxa qalırdı. Ağcanın ən acığı gələn də bu idi.

– Niyə baxırsan, xala, buynuz-zad çıxartmamışam ki!

– Qızım, sənə baxmıram, yaradanın qüdrətinə heyranam!

– Bəsdi sən allah!

– Allah yaman gözdən saxlasın!

Bəlkə də buna görə, dilə-dişə düşməkdən ehtiyat elədiyi üçün Ağca Baxışın ilk işarəsini rədd etmədi, ona könül verdi.

Oktyabr bayramında inşaatçılar klubundakı görüşdən, məktəb məzunlarının ikinci buraxılışı axşamından sonra Baxış buraya trest rəisi ilə gəlmişdi ki, məktəb qurtaranları tikintidə işə çağırsın. Ağcaya məktub yazmağa məcbur oldu. Məcbur oldu deyirik, çünki doğrusu budur: heç evlənmək xəyalında deyildi. Çox qızları tanıyıb zoşlasa da, belə fikrə düşməmişdi. Amma Ağcanı görəndə özünü itirdi. Bir gün, iki gün lap kefli kimi gəzdi. Güman elədi ki, ötüb gedər, gördü yox, gedənə oxşamır. Oxlanıb, özü də yaman yerdən oxlanıb. Dərdini kimə desin, kimi göndərsin? Fəhlə adam, ana yox, bacı yox, özü utancaq, açılışmamış. Birdən-birə durduğu yerdə adamın başına bu iş gəlsin!..

Nə isə, ha fikirləşdi, gördü ki, məsələni açmaqdan savayı çarə yoxdur. Özü də üzbəüz yox, qiyabi, məktub ilə! Baxış heç bir zaman savadın qədrini indiki qədər bilməmişdi. Kağız hazırladı. Çox yazdı, çox pozdu, axırda sevdiyinə belə bir məktub göndərdi:

“Məni ordudan tərxis edəndə ürək zəifliyini səbəb qoymuşdular. Yürüşlərdə, yoxuşlarda təngnəfəs olurdum. Güman etmişdim ki, bundan sonra mənim qəlbim ilə ancaq həkimlər maraqlana bilərlər. Amma görüşümüzdən belə məlum oldu ki, yox, orada həyat qaynayır və yeni bir işıq yanır. Onu siz yandırmısınız. Ümidvaram ki, həmin işığı söndürməyi heç bir zaman rəva görməzsiniz!

*Ehtiramla, Baxış”*

2

Gəlin gəldiyi ilk gündən Ağca Baxış ilə şərtləşmişdi: uşaq bağçasında qulluğa girəcək, fəhlə balalarına tərbiyə verəcək, sonra da ali təhsil alacaq.

Toy dəsgahı, mehriban ailə həyatı başlanan günün səhərisi Ağca iki nömrəli uşaq bağçasına mürəbbiyə təyin olundu. Ağcanın arzuladığı bağçanın balaca həyətində hovuz tikilmiş, cərgə ilə ərik, iydə, badam ağacları basdırılmış, tənəklər baş-başa vermiş, qızılgüllər neçə yerdən calaq elənmiş, təzə binanın eyvanı, qapı-pəncərəsi qəşəng rənglənmiş, dirəkdən çilçıraq asılmışdı. Oğlanlı, qızlı körpə uşaqlar quşlar kimi səs-səsə vermişdilər.

Ağca yenicə ayaq basdığı bu körpələr evini özünün həyat və əmək ocağı saymışdı. Gündə neçə dəfə uşaqları bir-bir dindirməsə, ağacları sulamasa, hovuzun suyunu təzələməsə, otaqların səliqəsini yoxlamasa qərarı gəlməzdi. Birinin düyməsini tikir, birinə şəkil çəkir, bir başqasına hesab öyrədir, nağıl danışırdı. Cücəli toyuq kimi körpələri başına yığıb cürbəcür mahnılar oxuyur, onlara oyunlar öyrədir, cərgələrə düzürdü. İş görəndə qalın hörükləri kürəyindən sürüşür, gözünün qabağını kəsir, bəzən hovuz suyuna batırdı.

Qız, saçını cəld düyünləyib dalına atanda, bir dəfə müdirə gülə-gülə demişdi:

– Qızım, onlar sənə kəndir deyil ki, nemətin qədrini bil! Onun həsrətini çəkənlər var!

Ağca sonra hörüklərini bir ipək tor içinə yığıb kürəyinə atardı. Boynunu tərlətsə, darıxdırsa da, müdirənin sözünü yaddan çıxarmazdı.

Ailə həyatının dadlı meyvəsi, ay parçası kimi bir oğlan uşağı da muştuluq şənliyi ilə gəlib çıxdı. Gənc ailədə körpə səsi saf musiqi kimi eşidilməyə başladı.

Bənna Baxışla Ağcanın günü, dirliyi xoş keçməkdə idi.

Ailədən, güzərandan söhbət düşəndə, hərə bir arzudan deyəndə, Baxış da küsənə-küsənə öz səadətindən danışardı:

– Qardaş, bizim zəmanədə insanın canı sağ olsun, yaxşı da ömür-gün yoldaşın olsun, qalan hər şey ötüşər. Ağca ilə qabaq-qabağa oturanda, kəlmə verib kəlmə alanda, bir də Nadirin qığıltısını eşidəndə, elə bilirəm bütün yorğunluğum getdi. Deyəsən, heç ağır daşları divara düzən, səhərdən axşama belədən-belə mizan çəkən, sement vuran, fəhlələr ilə çənə döyən mən deyiləmmiş. İnsana könül həmdəmi hər şeydən fərzdir. Can deyib can eşidəsən, bir-birinin başına and içəsən. Məhəbbət də, həyat da, ləzzət də budur. İdarədə də adamın kefi saz, ürəyi işıqlı olur. Həyat yoldaşı, mehriban ailə işdə də adama bir arxadır.

Baxış tamamilə haqlı idi. Ağcanın yoldaşlığı, bağçadakı qulluğu, ailə qayğısı bu tərifə tamamilə layiq idi.

Qadın var həmişə fikri-zikri konsertlərdə, bu teatrda, o tamaşada, gəzməkdə, seyrəngahda, bayır-bağçada olar. Evinin işini yükləməyə də qulluqçu axtarar. Ərinin işdən gəlməyi yadına düşəndə, qaçıb restorandan bir boşqab soyuq kotletdən-motletdən alıb gətirər, qabağına atar, sonra poçtalyon kimi qapıdan yox olar...

Belə evin mehmanxanadan nə fərqi!

Yox! Baxışın ailəsi hara, bu söhbətlər hara!

Ağca qulluğunu ikinci növbəyə, nahardan sonraya salmışdı. Səhər yerindən qalxan kimi birinci işi ərinə yemək vermək, onu yola salmaqdı. Uşağı yedirib, geyindirib havaya çıxarmaq, sonra nahar tədarükünə düşmək.

Ağca ərzağın təzəsini, yaxşısını, həm də bahalısını alardı. Handa bir şeyi bəyənməz, dönə-dönə seçərdi ki, Baxışın xoşuna gəlsin. Onun hazırladığı süfrə zənginliyi ilə olmasa da, səliqəsi səhmanı ilə həmişə seçilirdi. Stol üstündə hər şey par-par parıldardı. Deyərdin bunlara əl vurmaq heyifdi, hansı qəzetə, hansı sərgiyə getmək üçün şəkil çəkiləcək.

Baxış işdən gec gələndə Ağcanın gözü qapıda qalardı. Tez-tez həyətə çıxıb evə girərdi. Tramvay zəngi cınqıldayan kimi ürəyində deyirdi: "Baxışı gətirir".

Uşaq da böyümüşdü. Ata-bala qabaq-qabağa oturub, Ağcanın bişirdiyi xörəyi iştahla yeyəndə, qaşığı qoyub çəngəli, çəngəli qoyub stəkanı, stəkanı qoyub kağız dəsmalı götürəndə, "əllərin var olsun!" – deyə təşəkkür edəndə, Ağcanın ürək rahatlığına söz ola bilməzdi.

Görərdin axşam, şirin söhbət vaxtı Baxış bir kağız bağlamanı ortalığa gətirir, ana-balaya göstərib soruşurdu:

– Kim bilər bu nədir?

Biri konfet, biri çəkmə, biri dəsmal, biri corab, biri ətir deyərdi.

– Bilmədiniz!

Nadir tələsik bağlamanı atasından almaq istəyəndə, bir də görərdi ata qutudan bir sputnik çıxarıb stol üstünə qoydu. Göyə üz qoyan sputnik əvvəl marş çalmağa, sonra da fit verməyə başlardı. Nadirin sevincinin həddi olmazdı...

Deyirlər xain, çəp bir göz bütün xoşbəxt ailələrin pəncərəsindən baxır, içəriyə soxulmağa fürsət axtarır. Bizim tanıdığımız evdə bu etiqada inananlar, bəlkə də, yoxdur. Amma xanımlardan uzaq olsun, Baxışın evinə birdən-birə əsən acı ruzigarı, ürəyim ağrısa da, deməyə məcburam.

Ağcanın başına elə bir iş gəldi ki, ailə səadəti alt-üst oldu.

Baxış yağlı maşın kimi çox işlək adam idi. Ağrı, yorğunluq, zəiflik ona kar salmazdı. On beş ilin ərzində onun işdən qaldığını görən olmamışdı. Adı həmişə məruzələrdə, şəkli lövhələrdə, işi dillərdə idi. Heç kimin gümanı gəlməzdi ki, bu zirək kişiyə də xəstəlik yaxın düşər.

Bəzən kürək sancısından, ürək ağrısından şikayət eləsə də, Ağcanın sözünə baxmaz, işə gedər, neçənci mərtəbədə divar qoyar, tavan örtərdi. İşdən qayıdan kimi dalbadal rəngli çay içər, bir-iki saat uzanıb dincələndən sonra durub qəzet oxuyar, radio eşidərdi.

Ağca ərinin həkim çağırmağa kahıllıq etməsinə bir növ alışmışdı, inanmışdı ki, baş ağrısı, kürək ağrısı... bunlar işlək adamlarda soyuqdan, havadan, küləkdən olan, tez keçib gedən şeylərdir. Bu "adi" şeylərdən belə müdhiş bir fəlakət baş verə biləcəyini Ağca heç xəyalına gətirməzdi. Elə bir fəlakət ki, nə həkim, nə dost, nə idarə, el-gün, nə qurulu ev-eşik, nə bəslənən şirin arzular qarşı dura bildi!

Ölüm qara qartal qanadını bu gözəl, bu munis xanıman üstündə görəndə, iti caynaqları ilə Baxışın qəlbini parçalayanda, sanki hər şey bitdi!

Ağcanın illər boyu bəslədiyi arzu və ümidlər elə sarsıldı, tamaşasına durduğu füsunkar qayalıqlar kimi birdən-birə elə uçulub töküldü ki, dünya və aləm başına fırlandı.

Baxışın vəfatından xəbər tutanlar axışıb gəldilər, idarə qalmadı baş sağlığı yazmasın, maşın qalmadı dəfn mərasiminə çıxmasın, adam qalmadı bu adlı-sanlı ustaya yanıb heyifsilənməsin.

Orkestr gətirdilər, cah-calal ilə götürdülər, şəklini çəkdilər, nitq dedilər, qəzetlərdə yazdılar, uşağa kəsəmət kəsdilər.

Mərhumun yeddisi, ayı, qırxı keçdi. Ağcanın üzü gülmədi. Necə gülə bilərdi! Ürək sevgilisini, dağ kimi kişisini itirən cavan gəlinin əlləri qoynunda qalmışdı. Qadında rəng-ruf dəyişdi. Bədən tufana tutulmuş gülzar kimi quruyub soldu. Bütün o gözəllik, məlahət uçub getdi. Şəkil kimi gəlindən bir dəri, bir sümük, bir də quyu suyu kimi dərinə enmiş gözlər qaldı.

Hanı qəzetlər, telefonlar, radiolarda Baxışın çəkilən adı, hörməti! Hanı səhər-axşam isti nəfəsi ilə "sağ ol" deyib evdən çıxmağı, şəst ilə "salam" deyib qapıdan girməyi, bükülü bazarlığını stol üstünə qoyub mübarək deməyi, uşağı qucaqlayıb min bir dil ilə oxşamağı, cibindən cürbəcür hədiyyələr çıxarmağı, rəngli, şəkilli kitablar göstərməyi? Hanı axşamlar sevgilisinin qolundan tutub bir məclisə, bir cəmiyyətə, toya, təvəllüdə, görüşə getməyi! Hanı evinin səadəti, şənliyi? Deyərsən, dəyirmanın suyu sovrulub, işıq həmişəlik sönüb. Otaqlarda qu vursan, qulaq tutulur. Divarlardan sükut, soyuqluq sezilir...

Baxışın tanışlarından biri, ara-sıra mərhumun qapısını açan, ərk ilə yeyən-içən gödək, gövdəli kişi başsağlığına gələndə, Ağcanın kənara çağırdı. Gizli söz deyən kimi, səsini alçaltdı:

– Ağca xanım, heç fikir-zad çəkmə. Allah rəhmət eləsin. Dünyanın işidir. Bir yandan bağlayan fələk, bir yandan açar. Özün bilməmiş olmazsan ki, mən yenə subayam. Səni özüm nikah eləyəcəyəm, uşaq da ki...

– Tfu sənin murdar sifətinə! Sən bu evdə nə qədər çörək yemisən, ay xain! Tfu alçaq üzünə sənin, tfu!..

Gödək kişi daş dəymiş köpək kimi zingildəyərək yox oldu.

Ağcanın – bu balaca həyatdə tənəyə, təhqirə uğrayan cavan ananı qəhər tutdu. Ona elə gəlirdi ki, Baxışın matəmi onun bütün vücudunu qurutmuş, gözündə bir damla da yaş qoymamışdır. Ancaq düşmən sözünün, acı tənənin yarası sanki indi onun kövrək qəlbini yenidən qanatmışdı. Gözlərindən yaş yox, qızıl qanlar axırdı. Yanaqlarından damla yox, ağır isti qurğuşun dənələri tökülürdü.

Qonşular, qohumlar təkrar yığıldı, çox təsəllilər deyildi. Kimsə bilmədi ki, nə olmuşdur.

3

Trestdən gələnlər olmasa, Ağca bəlkə də, kiriməzdi. Üç nəfər abırlı-təmkinli kişi qapının rəzəsini tərpətdi, salam verib içəri girəndə, Nadir qaçıb anasına xəbər elədi. Ağca dərhal gözünün yaşını silib eyvana çıxdı. Gələnlər Baxışın dostları idilər. Biri yoldaş Cuvarlı, biri də usta Mixaylov idi. Üçüncüsünü Ağca tanıya bilmədi. Cuvarlı hal-əhval soruşandan sonra bənnanın şəklini əlinə alıb xeyli baxdı.

– Ağca xanım, – dedi, fotoqraf gələcək, bu şəklin üzünü çıxardacaq, böyütmək istəyirik. Baxın, bəlkə ayrı şəkli məsləhət bilirsiniz. Deyərsiniz çəkər, neçə nüsxə lazımdır.

Trestin köhnə ustası Mixaylov da əlindəki bağlamanı kənara qoyub əyləşdi. Ağcanın kefini, Nadirin dərsini soruşdu.

Qonaqlar çox oturmadılar, bir stəkan çay içdilər. Nəsə himləşdilər, həyət-bacanı gəzdilər, baxdılar. Mixaylov bayaqkı qəzet bağlamasını əlinə aldı, Ağcaya üz tutdu:

– Qızım, – dedi, – sən heç demə ki, Baxış yoxdu. Nə qədər biz varıq, Baxış da var. Onun kimi sədaqətli yoldaş, handa bir usta heç vaxt yaddan çıxmaz. Keçən ay tələbələrə yataqxana tikirdik, binanı on beş gün tez verdik. Təhvilə nazir də gəlmişdi. Müzakirə oldu, bəyəndilər. Briqadaya iki aylıq mükafat yazdılar. Rəisimiz elan eləyəndə, ustasından fəhləsinə qədər hamı bir ağızdan dedi:

– Bu mükafat Baxış Baxışovun ailəsinindir. O kişi canını tikintidə qoyub, indi budur, onun pulunu, neçə mindi, gətirmişəm, qol çəkib götürün!

Mixaylov danışa-danışa bir dəstə yüzlüyü güzgünün qabağına qoydu, üstünü qəzet ilə örtdü. O, sözünü qurtarmamış cavan, ucaboy oğlan – trestin həmkarlar komitəsinin təzə sədri sözə başladı:

– Ağca bacı, rəhmətliyin işini eşidən gündən partkomda da, trestkomda da söhbət olub, Nadirə məktəbi qurtarana qədər təqaüd kəsilir, danışmışıq. Sizə də...

Bu yerdə trestkom sədrinin dili gəlmədi. Ağcanın cavanlığına görə təqaüdə düşməməsini demək istəyirdi ki, dili gəlmədi. “Nə lazım, bəlkə heç soruşmayacaq, soruşsa, deyərəm...” – deyə düşündü. Sonra tez əlavə etdi:

– İndi, odur, iki nömrəli bağça uzaq olsa, o birinə keçirə bilərik. Mürəbbiyə yeri var. Məsləhətinizə baxın, ürəyiniz istəsə, ora keçə bilərsiniz, baxın.

Ağca razılığını bildirdi, Nadiri Cuvarlı yoldaşa tapşırdı:
– Gözünüz üstündə olsun, bir sənət öyrənsin.

Cüvarlı ananı arxayın etdi ki, Nadiri trestə gətirəcək, həm işləməyinə, həm də oxumağına göz qoyacaq.

Ağca güman etməzdi ki, ən ağır dəqiqələrində qüvvətli, qüdrətli insan əlləri onun qollarından tutub qaldıracaq, dizinə taqət, qaralan gözlərinə işıq verəcək. Səhərdən axşama başları qarışıq olan, böyük planlar tökən, binalar tikən, Moskvada belə yüz idarə ilə bağlı olan, neçə yüz fəhlənin işinə əncam çəkən bir trestdə Baxış Baxışovun – sıradan çıxmış bir kişinin adını bu qədər əziz tutarlar.

Bayram olmazdı Baxışın evinə dəvətnamələr gəlməsin, albom olmazdı şəkli vurulmasın, qəzet olmazdı adı çəkilməsin, xeyir iş olmazdı. Ağca başda olmasın, təzə il olmazdı Nadirin payı göndərilməsin, səyahət olmazdı uşağı aparmasınlar.

Trest qadınları Ağcasız bir qonaqlıq keçirməz, bir tamaşaya getməzdilər. Evlər təmir olunanda, işıq, su, qaz, sobalar yoxlananda, ilk dəfə Ağcanın evinə usta gələrdi. İstirahət evinə putyovka paylananda, Ağca siyahıdan düşməzdi...

Ağca bütün bunları yaxşı başa düşürdü, görürdü ki, Baxış yalnız ailəsində deyil, iş məqamında yoldaşlar içərisində də sədaqəti və ləyaqətilə məşhurdur. Görürdü ki, isti bir qayğı onu həmişə, hər tərəfdən əhatə edir, qol-qanadından tutaraq həyatın sürətli axınında aparır, dəstədən, mühitdən ayrılmağa qoymur. Bu həyatın özü də belə bir gedişə müsaid və münasibdir. Özünün bağçada işə, oğlunun məktəbdə dərsə aludəliklə vaxt keçirdiyini, gündən-günə qüvvətlənən sürətli gələcək meylini aşkar görürdü.

## 4

Bu evdə qəribə bir aləm vardı. İşıqlı pəncərənin qabağında zər haşiyəli çərçivədə qıvrımsaç, güləş, sağlam, sinəsi açıq bir bənnanın şəkli dayanmışdı. Yox, bu şəkil deyildi. Elə də şəkil olarmı? Güclü bir igid dayanmışdı. Sanki Baxış öz otağına göz qoyub hər şeyə baxır, sevgilisinin də, oğlunun da duruşuna, oturuşuna, dinib-danışmağına diqqət yetirirdi. Deyəsən bu saat stol üstündə hoppanıb boğazlı çəkmələrini geyəcək, döşəmədə gəzinəcək, Ağcanı da, Nadiri də danlayıb deyəcək ki, niyə geyinib konsertə getmirsiniz, mən buradayam, niyə darıxırsınız? İşinizdə olun!

Sanki bu igidin ayıq və iti baxışları gənc ailədə hər şeyi birləşdirirdi. İşləyən də, oxuyan da hər an başda əyləşənin nəzərində idi. Uzun illər eyni marağını, diqqətini saxlayan qıvrımsaç oğlan sanki evdəkilərdən də bunu tələb edirdi. Sanki sakit, səssiz, davamlı, mənalı, mehriban nəzərilə deyirdi: "Mən buradayam, niyə darıxırsınız? İşinizdə olun!"

Qıvrımsaç oğlanın nəzərindəki bu məna uşağa da, böyüyə də eyni dərəcə aydın və mühüm idi. Onlar hər səhər öpüşüb ayrılanda, hər axşam öpüşüb görüşəndə, Baxışdan bu sözləri təkrar-təkrar eşidirdilər: "Mən buradayam! Siz işinizdə olun!"

Lakin bunlar təkrar deyildi. Hər gün başqa bir məna, başqa riqqət, başqa bir hərarətlə səslənirdi. Bunlar ana-balanın öpüşlərindəki hərarət və təravət qədər təzə və şirin idi, həmin öpüşlər qədər onları birləşdirirdi.

Birləşdirirdi deyirik. Qıvrımsaç oğlanın nəzərlərində birləşdirən qədər ayıran bir qüvvə də var idi. Ağca da, Nadir də hər dəfə yuxarı başa nəzər salanda, bu ayrılığı duymamış deyildilər. Ana oğlunu, oğul isə anasını düşünürdü.

Oğul öz anasını Baxışın sağlığındakı qədər şən və qayğısız, ana da balasını atalı vaxtındakı qədər bəxtiyar görmək istəyirdi. Hər ikisinin ciddi-cəhdi bu idi.

Görərdin, anası uşağının kəsəmət pulunu yığıb ona maqnitofon almaq istəyir. Uşaq isə həmin puldan gizlincə götürüb anasının sumkasına qoyur, ona yeni palto pulu düzəldir. Xərcləməyə gələndə, bəzi ailələrdəki ixtilaf burada da olurdu. Ancaq burada məzmun ayrı idi: oğul anasını, ana da oğlunu vacib sayırdı.

– Atamın yoxluğunu dost-düşmən bilməsin. Yaxşı geyin, ana!

– Tay-tuşdan geri qalma, bilməsinlər ki, qabaqda atan yoxdur! Hələ ki, mən varam, oğul!

Nadir "Şərəf lövhəsinin" yanından keçəndə, atasının şəklini orada görmədi. Ağır bir kədər ilə bunu anasına dedi. Ağca, Mixaylova bildirdi. Mixaylov dedi:

– Sabah axşam Nadiri də götürün, trestə gəlin! Dəvətnamə göndərəcəklər! Hələ-həlbət!

Ağca kişisinin şəklini klubda adlı-sanlı işçilər cərgəsində görəndə, razılığını bildirdi.

Cuvarlı dedi:

– Ağca xanım, Baxışın şəklindən nigaran olma. Mən gözləyirəm ki, bu gün-sabah Nadirin özünü məşhurlaşdıraq. Nadir FZU-ya gedir. İndi cavanlar oradan boy atırlar!

Bayram axşamı raykomdan da gələnlər var idi.

Klub ağzınacan dolu idi. Cuvarlı məruzə eləyirdi. Trestin keçmişindən, gələcək planlarından, qabaqcıl ustalarından deyirdi...

Ağca 5-ci sırada, oğlunun yanında oturmuşdu, daha doğrusu Nadir onun yanına gəlmişdi.

– Ana, mən həmişə sənnən oturacağam!

Bu sevincli axşamda, bütün işçilərin tökülüb gəldiyi məclisdə ana-balanın yanaşı oturub şirin söhbət eləməyi də mənalı idi. Bugünkü işlər barəsindəki məruzədə Baxışın adı çəkilməyəcəyini bir növ hiss etdirməmək üçün Nadir anasını məşğul etmək, danışdırmaq istəyirdi. Ağca isə onun qolunu tutub deyirdi:

– Qulaq as! Dayan!

Görünür bu incə mətləb məruzəçinin, Cuvarlı yoldaşın da nəzərində idi. Söhbəti hərlədi, fırladı, o yerə gətirdi:

– Biz gərək trestimizin, otuz ildən bəri inşaat ilə məşğul olan, şəhər tikən nəhəng idarəmizin tarixini yazaq. Qorki özü deyib, belə tarix vacibdir, yoldaşlar! İnqilabımızın hər bayramını eləyəndə, baxıb görürsən ki, belə tarix çox vacibdir. Bunsuz bizi yaxşı tanıyan olmaz. Odur, gündə bizə xarici qonaqlar gəlir. Hələ daxili demirəm. Hər gələn də dəftərini açıb səliqə ilə yazmaq istəyir: haçandan, kimdən, nədən nə cürə!.. Yaxşı, necə ola bilər ki, mən bu şəhərin inşaat tarixindən deyəm, Baxış Baxışov kimi şərəfli bir ustanın işini unudam, üsulunu deməyəm, şəklini göstərməyəm...

Bu yerdə bütün zaldakılar əl çaldılar. Çoxları da dönüb beşinci sıraya, yanaşı əyləşən ana-balaya baxdılar. Baxdılar, daha da bərkdən əl çaldılar. Çoxunun sevincdən gözü yaşardı. Adamlar yalnız Baxışın əziz xatirəsinə yox, həm də gül kimi balalar bəsləyən ananın vətəndaş ləyaqətinə əl çaldılar.

Ağca həyəcandan qızarmış, başını aşağı salmışdı, oğlunun əlini sıxırdı. Nadir də ətrafına baxıb başını tərpədir, razılıq işarəsi verirdi.

Cuvarlı danışdıqca, bu səliqəli şəhərin bütün çətin tarixi, xoş mənzərəsi, sabahkı dövranı Ağcanın nəzərindən keçirdi.

Cuvarlı yoldaşın sözü sözdür. Görərsən, iki gün çəkməyəcək ki, əli qələmlilər gələcək, binalara baxacaq, dəftərləri açacaq, adamları

dindirəcək, şərəf lövhələrini yoxlayacaq, tarix yazacaqlar. Bu sıralanmış uca ağ evlərin çoxunda Baxışov Baxışın adını görəcək, yazacaqlar. Lap təzə binalara baxanda da Baxışı yad edəcəklər:

– Bu da Baxışovun işidir. Ancaq ata Baxışov ayrı, oğul ayrı.

– Hansı yaxşı tikib?

– Atanın ata yeri var, oğulun oğul!

– İkisi də bir əsrin oğlu, bir nəsil deyilmi?

– Bəli, tikənlər, quranlar nəsli!

– Bizim nəsil!

*1958*

## XARİCİ NAXOŞLUQ

Xarici naxoşluq deyəndə zahirdə, üzdə olan naxoşluğu demirəm. Bu sözü mən coğrafi mənada işlədirəm, sərhəd xaricindəki naxoşluqlardan söhbət gedir...

Mən deyərdim bizim şəhərdə hakimlik sənətindən çox növbətçiliyi olan sənət yoxdur. Özüm həkiməm, günaşırı, bəlkə də daha çox növbətçi oluram. Xəstələrimə müttəsil nəzarət eləmək, gecə-gündüz müalicə prosesini izləmək nəticəsini vərəqlərə köçürmək, ən güclü bir arzu kimi heç vaxt məni tərk etmir.

Növbətçilik saatlarında yalnız ixtiyarında olan xəstələrlə məşğul olmursan. Bir də görürsən, xəstəxananın darvazası taybatay açıldı. Budur, “Volqa”, “Pobeda” ya “Moskviç” maşınında, ya da lap yük maşınında “ah-uf”la təzə xəstələr gətirdilər. Düzdür, bizim xəstəxana şəhərin ucqar yerindədir. Çarpayısı da azdır. Hər saat oraya xəstə daşımağa icazə vermirlər. Amma gələni geri qaytarmaq da olmur. Biri qəfildən sancılanıb, birini maşın basıb, birini araq yıxıb, bir başqasını bıçaqlayıblar. Ya it qapıb... Nə başınızı ağrıdım, böyük şəhərdir, bədbəxt hadisələr olur. Daha belə yerdə nə həkim, nə şəfqət bacısı qapını bağlayıb xəstəni rədd edə bilər. Nəsihət oxumağa, şəhər sovetinin qərarlarından maddə gətirməyə dəyməz. Qanun da buna yol vermir. Adamın vicdanı da qəbul eləmir ki, deyəsən: “Yoldaş, yerimiz yoxdur, qayıdın gedin!”

Bu axşam gətirilən xəstə dediklərimin heç birinə oxşamırdı. Nə it qapmaq, nə sərxoşluq, nə bıçaqlanmaq söhbəti var idi. Əksinə, çox

sakit, çox mülayim, özündən də zarımaq, zıqqıldamaq deyilən şey eşidilmirdi! Qəbul otağında divanda uzanan xəstəyə yaxınlaşanda şoferdən soruşdum:

– Nəyidir xəstənin?

– Bilmirəm, doktor.

Şəfqət bacısına müraciət etdim:

– Buna nə olub?

– Bilən yoxdur.

– Bəlkə heç xəstə deyil, götürüb gətirmisiniz.

– Doktor, necə xəstə deyil, küçənin ortasında asfalta yıxılıb qalmışdı. Camaat başına yığılmışdı.

Mən xəstəyə yaxınlaşdım. Doğrudan da bənizi qaçmış, rəngi solmuş, taqətdən düşmüş gənc, nazik bir qızın sifətini gördüm. Qara qaşlar altında xeyli dərinə çökmüş iri gözlər olmasa meyit güman edərdim. Sapsarı idi. Lap ipliyi üzülmüşdü. Nə bir söz, nə hərəkət? Ancaq iri gözlərini ağır-ağır o yan-bu yana çevirərək gəlib-gedəni süzürdü.

– Qızım, sənə nə olub?

– ...

Mən xəstənin nəbzini yoxlamaq üçün çöp kimi nazik biləyindən tutdum. Nəbzi zəif vururdu:

– Sənin nəyindir, qız?

Xəstə başını çətinliklə mənə tərəf çevirib ağır-ağır dedi:

– Burada kino varmı?

– Nə kino?

– Televizorunuz varmı?

– Sən xəstəsən, ya əyləncə axtarırsan, qız?

– Axtarmıram, prosto soruşuram.

Mən sualımı bir də təkrar etdim:

– Nəyindir, haran ağrıyır?

– Özüm də bilmirəm.

– Haçandan beləsən?

– Bu gün bulvar yanında yıxılmışam.

– Yaralanmamısan?

– Yaram yoxdur.

– Bəlkə dəyib, toxunan olub?

– Olmayıb! Özüm gedəndə sərələndim.

Mən xəstəni dərhal palataya, rahat bir yerə köçürdüm. İlk tibbi yardım üçün nə lazımsa əmr verdim, hazırladılar.

Çox çəkmədi, xəstənin anası da gəlib çıxdı. Minnətdarlıq, razılıq edəndən sonra xüsusi bir sözü olan adam kimi mənə yanaşdı, pıçıltı ilə dedi:

– Doktor, Ofelyanı nə qədər istəyirsiniz burada saxlayın, sağaltmamış buraxmayın, qadanızı alım!

Xəstə sahibinin "damdandüşdü" xahişi mənə təəccüblü göründü. Təəccüblü göründü ona görə ki, belə xahişlər bizdə az olur. Əksinə, analar, atalar xəstələrini müalicə etdirən kimi tez çıxarıb aparmağa, xəstəxana rejimindən qurtarmağa tələsirlər. Mən anadan soruşdum:

– Ofelya çoxdanmı naxoşdur?

– Çoxdan.

– Haçandan?

– Olar bir neçə ay.

Təəccüb elədim. Belə zəif bir bədənin uzun müddət naxoşluğa davam gətirməyi, həkimə, müalicəyə xəstəxanaya müraciət etməməyi qəribə idi.

– Ay xala, bu zəif qızı vaxtında nə üçün müalicəyə gətirməmisiniz. Hətta onun bizdə kartoçkası da yoxdur. Belə başısoyuqluq olar?

Ana başını tovladı, üzümə baxdı, ürəyinin dərdini açan adamlar kimi səmimi danışdı:

– Ay doktor, indiki cavanlar bəyəm sözə baxır, bəyəm nəsihət eşidir, bəyəm dərdini deyir? Kinodan, konsertdən macal tapır ki, müalicəyə gəlsin, özünüz yaxşı bilirsiniz ki, hamısı incəlmək istəyir!

İndi başa düşdüm ki, ana nə üçün Ofelyanın buraya düşməyinə sevinir. Evdə, sərbəstlikdə heç bir müalicə tədbirinə boyun əyməyən övladın xəstəxana rejiminə tabe olması ana üçün doğrudan da təsəllidir. Məlumdur ki, hər bir xəstəni və xəstəliyi bacarıqla müalicə üçün birinci şərt diaqnoz, yaxud Sabirin dili ilə desək "dərdi təşxis" etmək, yəni dürüst müəyyən eləməkdir, doğrudur, qocalarda, uzun müddət naxoş olub müalicəyə getməyən, bədənini əldən salan, bir neçə azarı çarpazlaşan adamlarda təşxis çətin, mürəkkəb olur. Ancaq müasir təbabət texnikanın, kimyanın köməyi ilə ən pis xəstəlikləri açır, izah edir. Qorxulu, qaranlıq bir şey qalmır. Rentgen şüalarının nüfuz eləmədiyi damar hanı? Xüsusən Ofelya kimi cavan, on səkkiz yaşında bir qızın xəstəliyini təşxis etmək nə mürəkkəb üsul, nə də elə bir axtarış

tələb edir. Təzə boy atan ting kimi gənc, yarımşəffaf bədəninin bütün imkanları, nöqsanları da göz qabağında olur.

Ofelyanın müayinəsi və təhlilləri qızın zəifliyindən, qüvvətdən düşməyindən başqa heç bir xəstəlik əlaməti göstərmədi. Cavan bədən, imkanları tələbincə, vaxtında qidalanmayıb zəiflikdən üzülüb gedib, ayaq üstə dayanmağa tab gətirməyib...

Mən qızın anasını danladım:

– Şükür, sizin məişətiniz, güzəranınız yaxşıdır, məktəbli bir qızın yeyib-içməyinə niyə fikir verməmisiniz, niyə bədənini üzmüsünüz, xala?

Ana dəfələrlə verilən sualdan təngə gəlmiş kimi əllərini dizinə çırpdı:

– Ay doktor, başına dönüm, qurbanın olum, əgər sən Ofelyaya gündə ikicə dəfə xörək yedirdə bilsən, sənə ömrüm boyu minnətdar olaram! Yemir, yemir a qadan alım!

– Necə yəni?

– Yemir, əzizim!

– Necə yemir, onun otuz iki dişi cağbacağ yerində, həzm aparatında da bir azar-bezar yox, mədə şirəsi də normada. Niyə yeməsin?!

– Doktor, ona baxma, yemir, öldür yemir!

– Dadlı-duzlu xörəklərdən yeyər!

– Dünyada hər ləzzətli xörək – cücə əti, evdə bişən yağlı kökə, dolma, plov, qovurma və s. nə desin qabağına qoyuruq, geri itələyir, ayağa qalxır ki, yemirəm, kökələrəm.

Məni gülmək tutdu. Hörümçək kimi bir bədən sahibinin kökəlməkdən qorxması gülməli deyilmi?

– Nəyi kökələcək, onun bütün vücudunda beş kilo ət yoxdur.

– Qorxur, yemir! Onunku jurnaldır, kinodur.

– Mən onu yedirdim, sən tamaşa elə!

Doğrudur, mən döşümə döyə-döyə qadını arxayın elədim. O da xəstəxana yeməkləri ilə kifayətlənmədi. Səhər-axşam cürbəcür xörəklər bişirib yaraşıqlı boşqablarda qızının yanına daşımaqda davam etdi. Ancaq sonra gördüm ki, Ofelyaya xörək yedirtmək o qədər də asan iş deyilmiş.

– Ay qız, bədənini üzməkdən məqsədin nədir?

– Siz nə deyirsiniz, doktor, məni eybəcər, bədbəxt eləmək fikrindəsiniz?

– Bu nə sözdür, qızım, bəyəm xörək yeyənlər eybəcər olur?

– Bəs nə? Görmürsünüz necə ləndəhor qadınlar var bizdə, Yevropada hamı nazik, incədir. Adama fiqura lazımdır, fiqura!

– Nə görmüsünüz Yevropada, Yevropada olmusunuz?

– Mən "Ekrana" abunəyəm.

– "Ekran" artistlərin jurnalıdır, siz də artist olmaq arzusundasınız?

– Xeyr, artist yox, artistka!

– Artistkanın da bədəni gərək qüvvətli olsun.

– Mən qüvvət yox, fiqura istəyirəm.

– İncə olmaq istəyirsiniz?

– Bəli, mən incə olmasam özümü öldürərəm.

Mən qızın zəif vücuduna işarə etdim.

– Bundan da incə?

– İstəyirəm incə olum. Doktor, siz mənə bu xörəklərdənsə elə dərman verin, bədənim hörümçək kimi olsun, özüm də quş kimi uçum! Quş kimi ha!..

Mən aşkar görürdüm ki, Ofelya xəstə-zad deyil, bəzi kinofilmlərin qurbanıdır.

Ofelya xəstəxanada bir həftədən artıq qalmadı. Nə məsləhət eşidir, nə dərman qəbul edir, nə də verilən xörəkləri yeyirdi. Birtəhər sürünüb özünü televizorun qabağına salır, "xarici" film olmayanda kitabxanadan "Ekran" jurnalını (şübhəsiz ki, xaricdə çıxan jurnalı) gətirib vərəqləyir, bədənini, paltarını cürbəcür biçimlərə salır, güzgü qabağında dururdu.

Anası bu dəfə qızının yanına gələndə mən xahiş elədim:

– Maşını buraxmayın.

Qadın şoferi səsləyib dayandırdı. Güman elədi ki, mən maşına oturmaq istəyirəm.

– Buyurun, doktor!

– Mən yox. Ofelya gəzmək istəyir.

– Nə gəzmək?

– Kinoya getmək istəyir.

Ofelya bu sözü eşidib özünü həyətə atdı, anasını səslədi:

– Ana, mənim paltarlarımı gətir, tez ol. "Nizami"də "Yevo Lyubov" gedir, baxmasam ölərəm!

Ofelyanı anasına qoşub göndərdim və xahiş elədim ki, buraya qaytarmasın.

– Onun azarı ancaq klubda müalicə oluna bilər.
– Bu nə azardır, doktor?
– Bu xaricdən gəlmə azardır. Bizlərdə olmur, xala!
– Xarici mal eşitmişdim, xarici azar birinci dəfə eşidirəm. Bəs bu zəhrimar Ofelyanı haradan tutub?
– Bəzi kinolardan tutub xala, sağalar, qorxma! Bu da mal kimi bir şeydir, təzə çıxıb.

*1960*

## EHTİRAM

Ağsu yoxuşu şoferlərin gözünə durur. Ancaq aşandan, gədiyin başına çıxandan, üfüq boyu əlvan xalça kimi açılan Şirvan düzünə tamaşa edəndən sonra bütün zəhmət və çətinlikləri unudursan, quş kimi yüngül və yeyin gedirsən.

Həyat da belədir. Yüksəlmək çətin və zəhmətli, ancaq səfalı, fərəhli olur; enmək isə asan, ani və qüssəli olur.

Düzənliyə enib Ağsu kəndinin tozlu küçələrinə çatanda susuzluq duyursunuzsa, maşını dayandırıb sıx ağaclı, hasarlı bir həyətin qapısını döyürsünüz.

– Ay ev yiyəsi, bir stəkan sərin su olarmı?

Ürkək və utancaq kənd qızları nabələd qonağı görən kimi "bu saat" deyib budaqları bir-birinə sarmaşan nar, heyva, gilənar, gilas, armud ağaclarının altında yox olur, bir dəqiqə sonra abı kasada sizə su gətirirlər.

Öz əksinizi göstərən duru, sərin suyu başınıza çəkib məktəbli qızına təşəkkür deyəndə, qızdan ədəblə "afiyət olsun" eşidəndə cürətə gəlib bir xahiş də edirsiniz.

– Qızım, bu kasanı bir də doldurmaq olarmı?
– Niyə olmur, əmi, suyumuza nə gəlib?

Qız içəri qayıdan kimi ucaboy bir qadın kəlağayısını yellədərək qapıya yaxınlaşır:

– İçəri buyurun, qardaş, bizlərdə qonağı qapıda saxlamazlar, keçin içəri!
– Sağ olun, yol keçirik, gedəcəyik.

– Nə olar, gedəndə də gedərsiniz, içəri buyurun, dincəlin.

Kəlağayılı qadın qəti əmr ilə sizi içəri çağırır, kiçik gözləri ilə maşını süzəndən sonra soruşur:

– Gəlişiniz deyəsən Bakıdandı, qardaş?

– Bəli, Bakıdandır!

– Çünki buralara Moskvadan, Tiflisdən də gələnlər olur.

– Yox, biz Bakıdan gəlirik.

– Xoş gəlibsiniz, səfa gətiribsiniz. Bakıda mənim nəvəm oxuyur. Bəlkə eşitmiş olasınız. Ehtiram!

– Ehtiram?

– Bəli, Ehtiram!

– Harada oxuyur Ehtiram?!

– İnstitutda oxuyur.

– Oğul nəvənizdir, ya qız?

– Qızdan bircəsi var, sizə su verən. Oğuldandı, kiçiyidir, böyük qardaşı aqronomdur, həmişə əkin, tikinti üstündə olur. Qız da, allah sizinkiləri saxlasın, daş-torpağı oxuyur. Yanlarınca fəhlə aparırlar, yeri qazır, intiresni şeylər tapırlar, hər yay dağlara çıxır.

– Bacı, famili nədir Ehtiramın?

Qadın üzünü həyətin lap içərilərinə tərəf tutub, su verən qızdan soruşdu:

– Nədi ağız, Ehtiram nə yazdırır, Həsən qızıdı, yoxsa Qarayev?

Qızdan səs gəlmir. Səs gəlmir, ancaq siz bu sualın üzündən Ehtiramın kim olduğunu öyrənirsiniz?!

Öyrənirsiniz demək də düz olmaz, tanıyırsınız, tanıyırsınız, çünki Ehtiram sizin çalışdığınız institutun tələbəsidir. Yaxşı bilirsiniz ki, üçüncü kursdadır. Özü də hər il yay ekspedisiyalarında iştirak edir. İştirak edir, ona görə ki, siz, lap siz özünüz dekanata göstərib zəmanət vermisiniz ki, "bu zirək qızdır. Kəndləri də pis tanımır, alimlərə köməyi dəyər, briqadaya salın!".

Dekan da sizin zəmanətinizi nəzərə alıb, Ehtiramı kəşfiyyat işinə cəlb eləyib, qızın sevincinin hüdudu yoxdur. Ancaq kəlağayılı qadın bu işlərdən xəbərsizdir. O nə sizin kim olduğunuzu, nə Ehtirama zəmanət verildiyini, nə də işlərinin məhz siz tərəfdən yoxlanıldığını bilir.

Bunların heç birini bilməyə-bilməyə kəlağayılı qadın sizi yarıxoş, yarıcəbr çəkib evə, qonaq otağına aparır ki:

– Maşından nigaran olmayın, baxanımız var, bizim yerlərdə əyrilik olmaz. Əyləşin bir stəkan çay için! Hələ günortadır, dincəlib sonra gedərsiniz.

Əslinə baxsan sizin heç yolda dayanıb dincəlmək niyyətiniz yox idi. Bəlkə bu kəlağayılı qadın Ehtiramdan söhbət salmasaydı, siz heç dayanmayacaqdınız. Nəvəsinin sizdə oxuduğunu biləndən sonra siz də istər-istəməz dayanmalı oldunuz, qadının dedikləri ilə maraqlandınız.

Həqiqətən maraqlıdır. İki adamın arasında üçüncü bir adam haqqında söhbət gedir. Özü də danışanların biri kəlağayılı qadın, güman edir ki, siz onun nəvəsini tanımırsınız. Tanımadığınız bir adam haqqında bəs nə üçün söz açırsınız?

O da məlumdur: kəlağayılı qadın Ehtiramı sizə tanıtmaq, həm nəvəsi ilə fəxr etmək, həm də sizin Bakıya qayıdandan sonra Ehtiramı tapıb əhvalatı danışmağınızı xəyalında arzulayır. Siz isə öz təmkinini pozmur, tələbəniz Ehtiram haqqında danışmazdan əvvəl onun ailədə, kənddə, valideyn yanındakı ehtiramını bir növ yoxlamaq istəyirsiniz. Bunun özü pis deyil.

– Bacı, nə dediniz, necə oxuyur, dərslərindən neçə qiymət alır, razısınızmı?..

– Qardaş, qızın oxumağına söz ola bilməz. Bir od parçasıdı. Deynən! Gecə-gündüz, yay-qış, tətil demə, bayram demə, kitab əlindən düşərmi. Deyirəm, ay ərkansızın qızı saralmısan anqutun çıxıb, yatağa düşəcəksən, bu nədi. Dəftər-kitaba da adam belə aludə olar, sən mənim üçün professor-zad olmayacaqsan ki...

Siz qadının mühakimələrinə gülürsünüz:

– Ay xanım, məni bağışlayın, adınızı da bilmirəm.

– Səltənət!

– Səltənət xanım, nədir bəyəm, qızlardan professor çıxmağına siz inanmırsınız?

– Niyə inanmıram?! Şura hökuməti bunlardan lap yaranal da çıxardar, amma ki...

– Amma niyə?

– Amması var, çünki qız xeylağının bir ayrı yeri var, oğlanın da bir ayrı.

– Qızın oğlandan nəyi əskikdir?!

– Qız, qadan alım, qardaş, tez azır.

– Azmaq nəyə deyirsən, teatr-kinoyamı?!

– Yox, kinoya yox, televizoru özüm də hər axşam evdə qurub baxıram. Ona azmaq deməzlər. Azmaq odu ki, dindən-imandan kənar şeylər.

– Bizim qızlar indi çox ağıllı-kamallı böyüyürlər, Səltənət xanım.

– Kamalına sözüm yox, qudurmasın, azmasın.

– Azmazlar, yox!

– Bax elə Ehtiram, May bayramında gəlmişdi. Yenə dastan başladı.

– Nə dastan?!

– İndi də yeri qurtarıb, göydən başladı. Deyir ki, göydən adam gəlib.

– Necə yəni?

– Deyir göyə fişənglə adam gedir, bir saatda külli dünyanı dolanıb, xəbər gətirir!

– Səltənət xanım, siz buna inanmırsınız?

– Qardaş, fişəngə barıt qoyarlar, indi də göyə fişəng atırsınız.

– Lap böyük fişənglər atılır, içində maşın, cihaz, adam da gedir. Bizim alimlər indi elə maşın çıxardırlar ki, doğrudan möcüzə.

– Qız deyir, təyyarəçi oğlan fişəngə oturub göyə gedib. Deyirəm, bəsdi-bəsdi! Ağlın olsun, asi-asi danışma. Qız durub məni başa saldı ki, indi göy aləminə belə deyirlər. Mars belə getdi. Nə bilim, ay qardaş, bu qız göylərdən, ulduzlardan şeylər danışır, quruyub qalırsan. Deyirəm, qızım, sən yerdə, skamyada otura-otura, göydən nə xəbər bildin?! Deyir yox, alimlər göydə nə var öyrənirlər. Fişəng atıb şəkil çəkirlər. Göyün altını da görüb götürüblər, üstünü də. Vallahı, Ehtiram bayram günlərində burada şeylər danışdı ki, daha nə deyim?!

– Səltənət xanım, Ehtiram oxumuş qızdır, mövhumat, xəyalat danışmır, elm danışır. Bu saat bütün dünya göyə gedib-gələn təyyarəçi igiddən danışır. Eşitməmiş olmazsan: Qaqarin.

– Bəli, radiolardan eşitmişəm. Şəklini də görmüşəm. Ailəsi ilə bir yerdə. Ehtiram gətirmişdi, bütün qonum-qonşu baxıb. Bir boylu-buxunlu, igid oğlandı, sağ olsun!

– Qaqarin saat yarım ərzində yeri də fırlanıb, göyün də iqlimini, havasını öyrənib gəlib. Bütün dünya onun möcüz kimi sifətinə heyrandır!

– Hə, Ehtiram deyir guya göydə dəmir də, daş da yarpaq kimi yüngül olub uçur. Lap mat-məəttəl qalmışam.

– Göydə təəccüblü şeylər çoxdur. Qaqarinin səfərindən sonra təzə kitablar bağlanır, mühazirələr oxunur, şəkillər çəkilir. Səltənət xanım,

siz gəlin nəvənizin sözünü qürbətə salmayın, o, boş söz danışmır. Kitab-zad necə, oxuyursunuz, ya yox?

– Gecə kursunu çoxdan qurtarmışam. Başım kolxoz işinə, nəvə-nəticəyə qarışandan sonra daha kitab oxuya bilmirəm. Allah sizinkiləri də saxlasın, uşaqlar oxuyub, danışırlar. Şükür, radiomuz-zadımız var.

– Ehtiram kimi nəvəsi olanın gərək heç nə yadından çıxmasın: nə kitab, nə qəzet!

– Ehtiram çox şeylər danışır, mənim ağlım bir şey kəsmir, qocalmışam.

– Kəsər, kəsər, Ehtiram ağıllı-kamallı qızdır. Sənə bir şey deyəcəyəm, bilmirəm inanarsan, ya yox.

Səltənət təəccüblə üzünüzə baxır və güman edir ki, siz də nəvəsi kimi onunla deyişməyə hazırlaşırsınız. Özünü ciddiləşdirib soruşur:

– Nə deyəcəksiniz?

– Onu deyəcəyəm ki, Ehtiram bizim öz institutumuzda oxuyur.

– Yox canım! Yalan olar, qardaş!

– Yalanı-zadı yoxdur, Ehtiram mənim öz tələbəmdir.

– Düzünü deyin, qardaş. Ona siz dərs verirsiniz?

– Ehtiramı dağlara, briqadalarda elmi təcrübəyə göndərən mən özüm olmuşam. Əgər günah bilirsənsə, onu danlama, məni danla, Səltənət xala!..

Səltənət xala əvvəl dediklərinizə inanmaq istəməsə də, Ehtiramın işini, dərsini, təcrübəsini, vaxtını yeri ilə, yurdu ilə deyəndən sonra inanmağa məcbur olur və yarıfərəh, yarısual deyir:

– Qardaş, deyəsən sizi bura göndərən var axı?

– Var, bəli!

– Deyirəm axı!

Səltənət lap özünü yığışdırır, ev-eşiyə göz gəzdirir, balaca qızı səsləyir, elçi qarşılayan analar kimi təşvişə düşür, ciddiləşir:

– Qız, xörək-zad hazırlayın, qonaqlar acdır. Bəs, a qadan alım, kim göndərib sizi?!

– Bizi də Ehtiramı təcrübəyə göndərən institut göndərib. Göndərib ki, tələbələrin işləri ilə tanış olaq, onlara kömək edək. Səfərimiz Şuşayadır!

– Ehtiramın yanına gedirsiniz.

– Bəli, onun briqadasına baş çəkəcəyik. Sözündən-sovundan?

Səltənət mətbəxə qaçdı.

– Qıza bir balaca ev xörəyindən-zaddan, yazbaşı ağartıdan, həyətdən dərilən göyərtidən, tərəvəzdən...

– Şuşada nə çoxdur belə şeylər...

– Yox, evin əvəzini verməz, qardaş, zəhmətini çəkin! Bir balaca əmanət aparın!

– Gözümüz üstə!

– Yəqin Ehtiramı görəcəksiniz?

– Axşam onun yanındayıq.

– Çox-çox salam-dua. Sizin yanınızda da bilmədim; artıq-əskik danışdım. Qardaş, qıza deməyin, utanar.

– Əksinə, qıza təşəkkür edəcəyəm ki, nə yaxşı dilavər, qonaqpərəst, iş bilən nənən var!

– Yox canım, cavan vaxtımda qonaqpərəstliyim bişirib-düşürməyim var idi. İndi daha canım zəifdir, qardaş, yetirə bilmirəm.

– İgid-igid nəvələr böyüdənin ürəyi dağ kimi olar, necə ki, görürəm. Bir zəiflik yoxdur.

Səltənət xanım həm iftixar, həm də xəcalət hissi ilə başını tərpədib sanki təsdiq edirdi.

Dağda, kəşfiyyat işində çalışan qıza, Ağsu təsadüfünü danışanda inanmaq istəmədi.

– Nənəm elə şeyləri qonağa danışmaz.

– Necə danışmaz, nənən Nəbinin Həcəri kimi qadındı, qonaqlara macal vermirdi.

– Görünür, sizi tanımayıb.

– Tanımadığı üçün də sərbəst danışdı.

– Eyib olub!

– Eyib-zad deyil, açıq danışmağı bizə ləzzət verdi. Ancaq sən gərək onunla məşğul olasan, köhnə, mövhumi təsəvvürlərini dağıdasan, elmdən, məktəbdən, yeni həyatdan elə danışasan ki, həm maraqlana, həm də inana!..

– Günün tutulmasına hisli şüşə ilə baxdıranda gözləri bərəlir, hey suallar verir.

– Elə olacaq. Bir dəfə maraq oyandımı, əl çəkməyəcək... Şifahi təbliğat bəs nədi, buna deyirlər də!

*1961*

# HEYKƏL UÇULANDA

*Mənəm-mənəm deyənlərin inanma çox da qovluna!*

***M.Ə.Sabir***

Yayın cızlamasında, bulvarın gur yerində su dükanının qabağında adam əlindən keçmək olmurdu. İki nəfər ağxalatlı zirək qız hər ovcunda dörd-beş stəkan siroplu su doldurub peydərpey camaata verirdi. Manatlıqdan, abasılıqdan hərə əlinə gələni yaş nimçəyə atır, su istəyirdi. Pul saymağa hövsələ, macal yox idi. Ucaboy, sarıyanız, həsir papaqlı, döşündən pəhləvanlıq nişanı sallanan bir oğlan adamları kənara itələyib irəli yeridi, suçuya işarə elədi:

– A qız, bəri dur!

Stəkanlara qazlı su, sirop tökən başıaşağı qız etina etmədi.

– Bəri dur demirəm sənə, həyasız!

Oğlan bunu deyib taraş stəkanı qızın başına vurdu. Qız "vay dədə" deyib əli ilə başını tutdu, kürsüyə yıxıldı, fışqıran qan onun əlini, üzünü qırmızıya boyadı. Adamlar həyəcanla bir-birinə dəydilər:

– Bu nə işdir?

– Yazığın günahı nədir?

– Bu xuliqanlıqdır!

– Kimdir o? Niyə yaxalamırsınız cinayətkarı?

Oğlan heç nəyə fikir vermədən vəhşi heyvan etinasızlığı ilə şüşədən stəkana su töküb qurthaqurt içdi, stəkanı atıb getdi.

Bütün gözlər onun tam yaraşıqlı uca boyuna, vəhşi hərəkətlərinə dikilmişdi, danışmaq, nəsə demək istəyənləri sakitləşdirdilər.

– Sus!

– Bənd olma!

– İş idi düşdü...

– Necə yəni iş, xuliqanı yerinə aparmaq, alnına damğa vurmaq lazımdır.

– Ay hay! Sən də qəribə danışırsan?!

– Nə danışıram, əyri danışıram?

– Axı, qardaş, bilirsən o kimdir? (Cavab gözləmədən, gizli bir sirri açan kimi bərkdən əlavə etdim.) Dünyamaliyevin bacısı oğlu!

Bu sözü eşidəndən sonra danışanlar dinmədi. Qız da səsini kəsdi, ufuldamadı, yanındakılar da ona təsəlli verdi: "Keçib gedər, yayda qan aldırmaq cana xeyirdir, qızım! Qorxma, yaxşı olarsan!"

Dünyamaliyevin, daha doğrusu, Dünyamaliyev yoldaşın özünü tanımasam da...

Pis danışdım; Dünyamaliyev yoldaşı yaxşı tanıyıram və bizim rayonda onu tanımayan yoxdur və ola bilməz. Ancaq ki, o məni tanımır, mənim kimi balaca bir adamı elə mənsəb sahibi hardan tanısın və niyə tanısın, xırım-xırda adamları tanımağa onda vaxt hanı? Onun nəyinə lazımdır ki, məni tanısın.

Amma bacısı oğlunu mən tanıyıram, tanıyıram deyəndə bir əlaqəm, get-gəlim yoxdur. Onun atası bir zaman bizim rayonda qəzet çıxardırdı. Famili də Aşumov idi (əvvəl Haşımov imiş, sonra belə olmuşdu), Dünyamaliyevin gurhagur vaxtında yeznəsi Aşumov da bizim rayon qəzetxanasının böyüyü idi. Düzdü, vəzifəsi qəzetxana müdirliyi idi, amma deyəsən kişi elə bütün rayonun ağası idi.

Qəssabxanadan görərdin bütün bir qoyunu maşına basıb Aşumovun evinə aparırdılar. Xəstəxanadan “Aşumov yoldaşın evinə filan dərmanı göndərin”. Teatrda eşidərdik ki, “hələ oyunu başlamayın, Aşumov yoldaş baxacaq, qoy gəlsin”. Yollarda görərdik dirək uzadıblar, maşınları buraxmırlar ki, Aşumovun səsdən xoşu gəlmir. Aşumovun uşaqları da bunu bilirdilər. Aşumov budu gəldi, Aşumov odu getdi. Rayonda elə dik gəzərdilər ki, elə bil alçaq dağları bunlar yaradıblar. Aşumov belə Aşumov idi!

Görərdin küçələrdə maşınların ağzı açıldı nə açıldı. “Volqa”sından, “Pobeda”sından tutmuş rayonda nə maşın var bəzənib yola çıxardı. Birində sazanda, o birində güzgü, bu birində tirmə şal, bu nədir? Aşumovun toyu! Özünün toyu yox ha, oğlunun, ya bacısı oğlunun toyu! Bu dəm-dəsgah hamıya məlum idi.

Adam yox idi ki, Aşumov onun yuxusuna girməsin, canına lərzə salmasın... Bizim rayonun camaatı buna bir növ alışmışdı, dözürdü, amma mərkəzdəki yoldaşlar buna dözmədilər. Gün o gün oldu ki, Aşumovu işdən çıxardılar. Mərkəzdən bir böyük komissiya gəlmişdi. Aşumovun işlərini yoxlayanda nə tapılmışdısa, nə yazılmışdısa kişi neçə həftə o yan-bu yandan kağız gətirdi, şahid axtardı, heç nə eşitmədilər. Dərhal əmrini verib işdən çıxardılar. İşdən çıxanda nə olar? Vəzifə həmişəlik adamın boynuna biçilməyib ki! Amma Aşumovun məsələsi ayrı cür oldu. Camaata birtəhər gəldi: “Bəli, Aşumovu da dəbərtmək olarmış”.

Danışırdılar ki, Aşumov təyyarə ilə uçacaq, şikayətə gedəcək, böyük yerdən kağız-filan gətirəcək. Amma getmədi, məsələ ayrı cür

oldu. İşdən çıxandan, bilmirəm bir həftə, ya on gün sonra kişi vurğu vurmuş kimi yıxılıb öldü. Bir gecə yatdı, səhər durmadı. Biri dedi iflic olub, biri dedi ürəyindən, biri dedi böyrəyindən! Hər nəsə, yas quruldu, ağlaşma oldu. Kişini götürdülər, dəfn-kəfin elədilər.

Hamı dağılıb işinə, gücünə getdi. Nə idarələrdə, nə küçələrdə, nə də tarlalarda Aşumovdan bir əsər-əlamət qalmadı.

Fələk öz işində idi. Yenə öz qaydası ilə səhər açılır, axşam vaxtında düşür, günəş, bulud, külək, yağış, hava, hamısı qaydasında! Aşumovun uşaqlarının işi qəribə oldu. Bu firon uşaqlar indi kağız kimi qatlanmalı oldular. Necə də qatlanmasınlar? Hara baxdılar, bir havadar görmədilər. Bunların gözünə dağ görünməz, Aşumov görünərdi. Ataları həmişə qarşılarında uca bir heykəl kimi durardı. Uşaqlar elə bilirdilər ki, bu şəhərdə sözü keçən, adı tutulan bir adam varsa, o da atalarıdır.

Şəhərin idarəsini, təşkilatını, adamların həyatını quran, qaydaya salan da ancaq atalarıdır. Amma elə ki, Aşumov öldü, gördülər yox, ey dili-qafil! Nə qoyub, nə axtarırsan? Ölən bir qarğa, ya sərçə imiş! Dünyanın, camaatın heç vecinə deyil!

Radiolar danışır, konsert verir, teatr tamaşaları göstərilir, tramvaylar zınqhazınq sağa-sola gedir. Camaat toy-bayram eləyir, evlər tikilir, küçələrə asfalt salınır, cərgə ilə ağaclar əkilir, göyərir, işıq dirəkləri ucalır, rəngbərəng maşınlar sürətlə belədən-belə keçir, milislər küçə hərəkətinə nizam verir.

Deyəsən heç bu şəhərdə nə Aşumov, nə də Aşumov nəsli var imiş! Böyük oğlu Nadir küçədə papiros damağında dayanırdı – görsün bunun kefini necə soruşacaqlar, gördü heç bunu görən, saya salan yoxdur. Axırda yanından keçən bir oğlanı tutdu:

– Adə, student, mən Aşumovun oğluyam ey!

Tələbə başa düşmədi:

– Nə istəyirsən, xalaoğlu?

– Deyirəm mən Aşumovun oğluyam.

– Aşumov kimdir?

– Aşumov?!

Nadir az qaldı tələbənin ağzından bir yumruq vura ki, “belə filan, Aşumovu məgər tanımırsan?”

Tələbə onun barmağında sıxdığı papirosuna, qızaran üzünə baxdı, kefli olduğunu güman edib milis çağırdı.

– Yoldaş milis, yoldan keçənə sataşır, bu keflini aparın.

Milis işçisi Nadirin qolundan tutanda Nadirin bütün bədəni gizildədi, zehnindən təəssüflü bir xitab keçdi. “Ey dili qafil, gör nə aləmdir, sən yatmısan, Aşumov kimdir, zad kimdir!”

Nadir milisionerə də özünü tanıtmaq istədi:

– Aşumov mənim papamdır!

– Yeri, yeri, papa-mapa bilmirəm, vətəndaşlara sataşanın on beş sutkası var, yeri!

Nadir bir ətrafına baxıb vurnuxdu, adamların başına vurmağa taraş-taraş stəkan axtardı. Milisioner onun qolundan tutanda oğlanın yadına düşdü ki, yox, indi daha o zaman deyil! Vaxtı ilə gözündə dikələn, böyüyən, parıldayan, rəngbərəng vəzifəli adamlar... Tunc, daş, sement heykəllər gurultu ilə uçulub töküldü, vahiməli bir mənzərə göründü...

Nadir diksinib yuxudan ayılan kimi əllərini yuxarı qaldırdı, başını tutdu, güman etdi ki, hamı vahiməyə düşəcəkdir. Qəribə idi, heç bu uçurumdan səs-səmir çıxmadı, deyəsən bunlar hamısı qarışıq bir yuxu idi və ancaq onun gözünə görünürdü, ətrafına baxanda gördü ki, milisioner maşın çağırır:

– Bu sərsəmdir, yeriyə bilmir, maşına qoy apar, növbətçiyə təhvil ver, qoy ayıltsınlar, gəlib dərsinə baxacağam. Mən gəlməmiş dam-lamasınlar, gözləsinlər!

Müxtəlif materialdan yaranmış cürbəcür heykəllər isə Nadirin gözündə hey uçulub tökülməkdə, toz-duman qoparmaqda idi. Sirli bir pərdə dalında, sükut içində təkrar olunan bu mənzərəyə, deyəsən Nadirdən başqa baxan, tamaşa eləyən yox idi. Hər kəs öz işində idi. Adamların kefi saz, hava xoş, şəhər çilçıraqban idi.

*1962*

## AY İSMAYIL, BAŞA SAL!

Deyirlər rüşvətlə bərk mübarizə aparılır. Bu doğrudur. Amma mən bilmək istəyirəm ki, rüşvət nəyə deyirlər? Rüşvət ona deyirlər ki, mənim bir vəzifəli şəxsə işim düşür. Qanun buna ziddir. Amma vəzifəliyə filan qədər pul verirəm, o da qanunu ayaqlayır, mənim işimi düzəldir. Buna deyirlər rüşvət!

Bir də var ki, mənim nazir rəisi filankəsə hörmətim, məhəbbətim var. Plov bişirəndə onsuz boğazıma getmir. Çağırıb dəsgah düzəldirəm. Bəzi alimlər güman edir ki, bu da bir növ natəmizlikdir. Ancaq burada

nağd pul məsələsi yox, natura ilə ifadə olunan rüşvət var, amma bu işlərin eləsi var ki, nə rüşvət, nə də hörmət adlandırmaq olar. Bunun adını mən özüm də bilmirəm. Soruşanda deyirlər, yox, bu ayrı şeydir. Mən bilmək istəyirəm ki, ayrı şey, yəni nə?

Mən bir on-on beş il əvvəl Xaçmaz tərəfdə müəllim idim. Rayonun lap mərkəzində, meydanın qabağında, orta məktəbdə hesab dərsi deyirdim. Orda da bir "paxodnı" çəkmə geyən, saçı kəsik arvad, daha doğrusu xanım var idi. Nə istəsə heç kəs ondan müzayiqə eləmirdi. Adı da Rütubət xanım idi. Görürdün, Rütubət xanım budur gəldi qəssaba işarə elədi:

– Əmioğlu, o şaqqa necə şeydir?

– Erkək ətidir.

– Çək onu!

– Baş üstə!

– Ya mədəd!

Qəssab şaqqanı çəngəldən götürüb tərəziyə qoymaq istəyəndə xanım səsləndi:

– Ya heç çəkmək lazım deyil, bük bir kağıza aparım.

– O da baş üstə!

Qəssab şaqqanı, quyruğu da üstündə səliqə ilə qəzetə büküb verirdi. Rütubət xanım düzəlirdi yola.

Mən təəccüb eləyirdim:

– Bəs niyə pul vermədi? Düşünürdüm ki, yəqin tanışdırlar, sonra haqq-hesab çəkəcəklər.

Həmin qadını aşxanada xörək yeyib ayağa duran, ağız-burnunu silib çıxan görürdüm. Ya görürdüm ərzaq mağazasına girdi, qənddən, çaydan, düyüdən, yağdan səbətini doldurub çıxdı. Mağaza müdiri də baxa-baxa qalırdı. Lap məəttəl qalmalı işdir... Bəlkə lap kommunizmə keçmişik. Pullar götürülüb, mənim xəbərim yoxdur?

Onu da deyim ki, saçı kəsik qadın, yəni Rütubət xanım bu səyahətlərində tək deyildi. Yanında ucaboy bir milis işçisi gəzirdi, onun səbətini, ya çamadanını gəzdirirdi. Bazarı gəzdikcə səbət dolub ağırlaşırdı, amma xanımdan bir qəpik də çıxmırdı. Lap təəccüblü iş idi? Bazarkom belə olmaz. Naloq yığan heç olmasa qəbz verir! Dequstator da belə eləməz!

Bir dəfə gördüm təzə açılmış bəzzaz mağazasında Rütubət xanım top-top parçalar töküşdürdü, hərəsindən bir paltarlıq kəsdirib səbətinə yığdırdı, yoluna düzələndə bəzzaz çağırdı:

– Bura bax!
– Nə var?
– Bacı, pulu qaldı axı?
– Nə pul?
– Parçaların pulu!
Arvad yanındakına tərəf döndü:
– Ay İsmayıl yoldaş, sən başa sal!
İsmayıl da bəzzaza yanaşdı ki:
– Bənd olma!
– Necə?
– Deyirəm, bənd olma!
– Bəs necə olsun?
– Kişinin bacısıdır, yaz spesə! Spesə yaz!
– Nəyə yazım?
– Spesə!

Bəzzaz mat qalmışdı. Arvad barmaqlarını az qala onun gözünə soxub deyirdi:

– Bu qanmazı hardan gətiriblər bura? Bəyəm məni tanımırsan?
– Yox, bacı, tanımıram!
– Tanıyarsan, keç otur yerində!
– Axı necə?
– Ay İsmayıl, bunu başa sal! Görəsən hansı dərədən gətiriblər. Guya Quba mahalında adam tapılmırdı. Başa sal, ay İsmayıl!

İsmayıl da mağaza müdirini səslədi. Müdir satıcının üstünə qışqırdı:

– Əyə, işin olmasın, spesdir! Yaz spesə!

Mən də kənardan bunları görüb mat qalırdım. Axı bu nə rüşvətdir, nə hörmətdir?

Deyirlər bu qorxudandır.

Qorxudan adam malını, pulunu quldura, oğruya, yol kəsənə verər, o da dağda, xəlvət dərədə, yamacda. Axı, günün günortaçağı, şəhərin ortası, camaatın gözünün qabağı, Sovet hökumətinin oğlan vaxtı, kişi niyə malını əldən versin, belə şey görünməyib, canım!

– Qorxudan!

Sən demə, bu qorxu ayrı qorxu imiş.

Sən demə, Rütubət xanım ayrı xanım imiş. Lap böyük adamın bacısı imiş. Qabağında kimsə dinmirdi. O, bazara çıxdımı, hamı gizlənməyə çalışır, satdığı malları qaçırdırdı. O da ayıq adam idi. İsmayıla göz

vurur, qırğı kimi gedəni yolda saxlayıb, ovlayır, xurcunları tökür, bəyəndiyini səbətə atırdı. Neçə illər həmin xanım mahalda atını oynatdı.

1953-cü ildə, daha doğrusu, əlli üçüncü ilin yazında birdən-birə Rütubət xanımın ayağı kəsildi.

– Nə oldu bu xanıma?

Xəbər verən yox idi. Biri deyirdi naxoşdur, biri deyirdi qaçıb. Kimisi deyirdi ölüb, amma milisioner İsmayıl yenə bazarda idi. İki əlini dalında çataqlayıb dayanır, deyəsən məzuniyyətə çıxmışdı, dayanıb bu fani dünyanın işlərinə tamaşa eləyirdi.

– Ay İsmayıl, Rütubət xanım hanı bəs?

İsmayıl bir ayağını götürüb o birisini qoyub, ətrafına baxınır, dinmirdi. Vaxtı ilə hamını "başa salan" İsmayıl, indi nitqdən düşmüşdü. Susurdu.

– Ay İsmayıl, necə oldu bəs o arvad!

– Nə arvad, əyə?

– Rütubət xanım.

İsmayıl susub, boynunu qaşıyırdı.

– Rütubət xanım hanı?

– Ayrı söhbət danış!

Rütubət xanım o gedən getdi, bir xəbər çıxmadı.

Rütubət xanımın şəhərdə boğazlı çəkmə ilə addımladığını, İsmayılın kölgə kimi həmişə onu izlədiyini, əmrinə "baş üstə" deyib durduğunu, səbətini xüsusi bir zirəkliklə götürdüyünü görən adam deyirdi, bu arvad rayonun allahıdır. Heç güman etmək olmazdı ki, bu rayonda kök salan Rütubət xanım bu tezliklə yox ola!

Amma əlli üçüncü il yaman il idi. O ilin yazında nə oldusa, Rütubət xanımın çərxi çevrildi. Xanım o gedən getdi, nə onu görən, nə də əmrini eşidən oldu. Şəhər camaatı gülüb sevinir, şükür eləyirdilər ki, koxadan, yüzbaşıdan yaxamız qurtardı.

Rütubətdən var-yox, bir İsmayıl qalmışdı. O da payız yarpağı kimi lap saralıb solmuş, kiçilib yüngülləşmişdi. Daha "başa salmalı" adam tapmırdı. Taqəti də yox idi. Rütubət xanım haqqında bir söz eşidəndə xəcalətindən qızarır, üzünü yana çevirir, xahiş edirdi:

– Ayrı söhbət danış!

– Getsin o günlər gəlməsin, ay İsmayıl!

– Sənə dedim ayrı söhbət danış!

*1962*

# NİYƏ OVDAN AYAQ ÇƏKDİM

Bu da bir azardır. Biri içkiyə, biri qumara, biri nərdtaxtaya, biri rəqs meydançalarında oynamağa, biri quşbazlığa, biri futbola qurşanır.

Mən də ovçuluq azarına tutulmuşdum. Havada quş uçanda pişik kimi diksinib atılırdım. Başımdan ağrı tuturdu: "Bay, səni yarımayasan!"

Güman edirdim ki, gördüyüm quşları ovlamamaq, vurmamaq mənim üçün həm qəbahət, həm də acizlikdir. Eşidən, görən deyəcək evdə iki-iki ov tüfəngi, özü igid adam, de gəl, əlindən bir iş gəlmir, əfəldir.

Bu fikir-xəyal, məni, demək olar, çöllərə salmışdı. Qazandığımı barıta, patrona verib çantama doldurur, hər istirahət axşamı maşına oturub şəhərdən çıxır, rayonlara düşürdüm.

Kənd-kəsək, dərə-təpə demirdim. Dəniz sahillərində, dağlıq rayonlarda məni müəllim kimi tanıyan yox idi. Kimdən soruşsan, ovçu Kazım deyərdilər. "Ovcu Kazım odu getdi, ovçu Kazım budu gəldi". Hər yerdə düşərgəm var idi.

Ovçular özü də cürbəcürdür. Biri əsəb xəstəliyi ucundan, təmiz hava deyib çöllərə düşür. Biri bu peşədən qazanc götürür, bir başqası canavar, tülkü, qaban kimi vəhşi heyvanları qırmaqdan həzz alır.

Məndə bu arzuların, nə bilim hansı var idi. Əslində heç biri yox idi. Necə və nə üçün ovçuluğa qurşandığımı özüm də müəyyən edə bilmirdim. Bəlkə aldığım silah, həvəslə oxuduğum kitabçalar, gördüyüm kinolar bu yola salmışdı. Bilmirəm hansı idi, ancaq on ilə yaxın idi ki, bu yola düşmüşdüm.

Düşmüşdüm, özü də yaman düşmüşdüm. İki otağımın biri yaşamaq yerim, məskənim, ikincisi necə deyərlər, ovçuluq laboratoriyam idi. Burada qaban dərisi, qalın kürk, qulaqlı papaq, yun şal, boğazlı çəkmə, patrondaş, dəri torba, açarlı çanta, canavar əli, ceyran buynuzu, quş qanadı, xülasə, nə desən tapılardı. Özümdən başqa kimsə bu otağa girməzdi. Girsə də baş çıxarmazdı. Anam mənə yalvarardı ki, oğul, otağı heç olmasa ayda bir süpürsən yaxşı olar...

Onu deyim ki, mən ova gedəndə mənfəət, ya qənimət düşünməzdim. Yeməli quşları, heyvanları yox, qabağıma çıxanı vurardım, bəzən qurbanımı heç götürməzdim. Vurduğum dovşan, ya tülkünü, tüfəngin

lüləsi ilə o yan-bu yana çevirib düz nişan almağımı yoxlar, snayper əsgər kimi öyünüb ötərdim.

Ovçuluğun bir qaydası da var: nədənsə adam, rəhmsiz, qansız olur. Silah yaman şeydir. Adamı bərkidir, ürəyini daşa döndərir. Tüfəng əlimdə çölə çıxdımmı, dünyasında mərhəmət bilməzdim. Vurub yerə sərməyə bir canlı axtarardım. Eyib eləməsələr, yəqin ki, yol ağzında eşələnən, qaqqıldaşan toyuğu, xoruzu da nişan alardım. Çölə çıxanda bir gün ov tapmasam, inanın ki, yəqin dərdə düşərdim. Nə isə, mənim günlərim belə keçərdi... İndi, yoldaşlar məndən soruşarlar ki, niyə tərgitdin, niyə ondan əl çəkdin. Nə sayaq oldu?

Bu sirri heç kəsə deməmişəm. Deməzdim. Ancaq indi daha yaşımın keçmiş vaxtında söz ürəyimdə qalmasın, qəbrə getməsin deyə, açıram. Qoy başıma gələni yoldaşlar da bilsin, nigaran qalmasınlar. Dünyadır, bilmək olmaz!

Belə oldu: "Yaxşı yadımdadır. Yaz idi. Aprelin axırı, ya mayın əvvəlləri, bəlkə də ortaları idi. İydə çiçəklənmişdi. Zəmilər ətir iyi verirdi. Yenə ova çıxmışdım. Gəncə çayının solunda Şeyx düzü deyilən geniş bir səhra uzanır, ucu gedib kiçik Qafqaz dağlarının ətəklərinə dayanır.

İndi o yerlərin bir hissəsində şəhər salınıb, bir hissəsində də dəmyə taxıl əkilib. O il bərk yağınıq olmuşdu. Sünbül adama boy verirdi. Qoşalülə çiynimdə, axtara-axtara zəmiləri addımlayırdım. İtim də yanımda yox idi. Yaralanmışdı, aparmırdım. Nə başınızı ağrıdım. Birdən, deyəsən yerdən çıxdı. Xına rəngli bir ceyran dayanıb lap üzümə baxırdı.

– Ay aman, tez ol, qaçar!

Cəld tüfəngi aşırıb nişan aldım.

O qəribə idi ki, ceyran lap on addımlıqda, üzü mənə sarı şax durmuşdu, baxırdı, görürdü, amma tərpənmirdi. Sanki o da məni saymırdı. İnanmırdı ki, mənim əlimdən bir iş gələ.

Heç əyilmədim. Ayaqüstü, tüfəngi sinəmə söykədim, başını nişan aldım. Güllənin açılmağı ilə heyvanın aşırılmağı bir oldu. Güllə səsindən sonra həzin bir mələrti eşitdim. Bu nə idi? Başından vurulmuş ceyran mələyirdi? Yox!

Diqqət eləyəndə nə görsəm yaxşıdır. Ceyranın iki balası otun içindən qaçıb yamaca dırmaşdı.

Ana ceyranın qarnına baxanda gördüm ki, yazıq balalarına süd verirmiş. Ay yazıq! Balalar, rahatca durub əmdiyi yerdə, ana cəlladını görmüşdü. Görmüşdü, ancaq balasını əmizdirmək üçün dayanmış, tərpənməmişdi.

Böyrü üstə sərilmiş ceyranın axırıncı ürək döyüntülərini aşkar görürdüm. Görürdüm ki, yazıq heyvan, balalarından nigaran, həsrətlə can verir.

Deyəsən, o səssiz, sakit çöldə üfüqlərdən, torpaqdan, tarlalardan hey qulağıma bir səs gəlirdi:

– Qansız! Ərkansız cəllad. Bizlərdə yanıqlı mahnı oxuyurdular:

Aman ovçu, vurma məni,
Mən bu dağın maralıyam!

Bu yaşa gəlmişdim, dava meydanlarına da düşüb-çıxmışdım. Ömrümdə mən belə peşmançılıq, ürək ağrısı, vicdan əzabı çəkməmişdim. Mələr qalmış balaların dalınca xeyli baxdım, onlar bir xəyala döndülər. Özləri kimi sütül sünbüllər arasında yox oldular. Yəqin ki, tarlalar onları gizlətməsə idi anaları kimi hansı bir cəllad ovçunun zavalına gələcək idilər.

Elə bil başımdan bir çən dağ su tökdülər. Ceyrana əl vurmadım. Heç baxa bilmədim. Qan-tər içində tez geri qayıtdım. Tüfəng-qatarı bir yana atdım, o gündən tövbə elədim. Bir də mən, ovçuluq?

– Ay tövbə!

Ov şeylərinə əlimi də vurmadım. Anam onları bilmirəm neylədi, otağı güclə təmizlədi.

Mənim ovçuluğum belə qurtardı.

*1963*

*Bəzi ulduzlar kiçik olduqları üçün yox,*
*yüksəkdə olduqları üçün görünmürlər.*

# BİRİNCİ HİSSƏ

## Birinci fəsil

İlin o vaxtı idi ki, yay istisi adamların canından yenicə çıxmış, soyuq isə hələ kar eləməmişdi. Pəncərələr yenicə örtülür, qış tədarükü yada düşürdü. İsti paltarların boğçadan çıxarılıb həyətlərdə, eyvanlarda çırpıldığını, şəritə atıldığını görmək, köhnəlmiş naftalin iyini duymaq olurdu. Dünənəcən sərinlik axtaranlar indi daha kölgədən qaçır, küçənin günəşli tərəfinə keçirdilər. Üzlərə dəyən yüngül küləyin soyuqluğundan, saralmış yarpaqların kəpənək kimi tək-tək yerə enməsindən, gündüzlərin qısalmasından, havaların tutulmasından, arana köçən durna qatarlarının göydən gələn boğuq səsindən, məhsul yığımından, meyvə bolluğundan... məlum idi ki, payızdır.

Payızdır, lakin əsil payız havası müəyyənləşməmişdir. Bir gündə həm gün çıxır, həm yağış yağır, həm bürkü olur, həm külək!

Xüsusən bu gün axşama yaxın qalxan soyuq külək, sanki yaydan küncdə-bucaqda ilişib qalan hərarəti tamam süpürmək, ağacları kökündən qoparmaq, qapıları yıxmaq, küləşi sovurmaq, gözlənən şiddətli soyuqların yolunu təmizləmək istəyir. Adamlar yaxalarını bərk-bərk bağlayır, boyunluqlarını qaldırır. Çox üşüyənlər boğazlarını paltarın içinə çəkir, papağı xirtdəklərinə keçirir, gözlərini yumur, bellərini əyir, küləkdə üzən kimi, çətinliklə yeriyirlər. Küləyin istiqamətinə tərəf gedənlər isə arxalarını sanki küləyə çevirir, yeyin yeriyir, yarpaq kimi boğanağa düşəcəklərindən qorxurlar. Küləyin ağzına aldığı kağız, ağac parçaları daşa, divara ilişməyincə dayanmır. Yarpaqlar küçələr boyunca sürünüb gedən boz boğanaq içində xış-xış xışıldayır. Suların üzü örtülür, yuvasından azan quşlar güllə kimi daş-qaya dibinə, divar uçuqlarına düşürlər. Damlardan daranqıltı ilə tənəkə parçası düşür, qum tökülür, pəncərə şüşələri titrəyir, açıq qapılar şaqqıldayır, dəyirman pərləri elə fırlanır ki, görmək olmur. Çəpərlərdən çıxan tikan kolları oynaya-oynaya gəlib yol çuxurlarında bənd alır. Üfüq kəsif bir toz kütləsinə dönür, yer-göy birləşir, heç nə görünmür.

Eşikdə olanlar özlərini evə salmağa səy edirlər. Evdəkilər möhkəm geyinməmiş çıxmaq istəmirlər.

Fatma arvad hələ də təndir başında əlləşir. Obaşdandan qalxıb çirmənmiş, tabağı qabağına qoyub, pud yarım buğda unundan xəmir yoğurmuş, xəmir gələnəcən qaçıb təndiri qalamış, mətbəx boyu süfrə açıb şamama kimi sarımtıl kündələri bir-birinin yanına düzmüş, bişirməyə hazırlaşmışdı.

Səhər gün qalxanda bacısı Məsmə köməyə gəldi. Fatmanı əlixəmirli, qoluçirməkli, başında çalma, əynində önlük, pörtmüş halda qızmar təndir başında oturub kündə yayan, naxışlayan və yapan gördü.

O, Fatmaya həm acıqlanır, həm küsənirdi. Acıqlanırdı ki, o əjdaha kimi işləyir, "yeddi kürdün işini görür" xəstələnə bilər. Küsənməyi də onun üçün idi ki, özündə bu bacarığı, "əl-qol gücünü" görmürdü.

Doğrudur, Məsmənin işi Fatmaya nisbətən yüngül idi, amma Məsmənin canı sağlam deyildi. Özünü bərkə verən kimi kürəklərindən ağrı qopur, damarları gizildəyir, "sümükləri sancırdı". İki gün yorğan-döşəkdə arxası üstə yatmamış, tərləyənəcən çay içməmiş özünə gəlmirdi. Ürəyində deyirdi: "Bu can, bu bazburud, bu davam niyə məndə yoxdur! Bir ananın, bir atanın övladı deyilikmi?

Fatma Məsmənin salamını aldı. İşarə elədi ki, kündələri yaxına yığ.

Məsmənin verdiyi kündələri vərdənə altında yayır, burmacı ilə naxışlayır, yumurta sarısı sürtür, bir çimdik zəyrək səpir, sonra təndirin qızarmış yerini nişan alır, üzünü yana tutub istiyə cumulur, çörəyi yapıb tez qalxırdı.

Təndirin bir tərəfi dolmamış, o biri tərəfdə çörək qızarır, köpürdü. Fatma qırğı kimi özünü təndiri toxuyur, kəhrəba kimi sarı çörəkləri əlində çıxarıb, buğlana-buğlana süfrənin üstünə atırdı. Məsmə də isti çörəyi sahmanlayır, bir-birindən aralı qoyur, soyudurdu; ötüb keçən uşağa, qonum-qonşuya "iyi gələr" deyə kəsib verirdi. Fatma öz qızı üçün, Bakıda oxuyan oğlu və Məsmənin uşaqları üçün ayrıca yağlı fətir kündəsi hazırlamışdı. Xəmirin axır-uxurunda bunları da yapacaq idi.

Qəfildən külək qopdu, həyəti tozanaq bürüdü.

– Qanadı qurumuş, bir möhlət vermədi çörəyi yığışdıraq.

Qadınlar tələm-tələsik tabağı, süfrəni, təndiri örtdülər. Hazır çörəyi yığışdırıb içəri apardılar. Məsmə damda kəklikotu sərmişdi, dizini döyüb qaçdı. Fatma tələsdiyindən qalan kündələri sıx-sıx yayıb, təndirin ağzını örtdü. Külfəni qapadı.

Sadıq kişi poçt ilə Bakıya, tələbə oğluna göndərəcəyi bağlamanı sahmanlayırdı. Üzüm yeşiyinə bir balaca bərni bal ilə bişirilmiş halva, bir neçə gülöyşə nar, alma-armud qoymuşdu. Fətirlərə yer düşünürdü. "İsti şeydir, – deyirdi, – bura qoysam yağı çıxar".

Qapıya çıxıb səsləndi:

– Havağa bişəcək, havağa soyuyacaq?

Fatmanın da acığı tuturdu:

– Ondan tez ola bilmərəm ki!

– Poçt bağlanır axı!

– Sabahı yoxdurmu?

Sadıq cavab vermədi. O, nə olursa olsun, bu gün bağlamanı göndərəcək idi, çünki saat xoş idi, evdə xeyir-bərəkət vaxtı, çörək bişən gün idi. Bu, bəlkə Fatmanın yadına düşmürdü; ona görə də Sadığın cidd-cəhdi, tələsməsi onun halına təfavüt eləmirdi. Sadıq bağlamanı yerbəyer eləyib səliqə ilə tikdi. Əlinə alıb ağır-yüngül elədi, o yan-bu yanına diqqətlə baxdı, ürəyində dedi: "Dəvə belinə atsan, lap dünyanın o başına gedib çıxar".

Kişi öz əlinin qabiliyyətinə fərəhlənən kimi, cəld ayağa qalxıb bağlamanı qoltuğuna vuranda dayandı. Bağlamanı təkrar əlləri arasına aldı. Poçtdakıların rəngbərəng saplara bu tikişə irad tutacağı ürəyindən keçdisə də, elə möhkəm bir bağlamanın rədd olunmayacağını yəqin edib qapıdan çıxdı. Həyəti başına alan tozanağı görəndə Sadıq kişinin ürəyinə yenə şübhələr gəldi. O, həmişə tufan, külək, ya göy gurultusunu öz gündəlik işləri, həyatı ilə bağlar və yozardı. Xüsusən payızın bu zamanında açıq havada həyətdə çörək bişirildiyi halda birdən qopan bu bərk küləyi Sadıq bir xəbər, özü də uğurlu, xoş xəbər əlaməti saydı. "Lənət uğursuza" deyib yollandı. Darvazaya sarı gedə-gedə arvadını səslədi:

– Ay uşaq, qıyığı yiyəsinə ver; aralıqda əl-ayağa batar! Mən getdim!

"Bismillah" deyib, addımını darvazadan, balaca qapıdan eşiyə atanda, əlində çamadanı olan və içəri girmək istəyən adam ilə elə üz-üzə gəldi ki, qara çamadan ilə ağ bağlama bir-birinə toxundu. Sadıq ürəyinə zərbə dəymiş kimi tez:

"Yavaş, yavaş ol!" deyib geri çəkildi.

Gələnin üzünə baxanda yerində dondu, bir an hərəkətsiz qaldı. Sonra üzündə ani bir təbəssüm doğdu və yox oldu. Əlini oğluna tərəf uzatdı. Sual və təəccüblə onun üzünə baxa-baxa dedi:

– Nə əcəb, Vahid? Nə əcəb? Bu vaxt?

Görüş sevinci bir an içində müntəzirliyə çevrildi. Bu gəlişin səbəbini fikrinə gətirə bilməyən ata tez-tez soruşurdu:

– Xeyirdimi, əyə? Tətil-zadmı var? Nə əcəb?

Vahid çamadanı qapı ağzında qoyub, əllərini ovuşdurdu. Atasına dönüb nə isə demək istədi. Bağlamaya baxdı:

– O nədir?

– Sənə göndərirdim, ayın-oyundur, elə bu saat poçta gedirdim! Bəs niyə gəldin?

Vahid dinmir, cavab verməkdə çətinlik çəkirdi. Sadıq kişinin ürəyinə gəldi ki, "uşağın qəlbinə dəyərsən, evə gələndən səbəb soruşmazlar!.."

– Bəri gəl! – deyə içəri apardı. – Otursana! Otur, dincini al, yol gəlmisən, otur!

Fatma qolu çirməkli, üst-başı unlu içəri girdi. Oğlunu qucaqlayıb öpəndə, balaca qızı Nəzirə də altdan-yuxarı pişik balası kimi qardaşını marıtlayırdı. Bilmirdi anası kimi qucaqlasın, yoxsa, Vahid kimi dik dayansın. Fatma stola örtük salır, pəncərələri basır, pərdələri qaldırırdı; indi o, elə cəld tərpənirdi ki, deyəsən oğlunun görüşündən qoluna xüsusi qüvvət gəlmişdi.

Fatma eyvanda samovar qoyub çay tədarük edir, Vahid Nəzirəni qolları arasına alıb oynadır, top kimi atıb-tuturdu. Sadıq kişi isə əlini əlinin üstünə qoyub dayanmış oğlunun söhbətini gözləyirdi. Vahidin ona bir cavab verməməsi acığına gəlmişdi. Əvvəlki zamanlar olsa, qulağının dibini qızışdırardı ki: "Sənnən deyiləmmi, niyə cavab vermirsən? Kar-zad deyilsən ki?!". Ancaq indi bu hiss Sadıq kişinin özünə də gülünc gəlirdi. Çünki Vahid daha kirli-pasaxlı kənd uşağı "Çobanbala" deyil, karlı-başlı bir tələbədir; ustidentdir, Bakı kimi yerdə oxuyur, mərifət öyrənir, onunla belə rəftar yaramaz. Bəlkə də Vahid gəlişinin səbəbini qəsdən gizlədir, atasının suallarını qəsdən qulaqardına vururdu.

İki yerdə cavab gec gələr: bir əhəmiyyətsiz olanda, bir də lap vacib olanda. Görəsən Vahiddə bunun hansıdır?

Min əzab, min bir ümidlə oğul böyüdüb, uzaq şəhərlərə, ali məktəbə oxumağa göndərən atanın ürəyinə neçə-neçə gümanlar gəlirdi:

"Görəsən, adamdı-işdi, dərsdənmi kəm-kəsiri olub? Əlindən, Allah eləməmiş xatamı çıxıb? Bəlkə işə gəlib, komsomol adamdı, bəlkə göndəriblər elə?"

Sadıq kişi dözə bilmədi. Vahidin qolundan tutub silkələdi:

– De görüm, nəyə gəlmisən? Dərs vaxtı ki, adamı buraxmazlar?

Vahid başını aşağı saldı, zəif, məyus bir səslə cavab verdi.

– Nəyə gələcəyəm... Məktəbdən çıxartdılar...

– Necə? Səni məktəbdən çıxartdılar?

– Çıxartdılar, kənar elədilər.

– Neyləmisən, məktəbdən çıxardalar?

– Nə eləyəcəyəm, heç nə?

– Dərsi çatdıra bilmədin?

– Yox əşi, hamısından beşəm.

Vahid danışmaq istəyirdi, ancaq atası sualı sual üstündən yağdırırdı:

– Yoxsa, əlindən xata çıxıb?

– Elə iş olar, ata, məni tanımırsan?

– Bəs niyə çıxartdılar?

– Heç zad, düz-əməlli bir söz deyirlər ki!

– Necə ki, deməsinlər? Bəlkə müdirdən-zaddan küsmüsən? Yoxsa, yoldaşlarınla savaşmısan! Düzünü danış, mızıldama.

Vahid atasının intizarını görüb, deməyə məcbur oldu:

– Dedilər, səndən material var.

– Nə var?

– Material!

– Material nədir?

– Srağagün tədris hissə müdiri çağırmışdı. Mənə bir kağız göstərdi.

– Hissə müdiri kimdir?

– Direktorumuzun köməkçisi. Dedi: "Əmr var, kənar olursan". Məndən savayı da beş nəfəri çıxartdılar. Birinin nəsə naxoşluğu var idi, birinin də üstünə oğurluq yıxdılar. Biri qız ilə məktublaşmışdı. Bir xəbis adam var, iş başına soxulub, tələbənin düşməni! Hamısını eləyən odu.

– Bəs səni niyə qovdular?

– Mənə bir onu dedi ki, material verilib.

– Axı nə material?

– Nə material olacaq: atan arı saxlayır, kolxoza yanaşmır, nə bilim, vergi verir...

– Elə bu?

– Mən bilən elə bu!

Sadıq kişini heyrət aldı. Qorxulu bir şeydən qorunmaq istəyənlər kimi qollarını açdı, əllərini qabağa verdi, vücudunu geri əydi.

– Arı saxlamaq qadağandır? Bunu hansı mərdimazar deyir. Qəzeti, qərarı onun gözünə soxaram mən! Dünya hələ bəslik-zad deyil ki!

Vahid bu bəhanənin yersizliyini daha artıq hiss etdi:

– Yəni ki, hökumətə vergi-filan verir!

Sadıq təəccübdən dik qalxıb oturdu. Yenə qalxdı, hirsdən boğulmuş kimi, baxa-baxa qalxdı. Birdən səsləndi:

– Ədə, bəs vergi verməsəm ispalkom mənə nə deyər? Bu nə sözdü? Hökumətimin qoyduğu vergini qəpiyinəcən ödəyirəm. Bu günah olur?

– Bəhanəsi odur ki, kolxozçu deyilsən, təksən!

– Arıçıdan kolxoz var? Şəhərdə beş adam saxlayır, biri də mən! Gəlsin, yığsın, hamıdan qabaq mən olmasam, onda desin. Bu işin direktora nə borcu, uşağın oxumağına nə dəxli, canım? Lenin yoldaş özü deyib oxuyun. Oxumaq Şura hökumətində hamıya volnadır. Direktor bunu bilmir?

Vahid dinmədi. Sadıq əlini tovladı:

– Yox, bu bir söz olmadı, bir sözə oxşamadı. İlin bu vaxtında səni dərsdən ayırıb evə yola salmaq nə işdir?

– Deyir təksən, olmaz!

– Təksən! Tək olanda nə olar? Murtuzun dədəsi tək deyil, Mehralınınkı tək deyil? Budur, bu üzdən Heybət uşağı tək deyil? Yekə mahalda hamı kolxoz ola bilməzdi ki! Hamının da uşağı Moskvadan bəri handa bir böyük məktəblərdə dərs alır! Demədin atam sənətkardır?

Vahid bütün təfsilatı atasına danışmağa başladı:

– Partiya komitəsində işləyən var, dediyim o mərdimazar! Ondan bir gün qabaq məndən soruşdu ki, atan kolxozdadır, ya yox? Dedim, yox. Daha bir sözü olmadı. Çıxıb getdi. İki gün keçmədi ki, divara əmr asdılar, məni çıxartdılar.

Sadıq inanmadı:

– Bundan ötrü adam qovmazlar, o boyda da hərki-hərkilik olmaz, düzünü de! De, qorxma, danış görüm, məni niyaran qoyma, açıq danış!

– Qoyursan ki, deyim, ağzımda danışıram da.

İlk dəfə idi ki, Sadıq kişi oğlunun, əziz-xələf oğlunun səsindəki həzin riqqəti görüb duyur, ürəyinin başı ağrıyırdı. İndi o, etdiyi sorğu-sualın hamısını artıq və yersiz sayırdı, özünü danlayırdı: “Bir yandan mərdimazar işi, bir yandan da özüm uşağı silisə tutub sinsidirəm... Lənət sənə kor şeytan!”

Atanın da ürəyi kövrəldi. Özünü toxtatdı, səsinə mehriban ahəng verdi:

– Danış, bala, nə var söylə; burda özgəsi yoxdur ki, ev bizim sirr bizim. Söylə görüm, başına nə iş gəlib? Nə olar, iş adam başına gələr, nə olar, di söylə!

– Orda salyanlı bir köpəkoğlu var: Gəldiyev. Nəsə məngən düşüb: gah partkoma çağırır, gah dalımca gəzir, gah sifariş göndərir, gah iclasda adımı çəkir...

– Nədən sarı çəkir?

– Nədən sarı çəkəcək, yaxşılığa çəkməyəcək ki: "Nayıbov ictimai işə yapışmır, Nayıbov sözə baxmır, Nayıbov filan-peşmakan". Mən də baş qoşmuram. O kim, mən kim! Başımı aşağı salıb dərsimi oxuyuram. "İt hürər, karvan keçər", "Yel qayadan nə aparar?". Gedib direktorun ovcuna nə qoyubsa, nə qandırıbsa, götürüb əmr veriblər.

– Bəs direktorun ağlı hardadı?

– Ağlı başındadır. Amma Gəldiyevə inanır. Partiyaçıdır, özü də büronun üzvü. Onu qoyub mənə inanmayacaq ki. Bizim institut neft institutundan ayrıldı. Onda siyahı-filan tuturdular. Gəldiyev məni bir-iki dəfə çağırdı, danışdırdı. Deyirdim, yəqin iş tapşıracaqlar. Nə bilim, görünür pis niyyəti varmış...

Vahid susmuşdu. Sadıq kişinin yenə də qulağı onda idi. Dalısını danışacağını gözləyirdi. Vahidin qəzet parçasını qabağına çəkdiyini görəndə, sözünü bitirdiyini bildi:

– Bəs, bir yerə gedib eləmədin? Ərizədən-zaddan?

– Getdim komsomol komitəsinə, dedilər, baxarıq, "Baxarığa" da mən dözə bilməzdim. Əmrin bir üzünü komendanta göndərdilər. Çarpayımı alıb özgəsinə verdilər, yataqxanadan çıxartdılar. Qürbət vilayətdir, yerim yox, adamım yox, cibimdə yaxşı pulum yox. Harda qalıb gözləyəydim! Ərizəyə də o saat baxmırlar. Neçə gün yoxlayırlar, komissiya düzəldirlər, uzun çəkir. Qalmaq olmur.

– Qalmayanda da bəs nə olsun, atıla-atıla gəlmisən bəri. Nahaq yerə qovurlar, dinməz-söyləməz çıxıb gəlirsən. Özü də bu zamanda. Şura hökumətinin gül kimi qanunlarını o salyanlının gözünə soxaram! Necə yəni! Səndə olan o savad, o qələm məndə ola, görərsən o salyanlıdı, nədi, məhşər ayağına çəkirəm, ya yox! Necə yəni...

– Elə yerdə kömək lazımdır. Komsomol komitəsi də direktoru, partkomu qoyub mənim sözümü danışmayacaq ki? Arıçı oğlunu kim tanıyır?

Sadıq kişi yenə hirsləndi:

– Adə, heç deyəsən bu oxumaqlar-zad sənə kar salmır axı! Direktora, üzgörənliyə tərəf durandısa, daha o nə komsomol oldu. Başda oturanın tərəfinə hamı durar, hünər odur, sənin kimi kasıb-kusubun, əlsiz-ayaqsızın dadına çatsın. Komsomolu biz belə görmüşük. Belə eşitmişik. Bədbihesab işə rast gələndə komsomol səs salıb, dünyanı yığıb tökər. Xanlar oğlu İbrahim nə idi? Dərənin bir lütü! Yekə rayon ispalkomunu qulluğundan dəbərtmədimi? Yadından çıxıb? Nə var, nə var, ispalkom ona demişdi: "Niyə teatr verirsən". Bir sözün üstündə. Komsomol haqqın vəkilidi. Nə əcəb sən sözünü yerinə çatdırmamısan?

Vahid dedi:

– O vaxta baxma. İndi olsa... Bir də rayon hara, Bakı hara. Yekə, dərya kimi şəhərdir. Bir böyüyə şikayət eləmək üçün gərək neçə qapıdan keçəsən.

– Əsil elə şikayətə baxan yer oradır. Şəhərə, raykoma hay sala bilmirdin ki, nahaq iş var, gəlin!

– Hay salarsan, deyərlər xuliqanlıq eləyir, hay nədir?

– İndi bəs fikrin nədi, dərsi boşluyacaqsan?

– Dərsi niyə buraxıram. Bu məktəb olmasın o birisi olsun. Gərək elə Gəldiyevin murdar üzünə duram. Gedərəm Neft institutuna, həkimliyə. Ancaq ilin bu vaxtında heç yerə götürməzlər. Sentyabracan götürməzlər.

– Adam işinin üstündə bərk durar. Gündə bir qapıya nəyə lazımdır? Bəs əyripilan sürməyin necə oldu?

– Necə olacaq, klubda öyrənirəm də...

– Ordan qovmazlar ki?

– Ordan niyə qovurlar. Klubdur, kimin başarığı var, gedir öyrənir, orada mənim işimi bəyənirlər.

Oğlunun bu hərəkəti Sadığın xoşuna gəlmədi. Ancaq fikirləşdi ki: "Dünənki ana uşağıdır. Birdən-ikiyə belə şeylər görməyib, bərkə-boşa düşməyib, mərdimazara rast gəlib, danlamağa dəyməz".

Ayağa qalxdı:

– Sən çayını iç, gəlirəm. Yəhya müəllimgilə dəyim görüm. Sən çayını iç, qayıdıram!

Sadıq kişi yaxasını əli ilə örtmüş, qabağa tərəf əyilmiş halda soyuq küləyə qarşı gedir, gedə-gedə fikirləşirdi: "Mənim oğlumu ata-baba üstündə qovmazlar. Biz əvvəldən əliqabarlıyıq. Pis oxumağına görə

də olmaz. Həvəsli uşaqdır, kitabı üfürə-üfürə saylayır. Gecəsi-gündüzü dərsdir. Çaxır içən, şayka-maykaya qoşulan da deyil. Pis yol tanımır. Mən elə oğul böyütmərəm. Vahid quzu kimi uşaqdır. Qovsalar-qovmasalar, bir paxıllıq üstündə, gözgötürməzlikdən olacaq. Müsürman qardaşıq, mərdimazarlıq kimi dədə-baba sənətimiz var".

Sadıq kişi mərdimazardan çox çəkmişdi. Oğluna atılan bu daşın bədxahlar əlindən çıxdığı xəyalına gələndə əsəbiləşdi, qaşları düyüldü, addımlarını yeyinlətdi, ürəyində dedi: "Vahid bacarmasa da, mərdimazarın öhdəsindən özüm gələcəyəm! Hələ o qədər əldən düşməmişəm. Özüm sübuta yetirəcəyəm. Şura hökuməti haqq üstündə qurulub, haqqa zaval yoxdur! Lap sentirəcən getməyə varam!".

* * *

Vahid düz danışmırdı. Gəldiyev onun ən ictimai işə yapışmamağından, nə sözə baxmamağından, nə atasından-filanından yanıqlı idi. Bunlar hamısı zahiri söhbət idi. Əsil məsələ başqa idi.

Vahid bunu atasından gizlətsə də, biz oxuculardan gizlədə bilməyəcəyik. Gəldiyev ilə onun arasında keçən ildən bəri davam edən nazik bir mətləbi oxucular bilməlidirlər. Bu mətləb bu il bir az yoğunladı, bərkidi, gərginləşdi, hərif təkan vuran kimi qırıldı, Vahid isə ağzı üstə yerə gəldi.

O mətləbi Vahid atasına açıb danışa bilmirdi, danışa da bilməzdi. Qayıdanda xəyalında qoymuşdu ki, soruşsalar, deyəcəyəm: "İntriqaya düşdüm".

Vahidin qovulmasının başqa səbəbi var idi.

İnşaat institutunun layihə şöbəsində Rübabə adlı bir qız oxuyurdu. Bakılı, tarzən Səttarın qızı idi. Ucaboy, alagöz, qarasaç, gərdənli, gülərüzlü – bir sözlə, gözəgələn bir qız idi. Rübabənin təbiətən cəld, dik, məğrur yerişi var idi. Çox adamın ona gözü düşmüşdü. Ancaq Rübabənin gözü özündə idi, çünki Rübabə bu məktəbə görməyə-görünməyə, axtarmağa yox, doğrudan da oxumağa gəlmişdi. Onun fikri-zikri dərs idi, təhsil idi, elm idi.

Həmin illərdə ali məktəblərdə dərslər briqada üsulu ilə gedirdi. Bütün qrup bir neçə briqadaya bölünür, briqadirin rəhbərliyi ilə dərsə hazırlaşırdı. Tələbələr yoxlamaya gələndə də briqada ilə, briqadirin başçılığı ilə gəlirdilər. Tələbə bəzən müəllimdən çox briqadir qarşı-

sında cavabdeh idi. Briqada isə bütünlükdə müəllim qarşısında cavabdeh idi. Bir tələbə dərsdən zəif olanda bütün briqada zəif sayılırdı.

Sinifdə dərs briqadaları bölünəndə Rübabə Gəldiyevin briqadasına düşdü. Tələbələr arasında danışırdılar ki, Gəldiyev qəsdən Rübabəni öz briqadasına, ya özünü Rübabənin briqadasına salıb.

Birinci sülsün ortalarına yaxın idi. Şirin məşğələlər gedirdi. Riyaziyyat dərsində Rübabə stulunu götürüb, Vahidin briqadasına yanaşdı ki: "Mən sizinlə oxuyacağam". Gəldiyev əvvəl sevindi və belə düşündü: "Mənə naz eləyir. Partkom üzvüyəm, vəzifə sahibiyəm. İstəyir mənimlə oynasın, bunu da camaata hiss etdirsin. Qızlar axı vəzifəpərəst olurlar..."

Rübabəyə işarə elədi: "Gəl öz yerinə!". Dərs arasında Vahidə kağız yazdı: "Xahiş olunur briqadandan yabançıları qovasan!" Vahid kağızı Rübabəyə göstərdi. Rübabə Gəldiyevə cavab vermədi. Gəldiyev başqalarının eşidəcəyi bir səslə Rübabəni çağırdı: "Qız, yerinə gəl deyirlər sənə!". Rubabə yenə etina etmədi.

Zəng çalınandan sonra, Gəldiyev saçını geri atdı, əlini cibinə qoydu, Rübabəyə yanaşıb, özünü tox tutdu:

– Dərsə şuluqluq-zad salmaq lazım deyil, gəl öz briqadana!

– Mən indi lap öz briqadamdayam, arxayın ol!

Qız bu cavabında möhkəm durdu. Gəldiyev tədris müdirinə dedi, dekanı çağırdı. Rübabə dediyindən dönmədi: "Mən Vahidin briqadasında oxuyacağam, vəssalam! Gəldiyev özü nə bilir, mənə nə öyrədə! Gündə üç-dörd dərs buraxır. Onun ucundan mən də imtahandan qala bilmərəm".

Nə dekan, nə sinif rəhbəri Rübabənin xatirinə dəydi: "Harada istəyir, qoy otursun", dedilər.

Rübabə bu rəftarı ilə Gəldiyevin sinəsinə sanki bir dağ çəkdi. Gəldiyev heç vaxt güman etməzdi ki, Allahın bir "artist" qızı onun hörmətini, vəzifəsini saymayıb sözünü yerə sala, hələ dalınca da artıq-əskik danışa. Gəldiyev zənn edirdi ki: "Qızda bu cürət, bu iddia olmaz. Rübabəni öyrədən var, dil verən var. Vahidin şətəli keçib".

Giley-güzarını dönə-dönə Rübabəyə çatdırsa, hətta onu hədələsə də qız briqadaya qayıtmadı. Sözündə möhkəm durdu. Deyəsən Rübabə Vahid ilə birləşib Gəldiyevə meydan oxuyur, ya yanıq verirdilər. Hələ bir dəfə Rübabə Gəldiyevin iclas açdığı zaman pıqqıldayıb gül-

müşdü də... Gəldiyev bunları təkrar-təkrar xatırlayır, içindən yanır, az qalırdı Rübabənin qolundan tutub məktəbdən bayıra tullasın.

– Yaxşı, – deyirdi, – baxarıq, ay artist qızı! Səni ayağıma gətirməsəm, qabağımda ağladıb, diz çökdürməsəm Gəldiyev deyiləm, Getdiyevəm! Sən məni arıçı oğluna satırsan? Sən məni iki pulluq eləmək istəyirsən, yaxşı, görərsən, başına, dizinə döyəndə görərsən!..

* * *

Rübabə ilə Vahid arasında ünsiyyət doğduqca, yaxınlıq artdıqca Gəldiyevdə intiqam hissi alovlanırdı. Doğrudur, Vahid adi bir tələbə idi, Gəldiyev ilə tutaşmağa tabı gəlməzdi, lakin bir adamı yıxmaq üçün tutarlı bir bəhanə də lazımdı. Əla oxuyan, hörmət qazanan bir tələbəyə nə ad qoyub, nə qara yaxasan?

Gəldiyev çox götür-qoy elədi. Eşdi-eşələdi, anketləri roman kimi maraqla oxudu. Çox axtardı, tərcümeyi-haldan yaxşı vasitə tapa bilmədi. O yan-bu yandan soraqlaşdı, Şuşaya gedən işçilərə "təşkilat" "adından" "rəsmi", "məxsusi", "məxfi" tapşırıq verdi. Vahidə gələn poçt kağızlarının bir neçəsini ələ keçirib açdı. Bir şey çıxmadı. Təsərrüfat müdirindən təqaüd üçün olan sual vərəqələrini istədi. Vahidin vəsiqələrini başdan-ayağa, ayaqdan-başa oxudu. Vərəqədə yazılmış bir cavabın üstünə barmaq basdı. Vərəqədə soruşulurdu: "Kənardan gəliriniz və orta hesabla aylıq miqdarı". Vahid cavab vermişdi: "Kənardan gəlirim yoxdur. Heç yerdə işləmirəm..."

Gəldiyev əvvəl bu vərəqənin surətini çıxartdırdı. Notariusda möhür basdırıb təsdiqlətdi, Vahidin cavabını çəkə-çəkə komsomol bürosunun iclasına gətirdi. Vahidin özünü də çağırıb, müttəhim kimi, qapı ağzında xeyli dayandırdılar və sonra dindirdilər. Onu bayıra çıxarandan sonra Gəldiyev ayağa qalxıb, partiya komitəsinin adından iclasa nəticə vermək istədi:

– Budur, mövhumatçılar demiş, şükür Allaha, uzaqda deyil, göz qabağındadır. Budur müzür ünsürün siması! Bu, Nayıbov Vahidin anketi, bu da altında podpisi! Yazır, gəlirim yoxdur. Fakt ilə, sənəd ilə isbat olundu ki, atası Şuşada sürü ilə arı saxlayır. Balın girvənkəsini də filan qədərə satır. Sağa da satır, sola da satır.

Kim isə yerindən söz atdı:

– Atasını danmır ha... O biri sualları niyə oxumursan?

Gəldiyev acıqlandı:

– Dayan, dayan, yoldaş!.. – O sözünə davam etdi: – ...Filan qədər satır, sağa da satır, sola da satır! Bu il hökumətə 225 manat naloq verib, bu nə deməkdir, yoldaşlar? Abman! Bu Sovet hökumətini aldatmaq deməkdir. Öz şəxsi mənfəətinin, necə deyərlər, xeyiri üçün bizi aldatmaq! Yox, yoldaşlar, bəsdir daha! Biz arıçılara aldanmarıq! Qoymarıq! Buna yol verməriк! Hələ biz o qədər də yatmamışıq ki, düşmən üstümüzü alsın. Görün ki, biz necə adamları instituta götürmüşük! Sabah sinfi düşmən, filan qədər rüşvət təklif edəndə, belə ünsürlər nə kombinasiya desən düzəldərlər. İnstitutu da, bizim özümüzü də torğa qoyub satarlar... – Gəldiyev hirsindən başını qaldırıb acıqlı dedi: – Qovmaq, institutdan, komsomoldan! Rədd etmək lazımdır belələrini ki, başqalara da sirayət eləməsin! İbrət, primer olsun!

Gəldiyev əli ilə havanı tuturmuş kimi qolunu irəli atdı:

– Təsadüfi deyil bu məsələ! Niyə Nayıbov ictimai işə yapışmır? Niyə Nayıbov poruçeneyə baxmır? – Gəldiyev bu suallara özü mənalı bir ifadə ilə cavab verdi. – Çünki mənfəət çıxmır, çünki pul gəlmir, xeyir olan yerə Nayıbov papağını basar. Atası arıların şirəsini sorub yaşadığı kimi, bu da biz proletariatı istismar ilə bəslənmək, oxumaq istəyir. Yoldaşlar, baxmayaraq ki, adımızı aktiv qoymuşuq, ancaq ki, indiyəcən kor olmuşuq, küt olmuşuq, belələrinə xərc tökmüşük. Bəsdir, daha son qoymaq lazımdır. Sayıq olmaq lazımdır.

Doğrudur, direktor Vahidin məsələsi müzakirə olunan iclasa gəlmişdi. Ancaq burada iştirak etmək, tələbənin taleyi ilə dərindən maraqlanmaq üçün gəlməmişdi. Vahid haqqında Gəldiyev onun qulağını doldurmuşdu. Gəldiyev "müzür ünsür, qolçomaq balası, tərbiyəsiz..." – deyə Vahidi direktorun gözündə tamam nalayiq bir adam kimi qələmə vermişdi. Hətta onun sənədlərindəki saxtalığı eşidəndə Verdiyev bir qədər vahiməyə düşmüşdü. "Sabah bunun da məsuliyyətini çəkməli olacağıq!"

İclasa ona görə gəlmişdi ki, müxtəsər bir məlumat versin, Vahid kimilərin məktəbdə təsadüfi olduğunu, deyənlər düz çıxsa hərifin əmr ilə kənar ediləcəyini komsomol bürosuna hiss etdirsin.

Beləliklə, Verdiyev bir tərəfdən məsuliyyəti boynundan atmış, verilən "siqnallara" vaxtında qulaq asdığını isbat etmiş olurdu. İkinci tərəfdən də yaxın dostu Gəldiyevin könlünü alır, onun Vahid haqqındakı

niyyətlərinə mane olmadığını bildirirdi. Üçüncü tərəfdən Verdiyev Vahidin qəbul işinin köhnə bir iş olduğunu, köhnə rəhbərlikdə bir səhv olduğunu söyləməklə özünün direktorluq vəzifəsində təmiz işləməyinə işarə edirdi. Dördüncüsü də bu idi ki, Vahidin işinə bu qədər diqqət və əhəmiyyət verildiyini görən başqa tələbələr, aydındır ki, "özlərini yığışdıracaq", "zabitəli" direktordan qorxub çəkinəcəklər. Bu da ki vəzifə başında, Verdiyevin fikrincə, ən mühüm şərtdir.

Nə isə, Verdiyev papirosunun kötüyünü söndürüb külqabına atdı, yoxlamasını belə başladı.

– Partkom nümayəndəsinin, Gəldiyev yoldaşın məzmunlu çıxışını komsomol yoldaşlar hamısı eşitdilər. Mən də diqqətlə qulaq asdım. Bu işin bir ucu əlbət ki, direktorluğa, birinci növbədə, bir direktor olaraq mənə gəlir.

Verdiyev büro üzvlərinin sükutla eşitdiyini görüb sözünü kəsdi, mənalı çıxsın deyə, bir xeyli stol üstündəki kağızlara baxa-baxa susdu. Sonra davam etdi:

– ...Bir direktor olaraq mənə gəlir... Bir ucu da mənə gəlir... Buna görə də bəzi səhv təsəvvür qalmamaq üçün mən aşağıdakı qısa məlumatı komsomol yoldaşlara deməliyəm. Əvvəla, Nayıbov buraya rayon komitəsinin xasiyyətnaməsi ilə daxil olub, işində bu var. Özüm baxmışam. İkincisi, onu köhnə direktor qəbul edib. Mənim zamanımdan qabaqdır. Niyə qəbul edib, necə qəbul edib, onu mən deyə bilmərəm. Gərək bu məsələ öyrənilə! Üçüncüsü, vəsiqələrin yoxlanmasını, şübhəli tələbələrə əl gəzdirilməsini mən özüm partkomdan, – direktor bütün oturanları süzdü. Sanki, kimi isə axtarırdı, – heyif özü burada yoxdur, şəxsən yoldaş Zahiddən xahiş eləmişəm. Bunu zənnimcə, Gəldiyev də bilir. Dördüncüsü, günah Nayıbovun sinif komsomol nümayəndəsindədir ki, indiyəcən xəbərdarlıq eləməyib. Beşincisi...

Komsomol bürosunun katibi Muxtar direktorun sözünü kəsdi:

– Hələlik beşi bəsdir!

Gəldiyevin odlu nitqindən, direktorun soyuq yoxlamasından sonra Vahidə tərəfdar duran az oldu. Təkliflər var idi ki: "Təhqiqat üçün komissiya seçilsin", "yüngül tərbiyəvi cəza verilsin, töhmət olunsun". Gəldiyev bu təklifi edənlərə az qalırdı ki, göz ağartması verə.

– Çürük liberallar düşmənin dəyirmanına su tökürlər ha!

Muxtar onun üzünə baxdı: "Sss!" – deyə sükut istədiyini bildirdi. Sonra sözə başladı:

– İki kəlmə də mən deyim. Vahid haqqında deyilənlər, əlbət ki, bir ittifaq üzvü üçün arzu olunan hərəkətlər deyil. Ancaq yoldaşlar unutmasınlar ki, canlı bir insan, özü də gənc, dünən kənddən gəlmiş bir gənc haqqında, onun taleyi haqqında söhbət gedir...

Gəldiyev Muxtarın sözünü lağa qoydu:

– Gəncdir deyə çıxsın otursun başımızda! Gənc olmağı yox ey, ünsür olmağı barəsində danış. Məsələ ünsür məsələsidir, ondan danış, yoldaş komsomol!

Gəldiyev məna ilə "yoldaş komsomol" dediyi üçün Muxtarın rəngində bir qızartı duyuldu. Kənardan baxanlar onun susacağını, ya sözünü dəyişəcəyini güman edərdilər, Muxtar da eyni qətiyyət və kəsərlə Gəldiyevin üzünə baxdı və dedi:

– Partkomun nümayəndəsi qoysa, danışarıq!

Gəldiyev əmr kimi ucadan dedi:

– Danış!

– Danışacağam, ancaq kimin xoşuna, ya bədinə gəldiyini hesaba almadan danışacağam! Gəldiyev yoldaş yaxşı bilir ki, bizim, komsomol komitəsinin borcu bir tərəfdən ayrı-ayrı üzvlərimizdə baş verə bilən intizamsızlığın, səhvin qarşısını almaqdırsa, ikinci tərəfdən ədalətsizliyə qarşı mübarizədir!..

– Burada hankı ədalətsizlikdən söz gedir?

– Gəldiyev yoldaşın dediklərində bu var! Açıq görünür!

– Nə var?

Muxtar istədi açıq desin ki, böhtan var.

– Ədalətsizlik var!

Gəldiyev özündən çıxmış kimi yerində çalxalandı, əlini cibinə salıb çıxardı. Sanki bir şey axtarırdı. Kostyumunun yaxalığından tutub çəkdi, əlindəki qələmi dönə-dönə stola vurub, yerə atdı:

– Müzür ünsürləri ifşa etmək ədalətsizlik imiş?! – Gəldiyev mənalı-mənalı Muxtara, sonra da dönüb Verdiyevə baxdı: – Mən başa düşmürəm. Başa düşə bilmirəm ki, Muxtar nə danışır! Bu nə havadı çalınır!..

Komsomolçulardan biri söz atdı:

– Muxtar aydın danışır!

Gəldiyev dönüb səs gələn tərəfə baxmaq istəyirdi ki, Muxtar daha ucadan səsləndi:

– Qoy mən sizi başa salım, yoldaş Gəldiyev! Vahid haqqında deyilənlər söhbətdir. Bəlkə bunlarda həqiqət var, amma nə qədər ki, sübuta yetməyib hələ söhbətdir.

– Bəs arıçılıq?..

– Arıçı, tək təsərrüfatçı, zəhmətkeşdir. Onun balası institutda oxuya bilər, oxutmaq borcumuzdur. Bunda Vahidin bir günahı yoxdur.

– Sluşi, Muxtar, burada su çıxmaz arx-zad yoxdur. Bir müzür ünsür soxulub içimizə, qovaq getsin də! Nə çətin şey var?

Muxtar başını tovladı:

– Bu çox çətin işdir!

– Lap bu gün əmr vermək olar!

– Sənin sinəndən təpik ilə vurub küçəyə salsalar xoşuna gələr?

Gəldiyev əlini tovladı, kinayə işlətmək istədi:

– Sağ ol, doğrudan sağ ol! Gör məni kimə tay elədin?! Sən məgər düşmən ilə məni bir sırada eləyirsən?

– Olmaz ey, komsomolçu ilə belə inzibati rəftar yaramaz. Adamların taleyi ilə oynamaq olmaz. Vahid təşkilatın üzvüdür, səhvi olsa da birdən-birə kənara atmaq təhrifdir. Sabah Bakı Komitəsi bizi çağırıb üzümüzə tüpürər.

– Üz məndə, qoy tüpürsün. Bakı Komitəsi deyir düşməni yuxarı başa keçir?

– Nə düşmən, ay yoldaş Gəldiyev! Cavan oğlandır, dünən ana qucağından, sovet məktəbindən gəlib, bu gün düşmən! Əcəb məntiqdir. Yerindən qalxan düşmən! Cavan adamdır, səhvi var, borcumuzdur tərbiyə edək, kömək eləyək düzəltsin! Bizi niyə seçiblər bəs!

Gəldiyev əlindəki qələmi stola çırpıb səsinin qətiyyətini artırmağa, oturanları inandırmağa çalışdı:

– Mən doğrusunu bilmirəm, yoldaş komsomollar şutkaya qoyublar, ya nədir? Bura tərbiyə yeri deyil, oxumaq yeridir. Tərbiyəni indiyə qədər almalı idi. Nayıbov on il məktəb skamyasında oturub, tərbiyə almayıb, indi gəlib institutda – ali məktəbdə tərbiyə alacaq? Hökumətin ayda 180 manat lişni pulu yoxdur spekulyanta versin, desin: gəl ye, iç, oxu. Sabah da işimiz bərkə düşəndə, məsəl deyirəm, dön özümüzə, protiv get!

Uzun mübahisə və deyişmə düşdü. Axırda qət olundu ki, təhqiqat getsin. Vahidin sənədlərini yoxlatmaq direktora tapşırılsın. Verdiyev ha cəhd elədi ki: "Burada həll olunsun da, direktor da elə burdadır!".

Gəldiyev razı olmadı:

– Sənə tapşıranda nə olar, ay yoldaş direktor? Biz əlbir işləyirik, təfavütü nədir, sən, ya mən?..

– Mən deyirdim təşkilatın əli ilə olsun...

– Direktor da bir təşkilatdır, ya yox?

Gəldiyev bu qərara nail olandan sonra Muxtara tapşırdı ki, protokolun üzünü tez partkoma göndərsin. Sevinə-sevinə iclasdan çıxdı. Ürəyində təkrar etdi: "Direktora tapşırılsın", nə tapşıraram, necə tapşıraram, o mənim işimdir! Əmrə qol çəkiləndən sonra qoy hərif hara gedir getsin, hansı iclasa qoyur qoysun. Axırı gəlib mənə çıxacaq!

* * *

Vahidin institutdan qovulmaq xəbərini eşidəndə Rübabə bərk narahat oldu. Dərsdə otura bilmədi. Tənəffüs zamanı yoldaşları ilə bu əmr haqqında danışırdı ki, direktor sinfə girdi. Verdiyev binaya baxır, otaqları gözdən keçirir, özünə daha münasib otaq seçmək istəyirdi. Rübabə fürsətdən istifadə ilə soruşdu:

– Yoldaş Verdiyev, deyirlər bizim sinif tələbəsi Nayıbov Vahidi xaric ediblər.

– Vahid Nayıbovu?

– Bəli!

– Necə bəyəm!

– Doğrudurmu?

– Əmr var.

Rübabə dedi:

– Yaxşı olmadı.

Direktor istehza ilə ona baxdı, getmək istəyən bir meyl ilə dedi:

– Vahid ilə nə çox maraqlananlar var!

Rübabə qızardı:

– Xeyr, mən bir tələbə kimi maraqlanıram.

– Bəs biz necə yanaşırıq?

– Onu özünüz bilərsiniz!

– Bacım, – dedi, – Vahidi mən qovmuram, mən də götürmürəm. Bu məktəbin sahibi var, təşkilat var, mən də təşkilatın bir üzvü. Direktor özbaşına heç bir iş görmür. Partkom var, yerli komitə var, komsomol var. Birgə həll olunur. Belə sualları qapıda, sinifdə danışmaqdansa get

təşkilatdan soruş, səni başa salsınlar. – Direktor bunu deyib Rübabənin daha sərt cavabını eşitməmək üçün tələsik sinifdən çıxdı.

Rübabə axşam, dərsdən sonra Vahidi çox axtardı. Dərs otaqlarını, kitabxananı, komsomol komitəsini bir-birinə vurdu, tapa bilmədi. Gördüm deyən yox idi. Tramvaya oturub, aerokluba gəldi. Səhər orada imiş, rayona gedəcəyini söyləyirmiş.

Rübabə mərkəzi kitabxanaya baş vurdu. Qiraət zalında Vahidin bir stolu vardı. Boş vaxtlarında burada oturub mütaliə edər, yazar, pozardı. Rübabə dəfələrlə onu burada tapmışdı. Qızı görən kimi qələmini qoyar, barmaqlarının ucunda yeriyə-yeriyə qapıya çıxardı. Rübabə təklif etmişdi ki: “Yataqxanada imkan yoxdursa, gəl evdə çalış. Boş otaq var”. Vahid razı olmamışdı:

– Bilirsən, – demişdi, – Rübabə, hər dəqiqə bir kitab lazım olur, oxuduqca daha başqasına ehtiyac duyursan. Bilik aclığı heç bir aclığa bənzəməz. Bu iştahanı ödəmək olmur. Bəzən bütün oxuduğun kitablar çoxdan tamaşa edib ötdüyün bağça kimi gəlir, daha başqa yerlər görmək istəyirsən.

Bu kitabxana dəryadır. Toz basmış qəfəslərdə yatıb qalan, zahirən bayazlara oxşayan köhnə kitablarda, o dəri cildlər arasındakı əprimiş kağızlarda xalqların tarixi, insanların həyatı, minlərcə istedadların hissi, fikri, zəkası saxlanılır. Hər adam bir ömür yaşayır, oxuyan isə bir çox alimin də həyatını yaşayır. Keçmişlərin duyduğunu duyur, düşündüyünü düşünür. Bu kitablardan doymaq olmur. – Bir şey yadına düşmüş kimi Vahid səsinə məsum ifadə verərdi: – Bizim gənclərdə bilik arama, həvəs küləyi hələ bu qəfəslərin arasına əsməyib, hələ buranın havası əməlli-başlı təmizlənməyib. Havaxt gələrsən, ya haqq-hesab gedir, ya təmir. Mənim işimi aşıran o qoca çeşməkli kişi canlı arxivdir. Nə dildə, hansı elmdən, hansı çapdan olur olsun, kitabın adını çək, kişi barmağını gicgahına qoyur, gözünü qırpır, o saat yerini deyir. Gedək səni də tanış eləyim, gərəkli adamdır...

Deyəsən dünən idi, Vahid Rübabəni qoca kitabxanaçıya belə təqdim etmişdi:

– İstedadlı tələbə qızlarımızdandır, tanış olun. Elə bilirəm ki, bunun da sizə çox işi düşəcək. Kitabın dostudur...

Rübabənin ürəyindən həm sevincli, həm kədərli bir xatirə keçdi:

“Vahid bu sözlərilə mənə hisslərini deyirdi, tələbələr arasında dedi-qodudan ehtiyat edib demədiyi sözlərini burada, qoca kitabxana-

çının qabağında necə də uca səslə deyirdi. Yenə də bir şeyi gizlədirdi. Kitaba, kitabxanaya dəxli olmayan bir şeyi, lakin haqqında danışanda könlünü oynadan, qəlbini titrədən bir şeyi demirdi. Bəlkə də onun üçün başını aşağı salır, dəqiqələrlə dinmirdi...”

Bunlar nə qədər şirin və xoş idisə də məşğul olmağa vaxt yox idi. Vahidi tapmaq, danışmaq lazım idi.

Şər qarışmışdı. Bu zaman Vahid yataqxanada olardı. Rübabə oraya getmək istədi. Fikrinə gəldi ki: “Tələbələr söz eləyərlər”. Aşağıya, dəftərxanaya düşdü. Süpürgəçidən başqa kimsə yox idi.

Telefonla yataqxanaya zəng vurdu, dalandardan soruşdu. Dalandar axtarmağa getdi. Rübabə telefon qabağında intizar içində çox gözlədi. Bir də səs eşidildi:

– Alo, 14-cü otaqda Nayıbov olmur, gedib.

Rübabə yəqin elədi ki, Vahid şeylərini yığışdırıb, yola düşüb.

Bu xəbər deyəsən bir çəngəl kimi onun ruhunu çəkib bədənindən ayırdı. Sanki bütün ümidləri puça çıxdı, dayandığı yerdə dondu, sinəsindən soyuq bir ah qopdu. İxtiyarsız dəhlizin xəlvət tərəflərinə yeridi, portfelini qucaqladı, üzü pəncərəyə dirsəklənib dayandı. Könlünə anlaşılmaz bir qubar gəldiyini, gözlərinə xəyali bir pərdə endiyini, nəfəsinin ağırlaşdığını, əsəblərinin titrədiyini, sanki vücudunda bütün qüvvələrin tükəndiyini hiss etdi. Gözləri yaşardı. İsti dodaqlarını gəmirdi. Zehnində odlu bir həsrət dilləndi: “Vahid! Vahid!..”.

Heç yerdən cavab gəlmədi. Yalnız dolu gözlərindən iki inci yanaqlarına yuvarlandı. Qız ovucları ilə üzünü örtdü: “Vahid, məndən də incidin? Mənim nə günahım? Nə üçün görüşmədən getdin? Yoxsa tərk etdin. Etibarsız!”.

* * *

Rübabə institutdan çıxanda nə qədər özünü toxtatmaq, bikefliyini gizlətmək istəyirdisə olmurdu. Anlaşılmaz bir sükut, üzüntülü bir intizar onun hərəkətlərindən sezilirdi. Divar dibi ilə yavaş-yavaş yeriyir, qaşlarının düyünü açılmır, ürəyindəki boşluq qapanmırdı. O, ha çalışırdı ki, özünü iki il bundan əvvəlki, Vahidi görməmişdən, tanımamışdan əvvəlki kimi tox və toxtaq saxlasın, olmurdu. Deyəsən heç o, Vahidsiz yaşamamışdı. Onsuz bir dəqiqəsini xatırlamırdı. Deyəsən Vahid onun həmişəlik və əvəzsiz munisi olmuşdu. Bütün gecəni fikir-xəyal

ilə keçirdi. Ancaq yaxşı bilirdi ki, qovrulmağın, ya ağlamağın xeyri yoxdur. Bu saat Vahidə əldən gələn köməyi etmək lazımdır...

Səhər dərsdən qabaq oturub bir məktub yazdı:

"Vahid, salam! Etibarsız! Nə üçün görüşməmiş getdin? Beləmi rəftar edərlər? Muxtar ilə danışdım. O da bərk etiraz edir. İşini Bakı Komitəsinə bildirəcəyik. Verdiyev ilə ağızlaşdım. Daha qəti danışacağam.

Şad xəbər: bütün sinfimiz direktorun əmrindən narazıdır. Komsomolun kömək edəcəyinə şübhəm yoxdur. Mümkün qədər tez qayıt. Gedib kənddə qalma. Atan barədə kağız-kuğaz düzəlt, gəl, təşkilat bizim tərəfimizdədir. Ruhdan düşmə, ürəyinə salma... Gözləyirəm.

*Kübabə"*

* * *

Vahidin məktəbdən kənar edilməsi haqqındakı əmri oxuyanda Muxtar təəccüb elədi. Komitə üzvlərinin belə bir əmr hazırlandığını xəbər verən işarələrinə Muxtar heç bir zaman inanmamışdı! "Komitədə müzakirə etmişik. Tərbiyəvi təsir ilə, komsomol cəzası ilə kifayətlənmək fikrindəyik" demişdi. Birdən-birə, həm də komitədən xəbərsiz Verdiyevin belə bir əmr verməsi təəccüblü idi.

Deyəsən onun vəziyyətindən xəbər tutduğu, yaxud nəsə məsləhətləşmək istədiyi üçün Kərim Gəldiyev onu çağırdı. Zəng çalınan kimi Muxtar telefon dəstəyini götürdü. Kərim salamsız-kəlamsız, bir qədər də hirsli danışdı:

– Komsomol, nə oturmusan orda, dur bura gəl.

– Yanımda yoldaşlar var.

– Yola sal, gəl!

Muxtar Gəldiyevin otağına girəndə bir neçə nəfər tələbənin ayaq üstündə dayandığını gördü. Dərsə gecikmişdilərmi, iclasa gəlməmişdilər, ya hansı tapşırığı yerinə yetirməmişdilərsə, Gəldiyev onları danlayırdı. Onlar üzr gətirmək istəyəndə macal vermir, acıqlanırdı?

– Yaxşı, yaxşı! Obyektiv səbəblərlə öz nöqsanlarının üstünü örtmək bolşevikə yaraşmaz, bəsdir. Səhvi namusla boynuna almaq əvəzinə, müxtəlif bəhanələr də gətirmək istəyirlər, bilirsiniz belə povedenya üçün adamı...

Gəldiyev cümləsini bitirmədi, guya hirs onu kəsirdi. Sanki dayananların heç bir sözünü eşitməmək üçün qətiyyətlə dedi:

– Gedin izahat yazın, iclasda müzakirə eləyəndə danışarsınız, di gedin!

Gəldiyev Muxtarı görəndə yanındakıları aşkarca qovdu:

– Di çıxın! Çıxın, işimiz var, mane olmayın!

Gəldiyev həmişə səsinə, hərəkətinə sirli bir ahəng verməyi sevərdi. İstərdi ki, adamlar onun ən adi sözünün, ən sadə hərəkətinin dalısında "xüsusi bir məna" duyub ehtiyat etsinlər, özlərini yığışdırsınlar. Bu, ona anlaşılmaz bir hakimiyyət zövqü verməkdən başqa onun vəzifəsinin, işinin də əhəmiyyətini qat-qat artırırdı. O, az danışır, ancaq danışığına çox məna verirdi. Bir adama onun dik baxmağı, yanakı baxmağı, gözucu nəzər salmağı, ya oğru güdən kimi tünd baxmağı, ayrı cür mənalar verirdi. Elə tələbə olurdu ki, Gəldiyevin işini başa düşmür, bu cür baxışına məna verməkdə, səbəb axtarmaqda çox düşünür, çətinlik çəkirdi. Gedənlərin dalısınca qara müşəmbə ilə şpallanmış qapını bərk basıb qayıtdı. Cibindən çıxardığı bir dəstə açarla dəmir seyfin qapısını açdı. Səliqə ilə qalanmış qovluqlar üstündən "Kommunist" qəzetini götürdü. Muxtara tərəf uzatdı.

– Oxumusan?

– Yox!

– Təəssüf, çox təəssüf ki, oxumamısan, buyur oxu! – Kərim səsinə ağır təmkin və zəngin məna ahəngi verərək dedi: – Mən deyəndə ki, sinfi sayıqlıq bu saat hər bir kommunistdə, komsomolda əsas keyfiyyətdir, sizlər, siz komsomolçuların bəziləri xırda burjua səhlənkarlığı ilə qulaqardına verirsiniz. Siz elə bilirsiniz bu sözləri biz özümüzdən deyirik. Elə bilirsiniz ki, bunları biz patalokdan alıb sizə deyirik. Daha başa düşmürsünüz ki, bunlar hamısı partiyanın gündəlik direktivləridir. Bunlar hazırkı siyasi momentin zəruri tələbləridir. Bunlarsız bir dəqiqə yaşamaq, işləmək, kütlələrə rəhbərlik etmək olmaz. Bunlarsız beynəlxalq vəziyyətin mürəkkəbliyində oriyentasiya olmaz! Yoldaş Muxtar, bəs haçan bunları siz öz komsomol üzvlərinizə başa salacaqsınız, haçan?

Muxtar qəzetin sayıqlıq haqqındakı baş məqaləsini oxuya-oxuya Gəldiyevin qəzəbinin səbəbini sanki bilmək istədi:

– Nə olub yenə?

Gəldiyev sanki məhz belə bir sual, sanki lap bu sualın özünü axtarır, gözləyirdi. Səsini ucaltdı, əl-qolunu ölçərək eşik otağa, komsomol komitəsinə tərəf işarə ilə dedi:

– Nə olacaq? Bu siyasi momentdə, sinfi mübarizənin bu kəskin şəraitində komsomolçular səfərbər olub, partiya komitəsinə kömək etmək əvəzinə, tədbirlərimizə açıqcasına mane olurlar, aralıqda söz gəzdirirlər. Burjuaziyanın dəyirmanına su tökürlər. Bəlkə də düşmən əlində alətə çevrilirlər.

– Axı nə olub?

– Dünən direktor əmr verib, bir müzür ünsürü institutdan kənar edib, bu gün ayrı-ayrı komsomollar rəhbərliyin əmrini, necə deyərlər, təftiş etmək istəyirlər: "Niyə, nə üçün? Kəskin əmrdir, filan!".

Sən o məqaləni diqqətlə oxu, Muxtar, – sonra da əli ilə otbiçən kimi yarımdairə hərəkət cızaraq, havanı qətiyyətlə kəsdi: – Lap kənar olunmalıdır! Barəsində lazım gəlsə, ən qəti tədbir götürmək lazım gələcək. Biz daha nyançit eləməyəcəyik. Lenin demişkən: "Az olsun, yaxşı olsun". Qoy dörd yüz olmasın, üç yüz olsun, lap bərkə qalanda iki yüz komsomol olsun, amma yaxşı olsun. Qızıl qvardiya kimi olsun, tərəddüd eləyən, maymaq olmasın. Sinfi şüurca mağmun adamlar olmasın.

– Bizim komsomol təşkilatımız sağlam təşkilatdır.

– Əsasən, əlbət ki, amma içində Vahid kimi ünsürlər hələ var. – Gəldiyev əlini stola vurub, təkrar etdi: – Yoldaş komsomol, hələ var! Siyasi məsələlərdə güzəştə getmək olmaz! Hələ tökülüb qalıb, düşmən hələ bizim aramızda çalışır, yatmayıb. Biz hələ çoxlarını ifşa edə bilməmişik. Hansı ki, vacibdir. Hələ sıralarımızı lazımınca təmizləyə bilməmişik.

Muxtar özünü saxlaya bilmədi:

– Vahidə nə olub axı, ay yoldaş Gəldiyev? Doğrusunu başa düşmürəm ki, Vahid bu ağır cəzaya, bu ağır ittihamlara nə üçün hədəf olub? Mən bunu başa düşmürəm!

Kərim qulaq asmaq istəmədi. Şəhadət barmağı ilə qəzetə işarə etdi, ucadan dedi:

– Sənə dedim o məqaləni oxu! Diqqətlə oxusan, başa düşərsən!

– Mən bu məqaləni radio ilə eşitmişəm, indi də oxuyuram. Amma Vahid kimi qabiliyyətli bir gəncin bizim institutda nə üçün təqib olunduğunu başa düşmürəm.

Kərim stol dalından keçib, Muxtarın qabağını kəsdi, başını yanakı tutub təhdid ilə soruşdu:

– Sən buna təqib deyirsən?

– Təqibdir, təqib deyilsə, doğrudan da bu adamın bir mühüm günahı varsa, açın bizə də deyin! Bütün tələbələrə deyiləsi deyilsə, yoldaş Gəldiyev, mən burada komsomol katibiyəm, heç olmasa mənə deyin! Siz komsomolçulardan gileylənirsiniz, nahaq gileylənirsiniz. Əksinə, partkom üzvlərinin rəftarı bizə aydın deyil. Vahidin qovulması tələbələr arasında suala, danışığa, narazılığa səbəb olur, açıq danışırlar. Siz bəyəm bunu görmürsünüz?

– Narazılığı bəlkə təşkil edən var, bəlkə burada da bir düşmən əli var, yoldaş komsomol? Düşmən hiyləgərdir. Bu saat hər vasitədən istifadə edib, sizin bəzi komsomollar kimi, şatayuşşiləri özünə tərəf çəkmək istəyir. Kapitalist əhatəsinin qanunu belədir, yoldaş komsomol! Qafil olmaq cinayətdir. Dörd tərəfimiz kapitalistdir, hansı ki, hər dəqiqə bizə qarşı vuruşur, biz qalib gəldikcə sinfi mübarizə kəskinləşir. Biz indi hər addımda düşmən axtarmalıyıq. Lap evimizdəki o ata-anamıza, arvadımıza da inanmamalıyıq! Çünki bəlkə düşmən agentidir. Çox da ki, ata, ya anadır. Zahirə baxmaz! Bəli, bəli! Sənə deyirəm siyasi məqalələri yaxşı oxu! Oxu, görərsən orada yazılıb ki, sinfi düşmən necə hiyləgərdir. Necə rəzildir, necə alçaqdır.

Muxtar bir qədər susdu, sonra Gəldiyevin sözünə şərik oldu:

– Burada doğru yazılıb ki, sinfi düşmən hiyləgər, maskalıdır. Bütün bunları oxuduqca, doğrusu acığınız tutmasın, Kərim Gəldiyev, sizin hərəkətlərinizdən şübhələnirəm, düşmən əli bəlkə sizin bu təlaşınızda, bu canfəşanlığınızda, doğrudan da düşmən əli var axı, yoxsa bir gəncin dalınca bu qədər zurna-balaban çalmaq heç yerdə görünməyib.

Gəldiyev ayağa qalxır, bir əlini telefon dəstəyinə, o birini sağ cibinə qoyub, Muxtara baxır, gözü qızarır:

– Mən qulaqlarıma inanmıram! Sən məndən şübhələnirsən? Ədə, komsomol, məndən şübhə?

Muxtar ayağa qalxıb yumruğunu kürsüyə döydü:

– Lap səndən şübhələnirəm. Bəyəm sən Marksın bacısı oğlu zad deyilsən ki! Çox sənin kimi cibində bilet gəzdirən təsadüfi adamlar yüzlərlə cavanlarımızı cürbəcür çirkab ilə ləkələyib. Məktəbdən, zavoddan kənar ediblər. Bu bəyəm gizli bir işdir? Odur Ukrayna traktor-

çusu, odur Kuban yazıçısı, odur Bayıl fəhləsi, hərəsinə bir iftira yaxanlar kimlərdir? Belə düşmənlər doğrudan da var!..

– Mən qulağıma inanmıram, üçillik partiya üzvü Kərim, gör dünənki uşaqlar sənin üzünə nələr deyirlər! Gör komsomol təşkilatı nə zibillənib...

– Lazım gəlsə, bundan da artığını deyə bilərəm. Arxayın olun, sizin gənclər arasına şübhə toxumu səpməyinizi biz duymuşuq və lazımi təşkilatlara da xəbər vermişik. Vaxt gələr, müzakirə olunar, görərik: bu institutda komsomollar artıqdır, ya bəzi adını kommunist qoyanlar?

– Sən yəni belə dil açmısan?

– Mənim dilim həmişə açıq olub, açıq da olacaq!

– Olsun, baxarıq!

– Baxarıq.

– Görərik.

– Sağlıq olsun!

### İkinci fəsil

Gəldiyev Vartaşendə taxıl tədarükü müvəkkilliyində çalışanda ya xamlıq ucundan, ya ehtiyatsızlıqdan, ya da ayrı səbəbdən bir balaca dolaşan kimi olmuşdu. Özündən soruşsan deyər: "Yoldaşa daverit eləmişəm, başıma bu işlər gəlib".

Rayon icraiyyə komitəsinin sədri yazdı ki: "Ay Kərim, filan qədər taxıl burax!". Kərim buraxdı. Torpaq şöbəsi dedi: "Qəşəng oğlan, arpa ver, atlar acdır". Qəşəng oğlan verdi. Bir başqası zəng elədi ki: "Yoldaş Gəldiyev, bir-iki tay buğdaya gümanın gəlməzmi, bacı oğlunun toyudur, darda qalmışıq". Gəldiyev də rədd eləmədi. "Yoldaş tədarükçü, vacib yer üçün on beş torba taxıl ayırıb mənim sərəncamıma göndərməlisən". Tədarükçü əməl elədi...

Gəldiyevin işləri öz qaydasınca gedirdi. Anbardan ağ, dolu torbalar azalır, yer genişlənirdi. Bunun əvəzində məxaric qovluğundakı qəbzlərin, xahiş kağızlarının sayı artır, hesabı çoxalırdı. Axırı bir gün atası rəhmətlik hesabdar Gəldiyevi ayıltdı.

Güman eləməyin ki, indiyə qədər Gəldiyevə məsləhət demir, öyrətmirdilər. Yox! Hər dəfə, əl boyda qəbzlərə, ya dilucu tapşırığa,

anbar açdırıb taxıl buraxanacan Gəldiyevin canı boğazına yığılırdı. Nə hesabdar yazır, nə anbardar buraxır, nə də fəhlə taya yaxın gəlirdi. Hamısı nəm-nüm ilə tərpəşirdilər: "Canım, sabah kim cavab verəcək? Ordersiz-mordersiz, hesabsız-kitabsız bu taxıl hara gedir?.."

Gəldiyev hirslənirdi, partiya kitabçasını çıxarıb sol ovcunda tutur, sağ əli ilə meşin cildə elə şappıldadırdı ki, eşidən dik atılırdı:

– Bu cavab verəcəkdir ey, bu! Qaragöz bileti cibində gəzdirən oğlan atveçatdır! Sizin qarnınıza niyə sancı dolur? Sizə deyilir: ver, ver! Daha uzun müşərrəf lazım deyil. Daverit eləyib bizi bura qoyublar!

Gəldiyevin hərbə-zorbasından qorxan da olurdu. Əl-qolu gəlməyən, çəkilib mat-məəttəl qıraqda dayanan da olurdu. Xoruz kimi kişi ilə döş-döşə gələn, ora-bura yazan da hərdən tapılırdı. Ancaq Gəldiyevin arxası möhkəm idi. Atalar yaxşı deyib: "Arxalı köpək qurd basar!". Artıq-əskik danışanlar haqqında, görürdün, Gəldiyev zəng elədi, danışdı, sonra əmr verib başmaqlarını bayırda qoydu.

Gəldiyev işini elə qurmaq istəyirdi ki, əlinin altındakılar "yumurta yükü aparsınlar". Bu zabitə bəzilərinin lap xoşuna gəlirdi.

Gəldiyev aşağı işçilərin sözünə fikir vermirdi. Çünki onlardan heç bir təhlükə gözləmirdi. Fikri həmişə yuxarıda böyüklərdə idi. İnanmışdı ki: "Qulluq işində, adamı yıxan-tikən sədrin, naçalnikin bir qırmızı qoludur".

Ona elə gəlirdi ki, bu qəzet, tənqid, yoxlama-filan hamısı əvvəlcədən "böyüklər yanında aşı bişirilmiş adamlar üçündür. Allah dəyməyənə, bəndə nə eləyəcək". Gəldiyevin qənaəti bu idi. İndiyə qədər də bu etiqadla işləmişdi. Hələlik ziyan görməmişdi.

Rayonda bir hadisə oldu. Ondan sonra Gəldiyevin gözlərindən pərdə çəkildi. Etiqadları da altına su düşən divar kimi uçulub töküldü.

Hadisə deyəndə, böyük düşməsin, rayon icraiyyə komitəsi sədrinin İskəndər adlı bir katibi var idi. Avadanlıq üstündə müəllim ilə sözləri çəp gəlmişdi. Katib müəllimə demişdi: "Xuliqan!"

Müəllim başını aşağı salıb getmişdi. Qıraqdan baxanlar müəllimin qorxaqlığına gülmüşdülər, bəziləri də demişdi: "Hökumətdir, qorxmasın, nə eləsin!".

Müəllim qoçaq nə din, nə danış, götür ərizə yaz, İskəndəri məhkəməyə ver! Rayon məhkəməsi, düzdür, müəllimin ərizəsini dəftərə salıb nömrələmişdi, amma sonra bu ərizə saqqız olub məsul işçilərin ağzında çeynəndi. Qapalı aşxananın qabağında rayon icraiyyə komitəsi

sədri əllərini cibinə qoyub gülür, dili ilə dişlərini təmizləyir, müəllimə deyirdi:

– Söz deyəndə təşəxxüsünə dəyir, ay müəllim! Ərizəbazlıq eləyirsən, sovet məhkəməsinin də vaxtını alırsan... bu necə işdir?

Müəllim dedi:

– Yoldaş İsmiyev, sən rəsmi kommunist sayılırsan.

– Rəsmi niyə?

– Cibində kitabçan-zadın var da, kommunist sayılırsan, gərək yadında ola ki, insan şəxsiyyətini bizim ölkədə uca tuturlar. Vətənimiz belə olmasaydı, mən baş götürüb diyarbadiyar gedərdim. Mənim üçün izzəti-nəfs hər şeydən əzizdir. Öz şərəfini qorumayan nə vətənin, nə də xalqın şərəfini qoruyar. Bizim ölkədə heç kəsə ixtiyar verilməyib başqasını təhqir eləsin. Məhkəmə mənim ərizəmə ədalətlə baxmalıdır. Arxayınam ki, baxacaqdır. Siz katibinizin sözünü qulaqardına verirsinizsə, bu da sizin öz işinizdir.

İsmiyev müəllimi lağa qoydu. Gəldiyev də qəh-qəh çəkdi:

– Padumiş!.. Müəllim, bu od-atəşlə sizi bura kim göndərib?

– Mən özüm gəlmişəm.

– Gəlmisən, başını sal aşağı, işində ol! İdarədə adamla söz olar, artıq-əskik də olar. Bundan ötrü daha qiyamət qopmaz ki!

– Qiyamət-zad qopardan yoxdur. Bəzi işçilərə danışmaq lazımdır.

– Sən elə o körpə uşaqlara öyrət, qalanlar ilə işin yoxdur.

Gəldiyev sədri çağırdı:

– Əşi, gəl bəri!..

Onlar aşxanaya girib təzədən qabaq-qabağa oturdular.

Müəllim ovqatı qarışmış halda ağzını çevirib küçə aşağı getdi.

Üç gün çəkmədi, bir də gördülər, budur, maarif komissarının müavini icraiyyə komitəsinin qapısından içəri girdi. Salam-kalam elədi. Bir az məktəblərdən, məktəblilərdən xəbər aldı. Sonra başladı müəllimin təhqir olunması barəsində dəftər-kitab açmağa. İsmiyev and içdi ki: “Canım, təhqir-filan olmayıb, siz allah şişirtməyin, ona bircə kəlmə “xuliqan” deyilib, lap xuliqan olanda nə olar? Burjuaziya deyilməyib, qolçomaq deyilməyib, opportunist deyilməyib. Burada nə var axı?”.

Komissarın müavini hamıdan çox Gəldiyevi heyrətə salmışdı. Gəldiyev onun, o böyük qulluq sahibinin elə bir iş dalınca gəlməsinə inana bilmirdi. Öz-özünə deyirdi: “Taxıl hazırlığı deyil, plan deyil, tə-

darük deyil, iclas deyil, bir dılğır müəllim üçün də komissar müavini gedərmi?..”

O yandan da rayon məhkəməsindən maddə gətirdilər. İskəndəri müttəhim kimi dindirdilər. İsmiyev ha zəng elədi: “Ay yoldaş məhkəmə, pustyak işdir, sürtün getsin”. Prokurora papaq açdı, mümkün olmadı. Məhkəmə sədri deyirdi:

– Qanunnamədə nə yazılıb, o cür də rəftar olunacaq...

Dostlar özlərini yığışdırıb, İskəndərə qahmar çıxınca, kişini camaat qabağında mühakimə elədilər.

Qəribə işlər var. Həmin İsmiyev qardaşdan artıq istədiyi, idarəsinin dirəyi saydığı İskəndəri qulluqdan qovmalı oldu. Əmrə qol çəkəndə başını bulayıb, öz-özünə deyirdi: “Gör nə boş işdən ötrü...”

Dedim ki, komissar müavininin gəlməyi Gəldiyevi heyrətə salmışdı. Bu heyrət get-gedə ehtiyata çevrildi. İskəndərin işin görəndən sonra Gəldiyev özünə gələn kimi oldu. Hesabdar ona məsləhət gördü ki: “Çıx bu rayondan. Bu işlərin axırını fəna görürəm. Firqəçi adamsan, sənə yermi əskikdir?! Hara getsən vəzifə var. Dost-aşnaya o qədər də bel bağlama...”

Ömründə birinci dəfə idi ki, Gəldiyev, dili ilə olmasa da başını tərpədərək, aşağı vəzifəli bir adamın sözünü təsdiq edirdi. Gəldiyevin böhran keçirdiyi həmin bu günlərdə Bakıdan təşviqat şöbəsinə kağız gəldi ki, “Fəal rayon işçilərindən bir nəfərini mərkəzə ali məktəbə göndərin. Həmkarlar beşminliyi hesabına təqaüd alacaqdır”.

Təşviqat şöbəsi müdiri rayon icraiyyə komitəsi sədrilə məsləhətləşdi. İsmiyev həmin kağızı oxuyanda Gəldiyev irəli yeriyib yalvardı:

– Yoldaş İsmiyev, – dedi, – bu mənə yapışır. Ali məktəb əsil mənim yerimdir, göndər gedim!

İsmiyev etiraz eləmirdi. O yan-bu yandan deyirdilər ki: “Kərim dünən savad kursundan çıxıb; ali məktəbə getmək üçün bilik lazımdır”.

İsmiyev rədd elədi:

– Firqəçi adamdır, öyrənər. Mən Gəldiyevi göndərmək tərəfdarıyam! Özü təcrübəli, özü inanılmış, özü...

Gəldiyev Vartaşendən lap arxayın çıxdı.

Ona görəmi ki, tutduğu işlər düz idi, ya özü bu işləri düz sayırdı? Ona görəmi ki, cəsarətli idi, məsuliyyətdən qorxmurdu? Ona görəmi ki, yoldaşlarının sədaqətinə inanırdı, yamana dil bulamayacaqlarına əmin idi?

Yox!

Ona görə arxayın çıxdı ki, özünün partiya kitabçasını, şəxsi işini, vəsiqələrini, yoxlamalarını tamam yığışdırıb aparırdı. O, bu əqidədə idi ki, insan çıxdığı idarədən şəxsi işini təmiz apara bilsə, sonralar yüz adam yığılsın, yüz cinayət açılsın, faydasızdır, sübuta yetməz, boynuna qoyula bilməz.

Kərim Gəldiyev Vartaşendən qaçmaqla bir göz dağından da uzaqlaşırdı: çayxana xidmətçisi Zoyaya, xata elədi, bir "salaməleyk" dedi.

Bir neçə dəfə pitinin duzsuz olmasından şikayətləndi. Zoyanı kənara çağırıb "məxsusi" hazırlanmış yarpaq dolması xahiş elədi. Zoya bu xahişin aşpaza aid olduğunu deyəndə, Gəldiyev onun qulağına pıçıldadı: "Aşpazı da görürəm, Zoyanı da!". Zoya dedi: "Mən xörək bişirməyi bacarmıram". Gəldiyev əl çəkmədi: "Bəs ürək bişirməyi niyə bacarırsan?".

Zoya onun atmacalarını başa düşmədi. O birisi gün Gəldiyev altı manat xörək pulu əvəzinə, bir otuzluq qoyub çıxdı: Zoya otuzluğun artığını verəndə dedi:

– Qoy dursun, patom-patom!

Bir az sonra Gəldiyev Zoyanın iş saatı, boş vaxtı ilə maraqlandı:

– Sən heç çisti vozduxa, seyrə çıxmırsan?..

– Nabələdəm bu yerlərə.

– Mən bələdçilik eləməyə hazıram, bir gəz, ürəyin açılsın, kuxni iyi burnundan getsin.

Gəldiyev Zoyanı çəkə-çəkə meşənin otluq yerinə, alçaq, lakin qol-qanadlı bir qarağacın altına apardı.

– Oturaq, – dedi, – yorğunluğumuz çıxsın.

– Buradan heç yer görünmür.

– Əyləş, görünməyi neynirsən. Lesdi da! Qarağac kölgəsi özü hər zaman ələ düşməz, əyləş!

Qarağacın kölgəsində Zoya necə məğlub oldusa, o gündən sonra, kölgə kimi Gəldiyevin dalınca sürünməyə başladı.

Zoyanın cismən vəziyyəti dəyişdi. Gəldiyevi yaxaladı ki: "Gedək zaqsa!".

Gəldiyev onu qorxutdu, aldatmaq istədi: "Uşağın ola-ola mən sənlə birləşə bilməyəcəyəm. Gör onu birtəhər elə, sonra kak sleduyet toyumuz olsun!".

Zoya aldanmadı. Gəldiyevi o yana-bu yana dartışdıranda öz abırından partiyadan qovulmağından qorxub övlad haqqı verməyi boynuna aldı, amma heç uşağın üzünə də baxmadı. Onun qız və ya oğlan olduğunu soruşanda Gəldiyevin başından ağrı tuturdu: "Nə bilim nə zəhrimardır".

Zoyanı görmək, o barədə bir söz eşitmək, ya ata olduğunu xatırlamaq Gəldiyevə cəhənnəm əzabından ağır idi: "Gözüm görməz, qulağım eşitməz. Bərkə qalanda ayda iyirmi-otuz manat ağzına ataram. Tələbə adamam, özüm nə alıram, ona nə verim... Bir-iki ildən sonra rədd olub gedər, başımdan açılar. Yoxsa mən, otvetstvenni qulluqda girli pul aldıqca o fahişə (Gəldiyev Zoyanı həmişə bu ad ilə xatırlardı.) buradan tərpəşməyəcək, qohum-əqrəbasını da çağırıb yanına yığacaq ki, gəlin bir axmaq adam tora salmışam. Gəlin yeyək, dalısınca da söyək!.. Bu əxlaqsızlar mənim pulum ilə kef edəcəklər... Bu da zaqundu, a kişi?..".

Bunlara görə idi ki, Gəldiyev təhsilə getdiyini səsə salmadı. Bir gün hesabdarı çağırıb açarları verdi, ezam kağızını göstərib, öz haqq-hesabını yazdırdı. Axşam yatacağını, çamadanını icraiyyə komitəsinin maşınına qoyub, birbaş Yevlaxa sürdürdü...

İnstituta girəndə Gəldiyev dərsdən qabaq bir ictimai işin qulpundan yapışmağı, hiss ediləcək "canyanğısı" büruzə verməyi düşünmüşdü.

Hələ qəbul komissionu işini qurtarmamış, dərslər başlanmamış Gəldiyev məktəb dəftərxanasından qırağa çəkilmədi. Bir tələbə öz adını siyahıda tapa bilməyəndə Gəldiyev onun qolundan tutub, katibin yanına aparırdı. Tələbələr eyvanda söhbət eyləyəndə, dərs kitablarının nə vaxt alınacağı ilə maraqlananda Kərim Gəldiyev əlüstü tədris müdirinin otağına girib, iki dəqiqə sonra çıxır, ucadan hamıya bildirirdi. İmtahanların hansı otaqda, nə vaxt aparılacağını elandan qabaq xəbər verirdi. "Kişi yaxşı kömək eləyir".

Bir gün gördülər Gəldiyev eyvanınküncündə stol qoyub oturub, gələnə deyir:

– Yoldaşlar, kollektiv kinoya getmək istəyən yazıla bilər. Ucuz bilet gəlib.

Direktorun otağına girib, xahiş elədi: "Yoldaş Verdiyev, sabah-biri gün Beynəlxalq Gənclər günü gəlir. Pervi kurslarda yoldaşlar maraqlanır, istəyirik məruzə təşkil eləyək".

Direktor onu başa saldı:

– Kərimdirmi adınız, yoldaş Kərim, təşkilat ilə əlaqəyə girin. Planları var, danışın. Siz də iştirak edəcəksiniz?..

Gəldiyev o saat partiya komitəsinə getdi: "Məni direktor göndərdi ki, sizinlə danışım. Yeni gələn bəzi yoldaşlara ictimai naqruzka vermək barəsində..."

Gəldiyevin partiyalı olduğunu, ictimai iş ilə çox maraqlandığını biləndən sonra tapşırıqlar verməyə başladılar. Çox çəkmədi ki, Kərim Gəldiyev institutda "mədəni hücum" ştabının rəhbəri təyin olundu.

## Üçüncü fəsil

Dünyada cürbəcür insanlar var. Biri maddi həyatını, biri mənəvi həyatını, üçüncüsü ailə həyatını, dördüncüsü mənsəbi, şöhrəti üstün tutur. Kərim Gəldiyevin hansı əqidədən olduğunu bilmək üçün onun həyat fəlsəfəsilə bir balaca tanış olmaq kifayətdir.

Onun üçün həyat güzərandan ibarətdir. Bacaranlar yaxşı qururlar, bacarmayanlar qarışqa kimi ayaqlanıb, tələf olurlar. Bacaranlar azdır, bacarmayanlar çoxdur. Qulaqlarınızı yerə qoyun, dinləyin. Daimi bir gurultu gəlir, əzilənlərin, məhv olanların səsidir. Ancaq bunu dinləyən kimdir!

Gəldiyevin qənaəti budur ki: "Əzməsən əziləcəksən, ayaqlamasan ayaqlanacaqsan... Güzəran, mənsəb cəhənnəmin təkində də olsa, enməyi bacar!"

Onun üçün qadın ancaq qadındır. Qiyməti də bundadır: "Bir zaman var idi, kasıb adama arvad müyəssər olmurdu. Halal pul ilə rəğbətlisini almaq çətin idi. İndi ondan bol nə var. Madam ki, belədir, evlənmək, xirtdəyi kəndirə keçirmək nə üçün? Cibinin puluna münasib, istədiyin aşxanada xörək yeyərsən. Kişilik hünərinə münasib, rast gəldiyin qadın ilə də görüşə bilərsən".

Dostluq məsələsi haqqında Kərim daha qətiyyət sahibidir: "Dost adama xeyir verməlidir. Ya pullu və ağılsız olub yedirtməlidir, ya qulluq sahibi olub himayə kölgəsi salmalıdır, ya avara olub ələ su tökməli, başmaq cütləməlidir, yaxud da müxtəlif səbəblərə görə adama lazım olmalıdır. Üzüyola olsun, söz gəzdirən olsun, yaxud da qoçuluq, boşboğazlıq, böhtançılıq əlindən gəlsin... Müxtəsər: ən yaxşı dost istəyirsənsə, ən alçaq adamı tap! Beləsi yalandan şahid durmağa, düşmənini biabır etməyə, səs salmağa, dəstə düzəltməyə yarar".

Bu niyyət ilə də Gəldiyev Qurd oğlu Qədiri dost seçmişdi. Qədir əvvəl rayon qəzetlərinin birində kütləvi işçi idi. Şeirdən-zaddan da qaralayardı. Ancaq onu qəzetçi, ya şair kimi tanıyan yox idi. "Qəzetçini yazıları ilə tanıyarlar, ay Qədir, sənin yazını heç görmürük?"

Qədir məğrur danışırdı:

– Yazılarını demə, imzanı de!

– Deməli yazırsan!

– Yazmıram bəs hər gün o boyda qəzet hardan dolur?

Camaat onun şikəstə nəfsliyinə heyran qalardı.

Qədirin duruşu, oturuşu qəribə idi, Bakıya, kooperativ texnikumuna oxumağa gələndən sonra bu qəribəlik daha da artdı.

Bir dəfə ictimaiyyat müəllimi demişdi: "Böyük adamlar tarixdə həmişə ümumi axının əleyhinə gediblər. Onlar məlum vərdiş və görüşlərin ziddinə çıxıblar. Ayrıca, hamıdan seçilən bir yol tutublar. Hər bir yeni cərəyan, hər bir ideya uzun mübarizələrdən sonra qəbul olunduğu kimi, böyük adamların tutduqları yol da uzun illərdən, bəlkə də əsrlərdən sonra etiraf və təsdiq olunmuşdur. Böyük şəxsiyyətlər qarşılarında çox maneələr görmüşlər, meydanda tək də qalmışlar, ancaq sonra kütlə onların dalınca getməli olmuşdur..."

Müəllimin izahatını diqqətlə dinləyib düşünəndən sonra Qurd oğlu Qədir gördü ki, özündə böyük adam olmaq həvəsi və imkanı vardır. Ağır şeyi tərəzidə yoxlayan kimi Qədir də özünə güzgü qabağında vəra-vurdla baxdı. Gördü doğrudan da böyük adama oxşayır. Ancaq bir az qeyrət çatışmır. Qeyrət lazımdır. Qədir görünmək üçün fürsət axtardı. Özünü kütlədən, yəni "qara camaatdan" ayırmaq üçün həmişə hamı deyənin ziddinə getdi. Məktub yazdı, imza atmadı.

İclasların, uzun sürən müşavirələrin nəticəsini, qəbul ediləcək qərarı aramsız gözlərdi. Gözlərdi ki, mübahisə kəsilsin, hamı müəyyən rəyə gəlsin. Qərar oxunan kimi söz alıb, ziddinə gedərdi. Bəzən müzakirələr bitmirdi, qərar da yazılmırdı. Bu müddət Qədir üçün çox əzablı və üzüntülü idi. O, mərəzə tutulmuş kimi, bədəni ilə əlləşər, əllərini ovuşdurar, qalxıb oturar, oturub qalxardı. Adamlar arxayın dinib-danışdıqca Qədir əsəbiləşər, "qərar oxunsun" deyə qışqırardı. Tez-tez sədrin ağzına baxar, "Qərar! Qərar!" deyərdi. Sədr qərarı oxuyanda o qollarını çırmar, zehnində nitq hazırlardı. Bəzən Qədirin nitqinə ehtiyac qalmazdı. O, dilxor olar, əməyinə acıyardı. Qərar qəbul olundumu, Qədir, dərsini əzbərləmiş uşaq kimi cəld qalxar, etiraz edərdi.

Qədirin bu hərəkətini hamı bilsə və pisləsə də, o əl çəkmirdi. “Bizim məsələyə öz münasibətimiz var”.

Özünün adamlardan seçilməsini böyüklük əlaməti sayırdı. Camaat onu görən kimi deyərdi: “Ziddinə getməyə qərar axtarır, bir şey yazın, atın qabağına didişdirsin”.

Bir dəfə yataqxanada tələbələr sözü bir yerə qoydular ki, Qədiri danışdırmamış rəy söyləməsinlər. Onu ələ salıb danışdırdılar, qəsdən hamısı onun fikrinə şərik oldu. Qədir bir uyğunluğu, özünün “qara camaat” içində batıb-getdiyi kimi bildi. Qalxıb etiraz elədi: “Mən o mənada demədim, siz başa düşməmişsiniz. Ziddəm, ziddəm!”.

Qədirin iştirak etdiyi elə iclas yox idi ki, protokolun ayağında qətnaməyə zidd gedən olmasın. Katiblər onun əlindən təngə gəldikləri üçün əvvəlcə protokolun ayağını yazardılar: “Qədir ziddinə səs verdi”.

Bunun üstündə Qurd oğlunu həmkarlar komitəsinə çağırdılar:

– Balam, sən ki, hər tədbirin əleyhinəsən, bəs nəyin tərəfdarısan?

Qədir dedi:

– Mən füqərayi-kasibə tərəfdarıyam.

– Necə kasıb tərəfdarısan ki, iki adam ilə dil tapa bilmirsən?

– Tarixdə böyük adamlar tək qalıblar. Bəşəriyyət onları sonradan başa düşür.

– Qədir, heç səni başa düşən bir nəfər varmı?

– Gəldiyev məni yaxşı başa düşür. Görürəm ki, artıq ziyalılarımız yetişir, inkişaf edir.

Yataqxanada çarpayı paylananda hamı cumub özü üçün yaxşısını seçdi. Qədir başqalarına qarışa bilmədiyindən gözlədi. Axırda ona çarpayı çatmadı. Təsərrüfatçı ona qırıq bir taxt göstərib dedi: “Hələlik ötüş”. Tələbələr Qədirin vəziyyətinə güldülər. O öz vüqarını pozmadı. “Qaydadır böyük adamlar tarixdə zillət çəkiblər”.

Sonradan Qədirin bu xasiyyəti inkişaf elədi, dairəsini genişlətdi. Öz evlərində heç bir şeyi sonalamayan, anası gətirən hər xörəyi yeyən Qədir qonaq getdiyi yerdə mərəkə açardı. Dərhal xörəyi kənara itələyərdi ki: “Bu dadsızdır, ayrısını gətirin!”. Küçədə rast gəldiyi dostuna, hətta Gəldiyevə də salam verməz və almazdı. Daldan birisi çağırsaydı ki: “A Qədir, keyfin, halın?”. Əli ilə rədd edərdi: “Sonra! Sonra!”. Evdə əyləşib dostları ilə söhbətə məşğul ikən, birdən ayağa qalxar, oturanlar ilə əhvallaşardı: “Necəsən, kefin-zadın lap yaxşıdırmı?”.

Qədir bununla demək istəyirdi ki, mən fikirliyəm, başım məşğuldur. "Xırda" məsələlər sonradan yadıma düşür.

Beləliklə, Qədir az zamanda çox "şöhrət" sahibi olmuşdu. Onu yalnız tələbələr, yataqxana işçiləri deyil, az qala bütün şəhər tanımışdı. Hər kəsdə bir uyğunsuz hərəkət görünsə, deyərdilər: "Qurd oğlu kimi eldən dişqarı deyilsən ha!".

Bəli, Gəldiyevin belə dostları var idi.

Cəmiyyətin həyatı, ictimai mübarizələr haqqında Gəldiyevin fikri qapalıdır. Bu barədə ondan soruşanda acığı da tutur.

Bu nə sözdür, mən necə ki, bir kommunist, bütün bu məsələlərə kommunistcəsinə baxıram.

Amma onun qəlbinə-qılığına girməyi bacaran hünərli və fəndgir bir adam olsa, boş damarından tutar, Gəldiyev ürəyinin qapağını tas-kabab qapağı kimi götürər, orada nələrin qaynayıb-qarışdığı aydın görünər.

Belə hünərli adam tapıldı, o gündən də Gəldiyev kələfçənin ucunu itirdi.

İsti yay axşamlarının birində Gəldiyev dostu İslam Verdiyevlə, bir də Verdiyevin rayondan gəlmiş yoldaşı Qurban ilə pivəxanada əyləşib pivə içirdilər. Pivəxana ağzına qədər dolu idi. Pivə vardı, yer yox idi. Qapı ağzında azı bir otuz-qırx nəfər dayanıb, boyun-boğazlarının tərini silirdilər. İşçilər istiyə baxmadan od kimi işləyirdilər. Ağzından köpük daşan sərin pivə dolu, tərləmiş şüşə qabları bəzən qucaq-qucaq daşıyırdılar. Müştərilər də istinin gücündən yar-yoldaşın həvəsindən, bir az da pivənin öz təsirindən içdikcə içirdilər. Qapı ağzında dayananlar həsrət çəkir, ayaqlarının birini qoyub birini götürür, divara söykənir, içənlərin lap gözünün içinə baxırdılar. Atəş göstərən bu baxışları ilə deyirdilər: "Bəsdir də, bir insafın olsun. Dur, qoy biz də sərinləyək!". İçənlər isə həris nəzərləri gördükcə daha da iştahaya gəlir, ciblərinin küncünədək töküşdürür, təzədən sifariş verirdilər. Ona görə də gözlərini dayananların nəzərindən yayındırmağa çalışırdılar. Birisi gəlib kürsüyə söykənsə ki: "Sizin yerinizi tutmaq olarmı?", onlar elə vəziyyət alırdılar ki, fikirlərini üzlərindən oxumaq olurdu: "Durası deyiləm, ayrısını gör! Ayaq üstə qalarsan!".

Belə bir həngamədə Gəldiyevgil arxayın əyləşmişdilər. Onların stolu pəncərə tərəfdə idi. Bir az o yanda bir cavan gəlin, iki nəfər də oğlan oturmuşdu. Pivəxanaya girən kimi Gəldiyev gəlini görmüşdü.

Ürəyindən keçmişdi ki: "Düz arvad bu qədər kişinin içinə soxulub pivə içməz. Görəsən, bu kimdir?.."

Oturanda Verdiyev həmin gəlinə dilucu salam da verdi. Gəldiyev istədi əyilib soruşa: "Ay İslam, bu kim ola?.." Oğlanlardan çəkindi. Bir şey demədi, amma gözünü o tərəfdən də çəkmədi. Gəlinə baxdıqca narahatlığı artır, yerində otura bilmir, ağır gövdəsilə o yan-bu yana dönür, kürsünü dilləndirirdi. Nəhayət, oğlanlar durub getdilər. Gəldiyev güman etdi ki, yenə qayıdacaqlar. Ancaq on-on beş dəqiqə sonra xidmətçi gəlib pulu alanda Gəldiyev gəlinin tək əyləşdiyini, oğlanlar ilə tanış olmadığını bildi. Böyük bir sıxıntıdan qurtulmuş kimi sevindi. Meydanı boş görüb cürətləndi. Verdiyev bunu duymuşdu; ona tərəf əyildi.

– Çox baxırsan!

Gəldiyev boğazının ətini çəkdi:

– Mən ölüm, İslam, bir gör nə qayırırsan.

– Bizim qonşuluqda olur.

Verdiyev əvvəl bir zala göz gəzdirdi. Tanış adam görmədikdə gəlinə sarı döndü:

– Ağca xanım, tək nə üçün, kürsünü yaxına çəksəniz!

Ağca xanım dedi:

– Sağ olun, mən içdim.

Qurşağından ağ, qırağı tikməli, kəpənək boyda bir yaylıq çıxardıb, boyası pozulmasın deyə, çox ehtiyatla dodağının yanlarını sildi. Ağca xanım haqq-hesabını vermişdisə də durmurdu. Gəldiyev Verdiyevin sözünə qüvvətlə israr elədi:

– Bəri çəkin stolunuzu! Kollektivin... dadı ayrıdır.

Verdiyev işarə edib, stəkan gətirtdi. Ağca xanım onlara yanaşanda Gəldiyev qalxıb yer elədi.

Verdiyev dedi:

– Ağca xanım, tanış olun, bizim institut tələbələrindəndir. Qurban da mənim köhnə yoldaşımdır, Şəmkirdə işləyir.

Gəldiyev qırmızı iri əli ilə Ağca xanımın zərif, xırda, pambıq kimi ağ əlini sıxdı. Əyləşən kimi yumruğunu stola döydü:

– Qrajdanka, qarj... altı butulka pivə, isqəri!

Qurban onun səhvini düzəltdi:

– Butılka yox, adə, qrafinka.

Verdiyev Gəldiyevi Ağca xanıma təqdim edəndə "tələbə" deməsi ona bərk toxunmuşdu. Qurbanın təshihi də bir yandan pərt elədi. Verdiyev xanımla söhbətə başladı:

– Bəs tək nə üçün?

Ağca xanım dizi üstə qoyduğu redikuluna baxa-baxa dedi:

– Partnixaya gəlmişdim. İt qızı da məni zavtra-zavtraya salmaqdan təngə gətirib. Platiyam hazır deyil, istidən boğulurdum, dedim, bir stəkan sərin pivə içim, ürəyim yanırdı.

Gəldiyev söhbətə qarışdı.

– Sənətkarlarda yalançılıq adətdir, xanım!

Qurban soruşdu:

– Xüsusidir, ya arteldir?

– Xeyr, xüsusidir. Biz artel-martelə paltar verməriк. Onun oçer-moçerinə kim dayanacaq. Beş şahi baha olsun, çasni olsun. Bir də artel belə tikməz axı! Bu çoxdan bizə tanış müştəridir.

Gəldiyev istədi desin: "Tanışdır, bəs niyə yalan satır?". "Tanış" sözü ağzından çıxanda bu sualın yersiz olduğunu dərk edib dəyişdi:

– Tanış olmayanların da paltarını tikər, ya yox?

Ağca xanım Gəldiyevə baxdı. Onun sözündə bir istehza güman edib dedi:

– Xeyr, tikməz! – Sonra əlavə etdi, – kişi paltarları tikmir!

Gəldiyev yenə hazırcavablıq eləyib demək istədi ki, "Siz nə bildiniz mən kişi paltarı tikdirəcəyəm?". Bu sözü ağlına vurdu, özünü məzəmmətlədi: "Ay bədbəxt, qadın paltarı tikdirmək istədiyini deyərsən, işi korlarsan, heç hənanın yeridir?".

Sözünün çəp gəldiyini görüb şüşələri götürdü, stəkanları doldurdu:

– Dünyada gözəllik yaxşı nemətdir!

Müqəddiməsindən sezilirdi ki, mənalı bir şey demək istəyir. Oturanların susduğunu görüb, daha da ruhlandı:

– Gözəllik yaxşı nemətdir, heyif ki, hər adamda olmur.

– Hər adamda olsa nemətliyi qalmaz.

Verdiyev Qurbanı susdurmaq istədi: "Toxta!".

– ...Yaxşı nemətdir, demək olar ki, anadangəlmə xoşbəxtlikdir.

– Bəzən də bədbəxtlikdir.

Gəldiyev kiridi. Qurban elə bildi ki, o pərt olub, daha danışmaq istəmir. Ancaq belə deyildi. Gəldiyev ayrı şey düşünürdü:

– Yoldaş Qurban burada bir təzə söz danışdı. Guya gözəllik bədbəxtlikdir, nesçastiyedir. Qurban ağıllı adamdır, amma mən ha fikirləşirəm, bu sözü başıma yerləşdirə bilmirəm.

– Hansı sözü başına yerləşdirə bilmirsən? Qurbanın ağıllı olmağınımı?

Oturanlar qəhqəhə çəkib güləndə Gəldiyev qızardı.

– Yoldaşlar, bilmirəm bu gün niyə belə şair kimi olublar, hər sözlə kritka çıxartmağı mən də bacararam. Xahiş edirəm, yanımızda əziz qonaq var.

Verdiyev dedi:

– Bu məclis adamı şair də eləyər, o yana da keçər.

Gəldiyev Ağca xanımın üzünə baxdı:

– Mən bu sözü ağlıma sığışdıra bilmirəm ki, gözəllik bədbəxtlik ola!

Qurban dedi:

– Gözəllikdən doğan fəlakəti Allah heç bəndəsinə göstərməsin. Məsəl üçün, mənim bir çopur bacım var, indi də evdədir. Nə istəyən, nə tamah salan oldu. Qız rahat-farağat ağa kimi yaşayır. Amma Mina adlı göyçək bir qız tanıyırdım, üstündə dava düşdü. Biri bıçaqlandı, ikisi tutuldu, biri də baş götürüb getdi. Axırda qız özü də ürəkkeçmə azarına düşüb, Semaşkoda[1] öldü. Yazıq Mina çirkin olsaydı, indi mənim bacım kimi asudə dolanardı. Yoldaş Kərim, görürsənmi gözəllik adamın başına nə bəla gətirir!

Gəldiyev qabağındakı şüşəni götürüb ortalığa qoydu, sözünə davam etdi:

– Qurban mətləbi çox uzaqdan başladı. Pervi mən söz almışam, qoyun bir-iki kəlmə danışım. Kompaniyamızda, xotya kompaniya demək olmaz, stolumuzun başında adam da var. Qurbanın tanışı nə bilim Semaşkoya düşüb, ya bacısı evdə oturub qab-qaşıq yuyur, filan, behman... Allah bu barədə Qurbana səbir versin. Gəlin biz qayıdaq əsil mətləbə. O mətləb nədir? O mətləb gözəllikdir. Mən bu gün çox şadam ki, Ağca xanım kimi gözəl, nəcib bir qızla tanış oluram. Qabaq-qabağa oturub, kəlmə verib, kəlmə alıram. Bilirsən, İslam, bu nə priyatnıdır! İçək, bu qabları boşaldaq həmin nəcib xanımın sağlığına!

Ağca xanım da stəkanı araq qədəhi kimi iki barmağı ilə tutub, havada saxlayır, içənlərə başı ilə razılıq edir, gülümsəyirdi. Axırda özü də başına çəkir, sanki, ağzının acısı getsin deyə, tez-tez noxud çeynəyirdi.

[1] İndiki Musa Nağıyev adına xəstəxananın əvvəlki adı

Onun məclisdə sərbəst hərəkətini, qayda-qanunu yaxşı bildiyini, kişilərdən az içmədiyini gördükcə, Gəldiyev Verdiyevin üzünə baxır, Ağcanı göstərirdi. Verdiyev işarə ilə cavab verirdi: "Görüb götürmüş arvaddır..." Gəldiyev Ağcanın göz çuxurlarına, alın cizgilərinə, yanaqlarından aşağı arı çökəklərinə diqqət edəndə, üzündəki boyaları seçəndə qadının yaşlı olduğunu, ancaq özünü cavan saxlamağı bacardığını duydu.

Dostlar qalxanda Verdiyev Gəldiyevə dedi:

– Mən yataqxanaya gedəcəyəm, tələbələrin yer-yurduna baxmağa. Gecdirsə də gərək dəyəm. Zəhmət də olsa sən Ağca xanımı evlərinə ötür. Yuxarıda, Sovetski tərəfdə olurlar. Xahiş edirəm tək buraxma!

Ağca xanım razılıq elədi:

– Zəhmət çəkməyin, özüm gedərəm, hələ gec deyil.

Gəldiyev kişiləndi:

– Bizə nə deyərlər, ay Ağca xanım! Deməzlər bəs üç başı papaqlıdan bir qanacaqlı tapılmadı?..

Onlar Kommunist küçəsindən diklənib, sağa buruldular. Oradan da qaranlıq, tərəddüdsüz döngələrin birinə keçib, gözdən itdilər. Gəldiyev bu görüşdən sonra Ağca xanımın həyat yoluna bələd oldu. Bildi ki, o Zakirbəyovlardandır. Firavan güzəran görmüş adamdır. Altı ay ərdə olub. Xasiyyətləri tutmadığından ayrılıblar. Dörd yaş yarımlıq bir oğlu var, övlad haqqı verirlərsə də almır, ehtiyacı yoxdur. Özü işləmək istəyir.

Ağca xanım keçmiş ərini deyəndə, nədənsə, Gəldiyev Zoyanı xatırlamadı. Ancaq övlad haqqı adı gələndə xəyal elədi ki: "Deyəsən, taleyimiz arasında oxşayış var. O, nəcibdir, aliment istəmir, mənimki nanəcibdir, əl çəkmir". Ürəyinə gəldi ki: "Belə şeyin üstünü vurmazlar".

Gəldiyev Ağca xanımı lap evlərinə qədər gətirdi. Qayıtmaq istəyəndə Ağca təklif elədi.

– Buyurun, çay için.

– İndicə pivə içmişik ki!

– Pivədən sonra pis olmaz.

Kərim boyun qaçırmaq istəmədi. Ürəyində "Fürsətdi, bismillah!" – deyib içəri girdi.

Ağca xanımın evi, səliqə-sahmanı onu valeh elədi. Xanım böyük və uca pəncərələrin şüşəsini örtməsə də qara, ağır və qotazlı, piləkli pərdələri saldı. Sanki bununla otağın və otaqdakıların kənar aləmdən

əlaqəsi kəsildi. Gəldiyevdə xoş bir məhrəmlik hissi oyandı. Oturan kimi ev sahibi onun qabağına bir albom qoydu, özü mətbəxə çay hazırlamağa getdi. Gəldiyev köhnə, divarı naxışlı, varlı bir adamın olduğu seçilən otaqları nəzərdən keçirdi. Albomu varaqlayıb, dalısı ərəb hərfləri ilə yazılan şəkillərə baxdı. Bunların içində ticarət palatası, yarmarka komitəsi, tomojna məmurları vardı.

İçəri otaqda çarpayı səsi Gəldiyevi diksindirdi. Özü kimi başqa bir vaxtsız qonağın olacağından qorxdu. Əyilib baxanda uşaq çarpayısını gördü. Yadına düşdü ki, Ağca xanımın oğlu var. Bu haman uşaqdır ki, Ağca xanım həyatında buraxdığı ikinci səhv adlandırır.

Deyirlər hər şey var-dövlətdən asılıdır.

Ağca xanımın atası Hacı Abdulla təkcə Bakıda yox, bütün Qafqazda beş kişinin biri idi. Dərbənddə, Aşqabadda, Mərvdə, Buxarada, Vladiqafqazda, Batumda onun adını çəkəndə tanıyırdılar. "Hansı, o gödək Hacı Abdulla? O milyonçudur!"

Bəli, Hacı Abdulla milyonçu idi. Ancaq onun yeganə istəkli və göyçək qızı Ağca nə atasının milyonçuluğunu, nə də bunun nə demək olduğunu bilirdi. Onun yadında qalan budur ki, səhər anası ilə faytona oturar, əmiləri evinə, toya, qonaqlığa, nişana, xeyrata, görüşə, oyuna gedərdi. İkinci bir fayton da nökərləri, ayrı-ayrı qutulara bağladığı peşkəşləri gətirərdi. Bunları Ağca güc ilə yerdən qaldırıb qohumlarına paylardı. İpəksaplı qutunun bağından tutub ortalığa sürüyərdi:

– Bu Zibanınkıdır.

– Bu da sənin!

Əmisi uşaqları peşkəş qutularını açmamış Ağcanın ürəyi sakitləşməzdi. Elə bilərdi gətirdiklərini yerinə çatdırmayıb. Qutunu bəzən Ağca özü açardı. Budur, Zibaya çəkmə, corab, oyuncaqlar. Lətifinki qara məxmərdən bir dəst paltar, bir də gümüş toqqa, gümüş xəncər, gümüş vəznələr. Ənvərə çal papaq, Tələtə qatı açılmamış ləzgi şalı, yaylı uşaq avtomobili...

Qohumlar sevinişər, Ağca bundan ləzzət alardı.

O da Ağcanın yadındadır ki, cümə axşamları, bayram axşamları əmiləri səfərdən qayıdanda özü də belə peşkəşləri qəbul edərdi. Novruz bayramında onun başına o qədər pal-paltar, bər-bəzək, şirniyyat, oyun şeyləri tökərdilər ki, zalın ortasında tərpənməyə yer qalmazdı. Bu səxavətli qonaqların hamısından artıq, nədənsə, Təbarəkin sovqatlarına fikir verilirdi. Atası tez-tez onun adını çəkərdi, hamı görünərdi,

Təbarək görünməzdi. Daha sonralar Ağca bildi ki, Təbarək onun nişanlısıymış. O, ancaq toyda gələcək, ancaq onda görüşəcəklər.

Ağcanın uşaqlıq günləri beləcə şən-şətarətlə, əzizlik, bəxtiyarlıqla keçdi. Günün birində bu dəm-dəsgah lap böyüdü. Aləm, xara geyinmiş kimi, par-par parıldadı, evlərin qabağı camaatla doldu, musiqi çalındı, kişilər, qadınlar dəstə ilə evə doldu, gümüş göyə sovruldu, güllələr açıldı, oğlanlar küçəyə səs saldı, xonçalar bəzəndi, şamlar yandı, axund xeyir-dua verdi, faytonlar tərpəndi, sanki şəhərin bir hissəsi o biri hissəsinə köçdü.

Ağca gözünü açıb özünü Təbarəkin otağında gördü...

Onun birinci səhvi bundan ibarət idi.

Bilən olmadı Təbarəkin nəyi pisdir, niyə Ağca beş gün onun evində oturmadı. Toydan bir ay sonraya qədər hər gün səhər fayton Ağcanı atası evinə gətirər, axşam ər evinə qaytarardı. 31-ci gün axşam fayton nə qədər dayandısa Ağca atası evindən çıxmadı. Özü də soyuq, küləkli bir axşam idi. Axırda anasının faytonçuya rəhmi gəldi:

– Dur get, oğul, özünü soyuğa verərsən, yenə qızın tutması tutub!

Hacı Abdulla qızının ər evinə getməyəcəyini yəqin edəndə ürək verdi:

– Qızım, – dedi, – sıxılıb eləmə, istəmədiyin adama getməyəcəksən. Bunu mənə qabaqcadan da deyə bilərdin. Əlli qızım yoxdur, bir qızım var. Onu da xunciyər eləyə bilmərəm. Otur, bu ev-eşik sənindir. Havaxt kimi istərsən gedərsən. Heç könlünə qubar-zad gəlməsin!

Bu təsəllidən sonra Ağca başa düşdü ki, bütün külfətləri səhv iş görmüşdür.

İkinci səhvinin öhdəsindən gəlmək istəyirdi, anası qorxurdu: “Amanın bir günüdür, bala, tələf eləmə. Elə işdən hər adam salamat qurtarmır. Allaha da xoş getməz, cavan canını bədbəxt eləmə!”.

Ağca dedi:

– Qucağımda bəbə gəzdirməkləmi xoşbəxt olacağam?

– Uşağı qoy mənim öhdəmə! Sən get cavanlığını elə!

Ana ilə qız arasında bu söhbət olan günün axşamı vergi yığanlar Hacı Abdullanın qapısını döydülər. Arvad qışqırdı ki: “Ay aman, hamilə arvad var, qorxar, çıxın bayıra!”.

Onlar eşiyə çıxanda Ağcanın qoltuğuna iki boğça verib, qonşu otağa ötürdü. Ağca boğçaları pəncərədən o biri həyətə saldı. Bir neçə dəfə belə gedib-gəldi; anası onu eyvana çıxartdı, vergi yığanlara izin verdi.

Evdə şey qoymamışdılar. Olan Ağcanın cehizi idi. Gələnlər bəzi şeyləri yazıb getmişdilər.

Hacı Abdulla gündüzdən yola çıxmışdı.

Dükanını möhürlü görəndə səhər başıaşağı evə qayıdıb, pul çamadanını götürmüş, uzaq səfərə yol almışdı. Arvadına tapşırmışdı: "Qız bilməsin, yazacağam, yığışdırıb gələrsən".

Atası gedəndən bir il sonra Ağcanın anası sətəlcəmdən öldü. Əmiləri də yaxın gəlmədi. Qız körpəsi ilə tək-tənha qaldısa da özünü itirmədi. Dünyagörmüş xanımların məsləhətiylə bir dayə tutub, uşağı ona tapşırdı. Özü də zəhmət çəkib, orda-burda gizlətdiyi boğçalardan birinin böyründən xərcləməyə başladı.

Bundan sonra Ağcanın dost-aşnası çoxalırdı. Onu yeni tikilmiş bahalı libaslarda, şəhərin ən gözəl, ən yaraşıqlı oğlanlarının qolunda "toqsinə" girən, "mostorqdan" çıxan, "Novaya Yevropada" oturan, bulvarda gəzən, söhbət eləyən, musiqi dinləyən, nəhayət, yaxşı həkimlərin qapısında gözləyən görərdilər.

Ağca xanım "bəxtəvərlərin bəxtəvəri" idi. Bakının axar-baxarlı küçələrinin birində dörd otaqdan ibarət, ağzınacan dolu, topdağıtmaz ev-eşik təkcə ona qalmışdı. Rəzəli sandıqdakı boğçaların hərəsi bir ömrə bəs elərdi. Özü də cavan, ay kimi açılmış, gün kimi gümrahlaşmış, gəlinlər bulağından təzəcə su içmişdi. Şəhərdə beş qızın söhbəti var idisə, biri Ağca xanım idi. Müsamirələrdə qabaq cərgədə oturan, teatrların baş lojasını tutan, ilk tamaşaları buraxmayan, məsxərə yarışında diqqəti cəlb edən, seyrəngahlarda ən şıq görünən də Ağca xanım olardı. Güman edərdi ki, xanəndə ona baxıb segaha dəm verir, tarçı acığını simlərdən çıxır, məruzəçi ibarə başlayır, şair onun göz-qaşına bədahətdən bir bənd artıq deyir... Özünə gümanı gələn hər gənc onunla oturub-durmağı xoşbəxtlik sayırdı.

Ağca xanım bunların hamısını hiss edər, gününü xoş keçirməyə səy edərdi.

Deyəcəksiniz niyə ərə getmirdi? Deyəcəyəm: alan yox idi! Deyəcəksiniz: bayaqdan şəhər cavanları Ağca xanımın əsiri idilər, niyə bəs alan olmasın?

Siz mənim yalanımı tutmaq istəyirsiniz! Mən də dedim şəhər cavanları Ağca xanımla maraqlanırdı. Bunu yenə də deyirəm. Ona görə də Ağca xanımı heç kəs almırdı.

Bəli, qəribə də elə budur. Ağca xanım ilə bir axşam vaxt keçirməyi səadət bilən gənclərin heç biri ona həmişəlik yaxın durmaq istəmirdi. Bilirdilər ki, ona həmişəlik sahib olmaq mümkün deyil. Əvvəl o, "baxışına, duruşuna, gülüşünə qurbanam" deyən bir məsul işçiyə könül vermək istədi. Məsul işçi bunu hiss edən kimi daha gözəl görünmədi. Sonra bir hərbiyəlinin nəvazişləri Ağcanın xoşuna gəldi, ürəyinin mətləbini deyəndə hərbiyəli üzr istədi: "Bizlər, – dedi, – bu gün varıq, sabah yox, mənim bir ayağım otaqdadırsa, bir ayağım cəbhədədir. Risk eləməyin, məsləhət görmürəm, səni sevdiyim üçün də almaq istəmirəm... Sağlıq olsun, kapitalizm əhatəsinin öhdəsindən gələrik, düşməni qovub dənizlərə tökərik, onda bu haqda danışmaq olar..."

Sonralar Ağca, nədənsə, heç belə təmənnaya düşmədi. Görüşüb ünsiyyət bağladığı adamdan asanlıqla ayrıla bilərdi. Ayrıldığı adama qovuşduğundan, qovuşduğunu ayrıldığından fərqləndirmirdi. Ancaq yenə ürəyinin dərinlərində həsrətmi, ağrımı, arzumu deyək, nə deyək, incidici bir hiss oyanırdı. Bir-birini təqib edən qayğısız gənclik günlərinin izində sanki boranlarla süpürülmüş soyuq bir səhra ağarırdı. Getgedə bu səhra böyüyür, soyuyur, tənhalaşır, sükut içində batıb qalırdı. Ağca düşündükcə təsəvvürünə gələn və onu vahiməyə salan mənzərələrdən üz döndərməyə, hər şeyi unutmağa, nəyə, kimə isə ümid bəsləməyə çalışırdı.

İstəyirdi ki, ona indi sadəcə Ağca yox, filankəsin arvadı desinlər. İstəyirdi ki, rəsmi də olsa birisinin, bir abırlı kişinin olsun. Məclislərə, ziyafətlərə başqaları kimi o da cüt getsin, cüt qayıtsın. Xüsusilə zəmanəyə münasib oxumuşlar, firqəçilər, komsomolçular, ziyalılar ilə durub-oturmağı arzu edirdi. Buna görə də Gəldiyev ilə görüşməsi Ağca xanımı sevindirmişdi.

Gəldiyev gələn kimi düyü islanar, qazan asılardı. Ağca xanımın daş-qaşla parıldayan səxavətli əlləri stol başında tərpəndikcə süfrə ulduzlu göy kimi bərq vurardı. "Nikolaydan qalma" stəkan-nəlbəkiləri, qırmızı mürəbbə qablarını, göy meyvə büllurlarını gətirib tökər, növbənöv mürəbbələr çıxarar, şəkərçörəyi düzər, lumu kəsərdi. Çox çəkməzdi ki, ev sahibinin qohum-əqrəbası, yaxın yoldaşlarından bəziləri yığılardı. Xüsusilə yetim qalmış bacıqızı gələndən sonra Ağca xanım məclisi ona həvalə edərdi. Özü yumşaq divanda oturub, sədəfli qarmonu dizi üstə qoyar, açıb-büzər, vücudu da qarmonla bərabər uzanıb gedərdi. Gəldiyev özünü məhrəm bir evdə, – qız-gəlin içində görəndə

cənnətə düşdüyünü güman edər, inanmağı gəlməz, “yuxu aləmi” olmasın deyə, zənnini yoxlamaq üçün neçə dəfə kirpik çalar, gözünü bərk yumub, boş açardı, “Yox, həqiqətdir!” Ağca xanımı qarşısında sərbəst əyləşən və çalıb-oynayan görəndə sevincindən özü də çargah başlamaq istərdi. Səsi gəlmədiyindən özünə qəzəblənər, Ağcanın qolundan ərklə tutub rəqsə çəkər, balalarını öyrədən qartal kimi qol-qanad açar, oturanlara deyərdi: “Əl vurun, əl vurun!”.

Verdiyev bir gün məktəbdə Gəldiyevlə zarafat elədi:

– Aşna, – dedi, – özünü yaman yerə yıxmısan ha! Gec gəldin, əcəb tez öyrəndin. Gözlə, bir balaca məişət pozğunluğuna oxşaya bilən işlərə doğru meyl göstərmək niyyətinə yuvarlanarsan ha!

Gəldiyev irişdi:

– Ay İslam, sən allah, boşla! Qoyarsan kasıbçılığımızı eləyək, ya yox!

Vərdiş, deyirlər ki, insanda ikinci xasiyyətdir. Gəldiyev həyata nəqd baxan adamdır. Onun üçün Ağca xanımın səliqəsi əvəzsizdir. Bu səliqə, Gəldiyevi qız dalınca düşməkdən, bulvara çıxıb ona-buna sataşmaqdan qurtarırdı. İndi bu evdə o, keçmiş Bakı varlılarının həyatını yaşaya bilərdi, ürəyində neçə dəfə deyirdi: “Zalım burjuaziya, nə kef görüb!.. Təki mən də elə ömür sürüm, sonradan dalımca ha söysünlər”. Bir də Ağca xanım və onun evi Gəldiyevi dərsdən sonra “Ermənikənddəki” yataqxanaya qaçmaqdan, qarlı-boranlı günlərdə tramvaylardan sallana-sallana instituta iclasa gəlməkdən qurtarırdı. İclas olan günlər iki nömrəliyə oturur, Ağca xanımgilə gedir, yeyir-içir, rahatlanırdı. Axşam da durub hamıdan tez iclasa gəlirdi. İllərdən bəri arzuladığı “normal” həyatı tapmışdı. Neçə dəfə Ağca xanıma pul təklif eləmişdi, Ağca xanım acıqlandı. O da rastına düşəndə əlinə keçəndən, Corat qovunu, ya bir Şəmkir qarpızı, ya bir qutu konfet, bir şüşə Konkordiya çaxırı... İstirahət günləri də bir şaqqa ət çəkdirib aparırdı.

Ağca xanım Gəldiyevin bazarlığını bəyənmirdi:

– Bu, – deyirdi, – qoca ətidir, səni aldadıblar. Çaxırı, arağı, oradan almazlar, sən Bakıya nabələdsən. Pulu korlama! Kooperativçilər bu konfetləri xam adama verirlər. Özün ilə bir dəfə gedək, onun abırını ətəyinə büküm, qoy səni tanısın.

Bunlar Gəldiyevin şəstinə dəyirdi:

– Bax, Ağca, bir də bura ayaq basmaram ha!

Ağca onun qolundan tutub çəkir, divanda, öz yanında əyləşdirib, başa salırdı:

– Ay mənim key balam, sənə qıymıram. Lazım deyil, o qədər xərcləməli yerlərin olacaq ki, nə tələsirsən. Sən məni bir kinoya, teatra apar ey!

– İstəyirsən bilet alım, sirkdə yaxşı tamaşa var.

– Sirki neynirəm! Pişik maşın sürür. Teatra apar, teatra!

– Teatr skuçna olur.

– Tək getmirsən ki, ikimiz gedərik!

Gəldiyev Ağca xanımın xəcalətindən çıxmaq üçün tələbələrə gələn güzəştli biletdən iki dənə ayırır. Ağca ilə getməli olurdu. Biletlər dal cərgələrə alınmış olanda Ağca redikulunu qoltuğuna vurub, dəhlizdə dayanır, qapıda işləyən qadına acıqlanırdı: "Bu nə yerdir bizə veriblər, ayıb deyil? Məsul işçi gəlsin tələbələrdən də dalda otursun?".

Onları qənnadı dükanından, şəkilxanadan, peşkəş mağazasından çıxan görərdilər. Kişi dəlləkxanasının qabağında Ağca xanım gözlərdi. Qadın dəlləkxanasının qabağında Gəldiyev var-gəl edərdi. Bir ay çəkmədi ki, Gəldiyev ilə Ağca xanımın söz-söhbəti ağızlarda gəzdi. Biri deyirdi: "Dünən səni qırmızıpapaqlı arvad ilə Mirzə Fətəli bağından keçəndə gördüm". O biri deyirdi: "Saqqala salam vermirsən, ay Kərim! Kinoda niyə özünü görməməzliyə qoymuşdun?". Bəzisi də küsənirdi: "Əcəb adamdı o yanındakı... hardan tapmısan onu, həmişəlik olsun".

Gəldiyev ha inandırırdı:

– Canım, söz eləməyin, kulturnı olun. Ayıbdır, tanış adamdır, qulağına çatar...

Ağca xanım tərəfdən Gəldiyevi tanıyanlar isə ədəb-ərkanla təbrik edirdilər: "Mübarək olsun, amma bizi toya çağırmadın ha..."

Gəldiyev bunlardan da danırdı.

– A kişi, evlənmək nədir, zad nədir, məktəbi qurtarmayınca elə şey fikrimə gəlmir.

* * *

Dekabrın axırlarında tələbələr qış imtahanlarına hazırlaşırdılar. Gəldiyev məşğul idi. Ağca xanım onu partkom otağında tapdı, kənara çağırıb dedi:

– Təzə ili bizdə qarşılayacağıq. Birisi gün gələrsən. Gəldiyev sevindi:

– Ay qız, xərcdən-mərcdən payımıza düşəni deyin görək.

Ağca xanım barmağını silkələdi ki, "danışma".

Təzə ili Gəldiyev bir çox tanıdığı və tanımadığı qonaqlar ilə Ağcagilin zalında qarşıladı. Qonaqlar gedəndə səhərə az qalmışdı. Tramvaylar çoxdan dayanmış, şəhər yatmışdı. Boran ağ tük süpürgəsilə küçələri gah yuxarı, gah aşağı süpürürdü. Ağca xanım Gəldiyevə eşitdirdi: "Sən getməyəcəksən".

Qonaqları pilləkənlərdən ötürüb qayıdan Gəldiyev soyuq havadan isti evə girəndə xoşhallanır, əllərini ovuşdura-ovuşdura bu otaqdan o birisinə keçir, xışhaxış ipək yorğan-döşək açan Ağca xanıma minnətdarlıq edirdi. "Sənə də yaman zəhmət veririk, gərək bağışlayasan". Gəldiyev Ağca xanımın mehmannəvazlıqla o yan-bu yana keçməsinə, tük balışları şapalaqlayıb yumşaltmasına baxır, ürəyində fikirləşirdi: "Bu qadın səfehdir, hiyləgərdir, ya ağıllıdır? Səfeh adam belə səliqə yiyəsi olmaz, bu cür ev saxlamaz. Səfeh əldən bu qabiliyyət çıxmaz. Ağıllı adamdırsa, var-yoxunu niyə göyə sovurur? Özün dul arvad olasan, kənarlardan gəlmələri başına yığıb, belə xərc tökəsən? Buna kim ağıllı deyər? Bu pulunun dəlisidir... Bəlkə bir hiylə var?".

Son zənni Gəldiyevə gülünc gəldi. Molla Nəsrəddinin ərizə yazan qazını aldatması yadına düşdü. Xəyalında dedi: səhv olsa, küpədə olacaqdır, ərizədə səhv yoxdur. İndi burada da hiylə varsa məndədir. Onun hiyləsi yağ-düyüdür, bişirir, mürəbbədir, gətirir, gözəllikdir, təslim edir..."

Bu xəyallar Gəldiyevə ləzzət verirdi. Ancaq ürəyində yenə bir sorğu səsləndi: "Axı bu arvad sənin nəyinə bənd olub?".

Doğrudan da Ağca xanımın, ya da ona bənzər başqa bir xanımın ehtiramına nail olmaq üçün ya müstəsna gözəllik, ya nadir sənət, ya da yüksək rütbə lazım gələrdi. Gəldiyevdə bunların heç biri olmadığından o, Ağca xanımın səfehliyinə inanmaq istəyirdi. Bir az düşünəndə onun ağıllı olduğunu kəsdirdi. "Tacir-tüccar içindən çıxmış adamdır. Mənim kimi bir firqəçi, ziyalı ilə dost olmağına fəxr edir də! Kor deyil, görür ki, təşkilatda işləyirəm. Beş adam sözümü eşidir. Görür ki, sabah məktəbi qurtarmağıma macal verməyəcəklər, yaxamdan tutub, bir yerə direktor, ya naçalnik qoyacaqlar, hardadır indi mütəxəssis, həm də kommunist. Yaxşı, bunu bilə-bilə niyə yaxın gəlməsin, niyə aşna olmasın? Gedib şübhəli, bitərəf elementləri kavaler seçməyəcək ki... Yəqin söhbət düşəndə döşünə döyür: "Filankəslər bizdə idi!". Qoy sevinsin, yazıqdır. Ona sevinmək qalacaq, mənə də xoş gün!

Gəldiyev səhər saat onda ayıldı, öz-özünə "Ayıbdır, gəlib görən olar" deyə cəld durdu, geyinib getmək istədi. Ağca xanım dedi:

– Dayan, sözüm var!

Gəldiyev qayıtdı. Bir də gördü qoltuğunda portfelə oxşayan bir şey gətirən cavan bir oğlan içəri girdi.

– Olarmı?

Ağca xanım onu baş otağa keçirdi. Gəldiyevi çağırdı.

– Dur gəl bir şəklimizi alsın.

Gəldiyev tez güzgü qabağına keçdi. Yaxasını, başını düzəltdi. Cavan oğlan onları yan-yana oturtdu, başlarını yanaşdırdı, aparatı çıqqıldatdı. Gəldiyev maraqlandı:

– Bunun birini havaxt almaq olar, mastır?

– Sayasını bu saat verə bilərəm. Kabinetni istəsəniz üç günə!

– Kabinetnidən birini mənə hazırla!

Ağca xanım dedi:

– Sənin işin yoxdur, özüm böyütdürəcəyəm.

Gəldiyevin ürəyinə bir şey gəldi: "Mənim şəklimi evdə vurar, gəlib-gedənə göstərər, yaxşı deyil. Aramızda olan münasibəti aləm niyə bilsin".

İstədi Ağca xanıma bu şəkillər barədə bir şey desin, bacarmadı. Bircə bunu deyə bildi:

– Necə mastırdır? Yaxşı çəkir?

– Yaxşı olmasa, çağırarammı?

Gəldiyev paltosunun boğazını qaldırıb, dəhlizə çıxanda Ağca xanım dalınca gəldi: "Axşam gözləyirəm".

– Ağca, zəhmət verdiyim bəsdir.

Ağca bir az qətiyyətlə çağırdı:

– Zəhməti-zadı yoxdur, xörəyimiz var. Qonağım olacaq, hökmən gələrsən!

* * *

Gəldiyev axşamkı müvəffəqiyyətini deməyə adam axtarırdı. Zəngi basıb katibi çağırdı:

– Gör direktor gəlib?

Verdiyevin gəldiyini biləndən sonra durub kabinetinə getdi. Verdiyev əl verib onun yeni ilini təbrik elədi. Yenə yumşaq sandalına söykənib, məbhut qaldı. Məlum idi ki, yaxşı yatmayıb. Gəlib-gedən isə

onu rahat qoymurdu. Bir tələbə müəllimin qiymətlərindən narazı idi. Kitab imzalatmaq üçün bir dəstə kağız gətirmişdi. Yerli komitə sədri Lenin günlərini keçirmə planını razılaşmaq istəyir, nəşriyyat nümayəndəsi hansı kitablara isə abunə yığırdı... Xüsusilə davakar tələbə Verdiyevi qısnaşdırmışdı, əl çəkmirdi. Verdiyev müəyyən cavab verə bilmirdi: “Sabah gəl” deyəndə tələbə ayağını yerə döydü:

– Yoldaş direktor, sizin kabinetə girmək özü möhkəm bir iradə istəyir, hər igidə müyəssər olmur. Təvəqqə eləyirəm, mənə qəti cavab verəsiniz, ya hə, ya yox!

Gəldiyev direktoru onun əlindən qurtardı:

– Naxçıvanlı deyilsən?

– Onun nə dəxli?

– Yox, eləcə soruşuram. Fərhadovdur da familiyan?

Tələbə bir az şübhələnən kimi oldu:

– Bəli, Fərhadovdur.

– Səni mən görmək istəyirdim. Axşam saat 8-də partkom otağına gələrsən.

– Baş üstə.

Tələbə üzünü Verdiyevə çevirib yenə danışmaq istəyəndə Gəldiyev qoymadı:

– Fərhadov, gələrsən danışarıq, axşam!

İşarə ilə onu qovdu, sonra içəridəkilərə döndü:

– Yoldaşlar, bir yarım saat bizi tək buraxın. Partkomun suroşni, vacib işi var.

Gəldiyev bunu deyib ayağa qalxdı, qapının əlcəyindən tutub, müntəzir dayandı. Hamı çıxdı. Gəldiyev qapıçıya tapşırdı:

– Zənitik, adam buraxma!

Qapıçı çıxandan sonra Verdiyev dostunu danlamaq istədi:

– Sən lap ağ eləyirsən. Qəbul saatıdır axı, nə deyərlər bizə?

Gəldiyev əli ilə rədd işarəsi verdi, keçib Verdiyevin qabağında oturdu, gülə-gülə başladı:

– Sənin canın üçün, təzə ili elə vstereçat eləmişəm ki, heç Nikolay öz arvadını elə vstreçat eləməyib.

Verdiyevin dodaqları qaçdı. Gözucu qapıya baxaraq dedi:

– Budur partkomun vacib işi!

Gəldiyev qapı tərəfə döndü, sanki qapının örtülü olmasından razı qalaraq, səsinə daha da arxayın ahəng verdi:

– Bu ilim gərək uğurlu ola.

Verdiyev onu yaxşı başa düşür, söhbətinin təfsilatını da bilirdi. Ona görə heç nə soruşmadı.

– Ədə, – dedi, – gözlə, ənbərəni bada verərsən ha!

– Ənbərə nədir?

– Ənbərə o şeydir ki, adam qızanda gözünə görünmür.

Gəldiyev başını tovladı:

– Bu saat mənim gözümə heç nə görünmür. Elə bilirəm ki, bir kasa yağ içmişəm.

– Tək idin, ya yoldaşın-zadın...

– Axşam məclisdə idik, sonra tərkləşdik.

Verdiyev Ağca xanım ilə Gəldiyevi tanış elədiyini xatırlatdı:

– Görürsən, mənim ilə gəzən belə-belə şeylər yeyər ha...

– Boynumda minnətin var.

– Oğraş özünsən.

– Niyə ad qoyursan, dost-dosta yaxşılıq eləməz məgər?

Verdiyev söhbətə ayrı rəng verdiyini görüb, açıq danışa bilmədi, yalnız bunu əlavə etdi.

– Bu gecə də zənitəm!

Gəldiyev o gecəni də Ağcagildə keçirdi. Səhər samovarı dəmdə, süfrəni hazır gördü. Ağca xanım onu tələsdirdi:

– Dur, çayını iç, işimiz var.

Gəldiyev yeyib-içəndən sonra çıxmaq istədi. Öz vəziyyətindən utandı: "İndi deyər yeyən kimi qaçır". Azca duruxdu, saatına baxdı:

– Birinci dərsimiz texnologiyadır. Gecikirəm. Ağca, mən gedim.

Ağca xanım kinayə ilə dedi:

– Yeri, dərs qaçır!

Gəldiyev onun qolundan tutdu:

– Dərs qaçmırsa, gülüm, sənnən də az oturmadıq ha, iki gündür burdayam ki...

Ağca xanım geyindi, uşağa tapşırdı ki, eşiyə çıxmasın. Gəldiyevə qoşulub gedəndə Gəldiyev soruşmaq istədi: "Sən hara?". Xətrinə dəyər, deyə soruşmadı. Pilləkənlərdən enəndə Ağca xanım onun qoluna girdi. Tramvay tərəfə qoymadı, küçə aşağı yeyin getdilər.

Dünənki bərk qardan sonra gün çıxmış, hava durulmuşdu. Əriyən qarın axıb getdiyini, novdanlardan suyun töküldüyünü gördükcə yaz yada düşürdü. Amma Bakıda belə günlər, qışda yazı, yazda qışı və pa-

yızı andıran günlər çox olur. Gəldiyev tramvay xəttinə mümkün qədər tez çatmaq, Ağca xanımdan ayrılmaq istəyirdi: "Nə lazım, görən olar..."

Verdiyevin sözü yadına düşdü: "Gözlə; bir balaca məişət pozğunluğuna oxşaya bilən işlərə doğru meyl göstərmək niyyətinə yuvarlanarsan ha!.."

Buna bir qorxağın vahiməsi deyib güldüsə də yenə tələbələrdən çəkinirdi. Ancaq bu hissini Ağca xanımdan gizlətməyə çalışırdı. Tramvay xəttinə çatan kimi küçə saatına baxacaq, dizinə döyüb yüyürəcək ki: "Vaxtım keçdi, uşaqlar məni gözləyir".

Gəldiyevin niyyəti Ağca xanıma məlumdurmu, məlum deyilmi, bu barədə heç nə deməyəcəyik. Bircə onu bilirik ki, Ağca xanım Kərimi tramvay xəttindən çox uzaq, instituta da səmt olmayan bir tərəfə, Proletarski küçəyə çəkdi. Gəldiyev dedi:

– Hara gedirik?

– Mənimlə getmək istəmirsən yoxsa?

Gəldiyev şeir ilə cavab verdi:

– Hara getsən səninlə mən də varam...

Ağca xanım şüşəbəndi təzə salınmış, hələ rənglənməmiş bir dükanın qapısında dayandı. Əvvəlcə Gəldiyevi itələdi, dalınca özü girdi. Gəldiyev güman elədi ki, haradırsa Ağca xanımın işi var. Tək gəlməyi münasib bilməyib.

Bura darısqal, alçaq, yarımqaranlıq bir otaq idi. Ancaq səliqədə idi. Sağ və sol tərəfdə köhnə, uzun kürsülər qoyulmuşdu. Bir neçə adam oturub gözləyirdi. Gəldiyev gülə-gülə soruşdu:

– Bura haradır?

Ağca dinmədi. Otağın dib tərəfinə baxdı. Dib tərəf maliyyə idarələrində olan kimi alçaq şüşəbənd ilə qurşağa qədər kəsilmişdi. Ağca yeriyib, şüşəbəndin qapısını açdı. Onu içəri çağırdılar, getmədi. Qayıdıb Gəldiyevə işarə elədi. Gəldiyev əlləri paltosunun cibində, deyəsən, idarə başçısının otağına girdi. İdarə başçısı ortayaşlı, qarayanız, arıqca bir adam idi. Qalxıb əl verdi, yer göstərdi:

– Mübarək olsun! – dedi.

Gəldiyev:

– Sağ ol, – cavabını versə də, niyə mübarəkbazlıq olunduğunu seçmədi. Ağca üzünü arıq kişiyə tutub dedi:

– Ay Paşa, bizi yola sal, Kərimin dərsi var.

Paşa:

– Bu saat! – deyib çağırdı: – Həbib, Həbib!

Ağgeyimli bir oğlan gəldi. Paşa yazdığı kağızı ona verdi:

– Həbib, bu yoldaşları qabağa sal.

Həbib onları apardı. Gəldiyev Ağcanın qolundan tutub, ahəstə səslə soruşdu:

– Nə məsələdir?

Ağcanı gülmək tutdu. Ciddiliyini pozmadı. Gəldiyev bir də soruşmaq istəyirdi ki, Həbib şüşəbəndin qabağında dayanıb təklif elədi:

– Buyurun bura!

Gəldiyev gözünü Ağca xanımdan ayırmayaraq, pərdənin dalısına keçdi. Həbib pərdəni örtdü, gülər üzlə Gəldiyevin qarşısında dayandı: Onun üzünə baxdı:

– Soyunun, xəstəliyə-zada tutulduğunuz olmayıb?

Ancaq indi Kərimə əyan oldu ki, bura nə imiş, Ağca xanım onu nə üçün gətirib və həkim nə üçün belə sözlər soruşur. Elə bil başından bir qazan dağ su tökdülər. Bütün vücudu mum kimi yumşaldı, gözləri alacalandı. Dizləri taqətdən düşdü. Başı vurulmuş kimi boynuna endi, boğazından nəgahani bir "uf" qopdu. Həkimin suallarına ala-yarımçıq cavab verib çıxdı. Qaçmaq istədi, düşündü ki: "Qaçmaq ilə qurtarmayacaqsan. Dava eləyib pozdurmasan, evlənmisən ki, evlənmisən". Çaşmış halda qapıları açıb örtdü, gah müdirin, gah katibin yanına baş vurdu. Ağca xanım həkim otağından çıxıb, gülə-gülə Gəldiyevə yaxınlaşdı.

Gəldiyev bulud kimi tutulmuşdu:

– Bu nə işdir, Ağca xanım, məndən xəbərsiz məni evləndirirsiniz deyəsən?

Ağca xanım onun rəngini görüb xəyalını anladı. Sifətinə qəzəbli bir görkəm verdi:

– Bu nə qaşqabaqdır?

Gəldiyev qolunu ölçdü:

– Mən belə şeyə dözüb eləmərəm ha!

Ağca it ilə qarşılaşmış pişik kimi üzünü qabartdı. Sanki başının tükləri biz-biz olub tirmə şalı qaldırdı:

– Xəbərin yoxdur?

– Mənim razılığımı soruşmamış, bilməmiş...

Bu anda katib dəftəri və kəbin kağızını gətirib, Gəldiyevin qabağında tutdu. Gəldiyev heç üzünü o yana çevirmir. Ağca xanımdan cavab istəyirdi:

– Mənim razılığım: xahişim...

Ağca xanım onun ağzının üstündən elə bir sillə çəkdi, uzaqdan eşidənlər elə bildi ki, bez cırdılar.

– Razılıq, xahiş! Gör haçan razılıqdan danışır. Sənin üçün üç aydır bəyəm istirahət evi açmışdılar, qol çək!

Gəldiyev ağzını tutdu. Bu həngaməyə baxan adamların xəcaləti, qızmış aslan kimi duran Ağca xanımın qəzəbi, kiminsə hırıldayıb gülməsi, sanki Gəldiyevi hər şeydən məhrum edir və hər şeyə məcbur edirdi.

Ağca:

– Qol çək! – deyəndə katib dəftəri daha yaxın tutdu. Gəldiyev başını qaldırmadı. Qələmi güc ilə tutdu, dəftəri cızdı, nə yazdığını özü də başa düşmədi. Ağca xanım kağızı qatlayıb redikuluna qoydu. Onu elə şəst ilə bağladı ki, deyərdin illərdən bəri çalışıb ələ gətirdiyi arzularını oraya qoymuşdu.

Məmnun bir baxışla adamlara xudahafiz eləyib Gəldiyevin qoluna girdi, onu çəkə-çəkə tramvay ayağına apardı, vaqona mindirəndə yadına saldı:

– Axşam gecikmə!

Ağca xanımın səfehliyi haqqındakı axşamkı düşüncələr Gəldiyevin başından dağıldı.

Ağca xanımın təkidilə Gəldiyev İzzəti bağçaya qoydu. Axşam saat dörddə ötürməli, səkkizdə gedib gətirməli idi. Ancaq həmişə gedə bilmirdi və getməyəcəkdi də... Ağca xanım hər gün səliqə ilə uşağını geyindirib, bağçaya yola sala bilsə və vaxtında da gedib gətirə bilsə, heç bağça-filan lazım gəlməzdi. Özü işləmirdi. Evində oturub, yeganə uşağına qulluq eləyər, get-gəl əzabından da qurtarardı. İş belədir ki, Ağca xanımın nə uşaq ilə əylənməyə, nə də bağçaya yola salmağa vaxtı vardı: geyinib-keçinəndə dünya gözünə görünməzdi. Gəldiyev dərsi, ya iclası bəhanə gətirərdi. Ağca eşitməzdi.

– Sənə iclas şirindirsə, mənə də teatr...

– Bəs uşaq necə olsun?

– Uşaq var deyən, mən ömrümü puç eləməliyəm ki?

– Ağca xanım, bunu mən yanımda gətirməmişəm, öz balandır, qorxudan ölər!

– Balamdırsa, mən bilərəm, sən qarışma!

Ağca xanım hiss ilə çəkib qapını bağlar, uşağı həyətə endirər, tapşırardı:

– A qonşular, bundan muğayat olun. Oynasın, bir-iki saata qayıdırıq.

Əvvəl qonşular bir söz demirdilər. Elə ki, İzzət hər gün axşamlar həyətdə, qapı-bacada, ya onun-bunun evində qalmalı oldu, söz çıxdı, hətta bir gün ev idarəsinin işçisi gəlib, Gəldiyevi danışdırdı da:

– Bu uşağı niyə sahibsiz qoyursunuz?

Gəldiyev üzr istədi:

– Anasının vacib işi olur, qonşulara tapşırıb gedir, uşaqdır, durmur, qaçır.

İdarə işçisi ona inandı:

– Siz bunun atalığısınız, nə qədər yaxşı baxsanız, ögey deyəcəklər. Elə eləyin, uşaq sarıdan sizə diqqət tutan olmasın.

Gəldiyev ondan sonra uşağı bağçaya verdi. Ağca bir-iki gün özü yola saldı. Sonra uşağın yolu tanıdığına arxayın oldu, axşamlar onun qeydinə qalmadı.

Bağça saat səkkizdə bağlanırdı. Ağca xanımın qapısı saat səkkizdə açılmırdı. Uşaqlar bağçadan dağılışanda İzzət əlləri dizində dəhlizdə, qarovul kürsüsünün üstündə tək oturub mürgüləyirdi. Qulluqçular bağçanı silib-süpürər, yığışdırardı. İzzətin adamı gəlmədiyini görüb onu ötürərdilər. Buna da Ağcanın acığı tutdu:

– Ay itin balası, özün gələ bilmirsən bir addım yolu? Niyə qapını ona-buna tanıdırsan!

O idi ki, İzzət qorxusundan heç kəsə qoşulmurdu. Anası, ya Gəldiyev gəlməyəndə yola düşüb maşından, tramvaydan, milisdən, keflidən qorxa-qorxa gəlirdi.

* * *

Rübabə dərsdən qayıdanda və ikinci dəfə İzzəti küçədə tək görəndə izindən əl çəkməməyi qət etdi. Özünü ona göstərmədi, dalısınca gəlib evlərinə çatdı. İzzətdən beş dəqiqə sonra qapını döydü. Su daşıyan qarı qabağa çıxdı:

– Ay xala, İzzət kimin uşağıdır?

Qarı heç nə demədən həyətə çəkildi. Bir az sonra Ağca xanım qabağa çıxdı. Rübabə dedi:

– Bağışlayın, bu uşağı mən ikinci dəfədir sahibsiz görürəm. Gecə vaxtı, böyük şəhər, küçədə beş yaşlı uşaq...

Ağca xanım bunun ağzını yamsılayıb danışdı:

– Bağışlayın, bunun sizə nə dəxli?

– Uşaq bədbəxt ola bilər...

Ağca qışqırıq saldı:

– Bədbəxt olsun canın. Bikarlamısınız, bilmirsiniz nə hoqqa çıxarırsınız! Sizinki uşaq deyil, böyük dərdidir. Qızışıbsınız, çarə tapın, Kərimin ailəsi var, ay yazıqlar! Ummayın, şişərsiniz!

Vaxtilə Gəldiyev Ağcaya danışmışdı ki, məktəbdə bir neçə qız var, məndən əl çəkmirlər. Biri lap məktub-zad da yazıb. Ancaq Rübabə, bilsəydi, bu arvad Gəldiyevin arvadıdır və bu uşaq onun oğulluğudur, heç dalınca düşməz, bir kəlmə də danışmazdı. Ağcanın həyasızlığını gördüsə də susmadı:

– Xanım, – dedi, – uşaq mal deyil, istədiyin yerdə bağlayasan. Onun üçün sən məsulsan. O, tək sənin yox, gələcəyin, xalqın da övladıdır. Saxlamağı bacarmayanda əlindən ala bilərlər. Uşaq tərbiyəsi indi ümumi işdir.

Ağca qəh-qəh çəkib istehza ilə güldü və şəhadət barmağını ona tərəf silkələdi:

– Uşağı alsan da, atasını əlimdən ala bilməyəcəksən, umsuna-umsuna qalacaqsan, ay yazıq!

Rübabə başa düşdü ki, Ağca onun sözünü hayana yozur. Gəldiyinə, danışdığına peşman oldu, evin ünvanını götürdü, sakitcə qayıdıb getdi. Bütün gecəni fikir-xəyal içində başağrısı çəkdi.

## Dördüncü fəsil

Vağzal qapılarından çıxan camaatdan bilinirdi ki, qatar gəlmişdir. Adamlar daş pilləkənlərdən təmiz küçəyə enəndə qırılmış boyunbağı kimi səpələnib dağılırdılar. Bayaqdan döşəməyə mıxlanan maşınlar, müntəzir dayanan faytonlar hərəkətə gəlir, sanki bu qiymətli muncuqları yığmaq üçün qaçışırdılar. Tramvayçılar zəngi daha da bərk vurur, hamballar yüyürüşürdülər.

Gələnlərin bəzisi böyük və möhtəşəm binalar arxasında, geniş küçələrdə yox olurdular. Lakin nə Sadıq kişi, nə də onun məktəbdən

qovulmuş oğlu gözdən itdi. Lap şəhərin içərisində də onları – qabaqda məyus yeriyən oğlanı, onu izləyən çiyni xurcunlu, addımı qayım kişini görənlər nabələd olduqlarını seçə bilirdilər. Sadıq kişi ayağında yumşaq məst, şalvarı dolaqla qıvraq bağlanmış halda oğlunun dalınca gedirdi. O, bəzən adamlara yol vermək üçün səkidən aşağı düşür, hamının keçib qurtarmağını gözləyirdi. Lakin camaatın dalısı üzülmürdü. Şəhərin izdihamı və ehtişamı kişini elə tutmuşdu ki, heyrətdən deyirdi: "İlahi, görəsən, bu qədər camaatın çörəyini kim bişirir? Buna xamırmı çatar, tabaqmı dözər, təndirmi yetər... Bütün ömrümdə tutduğum bal bunların bir səhər çayına çatmaz..."

Sadıq kişi tamaşadan doymasa da bu gecənin fikrini unutmamışdı: mehmanxanada və ya kəndli evində yatacaq yer tutduqdan sonra oğlunun işi üçün gedəcəkdi.

Vahid də direktoru görməyə tələsirdi. Ancaq üzünü tük basmışdı, üst-başını düzəlməli idi. Məktəbdə belə görünmək istəmirdi. Atası soruşdu:

– Hara gedirik?

Vahid dedi:

– Çatmışıq!

Onlar inşaat institutunun uca, ağır və yaylı qapısını açanda dəhliz başındakı kəfkirli saat ikini vururdu. Vaxtı yoxlamaq Vahidin yadına düşməmişdi. Saat ilə üz-üzə gələndə işin axırına az qaldığını bilib darıxdı. O istəyirdi ki, tələbələr tənəffüsə çıxanda onu görməsinlər və atasını çəkə-çəkə iltimasa gətirdiyini bilməsinlər. İllah da Rübabə ilə bu vəziyyətdə üz-üzə gəlməyi heç istəmirdi.

Onlar direktor kabinetinin ağzındakı dəhlizdə gözləyənlərə qarışdılar. Vahid atasına pıçıldadı:

– Burada olur.

Necə danışmaq haqqında bəzi şeylər öyrətmək istədisə də artıq vaxt yox idi. Ona elə gəldi ki, bu saat göyköynək qadın qapını açıb, adamları direktorun yanına buraxacaqdır. Sadıq kişi bu balaca dəhlizə sığmırdı, o yan-bu yana gəzinir, vurnuxurdu. Dayananların birindən soruşdu:

– Direktor burdadımı?

– Burda deyil, bəs biz nə gözləyirik?

– Daha niyə acığın tutur?

Vahid atasının artıq-əskik danışacağından çəkinib, divanı göstərdi:

– Otur dincəl, – dedi.

Sadıq kişi üzünü qapıdan çevirmədi.

– Oturmağa gəlməmişik ha!

İçəridən çıxan bir qadın baş ləçəyini düzəldib ötdü. Qapıdakılardan gödəkcəli, arıq bir oğlan direktor otağına girdi. Sadıq kişi qapını örtməyə qoymadı.

– Yoldaş direktor, bağışlayın, uzaqdan gəlmişik, olarmı sizə zəhmət verək?

Qapısında xurcunlu kişini görən direktor nəsə dedi. Sadıq kişi içəri girdi.

Vahid atasında bu cürəti bilməzdi. Özünü itirdi, deyəcək idi: "Kişi, xurcunu burda qoy". Macal tapmadı. Onun dalınca kabinetə daxil oldu. Sadıq kişi xurcunu çiynindən aşırdı, direktorun qabağına yeriyib, çoxdanın tanışı kimi əl verdi. Vahid də görüşdü. Direktor irigöz, şişburun bir adamdı, üzündə çopura oxşayan çil vardı. Sadıq kişiyə yer göstərdi:

– Əyləşin! Nə qulluq?

Sadıq kürsünü irəli çəkdi, gödəkcəli oğlanı göstərib dedi:

– Qul sahibi olasınız. Bu yoldaşı yola salsanız yaxşı olar. Bizimki bəlkə tul çəkdi.

Gödəkcəli oğlan əlindəki dörd qatlanmış kağızı direktorun qabağına qoydu. Direktor açıb oxudu. Başını qaldırıb dedi:

– Başarmaram, bala, başarmaram!

Gödəkcəli oğlan tələb elədi:

– Başarmalı bir iş yoxdur, bu mənim haqqımdır, yazın versinlər.

– Niyə komissiyaya ərizə yazmamısan?

– O vaxt müalicədə olmuşam, ailəli yoldaşların hamısı necə, mən də elə. O qayda ilə yazın, təqaüd versinlər.

– Axı onlar ərizə vermişdilər, komissiyadan keçiblər.

Gödəkcəli oğlan onun sözünü yarımçıq qoydu:

– Budur, mən də yazmışam.

– Gərək komissiyaya yazasan. Orada partiya nümayəndəsi, komsomol nümayəndəsi...

Gödəkcəli oğlan ərizəsini onun qabağından götürmək istədi:

– Verin, başını yazım komissiyaya.

– Sən yazmaq ilə deyil, təzədən komissiya çağırmayacağam ki...

– Özünüz qol qoyun!

– Əcəb danışırsan, mən nəçiyəm?

Onun sözü gödəkcəli oğlanı heyrətə saldı, içəridə özgə adam olsa da ürəyindəkini saxlamadı:

– Siz institutun direktorusunuz!

– Çox da direktoram, komissiyasız mən bir şey edə bilmərəm, sabah...

– Onda komissiyanı direktor qoysunlar da.

– Nə demək istəyirsən, yoldaş tələbə?

– Demək istəyirəm ki, öz vəzifənizi nahaq yerə özgənin boynuna yükləməyin, buna siz qol çəkməlisiniz.

– Ərizənə qol çəkim, eləmi?

– Qanuni olmasını yoxlayın, sonra qol çəkin.

Direktor duruxdu:

– Sabah cavab verməli olanda elə bilirsən sənin yaxan ələ keçməyəcək?

Tələbə başını tovladı:

– Mən həmişə buradayam, tutanda ikimizi də bir apararlar.

Direktor qızaran kimi oldu, ərizəni götürüb bir də oxudu:

– Beş baş?

– Bəli!

– Kimdir onlar?

– Anam, bacım, yoldaşım, bir uşaq.

– Bunlar işləmirlər?

– Yoldaş direktor, işlədi-işləmədi təqaüd məsələsinə dəxli yoxdur. Külfəti olan adama nə təqaüd kəsilibsə, mən onu istəyirəm.

Direktor zəngi basıb hesabdardan təlimnaməni istədi. Sadıq kişi əvvəl gödəkcəlinin, sonra da Vahidin üzünə baxıb him elədi: “Uzun çəkəcək...” Direktor təlimnaməni oxuyub hesabdardan soruşdu:

– Bunu havaxt almısınız?

– İlin əvvəlində.

– İlin əvvəli uzundur, tarixini de.

Hesabdar dəftər-kitabı töküşdürdü:

– Avqustun 21-də.

– Ondan bu yana ayrı təlimnamə almamısınız?

– Necə almamışıq, təlimnamə hey gəlir.

– Bu barədə, ailələr təqaüdü barəsində?

– Elə budur ki, var!

Sadıq oğlunun qulağına pıçıldadı:

– Yaman diqqətcil adamdır.

Direktor qələmini əlinə aldı, mürəkkəbə batırıb ərizənin üstünə gətirdi. Dayanıb sətirlərə baxdı. Deyəsən mürəkkəbin öz-özünə töküləyini gözləyirdi. Əli havada titrədi, dönüb tələbədən soruşdu:

– Birinci dəfədir siz ailəli olursunuz?

– Mən çoxdan ailəliyəm.

– Yox ey, təqaüd məsələsində.

– Birinci dəfədir ailəli təqaüdü tələb edirəm.

Direktor qələmi yerinə qoyub ayağa durdu, əli cibində gəzindi, gözünün ucu ilə təlimnaməni göstərdi. Hesabdardan soruşdu:

– Bəlkə dəyişiblər?

– Dəyişsələr yazarlar.

– Bəlkə yazacaqlar?

– Yazanda biz də əməl elərik.

– Bu yoldaşın ərizəsini bəlkə razılaşdıra bildik?

– Hara ilə?

– Hara ilə olur olsun, ya komitə, ya komissiya, ya bura...

Tələbə qalxıb papağını başına qoydu.

– Yoldaş direktor, bağışla, incitdim sizi, o təqaüdü mən alsam, hər qəpiyi qiyamət günündə od olub canıma yapışar. Bu əzab ki, siz çəkirsiniz, mənim vicdanım qəbul eləməz. Azara-zada düşərsiniz, uşaqlarınız var, yazıqdır, qoy dursun.

Tələbə ərizəsini götürdü və parça-parça edib səbətə atdı, xudahafiz deyib çıxdı, hesabdar da onun dalınca getdi. Direktor tələbənin qarasına baxdı-baxdı:

– Di gəl beləsi ilə işlə görüm necə işləyəcəksən. Vəziyyəti düşünmür, məsuliyyəti bilmirlər.

O, xeyli vaxt başını qaldırmadı. Onu böht aparmış, on-on iki il əvvəlki bir zamana atmışdı. "Kənd-şəhər rabitə cəmiyyəti"ndən kəndə təhkimçi gəlmişdi, söhbətində məsəl çəkmişdi.

"Məşhur məsəldir, yoldaşlar, toyuğun başı kəndə, quyruğu şəhərə sarı dursa quyruq başdan şərafətlidir".

Komsomolçular irad tutub güləndə, Verdiyev bir-iki nəfəri çağırıb göz ağartması vermişdi:

"Babam əfəndi olub babalarınıza böyüklük eləyib, atam ağsaqqal olub atalarınıza ağıl öyrədib, özüm də firqəçi olub özünüzə rəhbərlik eləyirəm, nə belə atılıb düşürsünüz?.."

Komsomolçular Verdiyevin hədəsini car çəkib yerinə yetirmişdilər. Vilayət komitəsi çağırıb onun kitabçasını almışdı.

Ara sakitləşəndən sonra Verdiyev sübut edə bilmişdi ki, "belə söhbətləri mən ayıq baş ilə deməmişəm". Birtəhər özünü düzəltmiş, "Çocuq Dostları Cəmiyyətində", sonra "Göy birliyi"ndə işə girmişdi. Rayonda hansı seçki idisə, kimin barəsində müzakirə edilirdisə, Verdiyev əlini tovladı:

– "Eh, – dedi, – uzatmaq nəyə lazım, hər kəs eşşək olsa, biz ona palan olarıq".

Yenə onu qurdaladılar. Uzun dava-məşəqqət, yalvar-yapış... Axırı ki, bir töhmət ilə canını qurtarıb Bakıya qaçdı:

– "Canım, – dedi, – adamın biliyi kəm olanda tez çaşır, göndərin ali təhsilə, qoyun oxuyum..."

Bakıda onun işi avand gəldi. Müəllim kurslarına girdi, iki il oxudu. Orta məktəblərin birinə müdir müavini təyin olundu. Gündüzlər işlədi, gecələr təşkilatın təkidi ilə "Kommunist Darülfününuna" davam elədi. Özək katibinin yanında xətir-hörmət qazandı. Bir də gözünü açıb özünü məsul bir kürsüdə, başqa bir institutdan ayrılıb yenidən təşkil olunan inşaat institutunun ağası gördü. Keçdiyi yollar xəyalən göründükcə, Verdiyev tələbənin dalınca deyinirdi:

"Rəhmətlik oğlu, bilsən ki, əskim necə tüstülüdü. Bilsən ki, mənim tərcümeyi-halım partiyadan qovulmaq və partiyaya qaytarılmaq tarixindən ibarətdir; bilsən ki, hər qovulanda beş kilo ət itirirəm, heç bu sözü deməzsən..."

Onu hövsələyə gətirmək üçün Sadıq kişi təsəlli verdi:

– Böyük olmaq belədir də, siz atasınız, gərək hamısının nazını çəkəsiniz. Bunu deyib daha da yaxın oturdu. – Bu mənim, biədəb də olsa, oğlumdur, yoldaş direktor! Necəsə dolaşdırıb məktəbdən qovublar. İndi neçə müddəti külfətdə ovqattalxlıqdır. Çox xahiş edirəm ədalətlə bu işə baxasınız, uşağı oxutmağa düzəldəsiniz.

Direktor Vahidin üzünə baxırdı, sanki demək istəyirdi ki: "Bəli, yadıma düşdü".

Vahiddən soruşdu:

– Neçənci sinifdə idin?

– İkincidə.

– Qarabağlı deyilsən?

– Bəli.

Direktor düyməçəni basdı, içəri girən göy geyimli qadına dedi:
– Partkomda gör kim var, Kərimi çağır!
Vahidin ürəyi döyündü, Gəldiyevlə üz-üzə gəlmək çətin idi. İstədi çıxıb dəhlizdə dayansın, qapıçı qayıtdı:
– Bayram komisyonundadır, harasa gedib.
Direktor Sadıq kişiyə dedi:
– İşə tanış adam burda yoxdur, Gəldiyev yaxşı bilir, sabah gəlin baxaq.
Sadıq kişi əlini xurcuna atdı:
– Səhərçağı gəlsək necədir?
– Gəlin, doqquzdan burada oluram.
– Gəldiyev neçədə olur, onu da bilək da!
– O da doqquzda.
Vahid utana-utana soruşdu:
– Ərizə lazımdırmı, yoldaş direktor?
– Əlbət ki! Partiya təşkilatının üstünə yazın.
Sadıq "baş üstə" deyib çıxdı.
Pilləkənlərdən enəndə oğlundan soruşdu:
– Direktor elə budur?
– Elə budur, Gəldiyev kimisinə uyandan nə ağıl umursan.
– Adamdı da! Deyəsən canavar əli görsədiblər, qorxur.
– Gərək qorxmasın axı!
– O qədər haramzadə var ki, gözünü qorxudublar da!
– Qorxur qırağa çəkilsin, niyə vəzifəni boynuna alır? Onun bir qol çəkməsi ilə adamlar o yan-bu yan olur axı. Düz apara bilmirsə, iş başına niyə oturub?
Sadıq kişi başını tovladı:
– Ay pir olmuş, hələ uşaqsan. Sən deyən kimi olsa, Şura hökuməti daha qoşunu neyləyir, – küçədə duran, əli ilə maşınlara yol göstərən milisə işarə etdi, – milisi neyləyir, məhkəməni neyləyir, hələ o qədər anasının əmcəyini kəsən var ki!
Onlar söhbət eləyə-eləyə Sabir bağının qabağına çatdılar. Sadıq kişi heykələ baxdı:
– Bu Nikolaya sataşan şair deyilmi, Vahid?
– Bəli, Sabirdir.
– Ciyərli adam imiş rəhmətlik.
– Ciyər xəstəliyindən də öldü.

Sadıq kişi bir az susandan sonra dedi:

– Elədir, düşmən adamın tutarlı yerindən vurur.

Vahid "Şərq" mehmanxanasına tərəf döndü. Orada yer olmadığını bilib ötdülər. Bu mehmanxana sənin, o mehmanxana mənim, ha gəzdilər, boş yer tapılmadı ki, tapılmadı. Kəndli evində eyvanda da yatmağa razı oldular, ancaq direktor icazə vermədi; qaşqabaqlı, qara, ortaboy dalandar gözünü yumub, başı ilə rədd edirdi:

– Yerimiz yoxdur, yoldaş!

Onun təşəxxüsü Sadıq kişiyə ağır gəldi; bir cavabla da acığını ifadə etməyə çalışdı:

– Nə qansız adamsan, a kişi, Allah sənə qapıçılıqdan artıq qulluq qismət eləməsin, qırarsan xalqı! – Sonra Vahidə döndü: – Görürsən? Yazıq hökumət neyləsin, Nikolayla aşkara tutuşurdu, amma bunlar tülkü ölümcüllüyü ilə iş görürlər. Sən də deyirsən belə. Görmürsən köpək uşağını!

Uşaqdan aldığı qəzetə baxanda Vahidin yadına düşdü ki, sabah istirahət günüdür, birisi gün də bayram.

– Bəs necə eləyəcəyik, bir gecəliyə yer tapmırıq, üç gün qala bilərikmi?

– Yox canım, kişi bizə söz verdi, səhər orada olacaq.

Vahid ürəyində dedi: "İdarəyə gəlməsə, evinə gedib qapısını kəsərik".

Şəhər bağında bir az oturdular. Gecəni buralarda keçirmək lazım idi. Ancaq mümkün deyildi. Sadıq kişi hiss edirdi ki, gəzməkdən ayaqları qızışmış, keyimişdir, baldırları gizildəyir. Soyuqda oturduqca, özünə gəldikcə vücudu ağırlaşır, kürəkləri sancır.

Vahid də əlləri cibində oturmuş, dayanacağa söykənmişdi. Birdən düzəldi, üzünü yana çevirdi, papağının günlüyünü gözünə basdı.

Rübabə bir oğlan ilə söhbət eləyə-eləyə gəlib düz onların qabağından keçdi, onun sözlərini eşidən Vahid əsən kimi oldu: "Şərqdə" yoxdurlar. "Avropada" olacaqlar.

Rübabənin səsi ilə Vahidin məyusluğu sönüb getdi: o, yenə özünü dərs otaqlarında, Rübabənin yanında hiss etdi. Bu səs nə qədər xoş idi. Bir anda Vahidin yadında işıq kimi yanıb-sönən xatirələr bir-birini təqib etdi. Uzaqlaşıb gedən Rübabəni, gözdən itənə qədər, arxadan, həsrət nəzərləri ilə yola saldı. Vahid elə həsrətlə baxırdı ki, deyərdin gedən qız əbədi olaraq gedir və onun bütün sevinclərini özü ilə aparır.

Sadıq kişi də Rübabəni gördü. Oğluna, onun vəziyyətinə də diqqət elədi. Ürəyində dedi: "Cütdülər".

Rübabə ötəndə Vahid özünü itirmişdi, çaşmışdısa da, indi yavaş-yavaş özünü danlayırdı: "Niyə qalxıb görüşmədin, niyə çağırmadın!". Bu fikir ona çox gülünc və bir qədər də təhqirli gəldi: "Məni belə görməməlidir, yanındakı bəlkə heç məni tanımır. "Parapet" küncündə qalan bir oğlanla tanışlığını qızın başına qaxa bilər. Yox! Mən Rübabə ilə ya əvvəlki vəziyyətdə görüşəcəyəm, ya da heç görüşməyəcəyəm!".

Rübabənin sözləri Vahidin qulağında yenə də səslənirdi: "Şərqdə" yoxdurlar, "Avropada" olacaqlar!". Qız coğrafiyadanmı danışırdı, yoxsa adam həsrətində idi? Birdən bir şey xatırlamış kimi Vahid barmağını dişlədi:

"Rübabə bizi axtarır, "Şərq" mehmanxanasına gedib, buradan da "Avropa" mehmanxanasına dönür..."

Rübabə axşamüstü məktəbə gedəndə direktorun qapıçısı həmin göyköynək qadın xəbər vermişdi:

– O oğlan gəlmişdi axı!

– Hansı oğlan?

– O ki qovdular ha... şuşalı. Yanında bir kişi də var idi, görmədin?

– Yox, görmədim.

Rübabə zahirdə bu xəbəri soyuq qarşılamışdı. Bu işsiz, çənədən saz qadınların ağzına saqqız vermək istəməmişdi. Vahid qovulan zamanlar Rübabənin Verdiyev ilə deyişməsini uzun bir macəraya çevirib şirin söhbət elədilər. Həmin qadın dizinə çırpıb deyərdi:

"Qızışıblar, bacım, qızışıblar! Az qalıb kişinin üstünə daşlana!".

Həyətdə dalandarı tutub razılıq eləmişdi: "O şuşalı gədənin mitilini atdınmı bayıra?". Dalandar bilmədi kimi deyir.

– Hansı şuşalı?

– Biri var ey, direktor qovan.

– Qovulanların şeyini təhvil almışıq, necə bəyəm?

Göyköynək əlini onun kürəyinə vurmuşdu:

– Elə bax, qoy getsin mal otarmağına. Tərəkəmə köpəkoğlu çobanlıqdan gəlib burada rahat durmur. Kimə bənd olsa yaxşıdır. Səttarın qızı nədir, xanəndə Səttarın qızına tamah salırdı. İştaha bir bax! Əcəb olub!..

Göyköynək qadın Rübabəni tanımırmış: ancaq qızlar ilə oğlanlar, qadınlar ilə kişilər, böyüklər ilə kiçiklər, tələbələr ilə müəllimlər ara-

sında olan-olmazı izləməyi, seçməyi, qurdalamağı özü üçün peşə, adət eləmişdi. Bu hiss onda çox ayıq idi. Bir şey duydumu, deməsə, danışmasa, axırına çatmasa, tanıdıqlarına çatdırmasa bağrı çatlardı. Kimin kiminlə öpüşdüyünü, zarafatlaşdığını, kimin kimdən xoşu gəldiyini, ya gəlmədiyini, kimin kimə tamah saldığını, ya salmadığını, hansı qızın necə bəzəndiyini və niyə bəzəndiyini, niyə bəzənmədiyini həmdisurə kimi qiraət ilə danışardı. Səhər otaqları süpürüb qurtarar, direktorun gəlməyinə bir saat qalmış boşalardı, özünü dalandarın yanına verərdi:

"Ötən axşam urus müəllimləsi ilə müavini bulvarda görüblər...

Fəridə yenə geyinib-kecinib, gedəndən kağız alıb axı, yanına çağırır...

Elə hey cütləşirlər ha. Küncdə öskürürsən, görürsən sərçə kimi bir cüt çıxdı, elə əyirirlər, qıldan incə..."

Başqa xidmətçilər otaqları təmizləyib işini qurtaranda rahat olurdusa, göyköynək qadın durub-gördüyü, eşitdiyini qapı-qapı gəzib, bütün tanışlara çatdırmamış rahat olmurdu. Şirin iş vaxtında birisindən bir xəbər eşitdimi, dərhal süpürgəni yerə qoyub qaçırdı. "Xəbərləri" yerinə yetirməsə, rahat olmurdu.

* * *

Bağda dayanmaq mümkün olmayacaq idi. Gecə keçdikcə, adam seyrəldikcə dəniz tərəfdən sahil küçəsi ilə axıb gələn sazaq üzlərə dəyir, payız soyuğu kəsməyə başlayırdı, qalın paltar azlıq edirdi. Atabala tramvaya oturub vağzala gedəsi oldular. Bilet zalında daldalanmaq mümkün idi. Bura həm isti, həm səliqəli idi...

Vahidin ayrı bir ümidi var idi. Faytonçulara, ya hambalların birinə yanaşıb, yer xahiş edəcəkdi, güman ki, iyirmi-otuz manat versə, bir-iki günlüyə yer tapmaq çətin olmazdı. Ancaq kimə yaxınlaşdısa, bir şey çıxmadı. Axırda hirsləndi, papağı qırmızı haşiyəli dəmiryolçuya yanaşdı:

– Qardaş, – dedi, – bəlkə biri azıb Bakıya düşdü, gecəni harada qalmalıdır?

Dəmiryolçu dedi:

– Necə harada, şəhərdə mehmanxanalara nə gəlib, kəndli evi var...

Sadıq kişi baldırlarını göstərdi:

– Tökülür ey! Səhər açılandan ələk-vələk eləmişik. Yer verən kimdi?

– Şəhəri gəzmisiniz?

– Bəs nədi, əşi! Yer qalıb baş vurmamış olaq?

Dəmiryolçu bir xeyli sükutdan sonra cavab verdi:

– Vaxt elədi, baxtınızdan bayram qabağına düşüb, şəhərə gələn çoxdur.

Sadıq kişi oğlunun əhvalatını danışdı:

Bu gecəliyə daldalana bilsəydik. Mən heç, uşaq lap üzülüb, vaqonda da yatmayıb. Deyirəm get yoldaşların ilə görüş. Ona da utanır.

Dəmiryolçu dedi:

– Kəndə, rayona baxmayın, Bakı çox basırıq, qarışıqlıq olan yerdir. Camaat çox, hərənin bir otağı var, çəkilib oturub; mehmanxanalar da azlıq eləyir. Qonaq yanında adam doğrudan utanır.

– Bəs necə olsun, axı səhər vacib işimiz var...

– Necəsi yoxdur, gedək bizə. Birtəhər qalarıq. Qonağa layiq olmasa da bir otaqdır. Darışlıq olsa da atalar demiş: "Ürək geniş olsun!".

– Qonağınız çox olsun, sizə zəhmət vermək də yaxşı deyil.

– Bir zəhməti yoxdur, gedək!

Dəmiryolçu onları otağına apardı.

– Qardaş, – dedi, – bu mənim mənzilim, bu da bir dəst yorğan-döşəyim, növbədə olacağam, yata bilərsiniz. Bu radio, o da elektrik çayniki, qənd-çay da ki, var. Öz eviniz kimi!

Sadıq razılıq elədi:

– Çox sağ olun. Uşaq rahatlansın, mən lap kürsüdə də otura bilərəm. Bəs özünüz necə?

– Altı saat növbədə duracağam. Məndən nigaran olmayın, gündüz doyunca yatmışam.

Sadıq dəmiryolçunun girib-çıxmasından duydu ki, kişi mənzili onların ümidinə qoyub gedə bilmir. Vahidin də, özünün də pasportunu çıxarıb verdi:

– Buyurun, şəhər yeridir, sizdən soruşub eləyən olar.

Dəmiryolçu pasportları götürmək istəmədi:

– Yox canım, bir gecəliyə nə pasport.

– Ehtiyatdır da, sizdə qalsın, demək olmaz.

Dəmiryolçu pasportları qaytardı:

– Eyib deyilmi? Biri-birimizə etibar etməsək, daha nə yoldaşıq!

Qapını haradan bağlamağı öyrətdi. Mənzili qonaqlara tapşırıb getdi. Sadıq dalbadal bir neçə stəkan tünd çay içib qızışdı, rahatlandı, Vahidin heç nəyə meyli yox idi. Atası çarpayını göstərdi:

– Gəl, yat!

Vahid dedi:

– Mən dirsəklənəcəyəm, sən gir yat!

Ata-oğul bir-birinə təklif etdi. Axırda Sadıq kişi döşəmədəki təlisi açıb xurcunu başı altına qoydu, çuxasına bürünüb uzanmaq istədi. Vahid onun qolundan tutub, çarpayıya tərəf çəkdi. Kişi nə qədər dartındısa Vahid buraxmadı:

– Mən yatmayacağam, bil! Bu cür işin var idi, kişiyə niyə minnət eləyirdin?!

Sadıq çarpayıda yatmağa məcbur oldu. Vahid isə döşəmədə özünə yer elədi.

O, xüsusilə indi atasından xəcalət çəkirdi:

"Böyüdüb başa çatdırıb. İndi onun oğul dalınca düşmək vaxtı deyil, mən onun dalınca düşməliyəm. Gərək otursun, rahatlığını eləsin, qayğı çəkməsin, qulağı dinc yaşasın. Övladına baxıb fərəhlənsin. Amma nə eləsin ki, gəldiyevlərin ucundan mən onu köməyə çağırmalı oluram, gör nə aciz oğulam! Qoca kişidir, yorğunluq, soyuq... Sabah xəstələnə bilər, təhsilimdən ona xeyirim budurmu?.."

Xəyalat içində köks ötürüb duran Vahidin gözünə xeyli vaxt yuxu getmədi.

Sadıq kişi də yerinə uzanan kimi papiros yandırmışdı, hərdən sümürüb fikirləşirdi. Ancaq fikir çəkdiyini oğlundan gizlədirdi. O da Vahiddən xəcalət çəkirdi: "Mən bir qulluq sahibi olsaydım, oxumuş olsaydım, altımda maşınım, əlimdə portfelim olsaydı, kim oğluma burdan dur, orda otur, deyərdi?! Uşaqdır, yar-yoldaş içində sıxılır. Bəziləri qumar üstündə, oğurluqda danlananda, Vahidi də atasının ucundan incidirlər. İndi nə qədər qüssə eləyir! Niyə qapılarda boynunu büksün, niyə ona-buna təvəqqe eləsin? Soyuq yerlərdə yatsın... Belə də ədalətsizlik olar? Gör nə qədər mərdimazar var hələ içimizdə! Bəyin, xanın toxumu kəsilmir da!".

Sadıq kişinin atalıq ürəyi cuşa gəldi. Dikəlib oturdu. Papirosunu işıldadıb Vahidə sarı baxdı. "Deyəsən, o yatıb, yuxudadır". Köynəkçək qalxdı, balıncı aparıb yavaşca Vahidin başı altına qoydu. Çuxanı götürdü, üstünə yorğan saldı. Bundan bir ürək arxayınlığı duydu. Qaranlıqda bir qədər dayanıb, Vahidin rahat və isti nəfəsini dinlədi. Çuxanı üstünə çəkdi, qollarını qoltuqlarına büküb, papağı qulağının altına qoydu, əsnəyə-əsnəyə "Ya haqq!" dedi, yatdı.

Vahid qayğılı olsa da yorğunluq onu götürüb yuxu aləminə atmışdı. Orada o, boş və sakit bir yerdə rahat əyləşib kitab oxuyurdu. Qəribə

bir kitab! Ağ ipək vərəqləri açılıb uzanır, uzandıqca Vahidin baxışları da gedir, onların axırını görmək olmurdu. Bulud kimi qatılaşan, lay-lay yığılan ipəkdən gah ildırım kimi şaqqıldayan, gah gözəl xəzəl kimi xışıldayan vərəqlərdən savayı heç nə görünmürdü. Vərəqlərin örtdüyü uzaq üfüq qızarır, arxasından süngü kimi şüalar çıxır, göyləri yazırdı. Vahid vərəqləri qatlamaq istəyirdi. O, vərəqləri çevirir, lakin çevirə bilmirdi. Onlar qalın laylar, qurşun vərəqlər kimi ağırlaşırdı. Kitabı bükmək istəyir, qatlanmırdı. Sayrışan hərflər oynaşıb dururdular. Kitab örtülmürdü. Vahid kitabı dizindən yerə buraxdı, ipək vərəqlər içindən işıqlı bir şəkil seçildi. Bu şəkil böyüyür, cana gəlirdi. Vahid sevinc və heyrət içində Rübabəni qucaqlamaq istəyirdi. Rübabə kitabı yuxarı qaldırır. Vahid bir vərəqi oxuyurdu: “Rübabə!”

Rübabə ikinci vərəqi oxuyurdu: “Vahid!”

Vahid heç bir şey başa düşmürdü. Vərəqləmək istəyəndə Rübabə kitabı ağır-ağır örtürdü. Adlar, sətirlər bir-birini öpəndə, vərəqlər yumulanda Vahidin gözü açıldı, o özünü özgə otağında, yataqda qan-tər içində gördü: “Of, ay aman!”

Vahid üzərində ağırlaşan yorğanı cəld aşırıb dikəldi. Yerin içində oturub, yuxudan tamam ayılmaq üçün bir neçə dəfə kirpiklərini çaldı. Halbuki o daha da yuxulamaq, o xoş mənzərəni, vərəqlərin üz-üzə gəlib qovuşmasını bir də görmək istəyirdi. Rübabənin o sirli kitabı hansı bir qüvvətləsə tutub saxlamasına bir də baxmaq istəyirdi. İndi ürəyində nəsə deməli sözü də var idi.

“Hanı Rübabə, hara getdi, nə tez durub getdi?..”

Başı altında balıncı görüb durdu: “Yazıq kişi!” – dedi.

Yorğanı atasının üstünə çəkdi, balıncı da qoymaq istəyirdi, ayılmağından qorxub tərpənmədi.

Gecənin nə vaxtı idisə Sadıq kişi oyandı. Yorğanı öz üstündə görüb, oğluna acığı tutdu, qalxıb yenə onun üstünü basdırdı, bir papiros yandırıb işıldatdı. Pəncərəyə yanaşıb üfüqlərə baxdı, qaranlıq idi, hava işıqlanana oxşamırdı.

* * *

Səhər tezdən ata-bala gəlib, inşaat institutunun qapısını kəsdilər. Qarovulçu onları başa saldı ki, istirahət günüdür, idarə açılmayacaq. Vahid direktorun söz verdiyini söylədi. Saat birə qədər gözlədilər. Axırda durub gedəsi oldular. Sadıq kişi acıqlanmışdı:

– Sən oxumuş adamsan. Cüməni niyə çaşdırırsan?

– Özü dedi sabah gəlin də!..

– Daha dəmiryolçunun evində qala bilmərik. Deyər üz verdik, astar istəyirlər.

Onlar məktəb həyətindən çıxıb, mehmanxanalara getdilər.

"Şərqdə" yer tapmadılar. Ancaq dəftərdar olmadığından növbətçi onları gözlətmək istəyirdi. Vahid xahiş elədi:

– Qaçmırıq ha, al bu sənin otuz manatın qabaqcadan! İki gecə qalacağıq, çox yox, dəftərdar gələr yazarsan. Sən hələlik yerimizi göstər, rahatlanaq.

Növbətçi pulu götürüb onlara yer verdi. Yer tapılandan sonra tələsməyə ehtiyac yox idi. Müdirin başı açılmamış Vahidin şikayətinə arxayın baxması çətin idi. Bayram günlərinə isə iki gün qalırdı. Hər yerdə bərk hazırlıq gedirdi, şəhər toya hazırlaşan gəlin kimi bəzənirdi.

Bayramı Bakıda qalmalarına xüsusilə Sadıq kişi sevinirdi. O heç vaxt belə yerdə bayram keçirməmişdi. Şənliyə doyunca tamaşa edəcəkdi.

* * *

– Məxluqa bax, ay Vahid! Adama bax! Düzü-dünyanı götürüb... Vay atannan hey!

Vahid hələ bayaqdan şəhəri başına alan orkestr gurultularını eşidir, tələsik geyinib hazırlaşırdı. Pəncərəyə əyiləndə əllərdə dalğa kimi açılıb-bükülən qırmızı bayraq, böyüdülmüş şəkil və zər yazılı şüarlar, dəstələrin böyük küçələr boyu ilə axıb getdiyini gördü:

– Gedək, ata, – deyib, paltosunu geyindi.

Onlar gəlib, mərkəz küçənin bir kənarında dayanacaq, tamaşa edəcəkdilər.

Milislər tinləri kəsib əsas küçələrə adam buraxmırdılar. Beş addım yeri ötmək üçün beş küçə hərlənməli olurdun. Vahid bələd adam kimi dala baxmadan ötür, atası da onun izincə yüyürürdü. Onlar əyri küçədən, "Avropa" mehmanxanasının qabağından burulub nümayiş yerinə, sahilə çıxdılar. Nümayişçilər gəldikcə, meydana yollanmaq üçün buraya yığılırdılar. Vahid küçə yuxarı yeriyib, dayanan dəstələri atasına tanıdırdı.

– Bəs sizinkilər hanı?

Atası soruşmasa da Vahid öz məktəblərini axtarırdı. Hər il institut ali məktəblər ilə bir cərgədə gələrdi. Bu il isə bütün rayon təşkilatları

ilə gəlmişdi. Dəstələr dəqiqədə bir düzülür, beş-on addım gedir, sonra dayanırdı. Dayananda adamlar dağılışıb kürsülərdə, səkilərdə otururdular. Yuxarılardan, dəstələrin lap başından bir işıq kimi süzülüb gələn "Farağat" komandasını duyunca hamı öz yerinə qaçır, dağınıq, topa-topa duran adamlar əvəzində, yanaşı iki cərgə, zolaq kimi müntəzəm və əlvan dəstələr uzanırdı. Belədə təşkilatları bir-birindən tez seçmək olurdu. Hər iyirmi-otuz addımdan bir dayanan bayraqdarlar dəstələri ayırırdılar.

Vahid tələbələri görmədikdə darıxdı, həvəsdənmi, həsrətdənmi bir müddət çox axtardı. Lakin sonra xatırladı ki, "Sən qovulmusan, daha tələbə deyilsən. Birisi gəlib soruşsa: "Kimsən?", nə cavabın var? Tələbə deyiləm. Kolxozçu da, qulluqçu da deyiləm".

Zehnində doğan bu sualdan sonra Vahid ətrafına baxdı, özünü nümayişçilərdən, ümumi və qaynar bir həvəslə axıb gedən dalğalardan kənarda gördü. O indi sanki həyatın hərəkətindən ayrılmışdı, əli əsalı qocaların, evdar qadınların, əlillərin, uşaqların, qərib-qürəbanın, müsafirlərin arasında idi. Ətrafında tay-tuşlardan, yoldaşlardan, yaşıdlardan görmürdü.

Öz vəziyyətindən utandı. Ürəkdən qopan bir kədər soyuq cərəyan kimi bütün damarlarından keçdi. Vücudu sustaldı. Nəzərləri söndü. Ona elə gəldi ki, küçələrə çıxan bu yüzminlər, yerindən oynayan bu kütlələr arasında, tamaşaya duranlar içərisində ondan küskünü, ondan bəxtsizi yoxdur. Bu talesizliyinə odlandı. Qəzəbmi, hirs, ya təəssüfmü, hansı bir alovdansa alışan qəlbilə bütün bədəni yandı. "Hanı mənim yoldaşlarım? Dostlarım? Hanı könül vermək istədiyim? İndi mənim könlüm – kənara atılmış köhnə bir kitab onun nəyinə lazımdır..."

Fikirdən baş qaldıran Vahidin gözü dalğalanan dəstələrə düşdü. Elə bil yuxudan ayıldı:

– Bu nə aləmdir!

Milislər vurnuxaraq cəld ötən, özünü haraya isə yetirməyə can atan bir gənci yolundan qaytardılar. O, şəfəq kimi tez o biri tərəfdə görünür, eyni sürət, eyni təlaş ilə yüyürür, qarşısını kəsən milisin üzünə baxmırdı. Elə hiss ilə danışırdı ki, hamı təəccüb edirdi.

Kənardan baxan, hər dəstəyə diqqət yetirdiyini görən olsaydı, onun kimi isə bərk axtardığını düşünərdi; çünki o gah dəstələrin yanınca yeriyir, gah qabağa qaçır, gah da dala qalırdı; bir an da sakitləşmir, özünə gəlmirdi. Bu gənc doğrudan da adam axtarırdı, ancaq birini yox, çoxunu, çoxları axtarırdı.

O, səkkiz yaşından indiyə qədər hər bayramda və mərasimdə qoşalaşıb, əl-ələ verib gəzdiyi, deyə-gülə oynayıb sezdiyi pioner, şagird yoldaşlarını axtarırdı. Məktəb həyatından tutmuş instituta qədər, kənddən şəhərə, pionerlərdən komsomola, tələbədən müəllimə və qulluqçuya qədər hər yerdə onun yoldaşları vardı. Onlar hanı? Onların hamısı bu gün nümayişdə, bayram keçirən dəstələrdədir. Onlar, etibarlı yoldaşlar bu saat yanlarına baxırlar, "Vahid hanı?" – deyə bir-birindən soruşmurdumu?

Yox, soruşmurdular. Xəyallarına da gəlməzdi ki, Vahid cərgədən çıxmış ola. Onlar inanırdılar ki, Vahid bu gün harada isə ləpələnən bayraqların altında, dəstələrdə öz yerindədir. Ümumi ahəng ilə atılan addım səsləri içərisində Vahidin hənirtisini də hiss edirlər. Onun, yəqin ki, arxada və ya qabaqda, kənddə və ya şəhərdə, Moskvada, Bakıda və ya Daşaltı kəndində dəstələrin birində olduğunu bilirdilər. Eşitsələr ki, Vahid kənarda qalmışdır, eşitsələr ki, Vahid bu günlərin sevincindən məhrum edilmişdir, addımlarını dayandırar, komandanı çağırar, tələb edərdilər: "Vahid gəlsin!"

Komandan dərhal Vahidi yoldaşlarına çatdırar.

Yox, komandan Vahidə yaxın da düşə bilməz. Vahid ilə onun arasında, Vahid ilə yoldaşlar, nümayişlər, bayramlar, şənliklər, sevinclər arasında kağızdan, lakin uçurulmaz bir sədd durmuşdur. Komandan bu səddin qarşısında dayanar, oxuyar. Bu əmri hamı eşitmək üçün ucadan oxuyar, nə cərgələr ləngiyər, nə bayraqlar dayanar, nə şənliyə xələl gələr, nə rəsmi-keçidə gələnlər bir şey bilər, yalnız Vahid məhrumiyyət payını alıb, həyatın unudulmuş guşələrində tərk olunar...

Bu əmr nə qədər güclüdür? On beş illik tərbiyəni, dərsi necə puç edir? Bu əmrin gücü ilə pəncələşmək olmazmı? Hanı? Yoldaşlarım hanı?..

Vahidə elə gəldi ki, direktorun əmri bütün camaata elan olunmuşdur. Hamı baxışlarında bunu bir-birinə deyir, ancaq dillərinə gətirmirdilər. Vahidin ürəyi quş kimi çapaladı, o üzünü tutub nümayişçilərə qışqırmaq istədi:

– Nə üçün məni qovursunuz? Mən haman Vahidəm, sizinlə böyümüşəm, sizinlə oxumuşam, sirdaş olmuşam, sizinlə də baş ağartmaq, ölmək istəyirəm. Məni atmayın!

Lakin Vahidin səsi çıxmırdı.

Torpaqlardan, yerin damarlarından qopan kimi görünən orkestr səsləri onu özünə qaytardı. Uzun, enli bir bayrağı çəkə tutmuş iki nəfər qız göründü. İnşaat institutunun tələbələri, müəllimləri bir-bir göründükcə, elə bil, Vahid qürbətdən qayıdıb, öz ailəsini görürdü. Balıq suya atılan kimi özünü dəstəyə tulladı: "Rübabə!" deyən həsrətli səsi əlli addım aşağı-yuxarı hamı eşitdi.

Vahid Rübabənin əlini sıxdı, Rübabə Rəşid ilə dünəndən Vahidi axtardığını dedi. Yoldaşları soruşurdular:

– İşin düzəldimi?

Vahid onlara qoşulub, sevinclə yoluna davam etdi. Lakin dəstəbaşı araya soxulan bu artıq adamı çıxartmaq istədi. Yoldaşların ona hörmətini görüb, öz-özünə dedi: "Bir az söhbət edib gedəcəkdir".

Gəldiyev nizam gözləyən məsul bir adam kimi dəstəbaşını çağırıb danladı:

– Yadların cərgədə nə işi var?

Dəstəbaşı Vahiddən üzr istədi:

– Zəhmət çəkin, razı olmurlar.

Vahid yanındakıları göstərdi:

– Bunlar mənim yoldaşlarımdır axı, mən də tələbəyəm...

Gəldiyevin hirsi soyumadı. Haradansa bir milis tapıb işarə elədi. Milis Vahidə yanaşdı:

– Yoldaş, – dedi, – çıxın. Yad adamların dəstəyə girməsi qadağandır.

Vahid dedi:

– Burada bircə nəfər yad adam var, odur bax, o göygöz!

Gəldiyevi göstərəndə o üzünü yana çevirdi, dəstələrin arasında yox oldu.

Beş dəqiqə keçmədi ki, başqa bir inzibati işçi ilə gəldi. Bu adam Vahiddən vəsiqə tələb elədi, onu sıradan çıxartdı. Vahidin yanında milisi görəndə Sadıq kişi dəstəyə cumdu. Oğlunu çəkib aparmaq istədi. Gəldiyev onu itələdi:

– Qoymayın aradan çıxsın, yoldaş milis, bunların fitnəsi var, nümayişi pozmağa gəliblər, yoxlamaq lazımdır! Bəlkə düşmən tapşırığı...

– Kəs səsini axmaq, özün başdan-ayağa fitnəsən!

Gəldiyev ha boylandı, bu cavabı deyəni görmədi. Tələbələr hamısı gülür, onun qəzəbdən qızarmış üzünə baxırdılar. Gəldiyev axtarırdı:

– Onu deyən kim idi? İfşa olunmamış ünsürü tapmaq lazımdır. Sayıqlıq lazımdır.

Heç kəs Gəldiyevə qulaq asmırdı. Bu onu daha da özündən çıxarırdı.

## Beşinci fəsil

Gəldiyev partkom otağında, əli cibində, paltolu, lakin başı açıq oturmuş, gözünü stol üstündəki dolu və bağlı iş qovluğuna dikmişdi. Qıraqdan baxan elə bilərdi ki, idarəyə yenicə gəlmişdir.

Bəlkə Gəldiyev üşüyür? Üşüyən adam papağını götürməz, stol üstünə atmaz, düymələrini açmaz. Bir də divar peçi yanır, otaq istidir. Siniflər bumbuz olanda, bura hamam kimi buxar verir. Bu da Gəldiyevin zabitəsindəndir. Bir dəfə Katyanın üstünə çığırmışdı ki: "Səni qulluqdan elə itirərəm ki, izin-tozun qalmaz". Katya o gündən Gəldiyevin otağında qaza, işığa, səliqəyə xüsusi fikir verirdi. Kim isə ona demişdi: "Gəldiyev tam direktor yerindədir".

Direktorun otağına Katya o qədər məhəl qoymazdı. Direktor acıqlansa heç vecinə almazdı. Ona görə ki, Katya on beş ildir qulluq eləyirdi, işinin həmişə "zamlardan" aşdığını görmüşdü.

Gəldiyev isti və sakit otaqda nədənsə narahat idi. Gözünü səqfə dikmişdi. Səqfə baxanda o, keçən günləri, payızın əvvəllərində Rübabə ilə görüşdüklərini xatırladı. Bu xatirələr ona, yetişməyi gözlənən, lakin yetişməyib, çağala qalan meyvə kimi gəlirdi. Rübabə ilə son görüş, daha doğrusu Rübabənin onunla son görüşü həmin bu otaqda olmuşdu. Onda hələ Rübabə ona bir Gəldiyev kimi olmasa da, bir tələbə kimi hörmət edirdi.

Çağıran kimi gəlmişdi. Təklif edən kimi keçib oturmuşdu. Əhval soruşan kimi razılıq eləmişdi...

Gəldiyev "məsələni" qurtarmaq üçün çağırmışdı. Nəzakətlə sözə başlamışdı:

– Rübabə, sizi çağırmaqda məqsədim, bəlkə də özünüz yaxşı bilirsiniz... Bilməmiş də olmazsınız, çünki mən qəlbdən-qəlbə yol tapan bir şeydən danışıram. İnsanın jizni, yaşayışı müəyyən bir şəraitdə keçər, gedər. Bu şərait də hər kəsin özündən asılıdır. Mən ürəyimin sirrini sizə açmaqda, kanişna, bir pis iş görmürəm, çünki biz azad sovet gəncləriyik. Daha ana, bacı, xala, bibi vəkalətinə möhtac deyilik. Mən bu gün sənin qarşında durub smeli öz ürəyimi açıram...

Gəldiyev bunları mülayim bir səslə demişdi. İki şeydən çox xoşu gəlmişdi: sevgisini izah edərkən "sevgi" sözünü dilinə gətirməməyindən və bir də bu təmənnasında özünü vəzifə sahibi kimi yox, sadə bir "qrajdan" kimi tutmağından!

Ani bir xəyaldan, bəlkə də Rübabənin susmasından doğan peşmançılıqdan sonra o, fikrini dəyişmişdi. Sanki Verdiyevdən tutmuş Qurd oğluna qədər bütün yoldaşlar, sirkdə gördüyü tamaşalar, eşitdiyi söhbətlər tökülüb ona ağıl öyrətməyə gəlmişdi:

"Sən nə qayırırsan, ay səfeh! Qadın ovunda iki silah var: rütbə, dil! Vəzifəni hiss etdirmək istəmirsənsə, qəlb çalan şirin sözlərə nə gəlib? Nəzakəti məclislərə saxla, burda, ikilikdə Rübabə ilə məhrəm bir qadın kimi danış! Ona konfet, kişmiş vermirsən, heç olmasa məhəbbətdən de! Dilindəkini yox, ürəyindəkini de, ürəyindəkini söylə, söylə, yeridir!"

Gəldiyev Rübabənin üzünə, lap gözlərinin içinə baxmışdı. Əllərini döşünə qoyub and içən kimi əyilmiş və demişdi.

– Niyə gizlədim. Mən səni lap sevirəm! Rübabə, sənə vurğunam! Lap nastoyaşşisindən!

Gəldiyev bu sözləri deyəndə nə əsmiş, nə də rəngi dəyişmişdi. Ancaq qız pul kimi qızarmış, tər tökmüş, dodaqlarını çeynəmişdi. Həmin dəqiqədə həm Rübabəyə, həm Gəldiyevə yeni bir mətləb aydınlaşmışdı. Rübabə bilmişdi ki, Gəldiyevin ona hörməti, xoş danışığı, bir ictimai vəzifə sahibinin danışığı deyilmiş, Gəldiyev də anlamışdı ki, Rübabənin ürəyində qətiyyən onu sevdirən niyyət yoxdur. Bu duyğulardan birincidə nifrət, ikincidə məsuliyyət əmələ gəlmişdi.

Gəldiyev niyyətinin nəticəsizliyini Rübabənin hövlündən, həyəcanından, az qala divarı yarıb qaçmaq istəməsindən, əli ilə rədd işarəsi verib "Ayıb olsun! Ayıb olsun!" cavabından anlamışdı. Ancaq nə edəsən ki, aylardan bəri başında yer eləyən şirin niyyətlər Gəldiyevi əldən qoymurdu.

Qıza nə vədələr verməmiş, nələr danışmamışdı... Ürəyinin parçalandığını isbat üçün nə vəziyyətə düşməmişdi. O, açıq sinəsinə yumruqlar vuraraq, qəlbini dindirmək istəyəndə, Rübabə bir əli qapının əlcəyində, o biri əli ilə dizinə çırpıb demişdi: "Ayıb olsun! Ayıb olsun sənə!".

Gəldiyev keçib Rübabənin önündə diz çökmüşdü: "Öldür məni, atqaz eləmə. Başımı kəs, yox demə! Qul elə, sat! Rübabə, sənsiz Kərim məhv olacaq. Bir gəncin jizninə bais olma! Yəqinini deyirəm sənə!".

Rübabə qapını bərk itələmiş, ilan ağzından qurtulan quş kimi qaçmışdı. Gəldiyev tez qalxıb üst-başını sahmanlayıb, stolun başına keçmişdi...

Ondan bir ay sonraya qədər Gəldiyev çox intizar çəkmişdi. Hər gün qulağı səsdə idi. Qorxurdu ki, qız gedib şikayət edər. Axırda məsələnin açılmadığını görüb sevinmişdi, zənni ayrı şeyə də getmişdi:

"Yəqin qızın könlü var. Məsələni sekretni saxlamağından, bir yerdə dilinə gətirmədiyindən görünür ki, ürəyi var. Axı, bir də mən lap kəndli-kəndliyana tərpəndim. Küçənin əxlaqsızına yanaşıb birdən-birə təklif edəsən, yenə də razı olmaz. Gərək sümük sındırasan, aylar ilə bişirəsən. İllah da Rübabə... Eh, buna vaxt hanı... Yox, Rübabənin rəyi var, ancaq başarmıram..."

Şairlikdən başı çıxan yoldaşı Qədir ona bir məsləhət görmüşdü: müfəssəl bir məktub yazmağı, ürəyinin mətləbini orada şərh etməyi, səhvlərini bolşevikcəsinə boynuna almağı demişdi. O da təxirə salmadan məktub hazırlatmışdı.

Gəldiyev, doğrudur, bir kəsə məktub yazmaz, bir kəsdən də məktub almazdı. Ancaq evdə, məktəbdə, yar-yoldaş arasında çox məktublar görüb. Bir neçə məktub tutub iclasa qoyub. Lakin Rübabəyə göndərmək üçün hazırladığı məktubun tayını heç kəsdə görməyib və görməyəcəkdir.

Əvvəl başdan ox ilə deşilmiş bir ürək şəkli səkilib. Sol tərəfdə bir gül ağacı, onun budağında oturan bülbül boynunu uzadır. Ağacın dibində bir tülkü çəkilib, həsrətlə yuxarı baxır (bu şəkli Gəldiyev, deyəsən, hansı kitabdasa görmüşdü), ortadan bənövşəyi rəngdə mürəkkəb ilə iri sərlövhə yazılıb:

"Şanlı məktub Sevdiyimə"

Üç xətt ara verdikdən sonra əsil məktub başlanır. Cümlələrin baş hərfləri iri və kölgəli yazılmışdır. Hər iki sətirdən sonra qırmızı xətt ilə yazılmış şeirlər gəlir. Axırda bir neçə müəmma var! "Yaz görüm bənövşəyi çernilin mənası nədir. Məhtaba qarşı düşüncələrdə xatırlanmayan bədbəxt sayıla bilərlərmi? Qönçələr havaxt açılacağını kimdən sormalı?.. Cavab! Cavab! Cavab! Cavabınızdan mənim üçün iki yol ayrıla bilər: İzn, ya ölüm! O da sənin insafına bağlıdır. Ax!.. Bilsəniz bu sətirləri yazanda nə qədər göz yaşı axıtmışam! Taleyim, əcəba, məni güldürəcəkmi? Heyhat! Ah... İnsafsız, gözəllər nə qədər insafsız olurmuş! Bu qədər..."

Son cümləsi budur: "Ürəyimin ən dərin guşəsindən əlinizi sıxıram!".

O vaxt, beş gün oldu, bu məktuba cavab gəlmədi, on gün oldu, bir ay oldu səs çıxmadı. Gəldiyev Qədiri tapıb məktubun kəsərindən şikayətləndi: Qədir lağa qoydu.

– O məktub mənə kimdən gəlsəydi müzakirəsiz bənd olardım. Gör qızın səndən nə qədər zəhləsi gedir! Nə düşmüsən onun dalınca, qardaş! Zorba-zorluq deyil ki! Köhnə zaman olaydı, götürüb qaçardın, aldadardın. İndi əlac yoxdur. Sən bir ayrısını tap. Eybi yoxdur, mən yenə yaxşı bir məktub hazırlayaram. Onun surəti məndədir.

Gəldiyevin qol-qanadı qırılmışdı. Rübabədən təmiz əl üzmüş, intiqam fikrinə düşmüşdü...

İndi bütün bu əhvalatdan neçə ay keçmiş, gözləri səqfə ilişəndə onun damarlarında əvvəlki hisslər oynadı. Özü də bilmədi ki, nə ağıl, nə iradə ilə Rübabədən əl çəkmişdir. Odlu təəssüf vücudunu yandırdı. Ürəyindən soyuq, qılınc kimi iti bir səda keçdi:

"Mən artıq evlənmişəm. Ağca xanım məni sevir, mən də Ağca xanımı sevməli olmuşam!" Sinəsindən qopan ah duman kimi havanı örtdü. Ani külək onun arzularını kül kimi göyə sovurdu, üfüqlər tutuldu, göz qapaqları, xatirələrini örtən pərdə kimi endi, qabağındakı qovluqda bənd aldı.

Bu qovluq şəhər rayonundakı mədəni hücum əsgərlərinin və məntəqələrin siyahısıdır. Rayon komitəsi Gəldiyevi bu işə təhkim etmişdi. O, siyahıları almışdı ki: "Bir-bir özüm yoxlayım!".

Dolu qovluğun içindəki kağızları görəndə gözü bərəldi: "Bunu kim oxuyacaq?".

Qalxıb dəhlizə çıxdı, göz gəzdirdi, boş adam tapmadı. Yadına nə düşdüsə, qırx birinci otağın qapısını açıb içəri girdi. Qoca, gödək və ağbaş professor dərs deyirdi. Gəldiyev girən kimi tələbələrin nəzəri qapıya çevrildi. Gəldiyev dedi:

– Bağışlayın, yoldaş professor, mane oluramsa da, yoldaş Səttarzadə bir zəhmət çəksin!

Rübabə durmaq istəmədi. Gəldiyev bir də təkid elədi:

– Vacib iş üçündür, yoldaş Səttarzadə, ləngiməyin!

Rübabənin gözü professorda idi. Professor icazə verdi, qız çıxanda Gəldiyev öz otağına yollanmışdı. Rübabə Gəldiyevi stol dalında oturan gördü, qutusunu çıxarıb papiros eşirdi. Gəldiyev yer göstərdi:

– Əyləş!

Rübabə qayıtmaq istədi:

– Əyləşmək zamanı deyil, dərsdən çıxmışam, sözünüzü deyin!

Gəldiyev bükdüyü papirosu dili ilə yaşlaya-yaşlaya, etinasızlıqla bir də "əyləş!" dedi. Rübabə qayıdanda Gəldiyev qovluğu göstərdi:

– Ay qız, ürkmə, bir balaca iş görəcəyik.

Rübabə baxmadı:

– Dərs vaxtı heç bir ictimai iş ola bilməz, bunu siz yaxşı bilirsiniz.

Gəldiyev onun dalınca yüyürüb acıqlanmaq istədi. Qız uzaqlaşmışdı. Çağırsa bütün dəhlizə səs düşərdi. Hirsindən papirosunu tulladı, qutusunu bir də çıxartdı. Barmaqları qovuşmurdu ki, tütün götürüb büksün. Dişi bağırsağını kəsirdi. Yeyin gedib, üzüyola saydığı Əmrah adlı bir tələbəni çağırdı. Hirsindən dərdini ona dedi. "Dikbaş adamları" institutdan qovduracağına and içdi.

Gəldiyev başını aşağı salıb stola dirsəklənmiş, əllərini bərk-bərk çataqlamışdı. Əmrah mədəni hücum əsgərlərinin siyahısını oxuyur, o da fikrini deyirdi:

– Oxu!

– Müseyib Qurban oğlu.

– Bura bax görüm, sən bunu tanıyırsan?

– Tanıyıram. Yaxşı bilikli müəllimdir.

– Atası nəçi idi?

Atasının pinəçi dükanı varmış!

– Briqadir yaz.

– Əhməd Ağaməmmədov.

Gəldiyev gözünü qıydı:

– Hansı Əhməddir. Yoxsa o faytonçunun oğludur, hə?

– Bəli.

– Qarala, belə qoy. Eşqbazları bəri qırağa yığ.

– İmran Sultanov.

– Necədir!

– Yaxşı tələbədir, fəaldır.

– Oxu!

– Söhbətov Əli.

– Ətkaz!

Əmrah Gəldiyevin üzünə baxdı. Gəldiyev onun suallı baxışını anlasa da cavab vermədi.

– Oxu, oxu, ə!

– Qurban Qurbanlı.

– Hansıdır, o qara oğlandır? Həmişə də yaxası açıq olur ha!
– Mən qışda görmüşəm, yaxası bağlı idi.
– Bir onun anketini tap.
– İsmayıl Sarı oğlu.
– Şuşalı İsmayıl?
– Gərək ki, şuşalıdır.
– Onun qabağına sual qoy.
Əmrah siyahını qurtaranda zarafata salıb Gəldiyevə dedi:
– Sən yarısını suala çıxartdın, yarısını ətkaza!
– Bəs nə? İnanıb iş tapşırıblar, sovet vətəndaşlarını savadlandırmağı hər yetənə daverit etmək olar? Bəlkə savad işinə müzür element soxuldu. Onda mən atveçatam. – Bunu deyib təəccüblə soruşdu: – Qurtardı?
– Hə?
– Qurtarmaz, canım, gərək yenə olsun.
– Xeyr, yoxdur.
– Yox nədir. Mən özüm göstərmişdim: Qurd oğlu Qədir hanı bəs.
Əmrah Qədir haqqında haradansa eşitmişdi:
– Deyəsən onun adını ştabdan çıxardıblar.
Gəldiyev qabağa tərəf əyildi:
– Niyə?
– Deyir mədəni deyil, adam ilə rəftarı bacarmır...
Gəldiyev yenə hirsləndi:
– Adə, boşlayın, mən ölüm! Nə mədəni axı? Bunu nə salmısınız aralığa! Heç bilirsən o kimin sözüdür? Bir zaman proletariatın başından vurub qovurdular ki, get, sənin pulun yoxdur. Kasıb gərək ayaq üstə dursun. İndi də bu çıxıb. Yazıq fağır-füqəra danışmaq istəyəndə sinəsindən geri basırlar ki, mədəni deyilsən. Düşmən hiyləsidir, xalis! Qədiri dabavit elə, yaz ora! Yəni özümü əzib-büzməsəm, qızların başını tumarlamasam mədəni – kulturni deyiləm? Yaz ora Qurd oğlunu. Salarıq bir rayona!
– Yazmağına mən yazaram, ancaq gərək ştab ilə...
– Sən yaz!
Əmrah qalxıb qapıdan çıxanda Gəldiyevin sözünü təkrar elədi: “Ətkaz! Ətkaz!”
Gəldiyev də çıxdı, nə fikirləşdisə, yenə qayıtdı. Qapını örtdü, bir əli cibində, bir əli başında arxası qapıya tərəf gözlərini yarıyummuş

halda bir xeyli dayandı. Ağaca yığılan sərçələri pəncərədən gördü, saat iki olduğunu xatırladı. Dərsin qurtarmağına az qalmışdı. Yubanmaq olmazdı. Sanki ona bir qətiyyət gəldi, qapını çırpıb düz 41-ci otağa yollandı.

Gəldiyev bayaqdan bəri Rübabədən hayıf almağı düşünürdü. Partiya təşkilatı adından onu çağırıb təpinmək fikrində idi. Ürəyinə gəldi ki: "Ağ olar, bütün sinfi üzümə svidetel çəkər".

Məsələni yazıb direktora verməyi məsləhət bildi. Bu niyyət də ona əbəs göründü, çünki direktora az-çox bələd idi.

Müəyyən bir fikrə gələ bilmədi. Deyəsən bir qüvvə qabağını kəsmişdi. Rübabəyə qarşı bütün tədbirləri pozan bir qüvvə onun kirdarını alır, iradəsini qırır, heç bir şey eləməyə imkan vermirdi. Axırda qızı mehriban danışdırmağı və beləliklə, bəlkə qəlbini ələ almağı kəsdirdi.

Tələbələr tənəffüsə çıxanda o, 41-ci otağa gəldi. Rübabə portfelini bağlayırdı. Gəldiyev yeriyib düz onun qolundan tutdu: "Gedək", – dedi. Rübabə onun söz deyəcəyini güman edib çıxdı. Gəldiyev öz kabinetinə tərəf üz tutmuşdu. Rübabə dedi:

– Yenə məni hara aparırsan? Məndən sənə katib-zad çıxmaz!

Gəldiyev güldü:

– Ay qız, sən nə yaman kəmhövsələ imişsən. Kim səni katib eləmək istəyir? Sənə sözüm var.

Gəldiyev kabinetə girib oturdu:

– Rübabə, səninlə bir söhbət kimim var. Mən hələlik səninlə kak komsomol yox, kak yoldaş danışmaq istəyirəm. Sən razı olma ki, bir müzür elementin üstündə təmiz adına ləkə gəlsin, Vahidi deyirəm! Bilirsən?

Rübabə başını tovladı:

– Təvəqqe eləyirəm özünüzün yanlış yolunuzu mənə də öyrətməyəsiniz.

Gəldiyev dikəldi:

– Bizim hansı yolumuz yanlışdır?

Rübabə cavab verməmiş Gəldiyev səsini ucaltdı:

– Bizim bircə yolumuz var ki, o da sosializmaya doğru gedir. Sən bu yolun yanlış... Bilirsən nə çıxır?

Rübabə hirsindən qızardı:

– Bura bax, yoldaş Kərim, o çaxırı mənə səpmə, saxla, içərsən!

Gəldiyev Rübabənin hirsli vəziyyətindən vahimələndi. Əvvəlki mülayim ahənginə qayıtdı:

– Heç kəs sənə çaxır-zad səpmək istəmir. Mən yoldaşlıq nəsihəti eləyirəm. Borcumdur. Kak kommunist olmasa da, kak böyük yoldaş qulaq as. Böyüklərin nəsihəti dərmandır. Özü acı olar, nəticəsi şirin. Bunu atalar deyib.

– Atalar onu da deyib ki, ağıl yaşda deyil, başdadır.

– Demək özünü məndən ağıllı bilirsən də! Atalar özü deyib ki, qadın ağıldan naqis olar. Saçı...

– Onu atalar deməyib!

– Bəs kim deyib?

– Məşədi İbad deyib.

– Mən bu sözə inanıram.

– Həqiqi varis atasından qalana sahib durar.

Gəldiyev Rübabənin təslim olmayacağını yəqin edəndə: ayağa durdu, yumruğunu stola döyüb qışqırdı...

– De görüm, sən nə üçün partiya təşkilatının qoyduğu məsələyə protiv gedirsən? Sabotaj eləyirsən? Atım səni komsomoldan bayıra?!

– Partiya təşkilatı qoymayıb, o məsələni sən qoymusan.

Gəldiyev çiyinlərini çəkdi:

– Bəs mən kiməm? Partiya işi mənə daverit elənib. Mən partiyaya bir ziyalı kimi keçməmişəm, kənddə zəhmətkeş arasında keçmişəm. Bu mənim qınışqam.

Rübabə onu susdurdu:

– Vələmir görmüsən? Vələmir zərərli bitkidir. Hər kəs onu görsə məhv edər. Ancaq zəmidə sarı buğda ilə yanaşı bitəndə onu da taxıl ilə birlikdə biçərlər, səliqə ilə dərzlər vurub xırmana gətirərlər. Tayaya basarlar. Lap axırda, taxıl döyülüb sovrulan zaman onu külək aparar.

– Vələmir priçom? Nə demək istəyirsən?

– Demək istəyirəm ki, inşallah, xırman vaxtı gələr.

Rübabə qapını çırpıb getdi. Gəldiyev bir müddət örtülmüş qapıya baxdı. Bu saat oradan kiminsə görünəcəyini, yaxud Rübabənin qayıdıb üzr istəyəcəyini gözləyirdi. Qapının bir daha tərpənmədiyini, ortalıqda sükut və məyusluqdan başqa heç nə qalmadığını duyanda başını tərpətdi, ixtiyarsız təkrar elədi:

– Ətkaz! Ətkaz!

Qədir içəri girdi:

– Salam! Deyəsən öz-özünə danışırsan? Yoxsa qaz əti könlünə düşüb?

– Eh, işdən-gücdən baş ayılır ki... Budur, bax xirtdəyəcən...

Gəldiyev əvvəl iş qovluğunu göstərdi, sonra şəhadət barmağını xirtdəyindən elə çəkdi ki, ülgüc olsaydı, çoxdan boğazı üzülmüşdü.

– Kərim, sənə bir işim düşüb axı: "Gənc işçiyə" bir şeir vermişəm, haçandandır buraxmırlar. Sən allah, gedək katibin yanına, sən desən soyuq baxmaz. Səni tanımamış olmaz. Deynən bizim adamdı!

Gəldiyev papağını başına atıb qalxdı:

– Bizə yazdığın şeirlərdən çox fayda çıxdı elə...

– Balam, şair köpəkoğlu neyləsin?! Ovsun oxumayacaq ki, sən öz babını tapmamışdın.

– Babımı tapsam daha sənin şerin nəyimə lazım idi...

– Baxma, şeir həmişə qızın ürəyini yumşaldan şeydir!..

Qəzet katibi onları hörmətlə qarşıladı. Qədirdən əvvəl Gəldiyev başladı:

– Bizim bu gənc şairin şerini niyə ləngidirsiniz? Gənc kadrlara qayğıkeşlik...

Katib dərhal stolun gözünü açıb, mal duası kimi uzun bir kağız çıxartdı. Qədirə verdi:

– Bu yoldaşa oxumusan?

Gəldiyev dedi:

– Oxuyub. Məndə bədii həyəcan oyandı. – Qədirə döndü: – Nə təhər başlanır, yadımdan çıxıb.

Qədir əzbərdən dedi:

Ey günəş ölkəsi, həbəş ölkəsi
Sərin su ölkəsi, pəpəş ölkəsi...

Gəldiyev macal vermədi:

– Gözəl deyib, özü də tam bir realist kimi, olduğu kimi deyilmişdir.

Katib başını aşağı saldı, sonra Qədirin üzünə baxdı.

– Özün bilirsən ki, Həbəşistanı İtaliya imperialistləri alıblar.

Gəldiyev dedi:

– Alanda nə olar? Lap gərək indi çap eləyək! Görsünlər ki, bizim kömək əlimiz dünya revolyusiyası...

Katib güldü:
– Kömək lazımdır, Qədirin şeri ilə yox!
Gəldiyev mübahisəyə girişdi:
– Səhv edirsiniz. Bizim hər bir vətəndaşımızın, hər bir gəncin səsi gərək...
Katib ayağa qalxdı, hərifin öz dili ilə danışmağa məcbur oldu.
– Qədir yoldaş, sağlıq olsa, dünya revolyusiyasına qədər bu şeri yaxşı-yaxşı düzəldər, onda baxarıq.
Qədir etiraz elədi:
– Gec olar, canım!
Katib onun üzünə mənalı baxdı:
– Necə, dünyada revolyusiya gec olacaq?
Gəldiyev özünü itirdi, Qədirə döndü:
– Nə danışırsan, – dedi, – ədə! Siyasi səhvə yol verirsən. Şairlərin bir vinti boş olar deyərlər, sənin heç deyəsən vintin yoxdur. Gəl! Gəl!..
Qədir şeri qoltuq cibinə qoyub çıxanda, Gəldiyevə gileyləndi:
– Əcəb köməyin dəydi!
– Balam, firqəçi nə eləsin?! Ovsun oxumayacaq ki... Sən də sənətini tapmamısan.
Qədir yolun ortasında dayanıb, Gəldiyevə baxdı:
– Deməli, hayıf alırsan?.. Əvəz çıxırsan məndən, a yalançı dost?!

## Altıncı fəsil

Atası Danqır Abbas qəbirdən qalxıb desəydi ki: "Bala, tələsmə, düşmənin basılacaq, işlərin belə rəvac tapacaq" Gəldiyev inanmazdı. İndi onun Rübabə sarıdan işləri belə axırdı ki, deyərsən suda balıq üzür. Vahidin nümayişdə özünü tələyə salmağı, atasının da işə qarışmağı, milis nəfərinin Gəldiyevə kömək çıxmağı... Bütün bunlar Gəldiyevin döşünə yatırdı. Söz-sözə gələndə deyirdi:
– Buna Sovet hökuməti deyərlər!.. Beş gün maskalanarsan, üç ay gizlənərsən, bir il ötüşərsən, axırda elə yaxalayarlar ha! Odur Nayıbov göz qabağında. Mən deyəndə ki: canım, istismarçı balasından xeyir gəlməyəcək, ağzıma vururdular: "Köpəkoğlu, sən qərəz aparırsan!".
De, buyurun, buyurun beşinci nahiyə milis naçalnikinin kabinetinə! Bir sandıq material var. İfşa materialını yazıqlar baxmaq ilə qurtara bilmirlər. Hələ dalısı gəlir, gəlir ha!..

Doğrudan da “materialın” dalısı gəlirdi. Bayram gününün səhərisi Gəldiyev, Vahidə bir “qardaşlıq” elədi: institutun partiya komitəsi adından “məktəbin sabiq tələbəsi, hazırda ifşa olunub bayıra atılmış müzür ünsür Nayıbov Vahid” haqqında əməlli-başlı bir xasiyyətnamə yazdı. Məktəb nümayiş komisyonunun akta oxşayan bir məlumatını da əlavə etdi. Şübhəsiz ki, bu məlumatda Gəldiyev bütün yaradıcılıq qabiliyyətini işlətdi. İnstitut tələbələrinin “bu müzür ünsürə” qarşı hiddətləndiyini və onun məhkəmə vasitəsilə cəzalanmasını tələb etdiyini, əks təqdirdə işin böyüyəcəyini yazdı və möhürlədi.

Direksiya adından milis rəisinə bir xahiş düzəltdi. Səliqə ilə maşında çap elətdirdi, kağızların üstünə tikdi. Bu xahişi direktora imzalatmaq lazım idi. Hərçənd Verdiyev onun qabağında dinməz, sözünü yerə salmazdı. Ancaq yenə ehtiyat elədi. Müavinə qol çəkdirmək istədi. Müavin təbiəti yumşaq adam idi, rədd eləmək əlindən gəlməzdi. Adi bir uşaq onun yaxasından bərk yapışsa, hər yana aparar, istədiyinə nail olardı.

Gəldiyev bir şeyi seçə bilmirdi ki, müavin ancaq xeyirxah işlərə, yaxşı əməllərə mülayimdir. Pislik, yamanlıq isə əlindən gəlmir. Elə yerdə o, daşdan da bərk olur. Gəldiyev kağızı gətirib tələsik: “Verdiyev burda yoxdur, qolla getsin, zəng eləyib istəyirlər” deyəndə, müavin qələmi götürdü. Gözü rəis, nahiyyə sözünə sataşdı. Kağızı oxudu, dedi:

– Yaxşı olar ki, Verdiyev özü qol çəksin.

Gəldiyev sözə basdı:

– Əşi, burda nə var... Qorxaqlıq, yəni bu qədər? Partkom səndən az cavabdeh deyil ki!

Müavin qəzəbini güc ilə boğdu:

– Direktor özü gələr, qol çəkər!

– Bəlkə bu gün heç direktor idarəyə gəlmədi.

– Gəlməsə qol da çəkilməyəcək.

Gəldiyev hirs ilə kağızları qapıb qayıtdı. Verdiyevin komissarlıqda olduğunu bilib, ora getmək istədi. Sonra məsləhət bilmədi. Direktor gələndə kağızları kargüzara verdi, imza üçün göndərdi. Özü də dalınca, guya bir ayrı iş üçün direktorun kabinetinə getdi.

İçəri girəndə kargüzar dayanmışdı. Verdiyev çay içir, həm də gözünü kağızdan ayırmırdı. Gəldiyevə baxıb gülümsədi, qələmi alıb imzaladı:

– Aşnanın işini deyəsən bitirmisən hə?..

– Aşnanın işini aşna bitirdi. Atalar demiş, insanın özü-özünə elədiyini, el yığıla başarmaz. Zalım oğlu, məktəbdən qovulmusan, yaxşı, get başqa yerə, bir sənət tap özünə, yoxsa, acığa düş, gəl inqilab bayramına sataş, dəstələrə şuluxluq sal? Bilirsən də hansı maddəyə düşür? Diversiya!

Verdiyev başı ilə işarə elədi ki, bilirəm. Gəldiyev dedi:

– Dünən naçalnikə zəng eləmişdim. Dedim, təcili baxılacaq? Dedi, hə, təcili! İctimai asayişi pozmaq maddəsinə düşür, azı bir üç ili var kürəyində, hələ azı!

Direktorun yanına adamlar gəldi. Gəldiyev kağızları alıb çıxdı, birbaş milis idarəsinə götürüldü. O, Vahidin atasının Bakıda olmağına, nizamsız camaat içində dəstələrə "soxulmağına" ayrıca məna verməyə çalışırdı. İstirahət günü məktəb binasına getmələrini, "qarovulu narahat etmələrini" söyləyir və dizinə döyürdü: "Nə bilirsən, bəlkə sovet məktəbinə qəsdən ziyan vurmağa, odlamağa gəliblər, nə bilirsən?".

Milis idarəsində bütün yazılanları, deyilənləri yığıb yoxlamaya, istintaqa verdilər. Vahidi isə Səttarzadə zəmanətə götürmüşdü.

Gəldiyev bunu eşidib telefon kitabçasından Səttarzadənin nömrəsini tapdı. Gecələrin birində kabineti içəridən bağladı:

– Mənə Səttarzadə lazımdır.

– Danışan Səttarzadənin özüdür?

– Yoldaş Səttarzadə, salam! Necəsiniz, kefiniz lap yaxşıdırmı? Sizə zəhmət də olsa, mühüm bir yerdən zəng edirlər. Xahiş olunur, deyilənləri diqqətlə dinləyəsiniz, eşitdiklərinizi təkrar etməyəsiniz, düzgün cavab verəsiniz, yanınızda kim var? Siz bu günlərdə bir nəfər müqəssirin zəmanətini boynunuza almışsınızmı? Almışsınız! Çox yaxşı...

Gəldiyevin söhbəti xüsusi bir rəsmiyyətlə başlaması Səttarzadəni vahiməyə saldı. O ha istədi soruşa:

"Bağışlayın, danışan kimdir?" – Nə ürəyi gəldi, nə də telefonda macal tapdı. Bir əli ilə stola söykənmiş, gələn səsi dinləyir, itaətkarlıqla cavab verirdi: "Bəli, bəli, baş üstə, yox, tanımamışam, olar..."

Gəldiyev deyirdi:

– Görünür ki, siz Nayıbovun cinayətlərindən bixəbərsiniz. Sizi zablujdat eləyiblər. Belə bir vredni adam gərək sizin sayıqlıq barədəki səhvinizdən istifadə etməyə imkan tapa bilməyə idi. Amma heyif!

Xalq arasında, qulaq asın, təmiz adınız var. Biz bu adın ləkələnməyinə təəssüf etməyə bilmərik. Demək vəzifəmizdir, vəzifəmizdir!

Gəldiyev sözünü bitirəndə cavab gözləməyib telefonun dəstəyini asdı. Səttarzadə isə, eşitdikləri ilə kifayətlənmirmiş kimi, bir neçə dəfə çağırdı: “Alo, alo...” cavab çıxmadı. Əlacsız qalıb dəstəyi yerinə qoydu. Təzədən götürüb qulağına tutdu. Yenə səs verən olmadı. O biri otağa keçdi.

Kişi, simasında bir iztirab olduğu halda, pianonu silməklə məşğul olan Rübabəyə baxırdı. Sanki Rübabəyə nə isə xəbər verdilər. O da atasına tərəf döndü. Atasının nəzərlərində qeyri-adilik duyub, yaxın gəldi. Səttarzadə bunu istəyirdi.

– Qızım, – dedi, – bu nə hoqqadır mənim başıma gətirirsən?

Rübabə yeridiyi yerdə donub qaldı. Kişinin də rəngi qaçdı. O, ailədə söz-sov, ovqattəlxlik görmüşdü, hətta bərk inciklik də xatırlayırdı, ancaq yeganə övladı olan əziz Rübabənin adı ilə bağlı olan heç bir inciklik yadına, gümanına gəlmirdi. Atası Rübabəyə güldən ağır söz deməzdi. Bir fəlakət üz vermiş, əlindən xata çıxmış kimi Rübabənin halı dəyişdi. İşdən çəkildi, atasının qəzəbli üzünə baxdı, deməyə söz tapmadı. Səttarzadə təkrar elədi:

– Qızım, bu nə hoqqadır mənim başıma açırsan?

Rübabə dedi:

– Ata, sənə nə olub?

Səttarzadə əlini saqqalına atdı:

– Bu vaxtımda razı olursan divan-dərə ayağına çəksinlər?

– Sənə nə olub, ata?

– Yaşım altmışı ötüb, hələ divan-dərə tanımamışam, məhkəmə görməmişəm. Məni sən qalmaqala calayırsan, kimin üçün calayırsan?

– Sənə nə olub, ata?

– Bilirsən ki, mənim indi bircə arzum, fikrim-zikrim sənsən? Qeydini çəkirəm, gecə-gündüz əl-amandayam ki, qəlbi sınıqdır, ürəyinə qubar gəlməsin. Həm ata olaram, həm ana, təki boya-başa çatsın...

Rübabə məsələnin özünə aid olduğunu yəqin edib, səsini qətiləşdirdi:

– Nə olub, ata?

– O Vahid kimdir müsahib olmusan? Mən sənin sözünə uyub zaminə götürürəm, bəs sən düşünmürsən ki, atamı hər lotunun ayağına verməyim?

Rübabə doluxsundu, hirsindən ağladı:

–Ata, – dedi, – sənə nə olub? Vahidəmi deyirsən o sözü? Xainlərə inanma, ata! Ata can!

Rübabə əlləri ilə üzünü örtdü, hönkürtü ilə üzü üstə çarpayıya yıxıldı...

* * *

Bütün günü Rübabənin üzü gülmədi. Səhər iki dərs oldu. Tarix müəllimi gəlməmişdi. Saat 12-də evə qayıtdı. Qulluqçudan öyrəndi ki, atası zəmanətini geri götürüb. Ürəyi sıxıldı, xəyalında özünün səhv etdiyini fikirləşdi: "Vahidin adı məni xiffətlə, fikir-xəyalatla bağlayır. Nə üçün mən əl çəkmirəm? Qızlar kimi üz döndərib getmirəm? Aramızda ki, rəsmi, ya qeyri-rəsmi heç bir şey yoxdur... Bir salamməleyk üçün bu qədər iztirab olarmı? Omu bədbəxt, mənmi talesizəm?.."

Bu tərəddüd Rübabəyə dağlardan ağır gəldi. Mənəvi bir qüvvə sanki onun çiyinlərindən tutub vücudunu ağac kimi bərk silkələdi. Əsəblərindən bir gizilti keçdi, qəlbinin dərinliklərindən qopan odlu bir ah yaz yeli kimi onu ayıltdı:

"Vahidlə aramızda heç bir şey yoxdur! Mənim üçün bundan dəhşətli sözmü var? Olan şeydirmi? Birləşmiş qəlbləri qılıncdan başqa nə ayıra bilər?"

Vahid ilə keçirdiyi az, lakin şirin tələbəlik günləri bir barama mərasimi kimi nəzərində cilvələndi. İki ad bir-birini çağıran işıq kimi zehnində yanıb-söndü: "Vahid – Rübabə! Rübabə – Vahid!"

Rübabə elə tutulmuşdu ki, cırtmaq vursan, qanı axardı. Həyəcan onun bütün vücudunu qabartmışdı. Bu saat gözlərindən yaş, damarlarından qan, dilindən odlu fəryad qopacaqdı. Divardan tarı alıb istəkli kimi bağrına basdı, simləri dindirdi. Onların hər biri sirdaş, müsahib kimi Rübabənin dərdinə şərik, ürəyinə təsəlli idilər.

Rübabə kirpiklərini qaldırıb, atasını qarşısında görəndə ürəyinə təskinlik verməyə, hissini cilovlamağa çalışdı:

– Ata, – dedi, – Vahid heç kim deyil, ancaq məktəb yoldaşımdır. Lakin vəziyyəti pis olan yoldaşdan üz döndərmək, bilirsən ki, çirkinlikdir. Gəldiyevlər dəstə ilə onun kölgəsini qılınclayırlar. Mən Vahiddə günah görməmişəm. Onun məndən kömək ummağa haqqı vardır. Bəs yoldaş nədir? Yoldaş harda lazım olar? Yadındadırmı bu bayatı:

Göyərçinəm, uçdum gəl,
Dost bağına düşdüm gəl.
Yaxşı günün yoldaşı,
Yaman günə düşdüm, gəl!

Mən yaxşı günün dostu olmaq istəmirəm. Namərdlik nə sənə, nə mənə, nə zəmanəmizə yaraşır.

– Qızım, sən ispalkom deyilsən, məhkəmə deyilsən, nə köməyin dəyəcək? Onun ata-anasına nə gəlib, qohum-əqrabasına nə gəlib? Bir qız xeylağı qabağa düşüb nə edəcəksən? Nə borcuna, nə bilirsən kimdi? Bəlkə sabah sənin özünü də ona qatdılar...

Rübabə atasının iztirabına dözə bilmədi, qalxıb onun boynunu qucaqladı:

– Ata, sən Vahidin işindən heç şübhəyə düşmə. Sonra görəcəksən ki, düşmənləri onu dolaşdırırlar. Paxıllar. Mən əyri işə tərəfdar durmaram. Məni danlama.

* * *

Rübabə qəfəsdəki quş kimi darıxırdı. Əlinə kitab aldı, baxa bilmədi. Telefonla söhbət eləmək istədi, hövsələsi gəlmədi. Geyinib çıxdı, yavaş-yavaş tək gedir, başını fikirdən qaldırmırdı. İndi-indi atasının təklifi onu odlandırır, təhqir edirdi. Elə bir işi Rübabə özü üçün çox qəribə sayırdı. Bütün ömrü boyu qadınlar haqqında eşitdiyi böhtanlar xatırına gəldi. O, həmişə bunları istehza ilə dinləmiş, nifrətlə unutmağa çalışmışdı. Bir an üçün özünə yaraşdırdığı etibarsızlıq üçün Vahid gəlib qabağını kəsir, soruşurdu...

Gözəl qızlar, vaxtilə pərəstiş etdiyi adamlar Rübabənin xəyalında canlandı. Turgenevin qəhrəmanı Yelena, məhəbbət deyib İnsarov üçün üzülən, el-günündən ayrılıb gedən o pak xilqət Rübabənin ətəyindən tuturdu: “Mənim adımı böyük hərflərlə yazan sən deyildinmi? İqrarıma and içən, sözlərimi mahnı ilə təkrar edən sən deyildinmi?”.

Füzulinin Leylası günəş kimi fəzada görünür, Rübabənin yoluna işıq salırdı; sanki o, kədərləri, dərdləri, vahimələri, tərəddüdləri vurub əritmək üçün çıxmışdı. Onun şüaları yerlərə, küçələrə, kölgələrə, bağçalara, daşlara, göy qübbə kimi təmiz və qabarıq dayanan dəniz sularına yazırdı:

“Ey munisi-ruzigarım, ana.
Qəmxarım, qəmgüsarım ana.
Mən dari-bəqayə əzm edəndə,
Dünyaya vida edib gedəndə,
Mənsiz çəkib ahlar, fəğanlar
Səhralara düşdüyün zamanlar,
Düşsə yolun ol olan diyarə,
Ərzi-qəmim eylə ol nigarə,
Zinhar ona olanda vasil,
Xoş kimsədir, ondan olma qafil,
Damanının tut, rizasın istə,
Mən mücrüm üçün duasın istə!..”

Dərviş Nakamın dərdi ilə yorğan-döşəklərə düşən Gövhər Tacın zəif, xəstə vücudu göründü. Onun son nəfəsində, solğun dodaqlarından qopan “məhəbbət!” sözü Rübabənin qulaqlarında məhkumların son fəryadı kimi həzin səsləndi.

Budur çiynində ipək əba, xəstə qızın nəbzini yoxlayan filosof Əbu-Əli Sina, böyük həkim dayanmışdır. Xəstənin yaşadığı şəhərin küçələrini saydırır. Bir küçənin adı gələndə qızın qəlbi çırpınır. Həmin küçənin evləri sayılır, bir evin adında qızın nəbzi bərk vurur. Həmin evdəki gənclərin adını deyirlər. Bir gəncin adını söyləyəndə qız özündən gedir. Həkim ayağa qalxıb ah çəkir. Ev sahibindən üzr istəyir: “Bunun, – deyir, – dərdi böyükdür, bu vurulmuşdur...”

Rübabənin nəzəri gəlib öz küçələrində bənd aldı. Budur, süd kombinatında zəif, lakin üzündən-gözündən sönmüş bir məlahətin izləri seçilən bir qadın çalışır, o, kimsənin nəzərində deyil. Nə məclislərdə, nə mərasimlərdə, nə qəzetlərdə adı çəkilir, onu az adam tanıyır, lakin tanıyanlar yaxşı tanıyır. O həmin Zəhradır ki, on beş il bundan qabaq vərəmdən ölən sevgilisi Xəlilin xahişinə əməl edirdi. Xəlildən yeddiaylıq bir uşaq qalmışdı; kişi son nəfəsində demişdi: “Zəhra, oğlumu ögeylər umuduna qoyma”. Zəhra əlini ağlar gözlərinin üstünə qoymuşdu. O gündən uşağa həm də ata olmuşdu. Rübabə bilirdi ki, Zəhra qadınlıq hissi və məhəbbətini öz körpəsinin başına sadağa elədi. Oğlunu böyütdü. İndi onun oğlu qabiliyyətli gənclərdən biridir. Anası ilə qol-qola gedəndə deyirsən bacı-qardaş gəlir.

Sanki bu saat Zəhra da Rübabənin qabağına çıxacaq idi. Ancaq tamam başqa, gözlənilməz bir adam çıxdı. Rübabə Gəldiyevlə qabaq-

laşdı. Özünü görməməzliyə vurub, ötmək istədi, küçənin o biri tərəfinə keçdi. Gəldiyev səsləndi:

– Rübabə!

Rübabə dinmədi. Gəldiyev dalınca yeridi:

– Rübabə! Yoldaş Rübabə!

Rübabə məcbur olub döndü. Tramvay onların arasını kəsdi. Rübabənin ürəyindən bir arzu keçdi: “Tramvaylar kimi gurultulu bir hərəkət bizi həmişəlik gəldiyevlərdən ayırsaydı!..”

Gəldiyev küçəni adlayıb gəldi:

– Dayanın!

Onun sözü də, mətləbi də Rübabəyə aydın idi. Üzünü görmək isə mənəvi əzab idi, tələsirmiş kimi ötəri dedi:

– Nə buyurursunuz?

Gəldiyev yaxınlaşıb, onu kənara çəkmək istədi.

– Vacib yerə gedirəm, tələsirəm. Qalsın, məktəbdə danışarıq!

Rübabə bunu elə bir ahəng ilə dedi və getməyə üz qoydu ki, Gəldiyev macal tapmadı. O, Rübabəni saxlamaq üçün söz axtarır, bəhanə düşünürdü. Rübabə tramvaya yönəldi. Vaqonlar onu götürüb sanki Gəldiyevin şərrindən uzaqlaşdırmaq üçün yeyinlədilər.

Rübabə düşünürdü tramvaydan harda düşsün? Komsomol komitəsinə, yoxsa milis idarəsinə getsin? Ancaq yaxşı bilirdi ki, bu təşkilatlardan hər birinin rəyi işə təsir edəcəkdir. Hansından Vahidin xeyrinə ümid çoxdursa oraya getmək lazımdır.

Yeddimərtəbə ağ daş binanın qabağında düşüb, komsomol komitəsinə çıxdı. Birbaş katibin yanına getmək fikrində idi. Ürəyinə nə gəldisə mədəni-maarif şöbəsinə döndü. Şöbə müdirini tapmadı. İşçilərdən kim isə, cavan bir qız, qovluğa kağız tikirdi:

– Əhmədov hardadır?

– İclasdadır.

Rübabə təşkilat şöbəsinə gəldi. Otağın qapısı açıqdı, amma heç kəs yox idi. İki nəfər gənc paltolarının yaxalarını qaldırmış, əlləri ciblərində kimi isə gözləyirdilər.

Qapıçı savad kitabını qabağına qoyub hərfləri höccələyirdi.

– Qasımov yoxdur?

– Müşavirədədir.

Rübabə şöbə müdirlərinin katibin yanında olduqlarını düşünüb, oraya gəldi. Qapı bağlı idi. Qapıçı qabağında qəzetləri qatlayıb sahmana salırdı.

– Qəhrəmanın yanında kim var?

Rübabə qəsdən katibin adını tutdu. Qapıçı birinci dəfə görsə də onu ya katibin qohumu, ya da hardasa məsul komsomol işçisi güman edib, ayağa qalxdı. Balaca açarı qapıya salıb qıfılın işkilini qaldıra-qaldıra Rübabənin familiyasını soruşdu. Rübabə dedi. Qapıçı deyəsən pis eşitdi. Rübabə təkrar elədi. Bir dəqiqə keçmədi, qapıçı gəldi ki: "Məşğuldur", Rübabə bir az hirsləndisə də büruzə vermədi:

– Bəs haçan qəbul edir o?

Qapıçı divardan asılmış əl boyda kağızı göstərdi. Rübabənin qəbul cədvəlini oxuyacağından və bu günün qəbul vaxtı olduğunu bilib dara-bara salacağından qorxdu. Dilucu dedi:

– Bu gün vacib işləri var. Adam gəlib, Tbilisidən.

Rübabə nə onun dediyinə, nə də qəbul cədvəlinə fikir vermədi. Vaxtı itirməmək üçün milis idarəsinə yollandı. Dəhlizin başında Əhmədov ilə qabaqlaşdı. Əhmədov Vahidin işi ilə onsuz da məşğul idi. Gəldiyevin yazdıqlarını bir-bir oxumuşdu.

– Arxayın ol, – dedi – işi özüm izləyəcəyəm.

Rübabə milis idarəsinə gələndə bildi ki, komsomol komitəsi işin əsil rəngini bunlara hiss etdirmişdir. Milis işçisi bir-birinə tikilmiş müxtəlif sərlövhəli, müxtəlif həcmli, lakin eyni məzmunlu, eyni imzalı kağızlara murdar əsgiyə baxan kimi baxır, təəssüflə deyirdi:

– Bəyəm belə böhtanlar birdir, ikidir!..

İş ilə tanış olandan sonra, Vahidi axırıncı dəfə rəis özü dindirdi. "İctimai yerdə asayişi pozmaqda" özünü müqəssir bilib-bilməməsi haqqında soruşdu. Vahid bir misal ilə kifayətləndi:

– Topal Teymurun barigahına yaxın düşmək qan-qada imiş. Hökmdar ordugahın ortasında məskən qurarmış, quş quşluğu ilə ora yol tapa bilməzmiş. Hökmdar gecənin bir vaxtında fəryadlar qoparan bir qadının ağlayaraq, çadıra girdiyini, itirdiyi övladını istədiyini görüb təəccüb edir.

– Ey qadın, – deyir, – sən buraya necə yol tapdın? Mənim keşikçilərimdən qorxmadınmı?

Qadın cavab verir:

– Sənin barigahına poladdan, dəmirdən hasar çəkilmişdir, sənin qərargahın odlar, alovlar, tilsimlər, əli qılınclı mühafizəçilərlə qorunur. Ancaq bunların hamısı bir qüvvənin – ana məhəbbətinin önündə acizdir. Mən balasını itirmiş bədbəxt anayam. Odlu ahım dəyən dağlar

alçalır, dənizlər quruyur, çaylar dayanır, hamı, hər şey mənə yol verir. Mənim fəryadımı bütün kainat eşidir! Mən anayam! – Vahid üzünü yana çevirdi: – Mən sizin diqqətinizi ona, bax, o küncdə qoyulmuş qızıl bayrağa çevirmək istəyirəm.

Rəis dönüb baxdı. Vahid dedi:

– O bayrağın kölgəsi bizim 190 milyon bir xalqın anasayəsidir. Dünyada heç bir qüvvə övlad əlini böyük ananın ətəyindən üzə bilməz. Mən Vahid Nayıbov da bu xalqın oğluyam. Bayram günündə yüz minlərlə camaat bu bayrağın dalınca, bu bayrağın kölgəsində addımlayanda, dayana bilməmişəm, yoldaşlarıma qoşulmuşam. Bu bir cinayətmidir? Övladın anaya qovuşması bir cinayətmidir? Təhqir olunmuş bir gəncin özünə ruh verməsi, səsini səslərə qatması qəbahətmidir? Zərbələr yeyən bir yolçunun doğru yoldan dönməməsi, mətanəti, möhkəmliyi təqsirmi, günahmıdır?.. – Vahidin boğazı tutulan kimi oldu. Düşmənlərinin adını çəkdi. – Bunları, – dedi, – görəndə yem dalınca yüyürən həşərat yadıma düşür. Hər işıldayana gövhər, hər guruldayana güc deməyəcəyəm. Bunlar, bu adamlar, yoldaş rəis, inkişaf edən hər kəsin düşmənidirlər. Siz məni camaat içinə, minlərlə məktəblilər, komsomolçular içinə çıxarın, uca səslə həyatımı danışım. Görək o bayraqları əllərində aparan məğrur gənclər bunlarımı cərgələrinə çağıracaq, mənimi...

Artıq nə deyim, sözüm yoxdur...

Vahid haqqındakı iftira kağızları arxivə veriləndən, bu barədə həm müdiriyyətə, həm institut komsomol təşkilatına yoxlama yazılandan sonra inşaat institutu rəhbər işçiləri əl-ayağa düşdülər. Gəldiyev xəlvətdə pıçıldayırdı ki: "Burada, deyəsən, rüşvət məsələsi var".

İslam Verdiyev Vahidi də, atasını da hörmətlə qəbul edib, köhnə əmri dəyişdi. Üzünü Sadıq kişiyə tutub minnət qoydu:

– Yazıram keçən ayların da təqaüdünü versinlər. Oğluna da nəsihət ver ki, ürəyini sıxmasın. Belə işlər çox olur. Cavanlar işə bəzən qeydsiz baxırlar. Min beş yüz tələbə var, birdən-birə tanımaq olmur, səhvdir, baş verir... – Vahidə tərəf dönüb ərk ilə dedi: – Di get dərsinə! Get, amma gərək əlaçılığında davam edəsən, yoxsa aramız deyər.

Gəldiyevin inadını eşidəndə Verdiyev hirslənirdi:

– Əl çək, mən ölüm! Köpəkoğlunun şəhərində sənə qız qəhət olmuşdur? Aləmi qarışdırırsan bir-birinə, demirsən adamı dolaşdırarlar?!

Verdiyevin geri durması Gəldiyevi bərk vahiməyə salmışdı: "Sonra üstümə böhtan-zad yıxarlar ha... mənim özümü Vahidin gününə salarlar..."

Tezliklə Vahidin qəlbini ələ almağı, "barışmağı" məsləhət gördü.

## Yeddinci fəsil

Partkom katibi Zahid Vəliyev məzuniyyətə gedəndən sonra hər həftə Gəldiyev iclas eləyir, boynuna götürdüyü məsuliyyətin öhdəsindən gəlmək istəyirdi. Axı o, Zahidi Pyatiqorskiyə yola salanda kişiyə söz vermişdi. Gəldiyevin fikrincə, Zahid iş sarıdan bir az vasvası adamdır. Hələm-hələm adama etibar eləmirdi. Ancaq azar yazığı salmışdı. Həkimlər demişdilər ki, özünü mədən sularına yetirməsən, xəstəliyin qabağını almasan, peşman olacaqsan. Müalicə komisyonundan qayıdan kimi Zahid büro çağırıb katibliyi müvəqqəti Gəldiyevə həvalə etmişdi.

On beş gün keçməmiş xəbər gəldi ki, Zahidin xəstəliyi bərkdir, cərrahlıq işi var. Gəldiyev indi partkomun işlərinə daha müvəqqəti yox, həmişəlik, iş sahibi kimi baxırdı.

İki aylıq iş planını stolun üstünə, şüşənin altına qoydu. Cərgə ilə vəzifələrin hərəsinə iclas sərf edir, onları bir-bir guya həll edirdi. Ancaq, işdir, plana baxmır, bir də görürsən gözləmədiyin halda böyürdən beş məsələ çıxdı, özü də hamısı təcili. İctimaiyyət müəlliminin sözü həmişə Gəldiyevin yadında idi. "Biz bolşeviklər çətinlikdə gərək özümüzü itirməyək".

Gəldiyev də belə zamanlarda cəld tərpəşir, özünü möhkəm saxlayır, iclasları dalbadal çağırır, birini bağlayıb, o birini açır, yorulmaq bilmirdi. Bakı komitəsi inşaat institutundan beş nəfər məruzəçi istəyirdisə, Gəldiyev dərhal məsələni qoyur, siyahını tutur, on beş nəfər ayırır, əllərinə kağız verib göndərirdi. Buna da planı "artıqlaması ilə ödəmək" adı verirdi. Əlüstü həll olunan məsələni plana yazmağı artıq bilirdi. Ancaq bir yerdə hesab verəcəyindən, öz fəaliyyəti heç, büronun əməyi hədər getməsin, görülən işlər qələmdən düşməsin, unudulmasın deyə, cib dəftərinin qulağına yazıb yadda saxlayırdı. Bu məsələlərin hamısına da "cari" ad qoyurdu.

İclas olmazdı ki, "cari"siz keçsin. Çox zaman birinci, ikinci məsələlər yarım saat vaxt alanda, cari məsələ iki saat uzanırdı. Bunun

nəticəsində cari kəlməsi qeyri-cari bir məna almışdı. Əsil məsələlərə nisbətən carilərin uzanmasına səbəb bu idi ki, əsil məsələləri çox vaxt yuxarılardan, rəhbər təşkilatlardan tapşırırdılar. Bunların həlli asan idi.

Gəldiyev soruşur, öyrənir, iclasa hazır gəlirdi. Beş-on kəlmə izah edir, sonra: "Mənimcə, bu qərara gələk" – deyə, səsə qoyurdu. Carilər belə deyil. Bunlar institutun özündə, ayrı-ayrı adamların vasitəsilə doğan fərdi ixtilaflar idi. Bir tələbə qıza məktub yazıb, biri divar qəzetinə şəkil çəkməkdən boyun qaçırıb, bir başqası imza edib iclasa gəlməyib, daha birisi Gəldiyev ilə sözləşib... Belə məsələlərin həlli uzun çəkirdi. Bu məsələlərdən biri də ayın 27-də Rübabə haqqında iclasa qoyulan məsələ idi.

Bunun partkom iclasına gəlib çıxmasının uzunca bir tarixi var.

Anası Semaşko xəstəxanasında yatanda Rübabə bəzən dərsini buraxmalı, xəstənin yanına, həkim və ya xörək dalınca qaçmalı olurdu. Bir dəfə Gəldiyev evə zəng edib, onu iclasa çağırdı. Rübabə gələ bilməyəcəyini deyəndə Gəldiyev tələb elədi:

– Mütləq gəlməlisən!

– Gələ bilməyəcəyəm, ağır xəstəm var.

– Gəlməsəniz, məsələnizə baxarıq!

– Nə məsələmə?

– Komsomolda qalıb-qalmamaq məsələsinə!

– Axı...

Atası hirslənib telefonu əlinə almışdı:

– Kimdir danışan?

– Partkomdan danışırlar.

– Bağışlayın, Rübabənin anası ağır xəstədir. Evdə də kömək yoxdur, heç yerə tərpəşə bilmir.

Gəldiyev danışanın Səttarzadə olduğunu bilib sözünə daha rəsmi bir ifadə vermişdi:

– O, hər şeydən əvvəl bir komsomolçudur.

Səttarzadə dedi:

– O, bir ananın övladıdır.

– Başqaları beş ananın övladı deyil ki, hərə bir ananın övladıdır.

– Anası pis vəziyyətdədir, necə qoysun gəlsin?

– Siz ki yanındasınız, anası tək deyil ha...

– Mən ayrı. Qızdır, anadır.

– Yaxşı, iclasda məsələsini qoyarıq, görək, onun üçün təşkilatın intizamı fərzdir, yoxsa anası!

Səttarzadənin lap acığı tutmuşdu:

– Bura baxın, yoldaş, adınızı da bilmirəm, gedin məsələni harda qoyursunuz qoyun, qız mənimdir, iclasa qoymuram!

– Sizin kimi köhnə mövhumat tör-töküntülərini yerində oturtmağı bacarırıq.

– Köhnəliyimə baxma, sənin kimi boşboğaza dov gəlməyə taqətim çatar!

– Görərsiniz!

– Baxarıq!

– Baxarsınız!

– Görərik!

Səttarzadə telefon dəstəyini yerə qoyub Rübabəyə döndü:

– Bu kimdir?

– Gəldiyev.

– Sağ gəlməsin elə Gəldiyevi! Adam tapılmır, bunu katib yerində qoyurlar?

* * *

Anasının vəfatından beş gün keçənə qədər Rübabəyə bir söz deyən olmadı. Altıncı gün istirahət axşamı axırıncı dərsə zəng vurulanda qızlardan biri Rübabəyə dedi:

– Gəldiyev səni axtarır.

Dərsdən sonra Rübabə partkom otağına getdi. Gəldiyev stolun gözlərini bağlayıb geyindi, "gedək" deyə Rübabənin yanına düşdü, küçəyə çıxanda mehriban bir səslə qızın kefini soruşdu:

– Bağışla, – dedi, – evinizə gələ bilmədim. İşdən göz açmaq olmur. Başın sağ olsun, anan sarıdan. – Sonra Rübabənin "xüsusi kefi ilə" maraqlandı: – Rübabə, yaxşı deyiblər ki, oğul atadan, qız anadan yetim olar. Sən komsomolçu qızsan, gərək belə şeylərdən pozulmayasan. Ancaq bir yoldaş, bir tələbə, bir Rübabə yox, bir komsomolçu olaraq səndən inciyirəm.

– Pis komsomolçuyam ona görəmi?

– Yox, mən sənə pis deyə bilmərəm, pis komsomolçu da deyilsən. Ancaq səndə bir qapalılıq var. Təşkilat üzvü üçün qapalılıq, dərdi ürəyində saxlamaq nöqsandır. Axı biz ictimai adamlarıq...

Rübabə başa düşmədi:

– Nə barədə deyirsiniz?

– O barədə ki, biz oxumuş komsomolçular gərək hamıya nümunə olaq. Yadındadırmı. Səriyyə Xəlilovanın faciəsi?

– Bu faciənin söhbətə nə dəxli.

– Dəxli çoxdur. Demək istəyirəm ki, bizim həyatımızda köhnəliklə yeniliyin mübarizəsi hələ bitməyib, sinfi mübarizə kəskinləşib və biz irəli getdikcə də kəskinləşəcək. Yeni mübarizə formaları çıxıb. Bu mübarizənin qorxulu cəhəti odur ki, cəbhələrdə, açıq meydanlarda, səngərlərdə getmir, bizim həyatımızın ən dərin, kölgəli yerlərində, məişətimizdə, lap öz qəlbimizin içində gedir. Qolçomaq ilə mübarizə aşkardır. Bərkə qalanda tutub basırsan dama. Amma, köhnəliyi özündə, öz evində görəndə ona qarşı durmağı bacarmırsan. Bunun üçün qəhrəmanlıq, cəsarət istər. Cəsarət çatmayanda da evin yıxılır. Səriyyənin gününə düşürsən. Bu söhbətlər kimin barəsindədir?

Əvvəla özümüzün, bir komsomolçu kimi hamımızın barəsində. İkinci də, konkret, şəxsən sənin ailəndən bəzi şeylər eşidirik...

– Mənim ailəm indi müsibət içindədir. Fəryaddan başqa nə eşidə bilərsiniz?

– Bax lap bu cavabın özü! Bəyəm bu söz komsomolçunun sözüdür? Öz aramızdır, burada özgə adam yoxdur, sən bunu başqasına desən yaxşı olmaz. Burjua pessimizmidir. Biz göz yaşı olan dünyanı çoxdan yıxıb dağıtmışıq. Komsomol gərək ağlamaya, gülə! Gərək lap ağır vəziyyətdə də sən gülüb, komsomol olmağını düşmənə sübut edəsən?

– Görünür, mənim ağzımdan söz qapmaq istəyənlər var.

– Rübabə, inan ki, mənim indiki söhbətim tamam səmimi bir yoldaş söhbətidir. Bilirəm, anan ölüb, qəlbin zədəlidir. Mən istəmirəm, ictimai cəhətdən də sənə ləkə gəlsin. Təşkilata çatdırıblar: guya ölünün üstündə Quran oxuyan olub. Bunu da bağlayırlar sənin atan ilə, ictimai mənşəyin ilə, nə bilim bəzi-bəzi sözlər.

Rubabənin gözlərində qığılcım oynadı. Gəldiyevə baxdı, nə isə demək istədi. Gəldiyev davam etdi:

– Qulaq as, belə şeylərə məna vermə. Nə qədər ki, mən buradayam. Çox da atan, anan, filan, heç vaxt razı olmaram, təşkilat da razı olmaz ki, sənin atan ilə, ya başqası ilə bağlayalar. Sən hər halda komsomolsan.

– Məni atam ilə bağlamaq lazım deyil? Atadan artıq insan kim ilə bağlı ola bilər?

– Məfkurə məsələsi! Ancaq sənin bir şeyindən narazıyam. Atandır, ya hər kəsindir, inkişafına mane olursa cavab verməlisən. Komsomol cavabı, reşitelni!

– Mən atamdan elə şey görməmişəm.

– Görməmisən?

– Xeyr!

– Atanda heç köhnəlik hissi duymursan özün qarşı?

– Atam mənə həmişə mehriban olmuşdur.

– Komsomol odur ki, bu mehribanlığın özünə ziddiyyəti, köhnəliyi hiss eləsin.

– Burada nə köhnəlik ola bilər?

– Siz qəbir üstə getmişsiniz! Bilirsiniz bu nə deməkdir?

– Qəbir üstə getmək deməkdir.

– Bu, həyatdan üz döndərmək, məzarlardan təsəlli almaq meyli, burjua pessimizmi deməkdir. Proletariata yaraşmayan... Bədbinlik, çürük psixologiya!

– Proletariatın adamı ölməz? Proletariat qəbir üstünə getməz? İkinci də proletariat qəbri geridə qoyar. Proletariat bu cür işlərə qarşı mübarizə aparmışdır və aparacaqdır! Proletariat qəbiristanlığa yox, həyata doğru gedib, gedir, gedəcək və qalib də gələcək! Bildinmi? Siyasi savad lazımdır, yoldaş!

* * *

– Bu məktəbin rəhbər işçiləri harda oturur?

– Səttarzadənin qapıçıya verdiyi suala Gəldiyev otaqdan çıxdı:

– Bağışlayın, kimi görmək istəyirsiniz?

– Direktoru.

– Direktor sekaya gedib.

– Partkom necə?

– Buyura bilərsiniz!

Gəldiyev öz otağını göstərib, Səttarzadəni qabağa saldı. İçəri girib stol başına keçdi:

– Partkoma dair nə qulluğunuz?

Səttarzadənin nəzəri stol dalında, divarda qırmızı və müstəqil bir şüşə üstündə zər ilə yazılmış "katib" sözünə sataşdı. Kürsünü yaxına çəkib başladı:

– Yoldaş partkom, zəhmət də olsa, yanınıza xüsusi bir məsələ üçün gəlmişəm. Mənim qızım institutda oxuyur, ikinci sinifdə.

– Səttarzadə Rübabəmi?

– Bəli, Rübabə.

Bu cavabı eşidəndə, ceyran ovlamış ovçu kimi, Gəldiyevin gözləri parıldadı. Özünü güc ilə təbəssümdən yığıb ciddiliyini saxladı. “Görüm, – dedi – aşnam nə deyəcək”.

– Yoldaş partkom, mən özüm sənət cəbhəsinin adamıyam. Varım-yoxum bir qızdır. Arvadların sözü olmasın, nəzir-niyaz ilə böyüdüb bu yerə gətirmişəm.

Gəldiyev ürəyində təəssüf elədi, özünü söydü; “A zalım oğlu, niyə stenoqrafistdən, katibdən saxlamırsan, kişinin ağzından qızıl kimi söz düşdü. Nəzir-niyaz! Bax elə bu sözə də şahidim olsa Səttarzadənin abrını ətəyinə bükərəm. Amma de gəl, sabah danacaq da...”

Səttarzadə Gəldiyevin ah-ufunu, vurnuxduğunu gördü; bir şey axtardığını güman edib dayandı:

– Deyəsən keyfsizsiniz?

Gəldiyev xahiş elədi:

– Xeyr, siz buyurun, buyurun!

– Bu institutdan qulağıma ayrı sədalar gəlir.

– Kimin sədaları? Nə sədalar?

– Əlbəttə, sizin bəzi tələbələrin sədaları, sizin işçilərin sədaları... Adına yaraşmayanların sədaları. – Səttarzadə təzə xəbər ifadə edən bir səslə soruşdu:

– Gəldiyev kimdir sizdə?

Gəldiyev nagahani zərbə yemiş adam kimi səndirlədi, özünü saxladı:

– Var bir eləsi.

Katibin “bir eləsi” deyə, Gəldiyev familiyasını etinasız qarşılaması Səttarzadəyə cəsarət verdi:

– Yoldaş partkom, mən təəccüb eləyirəm, siz eləsini niyə beləsində saxlayırsınız? – əllərini geniş açaraq bütün institutu göstərdi. Böyük bir mədəniyyət ocağında at oynatmağa qoyursunuz! Rübabənin anası ölən gün qıza yaxınlaşıb ki, gərək iclasa gələsən. Biz də bilirik, iclas lazımdır, iclassız iş keçmir. Axı bir vaxtı var. Qız yazıq fəryad içində, yar-yoldaş, qohum-əqrəba təsəlli verir, bu yandan da, bağışlayın məni, bu zırrama əl çəkmir. Axırda telefonda acıqlanmışam, qayıdıb mənə nə desə yaxşıdır?

Gəldiyev gülümsədi:

– Nə dedi? “Məsələsini qoyarıq”, hə?

– Sizin canınız üçün, elə lap belə dedi! Görünür qulağınıza çatıb. Bir həyasızlığa bax ha! Gəlmişəm görəm partiya komitəsi bunları bilirmi? Buna nə deyir? Sonrası da... Səttarzadə duruxdu, başını aşağı salıb dedi: – Partkom otağıdır, burada demək olar. Həmin o Gəldiyevdir, Getdiyevdir, nədir, qızda təmənnası var, əl çəkmir. Bax budur burda... – Səttarzadə şəhadət barmağını stola döydü: – Burda, partkomun qabağında deyirəm: nə qədər gəldiyevlər öz yerində oturmayıb, nə qədər ki, təşkilat belələrinin qabağını almayıb, mən qızımı buraxmayacağam! – Səttarzadə bir az da ürəkdən dedi: – Canım, bu da köhnə Bakı qoçuları-zad olmadı ki, mənə!

Gəldiyev dedi:

– Siz niyə qızınızı gün işığına buraxmaq istəmirsiniz?

– Çünki rahatlıq vermirlər.

– Gəldiyev adam yeyən-zad deyil ha... Bir oğlandır, bəlkə Rübabəni istəyir. Bunu sən kimə qadağan edəcəksən? Qız ağacı, qoz ağacı...

– Xeyr, bağışlayasınız. İstəyir, cavabını da alar. Ancaq məktəbin təşkilatından istifadə edib, qızı qorxutmaq olmaz! Hədə gəlmək yaraşmaz!

– Nə bilirsiniz, bəlkə cavabını alıb, ona görə yaxınlaşır.

Səttarzadə rədd elədi:

– Xeyr, mənim qızım eləsinə cavab-zad verməz.

– Səhviniz də buradadır. Bağışlayın məni, yenə köhnələr kimi düşünürsünüz, bir gənc komsomol qızın azadlığını əlindən almaq istəyirsiniz.

Səttarzadə onun sözlərindən daha da hiddətləndi. Xüsusən, “köhnələr” deyəndə, Gəldiyev nəzərini kişinin ağarmış saçlarına salmışdı. Səttarzadə bunu seçmişdi. Düşündü ki: “Bu ya Gəldiyevin tayıdır, ya Gəldiyev bu hərifi doyurub, mən deyənə inanmayacaq”.

– Hər hökmünüzdə belə cəsarətli olsanız vay bizim gənclərin halına! Mən qızımı uğursuz təsadüfdən qorumaq istəyirəm, siz mənim üstümə çaxır səpirsiniz. Aşkar çaxır səpirsiniz. Nə oldu azadlığın qədrini biz bilmədik?! Siz əgər gözünüzü açıb dünyanı süd gölündə görmüşsünüzsə, biz gözümüz ilə od üfürmüşük. Məhkumluğun acısı hələ də damağımızdan getməyib. Hansı axmaq uşağının sərbəstliyini, səadətini istəməz! Bu nə sözdür?!

– Yox da, yoldaş Səttarzadə, vkus müxtəlifdir. Bəlkə sizin sluçayni saydığınız adam qızınızın xoşuna gəlmişdir, bəlkə ürəyi tutmuşdur...

– Qızım xoşuna gələn adamdan şikayət etməz. Bir də evlənmək onun heç xəyalından keçmir. Fikri-zikri məktəb, dərsdir, gecə-gündüz kitab... – Səttarzadə belə rəsmi bir yerdə qızından danışmağa məcbur olmasına sıxıldı, hirsindən susdu. Birdən tapança kimi açıldı: – Təəccüb eləyirəm!.. Elm ocaqlarımızda bəziləri nə ilə məşğuldurlar! Havaxtacan müsəlman balalarının əlindən dad çəkəcəyik? Canım, mən qızımı da, oğlumu da institutda görmək istəyirəm, buna mane olanlar gərək rüsvay edilsin!

– Bilirsiniz, yoldaş Səttarzadə, bunlar hamısı düzdür. Elm öz yerində. Necə deyərlər, cavanlıq da öz yerində. Ziyalısınız, yaxşı bilirsiniz ki, bizim elm köhnə elm kimi gənclik hisslərini öldürmür, daha da dirçəldir.

– Siz məni qəsdən yana çəkməyin. Biz anadan qoca doğulmamışıq. Gəncliyi görmüşük. Biz də görmüşük. Başqa xalqların necə elm-ədəb öyrəndiyini də görmüşük! Onlara da baxmaq xeyirsiz olmaz. Ali təhsil görməyən piyadadır.

– Təhsilə baxmaz. Mənim bir bibioğlum var, on altı ildir oxuyur, adını yurist qoyub, hələ də məlum deyil ki, nə yuvanın quşudur. Amma bir bacıoğlum var, texnikumu qurtarmamış böyük qulluğa çatıb, orden alıb.

Səttarzadə Gəldiyevin döşündəki MOPR nişanına baxıb dedi:

– Yaxşı igid dayısına çəkər.

– Məsələ ondadır ki, necə oğlandır.

– Elə deməyin, mühit adamı korlaya bilər. Pis yoldaşdan gələn bəla şeytandan da gəlməz. Doğrusu mən Rübabəni bu institutda qoymağa qorxuram. Eşitdiyimə görə, Gəldiyev xuliqanvarı bir şeydir, nə lazım...

– Siz belə deyirsiniz. Həmin Gəldiyevin Rübabədən şikayətini eşitsəniz nə deyərsiniz? Qızınızın gecə saat 9-da, 10-da Gəldiyevin qapısına getdiyini, onun ailə həyatına qarışmaq istədiyini desələr, inanarsınız? İnanarsınız, ya yox? Bizdə material var, material!

Gəldiyev bunları qəti səslə söyləyib, Səttarzadənin gözünün içinə baxdı. Səttarzadə heç bir şey eşitməmiş kimi sakit dayandı:

– Bu böhtanı da Gəldiyevmi düzəldib?

– Düzəltməyiblər, belə şey olub, fakt!

Səttarzadə başını tovladı:

– Siz məni doğma qızım ilə ləc salmaq istəyənlərin iftirasına uymayın, yoldaş! Bunlar hamısı Gəldiyevin fırıldağı olacaq! Xahiş edirəm Rübabəni o yolun adamı bilməyəsiniz. Mənim qızım iki kəlmə danışanda xəcalətindən qızarır. Siz gərək belə dedi-qoduların sahibini yaxalayasınız, qabağını almaq borcunuzdur. Bütün məktəb bilir, o abırsız oğlu qızı necə hədələyir. Mən təvəqqe eləyirəm, təşkilat bu məsələyə son qoysun. Yoxsa mən Rübabəni Moskva institutlarından birinə dəyişməli olacağam.

Gəldiyev dəftərinə iki sətir yazdı:

– Yoxlayaram, ancaq siz də qızlara o qədər arxayın olmayın. İndi ki, söz gətirdi deyim: Gəldiyevdən çox-çox qabaq onun şuşalı bir oğlan ilə yaxınlaşması haqqında institutda danışıq gedirdi. Hərçəndi elə bir şey yox idi, məsləhət görmədik ki, sizi narahat eləyək. Hər halda qab düşməsə, cingilti çıxmaz.

Gəldiyevin bu sözü tutdusa da Səttarzadə pozulmadı:

– Tanıyıram şuşalı oğlanı! Onun bizə get-gəli var. Kim buna pis məna verirsə, özünə gülür.

– Mən özüm üçün qeyd götürdüm, baxaram. İndinin gəncləri, elə mən özüm də içində, görürsən bir eşqə düşürlər, sonra soyuyurlar. Bir gün biri ilə, sabah başqası ilə evlənirlər. Bilirsən, həyat şən, insan azad, nə kefi istəyir, eləyir. Köhnə vaxt deyil ki, deyəsən: göbəyin bu oğlan ilə kəsilib. İndi deyir, istəmirəm, vəssalam. Elə şeylər bizim başımıza çox gəlir. Çalışdığımız budur ki, arada bədbəxtlik olmasın. Kim-kimi istəyirsə ona getsin, istəmir getməsin, maneçilik nəyə lazım.

Səttarzadə təəccüb elədi:

– Axı institut ZAQS bürosu deyil ki, yoldaş katib?

– İnstitut evləndirmir, gənclər özləri evlənirlər. Biz də, necə bir sovet adamı, onların yeni həyat qurması üçün şərait yaradırıq.

– Yeni həyat kişi ilə qadının tapışmasından ibarət deyil! Biz övladımızı ali məktəbə oxumağa, təhsilə qoyuruq, evlənməyə, ər, arvad seçməyə yox!

– Bunları bir-birindən ayırmaq olmaz, oxumaq da, evlənmək də öz yerində, vəhdət var.

Səttarzadə gedəndən iki dəqiqə sonra partkomun qapısı bir də döyüldü. Gəldiyev çıxanda Səttarzadənin qayıtdığını gördü:

– Bura bax! – dedi, – yoldaş, o Gəldiyev evlidir?

– Evlidir, necə məgər? – İndi evlilik ilə subaylıq arasında üç manatlıq bir məsafə var.

Gəldiyev bununla Rübabənin Gəldiyev ilə evlənməsi ehtimalını qüvvətdə saxlamaq istəyirdi. Səttarzadə yenə soruşdu:

– Onun uşağı da var gərək ki!..

Gəldiyevin dodağı qaçdı:

– Hə, qoca, görünür kürəkəninin həyatı ilə əməlli-başlı maraqlanmısan, öyrənmisən.

Səttarzadə əsasını yerə döydü.

– Bildim! Sən deyəndə ki, Rübabə qapısına gedib, bildim kimi deyirsən. Özü də deyirlər burada, bu dikdə olur.

– Deyəsən, orada olur.

– Tacir arvadı alıb.

– Yaxşı tanıdın.

– Niyə tanımıram. O, əclafdır, o, xuliqandır. Arvadı da özünün tayı. Körpə uşağın başına gətirdiklərini siz gərək eşidəydiniz. Nə əcəb eləsi bu institutda iş sahibidir. Yoldaş partkom, görürsünüz mənim qızım kimlər ilə üz-üzə gəlməyə məcbur olur?! Siz də deyirsiniz uşağı qoruma. Gəldiyevlər canavardan da qorxuludur.

Səttarzadə bunları dedi, heç bir cavab eşitməmək üçün, daha doğrusu buna qarşı heç bir cavab ilə təmin olunmayacağını bildirmək üçün düz çıxdı. Gəldiyev qələminin ucunu bir neçə dəfə stola döydü, ancaq danışmadı.

Səttarzadə gedən kimi Gəldiyev elan verib, sabaha büro iclası çağırdı. "Bu kaftarın cavabını vermək lazımdır!"

Səttarzadənin işini müzakirəyə qoymaqdan Gəldiyevin bir məqsədi vardı. Ancaq iş elə gətirirdi ki, bir neçə mətləb ayrılırdı, hamısı da Gəldiyevin xeyrinə.

Gənclərin tərbiyəsi, "ailələrdə kapitalizm qalıqları haqqında" gurultu qoparmaqla bir tərəfdən Gəldiyev özünü sayıq tanıdırdı, ikinci tərəfdən Vahidin canına üşütmə salmaq istəyirdi ki, "gör hansı ailə ilə yaxınlaşırsan. Özün də komsomolda heçə bənd!" Üçüncü və əsas cəhət üzünə nələr-nələr deyən Səttarzadədən intiqam almaq, abırdan salmaq fikrində idi. Rübabə heç vaxt buna dözməyəcək. Gəldiyevə təvəqqeyə gələcəkdi. Gəldiyev də Vahiddən uzaqlaşmağı tələb edəcəkdi. Məsələnin qoyuluşu, müzakirəsi və həlli elə gəlib yetişmişdi ki, burada hiylə olduğunu heç kəs güman etməzdi. Komsomol özəyində

Muxtar yenə işə qarışıb o yan-bu yan eləmək istərsə, onun özünü də təqsirləndirmək asandır.

Qəzetlər hər gün kapitalizm qalıqları ilə amansız mübarizə şüarı altında səhifələr verirdilər. Rayonlarda xurafat və köhnə adət təsirindən qurtulmayan işçiləri biabır edirdilər. Kiminin rüşvətxorluğu, qohumbazlığı, kiminin xəsisliyi, bəzisinin nadanlığı tənqid olunurdu. Elə sovet işçiləri var idi ki, "qəzetlərin kampaniyasını" xorlayırdı: "Canım, birdən-birə olmaz ha! Nə qədər ki, dünyada inqilab eləməmişik, elə şeylər olacaq. Xaricdə kapitalizm zəhrimar taxtabiti kimi gecədə yüz əllisini balalayır..."

Səttarzadə qızının məktəbdən eşitdiyi xəbərləri, müxbirlərin qəzetlərdə yazdığını nəzərə alır, Gəldiyev kimi bir böhtançının vasitəsilə öz adının bu ləkəli siyahıya düşə biləcəyini böyük bir dəhşətlə xəyalına gətirirdi.

Rübabə atasından soruşdu:

– Sən partkoma nə demisən?

– Nə deyəcəyəm, o hərifdən şikayət eləmişəm. Qoy burnunu ovsunlar.

– Kim ilə danışdın?

– Katibin özü ilə, hələ mənlə mübahisə başlamışdı.

– Axı katib burada deyil.

– Necə burada deyil. Kabinetində idi. Gödərək, sarıyanız...

– Ata, bizdə sarıyanız katib yoxdur.

– Bəs o kim idi məni qəbul elədi? Partkom otağında... katib idi.

– Ata, səni qəbul eləyən Gəldiyevdir.

Səttarzadə inanmadı:

– Necə Gəldiyev, a qız! Mən Gəldiyevdən ona bir Quran söz danışmışam.

– Özüdür! Odur!

– O olsa açıb deyərdi, söydüm, biabır elədim axı!

– O deməli yeri yaxşı bilir. Hay salıb ki: "Səttarzadə qızını ictimai yerlərə buraxmır. Özü də gəlib partkom ilə mübahisə aparır".

Səttarzadə qaşlarını düydü:

– Hara hay salıb?

– Məktəbə. Danışıb-eləyirlər.

– Nə demişəm danışalar?

– Çox nanəcib adamdır. Nahaq onunla danışmısan?

– Nə bilim, deyirəm partkomun katibidir, günü sabah gedib komissara deyəcəyəm.

– Komissara nə dəxli. O, katibin yerində oturur. Qəbul eləməyə haqqı var. Gərək öz sözünü özünə deməyəydin. Adamı ki, bir az xam tanıdı...

– Nə bacarır eləsin! Aşkar deyirəm: onun kimisi iş başına keçməməlidir, heç oxumamalıdır da!

Səttarzadə üzdə Rübabəyə ürək verirdisə də ürəkdən rahat deyildi.

Gəldiyev həmin günün səhərisi partiya bürosunda birinci, Həbəşistan hərbzədələrinə kömək məsələsini qoydu, sonra cari məsələyə keçdi:

– Yoldaşlar, – dedi, – cari məsələmizin özü birinci məsələ ilə sıx surətdə əlaqədardır. – Ayağa qalxdı, kəmərindən pırtlayıb çıxan köynəyinin ətəyini çəkdi. Boğazını arıdıb "ustanovka" verdi. – Orada həbəş zəhmətkeşləri yadları qovmaq üçün vuruşur. Onlara kömək əli uzadırıq. Unutmaq lazım deyil ki, biz ölkəmizdə kapitalizmi yıxmışıqsa da, hələ cəmdəyini sürüyüb aradan çıxara bilməmişik, qalıqlarını təmizləməmişik. Bir var ki, kənddə mübarizə aparasan, avam, qara camaat içində. Bunun ayrı işi var. Amma biz heç burnumuzun ucunu görmürük. Öz institutumuzda bu qalıqlar toxum salır, göyərir, əl-ayağa dolaşır, xəbər tutmuruq... sayıqlıq!

"İnstitutumuzda" deyəndə hamının diqqəti Gəldiyevin nitqinə cəlb olundu. Hamı müntəzir dayandı ki, görəsən kimin haqqında danışır. Gəldiyev təkrar sinəsini arıtladı:

– Yoldaşlar, söhbət ikinci kursun tələbələrindən biri haqqındadır. Özü də bakılı, şəhərli! Onların evlərində ölən olub. Ölünün üstünə molla gətirmək, Allahın əmri, peyğəmbərin şəriəti ilə, filan... özü də komsomol üzvü. Bunlar bir yana dursun, mən məlumat alan kimi onu çağırtdırdım. Dedilər dərsə də gəlmir, evlərinin nömrəsini tapdım. Gör kimin evində telefon var! Zəng elədim. Atası, yəni xanəndə Səttarzadə. – Gəldiyev "yəni" sözünü çox mənalı dedi və adamların üzünə baxdı: – Səttarzadə telefona gəldi. Mən belə lap kulturnu onunla danışdım, qəti surətdə qızını ictimai yerlərə buraxmayacağını söylədi.

Kim idisə dilləndi:

– Elə şey olmaz!

– Rübabə dərsə gəlir!

Gəldiyev qəzəblə əlini qaldırdı:

– Dayan!.. Buraxmayacağını söylədi. Mən çalışdım başa salam ki, yaxşı iş deyil, ziyalısan, buna sənin ixtiyarın da yoxdur. Sovet gənci, komsomolçu, yeni həyat... Bu da heç...

Srağagün oturub işləyirdim. Daklada-filana baxırdım. Bir də gördüm arıq, başı çallaşmış bir kişi, əlində əsa budur gəlir. Səttarzadə mənim sözümdən hirslənib, partkoma şikayətə gəlib. Mən də açmadım. Oturdu bir saat mənə Gəldiyevin "yaramazlıqlarından" danışdı. – Gəldiyev bu sözü deyəndə qəhqəhə çəkib güldü, başqalarının da güləcəyini gözləyirdi, ancaq ona qoşulan olmadığını görüb, ciddiliyinə qayıtdı: başladı ki, siz mənim qızımı oğlanlara təhvil verirsiniz. Bu necə məktəbdir, filan... Yoldaşlar, aydındır ki, mən Səttarzadə ilə çənə-boğaza durmazdım. Xanəndə olsa da qoca, mövhumatçı kişidir. On beş ildir Sovet hökuməti onu başa sala bilmir. Mən on beş dəqiqədə onu necə başa salım. Üzümə söydü də, cavab vermədim. Eybi yoxdur, deyərlər də. Səbrimiz çatar. Eşitdiyimə görə, Mərkəzi İcraiyyə Komitəsinin üzvüdür. Bunu nəzərə alaraq məsələni burada qoydum ki, özünüz bu barədə nə məsləhət bilirsiniz, eləyəsiniz. Ölçü götürəsiniz! – Gəldiyev sözünü qurtarıb oturmaq istəyində yadına nə düşdüsə təzədən başladı: – Bağışlayın, unutdum. Səttarzadənin qızını danışdırmışam. Atası, görünür, onu çoxdan sıxışdırırmış. Qız qorxudan açıb deməsə də məlumdur ki, atasının himayəsində oxuyub başa çatmayacaq. Səttarzadə guya indidən "ayrı instituta dəyişmək" bəhanəsilə qızı institutdan aparmaq, ərə vermək istəyir. Bilirik, Nayıbovun "institutuna" verəcək. Bəllidir. Biz bu hadisənin qabağını almasaq, bütün biabır olacağıq...

Gəldiyev adamları hazırlamışdı. Danışanlardan hərə bir rəy söylədi. Biri deyirdi: "Səttarzadə bizim işçimiz deyil, heç bir qərar çıxara bilmərik, gücümüz ancaq qızına çatar". Biri deyirdi: "Rübabəni mütləq məktəbdə saxlamaq və hətta evlərindən ayırıb yataqxanaya düzəltmək vacibdir. Kişinin məsələsini Mərkəzi İcraiyyə Komitəsinə, surətini də qəzetə yazmalıyıq".

Verdiyev etiraz elədi:

– Yazmağın adı yoxdur. Sabah-biri gün təzə seçki olacaq. Səttarzadə-məttarzadə gedəcək öz işinə.

Gəldiyev mane oldu:

– Yox, bizim borcumuz yazmaqdır. Qoy bilsinlər, sonra məsuliyyətli olar.

Verdiyev məsuliyyət sözünü eşidib, şərik oldu:

– Sözümü geri götürürəm. Yazaq, qoy bir siqnal da bu olsun.

Komsomol komitəsinin katibi Muxtar durdu. Məsələni bu qədər şişirtməyin institut üçün, təşkilat üçün nöqsan olduğunu, bu barədə əvvəlki fikrində qaldığını dedi, fikrinin protokola yazılmasını tələb etdi:

Gəldiyev acıqlandı:

– Yoldaş Muxtar, bura sənin üçün komsomol iclası-zadı deyil ha. Nə böyük adam olmusan ki, sənin fikrin üçün dəftər açaq? Otur, qulaq as, əksəriyyət nə deyər, sən də tabe olmalısan, vəssalam!

Muxtar papağını götürüb çıxdı:

– Yaxşısı budur mən gedim öz komsomolluğuma, sən istədiyin qərarı çıxart. Ya sənə verən, ya bizə!

Axırda Gəldiyev fikrini yeritdi. Səttarzadənin "əhvali-ruhiyyəsi" haqqında Mərkəzi İcraiyyə Komitəsinə yazdılar. Qız ilə xüsusilikdə danışıb, onu "təzyiq" şəraitindən ayırmaq məsələsini həll etməyi Gəldiyevə tapşırdılar. İclası bağlayanda Verdiyev Gəldiyevə yanaşdı.

– Amma yaxşı olmayacaq, gərək Muxtarın iştirakı ola idi.

Gəldiyev hirsli dedi:

– Qoy hara gedir, getsin! Dünənki malçişkə mənə ağıl öyrətmək istəyir. Onu seçməkdə biz çox pis iş görmüşük!

* * *

İnşaat institutunun açılışı bayramı üçün hazırlıq gedəndə Vahid güman etmişdi ki, dərs ilinin başlanmasını qeyd eləmək istəyirlər. Biletlər çap olunur, müsamirə üçün hazırlıq gedir, qonaqlar çağırılır, sənədlər seçilirdi, institutun həftəlik qəzeti bu gün çıxmışdı. Direktorun məqaləsini oxuyanda Vahidi heyrət götürdü: "Azərbaycanda birinci dəfə mühəndislik institutu təşkil edirik..." Bu tarixi səhvə görə Vahid redaksiya işçilərinə qızdı:

– Mühəndislik institutu bizdə on il bundan qabaq var. Tarixi niyə danırlar?

Vahid direktorun yanına gəldi. Qəzetin əllərdə gəzdiyini gördü.

Verdiyev utana-utana gələn və nə isə bir şey demək istəyən Vahidə döndü:

– Nə var, bala?

Vahid qəzeti göstərdi:

– Müəllim, bunu siz yazmışsınız, bu məqaləni?

Verdiyevin gözləri iftixar hissi ilə işıqlandı:

– Bəyəm imzası yoxdur?

– Var imzası, amma...

Verdiyev onu sözlü adama oxşatdı:

– "Amma" nədir? Yoxsa sən də Qurd oğlu Qədir kimi təbrikə gəlmisən?

Vahid ürəyində dedi: "Təbrikə yox, üzünüzə tüpürməyə gəlmişəm?". Sonra özünü saxladı:

– Bu cümləni oxuyun görək.

Verdiyev qəzeti əlinə aldı: "Bu gün Azərbaycanda birinci dəfə olaraq mühəndislik məktəbi açılır. Bu gün kulturamızın..."

Verdiyev Vahidin üzünə baxdı:

– Bunda səhv axtarırsan?

– Bəlkə birisi iyirmi üçüncü ilin qəzetlərinə baxdı, onda nə deyər?

Direktor dodağını büzdü:

– İyirmi üçüncü ilin nə dəxli var məsələyə?

– Axı iyirmi üçüncü ildə Azərbaycanda Politexnik İnstitutu kimi bir məktəbdə vurhavur dərs gedirdi. İndi də yazırıq "birinci dəfə". – Vahid əsəbiləşdi. – Axı tarixi qaralamaq olmaz.

Verdiyev tutuldu. Ancaq hiss etdirməmək üçün katibinə baxdı.

– Bu nə deyir, əyə, sərsəm gətirib, nədir?

Katib ağzını-gözünü əydi. Vahidi halaladı:

– O zamankı qarmaqarışıq bir şey idi.

– Hər halda bizim institutdan qarmaqarışıq deyildi.

Verdiyev Vahidi istehzaya qoydu:

– Özü də ali məktəbdə oxuyur. Ayıbdır, yoldaş tələbə! Bərpa dövrünün məktəbini bizə müvəffəqiyyət hesab eləyirsən?

Vahid dedi:

– Məsələ bərpa dövründə deyil, tarixi yenidən başlamaq iştahındadır. Yubiley lazımdırsa, on illik, on iki illik edilsin.

– Bilirik o zaman kimlər at oynadırdı politexnik institutunda...

Vahid gülümsədi:

– Deməli, institutun yox, sizin yubileyinizi eləyirik...

– Demoqoqluq lazım deyil. Bunu hökumət edir, sənin kimisindən soruşmurlar.

Vahidin səbri tükəndi:

– Sabah, – dedi, – yoldaş direktor, sabah xalq bizim üzümüzə nə deyər?

Verdiyev əsim-əsim əsdi, katibə tapşırdı ki, Vahidin dediyini “bir yerə” yazıb saxlasın. Özü ayaq üstə dayana bilməyib, halsızca kresloya oturdu.

## Səkkizinci fəsil

Qatar vağzalda dayanıb köksünü ötürəndə zəng səsləndi. Deyəsən bu səs o qədər qüvvətli idi ki, dəmir yol ilə şəhər arasında olan bütün həddi-səddi vurub dağıtdı. Vağzal qapıları taybatay açıldı. Əlində çamadan, bağlama, patefon, kitab, xurcun, kağız torba, çaydan və qeyri azuqə, qucağında uşaq olan, ya tamam əli boş adamlar vaqonlara sarı yönəldilər. Biletini göstərən, şeylərini vaqona qoyanlar elə sevinir, elə möhkəm otururdular ki, deyəsən ölənəcən bir daha vaqondan yerə düşməyəcəklər.

Yola salanlar gedənlərdən çox idi. İnstitutda qış tətili başlanmışdı. Tələbələr dəstə-dəstə evlərinə yola düşür, qış istirahətinin bir saatını da hədər keçirmək istəmirdilər. Oğlan, qız bir-birinə qarışmışdı. Görüşən, ayrılan kim, vidalaşan kim.

Birinci dəfə idi ki, Rübabə Bakıdan çıxırdı. Birinci dəfə idi rayona gedirdi; birinci dəfə idi atasından ayrılır, “yad” bir oğlana qoşulurdu. İmtahan kitabçasında yazılan fənlər siyahısının qabağında boş yer qalmadığını görəndən sonra Vahid arxayınlaşmış, tətilə evə getməyə tədarük görmüşdü. Rübabə ona bir dəfə: “Getməyəcəksən!” deyəndə o uşaq kimi yalvardı, ailəni, xüsusilə balaca bacısını könlü istədiyini dedi. Vahidin bu görüşdən əsas məqsədi anası idi, ancaq ana sözünü Rübabənin yanında dilinə gətirmədi. Rübabəni də qonaq çağırdı. Rübabə atasından izin aldı. Əslinə baxsan Vahid qonaq çağırmasa da Rübabə onunla gedəcəkdi. Əvvəla, ona görə gedirdi ki, rayonu, kəndi görsün, vətəni yalnız coğrafiyadan tanımaq, kənd həyatını hekayə və romanlardan öyrənmək Rübabə üçün eyib olardı. “Kəndi qoy aqronomlar öyrənsin” deyən qızlara Rübabə istehza ilə baxırdı. O, öz ixtisasını, – ev tikmək, insanlara məskən qurmaq işini – xalqın zövqündən kənarda təsəvvür edə bilmirdi. “Biz nə qədər oxusaq, yenə yaxşı mühəndis xalqın özüdür. Bizim borcumuz elmin hökmü ilə xalqın istəyini

birləşdirməkdir. Tikdiyimiz binalar kəndlinin, kolxozçunun zövqünə, məişətinə, güzəranına uyğun olmalıdır”.

Rübabə ilə həkim qızlar arasında mübahisə olurdu. Onların bəzisi, institutu bitirib kəndə getmədiyini, rayonun mədəniyyətsizliyi, şəraitin pisliyi, bəzi kənd işçilərinin kobudluğu ilə bəraətləndirirdi. Böyükxanım adlı bir uşaq həkimi Rübabəni sadəlövh adlandırıb gülür və deyirdi:

– Ağzın isti yerdədir. Allah qoysa kəndə təyin olunarsan, onda görərsən... Birinci həftə qapına azı bir yüz elçi gəlməsə mənə söy! Başda rayon icraiyyə komitəsinin sədri, ayaqda milis nəfəri, kommunxoz buxqalteri, məhkəmə katibi... Hərəsi əlində məktub qapına gələndə onda halını soruşaram. Bənd olanların əlindən çamadanını da qoyub qaçacaqsan...

– A Böyükxanım, niyə gülməli söz danışırsan?! Rayonlarda az məsul qadın işçiləri var? Elə bunların hamısına məktub gəlir? Bəzi axmaqları niyə nümunə çəkirsən!

Böyükxanım ciddiyyətlə başını əyərək cavab vermişdi:

– Əlbəttə gəlir. Ancaq öz yerlilərinə o qədər girişə bilmirlər. Elə ki, qıraqdan gəldi, işi bitdi. Ələ gətirməmiş qapısından çəkilməyəcəklər...

Rübabə bu mübahisələrdə qətiyyət göstərsə də, aciz qalırdı; çünki kəndi görməmişdi, gəzməmişdi. Doğrudur. Rübabə onların rəyinə inanmırdı. Bu fikirləri şəhər mübtəlalığı, ərköyünlük, tacir əhvali-ruhiyyəsi sayırdı. Amma yenə də kəndi görmək, aydın təsəvvür almaq istəyirdi. Bunun üçün münasib vaxt indi idi. Vahiddən gözəl yol yoldaşı olmayacaqdı.

Bir də Rübabə şəxsən Vahidin ailəsini görməyi, onun ata-anası ilə yaxşı tanış olmağı çoxdan arzulayırdı. Bilirdi ki, qızın oğlana qoşulub getməsini söz eləyərlər. Bunları yadına salmaq istəmirdi; çünki nə öz ailəsinə, nə Vahidə və onun sadə atasına bunlar yaraşmazdı.

Kəndə getməyin üçüncü səbəbi Vahiddən ayrıla bilməməsi idi. Vahid ilə ünsiyyəti elə yerə gəlib çatmışdı ki, heç biri o birindən kənarda yaşamır, yaşaya bilmirdi. Tətil günləri tələbələrin sevdiyi, intizarını çəkdiyi bir vaxtdır. Ancaq Vahiddən ayrılmaq qeydi olduğu üçün Rübabə bu günləri arzulamazdı.

İllah da anasının vəfatı Rübabənin sevincinin yarıdan çoxunu itirmək deməkdi. Vahid də elə buna görə Rübabəni aparmaq, qüssəsini unutdurmaq, mühitini, havasını təzələmək istəyirdi.

Vağzalda da, qohum-əqrəba yola salanda da ana kədəri Rübabəni tərk etmədi. Vaqonun pəncərəsindən aşağı baxanda özünə tərəf çevrilən ata baxışını, qoca xanəndənin gülər üzünü, nəvazişi və şəfqətli nəzərlərini, tanışların vida gülüşlərini, yaylıq oynadan əlləri gördü. Bunlar bir dəstə çiçək kimi sanki, pəncərəyə sarı tutulmuşdu. Rübabə baxıb fərəhlənir, uğura doğru getdiyinə inamı artırdı. Ancaq bu gül dəstəsinin ortası yox idi, orada qaralan boşluqmu idi, ya lalə sinəsinə çəkilən dağdı, matəm əlaməti idi? Rübabə o qaranlıq nöqtədən boylanan anasının solğun, həyəcanlı çöhrəsini gördü. Şirinxanım qızının uzaq səfərə getdiyini eşidib məzardan qalxmışdı... O, yenə xəstədir. Rəngi qaçmış, gözləri qızarmış, dodaqları ağarmışdı. Arıq, uzun və qüvvətsiz qollarını açıb zəif səs ilə yalvarır: “Qızım, Rübabə, səni sağlığımdakı kimi istəyirəm. Qızım, tez qayıt, qabağına gələcəyəm!”.

İncə bir riqqət Rübabənin könlünü parçaladı. Baxışını anasının xəyalı simasından ayırmadı.

Səttarzadə qızının bir nöqtəyə dikilən gözlərindən qəlbindən oyanan kədəri oxudu. Rübabənin ürəyindən keçənlər sanki gizli bir yol ilə onun qəlbinə axdı. Atanın gözlərindən axan yaş balanın yanaqlarında işıldayan incilərə cavab oldu.

* * *

Rübabə vaqonun dəhlizinə çıxıb tamaşa eləmək istəyirdi. Vahid stansiyaları, kəndləri, şəhərləri göstərirdi. Kürdəmirdən sonra təbiət dəyişdi. Boz, çılpaq, quru və bəzən də mazutlu çöllər, təpələr əvəzinə məhsuldar torpaqlar, sıx məskənlər başlandı. Yol kənarları bağ-bağçalıq, otlaq idi. Naxır, sürü otlayırdı. Çaylar düzənliklərdə qıvrılaraq sakitcə axır, kəndin saf havası adamı həvəsə gətirirdi. Azuqə ilə yüklənmiş ovçular uzaqlara gedirdilər. Buludlu mülayim hava, qışı yox, payızı andırırdı. Bəzən açılan, bəzən inadkar uşaq kimi tutulan üfüqlər, ötəri səpələnən yüngül yağışlar sanki Vahidə, vətənin təbiəti haqqında söyləmək istəyirdi. Elə yer olmurdu ki, qatar dayananda Vahid düşməsin. Gah böyük və sarı heyvanlar, gah Şirvanın gülöyşə, şirin narı, qırqovul, kərpic kimi camış qatığı, təndir çörəyi, bandaxdan kəsilmiş Gəncə üzümü...

Rübabəni ən çox maraqlandıran kəndlilər, yerli camaat idi. Bunların bəzisi qiyafəsini dəyişməmişdi, lakin çoxusu təzə dəb ilə paltar

geymişdi. Ancaq bu libas onların kənd xüsusiyyətini örtmürdü, əksinə, daha da qabarıq göstərirdi. Demək olar ki, onların çoxunda paltara bir laqeydlik, etinasızlıq gözə çarpırdı. Görürdün, gözəl və yenicə mağazadan alınmış kostyum geyinən bir kolxozçu unlu torbanı, ya meyvə səbətini qoltuğuna vurub budur gedir. Bir başqası yun şalvarını uzunboğaz çəkmənin quncuna güc ilə yerləşdirmiş, kostyum üstündən qayış bağlamışdı...

Bunlar vaqona girəndə nə danışdıqlarını, nə hərəkətlərini dəyişirdi. Rəftarlarında sərbəstlik, təbiilik hakim idi. Öz evlərinə gəlirmiş kimi arxayın, zarafatlaşa-zarafatlaşa vaqonda özlərinə yer eləyirdilər. Oturan kimi hamı ilə yoldaşlaşır, tanış olur, əhvallaşırdılar:

– Əmioğlu, səfəriniz haradır, allah qoysa?

Rübabə bunların sadəliyinə, güləşqabaqlığına baxdıqca xoşu gəlirdi. Vahiddən soruşurdu. Vahid onları yaxşı tanıyırdı:

– Kəndli, – deyirdi, – çox böyük sinifdir. Qədim sinifdir. Fəhlə sinfi iki-üç əsrlik yol gəlirsə, bunlar neçə min illərdir yoldadırlar, kəndlilər həmişə əkib-becərib, biçib, yığıb, xırman vaxtı isə taxılı özgəsi aparıb. Həmişə başlarına döyüblər. Bunlara yaz əkinçi, qış dilənçi deyiblər. Sabir bəy zülmünü yaxşı göstərib:

Vur, vur ki, gətirməyibdir arpa!
İnsan dözməz bu şarpa-şarpa?

İnqilabın böyük qələbələrindən biri bunların ayılmasıdır. Görürsən, Rübabə, onlar vaqona girəndə ev yiyəsi kimi tərpəşirlər. Keçmişdə vaqonlarda kəndli cınqırını çəkə bilməzdi, indi az qalırlar konduktora qanun öyrətsinlər.

Rübabə xoş bir hiss ilə dedi:

– Nə qədər sadədirlər. Camaat içində öz evlərindən, arvad-uşaqlarından danışırlar.

– Onlar zəhmətlə böyümüşlər. Əmək indi onlara vacib vərdişdir. Ürəkləri, süfrələri, qapıları, əlləri dilləri kimi açıqdır. Səmimiyyətləri, səxavətləri, qonaqpərəstlikləri, dostluqları qəribədir. Başını kəs, istədiyindən dönməz. Ərəblər neçə əsr babalarımızın başına qamçı, qapaz yağdırıb, dediklərinə inandıra bilmirdilər. Qılınc zoruna "Allahüəkbər" dedirdiblər. Kəndli yaxşı başa düşür ki, "Allahü-əkbər" filan onun əkin-tikininə faydasızdır.

Biz bunların sadəliyindəki səmimiyyəti saxlamalıyıq. Sadəlövhlük, avamlıq qalıqlarını isə atmalıyıq. Görürsən, ayaqqabılarını, libaslarını, papaqlarını təzələmişlər. Bu asandır, başlarını təzələmək isə mürəkkəbdir, çətindir. Ona görə də ziyalılarımızın mühüm işi kənddədir. Kəndlini başa saldıqca, özü başlayır köhnə adətlərlə mübarizəyə!

– Məsələ yalnız köhnəlikdə deyil. Hər köhnəni köhnə olduğu üçün atmaq, hər yenini yeni olduğu üçün tutmaq uşaq xasiyyətidir. Yeni köhnədən yaxşı deyilsə, yeniliyin mənası yoxdur. Saç burmaq, dodaq boyamaq Avropadan gəlmə adətdir, amma yaxşı adət deyil! Xalqın gözü sərraf gözüdür. Onun min illər boyu davam edib gələn yaxşı adətləri də var. Qocaya hörmət eləmək, qonağın hardan gəlib, haraya getdiyini soruşmaq, müsibətə düşən adamın başına yığılıb təsəlli vermək, kömək əli uzatmaq... Bunlar hamısı köhnə şeylərdir, ancaq təki bu köhnəlik insanlarda çox olaydı, həmişəlik olaydı.

– Mən köhnəlik kəndlilərin avamlığına deyirəm. Avamlıq ilə səadət barışmamışdır, barışmayacaq da.

* * *

Rübabə Sadıq kişinin alçaq, daş hasarlı həyətinə girəndə ürəyi döyündü. Nabələdliyindən necə hərəkət etmək lazım olduğunu, bu saat qabağına çıxacaq adamlara nə cavab verməli olduğunu kəsdirə bilmirdi. Ürəyində arzuladı: "Sadıq kişi özü çıxaydı!". Vahidin qolunu buraxmamışdı, sanki ondan kömək istəyirdi. Xəyalına gəldi ki, "kənd yeridir, söz eləyərlər". Tez əlini çəkdi, yavaş və müntəzir addımlarla həyətin bir tərəfində təmiz, şüşə pəncərələri ilə onlara baxan, qoşa sütunlu eyvanını qucaq kimi açıb çağıran, ikimərtəbəli evə doğru yeridi. Alt otağın böyük qapısı cırıltı ilə açıldı. Bir dəstə arvad-uşaq şadyanalıq ilə səslənib, gələnlərin qabağına çıxdılar. Onlar Vahidin əmisi qızı Dilara, qonşu qız Gülab, Gülabın uzaq qohumu Bədirnisə arvad və məhəllə uşaqları idilər. Balaca, uzunsaç, uzuntuman, başmağını sürütləyən bir qız uşağı Vahidin boynuna atıldı.

– Qağam gəldi, ay ana!

Qabağa çıxanların arasında ortaboy, enlisifət bir qadın vardı. Görən kimi Rübabə tanıdı: "Odur, anasıdır".

Qadın ağır-ağır yeriyib, Vahidin boynunu qucaqladı. Sonra Rübabəyə döndü. Onu diqqətlə süzdü, evə gələn bir səadət kimi, sevinc və ürəkaçıqlığı ilə qarşıladı:

– Çox xoş gəlmisən, qızım! Evim-eşiyim sənə qurbandır.

Rübabə onun ehtiramına bircə "sağ olun!" dedi. Bunun az olduğunu hiss edib soruşdu:

– Bəs Sadıq əmi hanı?

Qonum-qonşu Rübabə ilə Fatmanın danışığına diqqət yetirirdilər. Xüsusilə qızlar, nabələd quş kimi geyimi, gəlişi, duruşu və danışığı ilə təzə görünən Rübabənin tamaşasına durmuşdular, maraqla ona baxıb pıçıldaşırdılar, pıçıldaşıb baxırdılar.

Fatma qonaqlara kürsü çəkdi:

– Əyləşin! Oxuyanlar dünən, srağagündən gəliblər. Biz də nigaran qalmışıq. Pirolmuş, əl boyda kağız yazmır, demir, ata-anadır, gözü yoldadır axı?

Vahid əl-üzünü yuyurdu, dəhlizdən qışqırdı:

– Ay ana, qonağın yanında az danla məni!

– Qonaq niyə olur, Rübabə özümüzünküdür. Sənə nə?

– Özümüzünkü yaxşı bilir ki, mən tez-tez kağız yazıram.

Rubabə təsdiq elədi:

– Doğrudur, yazır.

– Yazmağına sözüm yox, amma bir bizə də yazsın da.

Rübabə qızaran kimi oldu, lakin qadının söhbəti göstərirdi ki, o ayrı şeydən danışır.

– Bir çamadan dəftər gətirir. Görürəm, tifil onları bir-bir əli ilə yazır. Deyirəm, ay bala, barmaqların qabar olar, bu nədir? Bakı dərsi də ağırdı. Amma əl boyda kağıza nə var. Arada yazarsan.

Vahid bacısını yanına çağırdı:

– Necəsən, maral bacım. Böyümüsən, yaxın gəl görüm! Sənə şəkilli kitab gətirmişəm.

Fatma arvad o biri otaqda çay-çörək hazırlayırdı. Gümüş stəkanaltılarını, qaşıqlarını tələsə-tələsə dolabdan çıxarır, mürəbbə, gülab tədarük edirdi.

O, qonağının, bəlkə də gələcək gəlininin gəlişinə son dərəcə şad idi, ürəyində deyirdi: "Həyalı balamdır, qapıya gələn inək südlü-bərəkətli olar! Yazın sığırçını kimi uçub gəlib, qədəmi xoş olsun, ilahi!".

Vahidin başladığı iş ata-anası üçün, xüsusilə anası üçün qorxulu bir iş idi. Fatma çox görmüşdü, oğlan özgə vilayətlərdə biri ilə danışır. Əvvəllər sözləri bir-birinə xoş gəlir, uyuşurlar, ata-ananın yanına

gəlirlər. İki ay keçməmiş evdə mərəkə qalxır, qohum-əqrəba bir-birinə dəyir, gəlin – həyasız qız isə xanimanı dağıdası olur.

Vahidin gətirdiyi qız özünə bab idi. Sadıq kişi Bakıdan qayıdanda "Bir xanəndə qızının bənd olduğunu, Vahidin də, deyəsən rəy verdiyini" söyləmişdi. Hətta onların evinə getdiyini, atasının nəcib adam olduğunu, ondan çox hörmət gördüyünü demişdi.

Bu xəbər ana iftixarı ilə sevinən Fatmanı bir yandan da təşvişə salmışdı. "Zamana qızlarını tanımaq olmur. Quzu kimi uşağım lotuya rast gələr. Uzaq olsun! Başı pozulandan sonra Allah görsətməsin, yığışdırmaq olmaz..."

Kişidən hey soruşdu. Qızın əsil-nəslindən, "cəld-əbasından" tutmuş gün-güzəranına, ev-eşiyinə, boy-buxununa, pal-paltarına, əndamına qədər, duruşuna, oturuşuna, dərsinə, mərifətinə, sözünə-söhbətinə, yar-yoldaşına, tay-tuşuna qədər hər şeyi xəbər alırdı.

Ancaq Bakıda beş günün qonağı olan Sadıq kişi bunları bilə bilməzdi. Bilsə də onda hövsələ nə gəzir, qıçını qıçının üstünə qatlasın, "arvad ilə arvad söhbəti" başlasın.

– Nə bilim, a rəhmətliyin qızı, adamdır də, pis olsa, gedə yaxın getməz. Zamana işlərini o səndən, məndən yaxşı bilir. Xeyir olar inşallah!

İndi daha Fatmanın nə suala-sifarişə, nə də Sadıq kişinin izahına ehtiyacı qalmışdı. Bacasından ay düşmüş – gəlini öz ayağı ilə gəlib çıxmışdı. Fatma Rübabənin gözəlliyinə sevindi, çünki o, qız üçün gözəlliyi şərt sayan analardan idi. Oğlunu evləndirmək fikirlərilə uğraşanda bu etiqadı daha da bərkimişdi. El arasında gözəlliyə uymağı pis sifət sayırlar, misallar çəkirlər.

Amma Fatma ağıllı olsa da, çirkin qızların çoxunu ocaq başında qalan görmüşdü. Fatma arvad da öz gəlini haqqında tələbkar olacaqdı, kamal cəhətinə bəlkə də güzəştə gedərdi, amma çirkinliyinə yox. "Kamalı qazanmaq olur. Sovet hökuməti məktəblər açıb, çobanları dağdan aparıb, dörd-beş ildə oxumuş eləyir, yola salır. Qız uşağını da öyrətmək, isinişdirmək olar. Amma çirkinin əlacı yoxdur, hökumət də düzəldə bilmir.

Göz-qaşını min bəzə,
Biməzəsən, biməzə!

Bir də zəmanə qızları açıqdırlar: "Bacı, – deyirdi, – oğlan ki, yastıq yoldaşını kifir gördü, gözü qıraqda olacaq. Qırağa baxan göz də çaş bitər. Axırı düzəlməz. Brilyant kimi qız olmasa Vahidi adaxlamaram. Qoy ayı qucağında görsün, ulduza baxanda gözü qamaşmasın".

Rübabə bu tələblərə münasib idi. Ucaboy, qaraqaş, alagöz, güləşqabaq, gərdənli, durna kimi!

Bu təsvir Fatmanın xəyalından keçəndə ixtiyarsız dili tərpəndi. Səs ilə dedi. Vahid ona yanaşıb pıçıltı ilə soruşdu: "Ana, durna kimə deyirsən?".

Fatma oğlunun üzünə baxdı, hər ikisi gülümsədi.

Göyün bir yeri top düşmüş dam kimi sökülmüşdü. Ağ, seyrək buludları aralayaraq, günorta günəşi oradan düz Sadıq kişinin eyvanına, əlində güllü çaynik dayanıb dəmləyən Fatmaya baxırdı. Fatma çayniki samovarın başına qoyub dayandı, üstünə tikmə dəsmal saldı. Gözünü göylərə dikdi. O, fəzada günəşi yox, arıçı evinə gəlin gələn Rübabəni görürdü. Rubabə sanki qəsdən eyvanın qənşərində dayanıb gülümsəyir, salam verirdi. Fatma sükutu ilə, müntəzir duruşu ilə işıqdan və təbəssümdən kiçilən gözləri ilə ona xoşgəldin edib içəri qayıdır, analıq sandığını onun "mübarək qədəmlərinə" tökmək istəyirdi... Bu sandıqda Fatma arvadın nəyi yoxdur...

Hələ oğlu bir yaşa çatmamış, sünnət toyunda kirvənin gətirdiyi töhfələrdən tutmuş bu günə qədər əlinə keçən qiymətli, əziz nə varsa hamısının üstünə sanki qızıl su ilə "Vahid" yazılmışdı. Belə əziz-girami oğulun nişanlısı quru evə gəlməməli idi. Bunun üçün Fatmanın hər tədarükü var idi. Ağır sandıq seçmə parçalarla dolu idi. Bacı mənə bax, qayçıkəsməz, gendədur, şəmsiqəmər, qaymağıxara, gülməxmər, naz-naz örpək, tirməkürdü, güləbətin, zərxara...

Körpəsini əlində oynadan zamanlar Fatma nəzərində Vahidi böyüdüb gənc bir oğlan eləyər, həmin parçaları geyinən yaraşıqlı bir gəlini onun qabağında, fərş döşənmiş zalda süzdürərdi. Qızın qızıl ətəklikləri xoş və xəfif gülüş kimi səslənər, döşündə babaxanası parıldar, təsəkqabağı yenicə doğmuş ay kimi cilvələnərdi. Oğlan buxara papağını çıxarıb mıxdan asar, qollarını dala əyib, çuxasını soyundurmağı tələb edər, qızılzəncirli saatını taxçaya qoyar, arxalığının ögənini qatlayar, bardaş qurub oturar, əl suyu istərdi...

Bunlar indi Fatmaya nə qədər köhnə gəlirdi. Utandığından bu arzularını dilinə gətirmirdi. Vahid indi komsomol oğlandır. Mühəndislik

oxuyur. Qələmi, ağlı-kamalı ilə tanınır. Adaxlısı da özü kimi, "Arıçı oğlu Vahid incinar". Fatma bu xəyaldan sonra dayanar, ürəyində deyərdi: "Belə də olarmış!.. Nişanlısı da özü kimi!.."

Fatmaya heç kəs dərs verməmişdi. Heç kəs sandıqdakı parçaları, təsək-məsəyi, çadra-çarşabı pisləməmişdi. Ancaq nədənsə bunların hamısı onun gözündən düşmüşdü. Gəncliyində, qocalıq günlərinin şadlığı, dincliyi üçün yığdığı bu şeyləri xəyalına gətirəndə məyus və narahat olurdu, övladı üçün elə bir aqibət hazırladığına xəcalət çəkirdi.

Rübabə gələndən sonra Fatmanın sevinci, təlaşı daha da artmışdı. Uzun illərdən bəri gözlədiyi oğul toyu, gəlin gətirmək mərasimi çatmışdı. Xəyal, arzu yox, həqiqət olmuşdu. Öz-özünə deyirdi: "Hanı sənin tədarükün, incinar oğula layiq işlərin hanı? Rübabəyə paltolar gərəkdir, sən çaşıb saxlamısan. Kostyumlar əvəzinə kürdü almısan. Ağır sandıqların, yüngül mücrülərin nəyə lazımdır?.. Kitab şkafları, yazı cihazları, stullar, bufet, patefon, belə-belə şeylər gərək..."

* * *

Sadıq kişi Məşədi Qasımla gəldi. Xoş-beşdən, Səttarzadə haqqında əhval soruşandan sonra oğluna döndü:

– Sizin dalınızca çıxmışdım. Son maşın da gəldi, yəqin elədim ki, sabaha qaldınız.

Vahid nəqliyyat ittifaqının maşını ilə yox, ayrı maşınla gəldiklərini dedi. Sadıq kişi həmişəki kimi Bakıdan, qəzetlərdən soruşmamış özü söhbətə başladı:

– Məşədi ilə aşağı düşmüşdük. Bakıdan gələn vardı. Nağıl hazırlığına.

– O nə deməkdir?

– Yığırlar, zaqatovka gedir. Deyir, hərə gərək nağıl borcunu versin.

Vahid dedi:

– Siz necə, borcunuzu verdiniz, ya yox?

– Mən başlasam kağız, mürəkkəb çatmaz. Gedin dedim, özüm Bakıya gələcəyəm.

– Bakıda nə tapacaqsan onları?

– Mən niyə, onlar tapacaq. Şuşada gəlib tapan, Bakı qəsdinində məni tapmaz?

Rübabə dedi:

– Əmi, mehmanxana adı çəkmə, evimizə nə gəlib?

– Məsəl deyirəm də.

Vahid kişinin sayıq salmaq istədi:

– Evinizi o nağıl hazırlayana tanıtsanız, özünüzü də nağıla düzər...

Sadıq sözü dəyişdi:

– İstəyirik artel düzəldək.

– Nə arteli?

– Fermadır, nədir, arıçılıq barədə.

– Haqqın yolunu tapdınız axırda. Xahiş eləyən çoxdurmu?

– Vardır, var bir yeddi-səkkiz nəfər. Binasını qoyandan sonra dalısı gələcək.

Rübabə söhbətə qarışdı:

– Arılar çoxdanın artelidirlər, bir işləyir, bir də yeyirlər.

Sadıq kişi öz hünərindən söhbət düşmüş kimi arılardan həvəslə deməyə başladı.

– Onların aləmi var, qızım. Böyüyün sözünə baxmağı, ağzıbir olmağı, tənbəli cərgədən çıxarmağı, qənaəti, təmizkarlığı... nəyini deyim, çox pak heyvandır. Təki biz insanlar çox şeyi onlardan öyrənəydik!

Vahid dedi:

– Ata, onların şüuru yoxdur. Nə eləyirlərsə...

Bu söz Sadıq kişinin xoşuna gəlmədi:

– Şüur nəyə deyirsən? Bişüur o adama deyərəm ki, iki əli ilə bir başını dolandırmır. Sən onların mərifətinə bax! Ananın başı ağrıyanda hamısı yas saxlayır. Özgəsinin başını yarmaq, tikəsini əlindən almaq üçün olan şüur nəyə lazımdır? O şüur deyil, zülmdür. Müsəlman şüuru...

– Şüuru yaxşı işlərə sərf etmək olar.

– Arılar eləyir də... Mən də onu deyirəm...

Sadıq həvəslə arıların əmək bölgüsündən, yazbaşı qaynayan həyatlarından söhbət elədi. Sonra dedi:

– Danışın görək, cavanlar, sizlərdə nə var, nə yox, a Vahid! O nədir, o mərdimazar oğlu Gəldiyev yenə oralardadır?

* * *

Bu yerlərin nə gözəl gecələri var! Xüsusilə, qışda hava qaranlıqlaşan, çıraqlar işaran kimi tərəddüd kəsilir. Hər şey istirahət sükutuna batır. Ay aşağıdan, dağlar ardından, Araz üstündən qalxanda, yuyunmuş kimi tərtəmiz, gümüş bədəni ilə görünəndə, bütün aləmə – evlərə, həyətlərə, küçələrə, dərələrə, təpələrə, düzlərə, dağlara ağ bir örtük çəkilir. Hər şey yatır, dünya xəlvət görünür. Ay səssiz yerişi ilə sanki qalxmaq, göylərin üst qatında, pilləkli, abı gərdəyin dalındakı yatağına girmək üçün tələsir. Tamaşadan doymaq olmur. Ancaq ayazdır. Fatma arvad Rübabəni səsləyir:

– Qızım, özünü soyuğa verərsən ha! Bakıya ağlın getməsin. Bura dağ yeridir, ayaz kəsir!

Rübabə içəri qayıdır. Otaqda adam xarici aləmi, sükutu, soyuğu tamam unudur. Üzlərdə şənlik, deyib-gülmək, çalıb-çağırmaq həvəsi görünür. Səkkiz gündür ki, Rübabə gəlmişdir. Bunun beşini kənar evlərdə, qonaqlıqlarda keçirmişdir. Vahidin qohumları, dostları növbə ilə onları çağırırlar. Şirin söhbətdə keçən gecələrin xoş dəqiqələrindən ayrılmaq olmur. Ev sahibi gecə qonaqları buraxmır. Səhər çayını da orada içirlər. Rübabə cürbəcür insanlar ilə tanış olur. Həkim Böyükxanımın söhbətini xatırlayır. "Bunlar hamıyamı, həmişəmi belə hörmətlidirlər? Bəs yalanmı deyirdilər? Bəlkə mənə hörmətləri Vahidin xatirinədir?"

Vahidin xatirinə də olsa, elin adəti də olsa, bu ehtimalın hər ikisi Rübabəyə xoş idi.

* * *

Bu səhər Vahid Rübabəni Cıdır düzünə tamaşaya aparmalıydı:

– Rübabə, – dedi, – buraların tamaşalı vaxtı bahardır. Söz ver ki, yayda da gələrsən. İstəyirəm bu düz, bu dağlar al-əlvan geyinəndə, Qarabağın əsil xanəndələri şeyda bülbüllər səs-səsə verəndə baxasan...

Rübabə dedi:

– Baharda, gül-çiçək açılanda çox yer gözəl görünür. Ancaq zəngin təbiət qışın qış vaxtında da seçilir. Bu kəmər dağlar, şiş qayalar,

günün altında parıldayan təmiz, sədəf qar, bu dərələr, hamısı zehnimdə qalacaqdır, unudulmayacaqdır.

Onlar uşaq sanatoriyasının yanından diklənib düzə çıxdılar. Əl ağacına söykənərək, yavaş-yavaş yeriyirdilər. Rübabə Vahidin qolunu buraxmırdı. Addımbaşı dayanıb ətrafa, şəhəri üzük qaşı kimi əhatə edən qarlı dağlara, sıldırım qayalara baxır, buranın nə üçün Qala adlandığını düşünürdü. Qayalar içində, qaya biçimində tikilən xan evləri, sanki buzdan sürüşüb düşməmək üçün divara yapışmışdı. Vahid böyük bir şairin cəzalandığı yeri, xanın qəzəb yerini Rübabəyə göstərdi. Divar kimi dik təpədən göz işlədikcə baxırsan, dərənin təki görünmür. Daş tullayıb qulaq asırsan. Bir dəqiqədən sonra quyudan gələn kimi səsi eşidirsən.

– Xanın daş qəlbi varmış! Adamların qolu dalısına bağlanar, dərəyə atılarmış.

Rübabə bu söhbəti eşidə bilmədi. Əlini ürəyinin başına qoydu. Ayağının altındakı sərt qayalara, daşlara, quru kollara, buzlamış qumlara baxdı, sanki onların şahidliyini soruşurdu. Onlardan səs çıxmırdı. Qış günəşi isə ağır-ağır əsrlik təmkinilə qalxır, şəhərin üstündən ötür, getmək istəyirdi. Bu da həmin günəşdir. Bu da xanın, xaqanın cəza dəstələrini görmüş, “müqəssirlər” fəryadını, yetimlər naləsini dinləmişdir...

Rübabənin xəyalına gəldi ki, meşə ilə bu təpə yapışmalı, bu məzar dəstəsini örtməli idi; heç olmazsa qanlı qətllərə təbiət mane olaydı!

Vahid dedi:

– Eh, Rübabə, insan çox qəddar olmuşdur. Öz həmcinsini məhv etmək üçün, o vasitə tapır. Bu dərəyə baxanda yadıma böyük, lakin bədbəxt bir sənətkar düşür. Simnarı, şahın tələbi ilə Xəvərnəq sarayı tikən ustanı deyirəm. Onu öz əsəri ilə məhv edirlər: tikdiyi uca sarayın başından yerə atırlar.

– Onun təqsiri nə idi?

– Təqsiri onun qabiliyyəti idi. Daha yaxşı saray tikmək, hünərini artırmaq meyli idi. Şah paxıllıqdan elədi, istəmədi ki, ayrı adamda da gözəl mülk olsun... Nizami sənətkarın faciəsini ürək ağrısı ilə təsvir etmişdir.

Rübabə dərənin o tayında, lap aşağıda qarda yüyürən bir adam gördü. Qarlı günlərdə ətraf kəndlərdən ova çıxan çox olur. Kəklikdə

qəribə bir axmaqlıq var. Adamı görən kimi uçub qaçmır, başını qara soxub arxayın dayanır.

Yüyürən adam doğrudan deyəsən quş tutmuşdu. Nə isə çantası ilə əlləşirdi. Meşədən pırıltı ilə bir dəstə kəklik uçdu. Güllə elə şaqqıldadı ki, deyərdin, dağlar yarıldı, təzədən dərələr açıldı. Bir kəkliyin özünü yerə çırpdığını Rübabə gördü: "Ovçular nə imansız olurlar..."

Onlar şəhərə tərəf enəndə Muşu kəndi tərəfdən gələn ovçular ilə qabaqlaşdılar. Ortayaşlı, başlıqlı plaş geymiş birisinin sol böyründə bir dəstə başı kəsilmiş quş vardı. Ovçu Rübabənin dayanıb mərhəmət hissi ilə baxdığını duydu:

– Qızım, – dedi, – ürəyiniz yuxa olur, bilirəm, amma bunlar bizim üçün yaranmışdır.

Bunu dedi, çantasından bir turac açıb Vahidə verdi. Vahid götürmək istəmədi. Ovçu təkid elədi:

– Al deyirəm sənə!

Rübabə dedi:

– Nahaq vurursunuz bu yazıqları. Bunlar dağlar üçün yaranıblar.

Ovçu dedi:

– Biz də "dağ başına" qoymaq üçün vururuq.

– Bilirsiniz bunun yamacda uçması nə gözəldir?

– Buludda olması da yaxşıdır, plov buludunda!

– Qarlı dağdan pırıldayıb uçması adama ləzzət verir.

– "Yağlı dağın" başında oturmağı da adama dad verir.

Rübabə ovçunun üzünə baxıb gülümsədi. Vahid quşu aldı.

– Ay Rübabə, – dedi, – söz güləşdirmə. Sən romantiksən, bunlar yeddi arxadan realistdirlər!

# İKİNCİ HİSSƏ

## Birinci fəsil

– Vahid! Vahid!

Vahid dönəndə Gəldiyevin başıaçıq, yeməkxanadan çıxıb ona əl elədiyini gördü. Onlar görüşdülər. Gəldiyev Vahidin qolundan tutub içəri çəkdi:

– Hara gedirdin belə?

– Evə sarı.

– Hələ tezdir, evdə hazır olmaz, əyləşin, nahar yeyək.

– Sağ ol, iştaham yoxdur.

– Otur, iştah diş altındadır. Yaxşı vostoçni kababları var, yanında sumağı.

Gəldiyev Vahidin etirazına qulaq asmadı, kabab, ona münasib də dəm-dəsgah gətirtdi.

Vahidə döndü:

– Lavaş istəyirsən, ya təndir çörəyi?

– Təfavütü yoxdur.

Gəldiyev iki barmağını qoşalaşdırıb, xörək verənə dedi:

– Hər ikisindən gətir! – Sonra dostyana söhbətə başladı: – Balığı at dəryaya, balıq bilməsə də xaliq bilər. Sən məni özünə qannıbıçaq sayırsan...

Vahid başını tərpətdi:

– Heç vaxt!

– Yox, dadaş, biz də axı kilosu filan qədərə buğda çörəyi yeyirik. Azdan-çoxdan başa düşürük, danmağa gəlməz! Amma, mən səni qınamıram, haqqın var... – Gəldiyev çəngəlindəki kabab tikəsini ağzına qoymamış Vahidə tərəf əyildi, az qala onun qulağına dedi: – Haqqın var... çünki aralıqda gedib-gələn şeytan elə toxum səpdi ki, hər kəs olsa inciyərdi. Nə isə keçib. – Tikəsini sumağa batırıb ağzına qoydu: – Biz bolşevikik, bolşevik arasında söz də olar, sov da olar, mübahisə də olar. Amma elə ki, işdən kənar məqamə düşdü, gərək hamısını yaddan çıxardasan. Necə deyərlər: "Drujba-drujba, slujba-slujba..."

İllah da sənin mənə andın yoxdur, bu çörək... bir yerdə işləmirik, hərəmiz bir yandayıq, aramızda incikliyə bəhanə tapılmaz, ikincisinə qalanda, Vahid, sənin mənə andın yoxdur, bu çörək... – Çörəkdən bir

çimdik qırtıb qırağa atdı, andını dayandırıb ətrafına göz gəzdirdi; divardakı şəkillərə baxdı, mötəbər bir şey görmədiyindən əlini yenicə qırxılmış üzünə qoydu: – Sənin mənə andın yoxdur, bu Kərimi öz əlinlə qəbirə qoyasan ki, həmişə xatırını saxlamışam, həmişə əlimdən gələn qədər xeyirxahın olmuşam, elə də varam. – Bu sözdən bir az utanan kimi oldusa da davam etdi: – Baxma o zamankı nümayiş məsələsinə. Onda bizi qorxutmuşdular. Hökumət işidir, hamısını açıb demək olmur. Hələ partiyaya keçməmisən. Səni müqəssir eyləməsəydik, bütün institutun adı batardı. Çox adam güdaza gedərdi. Onun ucundan da bütün rayon, rayondan da şəhər təşkilatı öz qaydasıynan!.. Əlac yox idi, bir adamı müqəssir eləmək hara, bütün bir təşkilatı zapaçkat hara? Çox işlər var, siz bitərəflər bilmirsiniz, biz bilirik... – Yenə Vahidə tərəf əyilib pıçıldadı: – Sən bitərəf adamsan, nə vecinə!

– Bitərəf niyə oluram?

– Komsomol özü də bitərəf təşkilatdı. Hər halda firqəçi deyilsən ki, yaxandan tutalar. Doğrudur, səni müqəssir elədik axırda da gördün dalında durduq. Bunun özü zaranee düşünülmüş tədbir idi. Rəsmiyyətə görə yazdıq, sonra da pozdurduq... – Kərim bir stəkan suyu başına çəkib mətləbə yanaşdı: – Sən gərək bunu nəzərə alıb inciməyəsən, şərait elədi.

– İncimək nə üçün? Uman yerdən küsərlər.

Gəldiyev onun üzünə tərs-tərs baxdı:

– Sən nə qədər ummasan da, mən səni unutmamışam. Bir məktəbdə oxumuşuq, sinif yoldaşı olmuşuq, demişik, gülmüşük, ikinci də ona görə ki, səni bacarıqlı oğlan bilirəm.

Gəldiyev ehtiyatında olan bütün yağlı, şirin sözləri xərcə verirdi; çünki bunların hamısı ancaq müqəddimə idi. Gəldiyevin əsil məqsədi Vahidə elədiyi yaxşılığı xəbər vermək, boynuna minnət qoymaq idi, çay stəkanını iki əlli tutub, qabağına çəkdi.

– Sən gərək ki, saray inşaatında çalışırsan, hə?

– Bəli.

– Neçə alırsan?

– Mühəndis maaşı alıram.

– Altı yüz, hə?

– Bir az artıq.

– Bircə yerdə işləyirsən?

– Bircə yerdə.

Gəldiyev yeni bir xəbər söyləyirmiş kimi ahəstə dedi:

– Dünən raykomda söhbət var idi, söz burada qalsın, bəzi yoldaşların irəli çəkilmək məsələsini qoydular, məndən soruşdular... – Dediklərinin təsirini yoxlamaq üçün susdu, Vahidin marağını gözlədi. Vahid isə kürəyini stola söykəyib, ardına qulaq asırdı. Gəldiyev stolunu bir az yaxına çəkdi, müsahibinə tərəf əyildi: – Hə, mən də fikrimi dedim, bəyəndilər. Yoldaşlar haqqında müzakirə açıldı. Bizimkilər birtərəfli düşündülər. Biz bolşevikik axı, insana qayğı məsələsini gərək yadımızda saxlayaq. Məsələn, sən özün yaxşı oğlansan, xatirini də istəyirəm. Komsomolçu, yeni mütəxəssis, niyə gərək elə gündə beş-altıca saat işləməklə kifayətlənəsən? Yerində lap açıq dedim. Dedim, dəlləklər altı yüzdən artıq alır. Vahid kimi kadronu bir tikintidə bənd eləmək insaf deyil. Sən ayda min beş yüz, min iki yüz alsan, həm dövlətə çox xeyir verərsən, həm də qabaqda xeyir işin var, toy eləmək üçün korluq çəkməzsən.

– Onu kim deyir?

Gəldiyev gülümsədi:

– Heç kəs demir, arifə işarə bəsdir. Bu saat bir cüt qadın çəkməsi neçə yüzə başa gəlmir, toy eyləyən ayaqyalın gəlin gətirməyəcək ki! Bunun xərci var, paltarı var, zinəti var, üzüyü-müzüyü var, çalanı-çağıranı var... Kooperativçi deyilsən ki, oğurlayasan. Sən sovet mühəndisi, cibin dolu ola gərək.

– Onsuz da keçinmək olar.

– Yox, yoldaş Vahid, səhv eləyirsən! Bəy balaları keçmişdə toy eləyəndə yeddi mahal o yana hay salır, şadyanalıq başlayırdı. Biz komsomolçu və firqəçilərin toyu da torjestvenni, daha şən olmalıdır. Əsil jiznin ləzzətini biz çəkməliyik, biz bəhrə almalıyıq, gözəl məclisi biz qurmalıyıq.

– Gözəl məclis gurultulu olmaya da bilər, gurultular çox vaxt peşmançılıq ilə qurtarır.

– Bu söhbətlər qalsın sonraya, Vahid, səni bu yerə, məsul yerə çağıracaqlar, mühüm bir məsələ üçün... onda görərsən mən sənin xətrini istəyirəm, ya yox...

Vahid Gəldiyevi diqqətlə dinləyirdi. Onun sözlərinin, zahirən səmimi görünən söhbətinin arxasında mütləq bir hiylə durduğunu güman edirdi. Raykoma çağırılmaq məsələsi Gəldiyevin işidirsə, hər halda burada bir fənd var, onsuz deyil!

Sabahısı gün Vahid səhər işə gedəndə "Vışka" aldı, birinci səhifədə hökumət qərarını oxudu. "Yeni Bakı şəhərinin plan layihəsini çəkmək üçün müsabiqə" elan olunmuş, üç mükafat təyin olunmuşdu.

Vahid belə bir xəbər eşitmişdi, ancaq indi sevindiyindən qərarı dönə-dönə oxudu, sanki özü haqqında yazılmış bir şey kimi hər sətirə diqqət yetirdi. Xəyalında dedi: "Fürsətdir!"

Bakı soveti inşaat şöbəsinin müdiri Mikayılov doğrudan da Vahidi çağırdı. Qabağına sual vərəqəsi və kağız qoydu, onu əlavə işə, yaxın bir inşaata təyin etmək istədi.

Vahid razılıq vermədi:

– Mən bir yerdə işləyirəm, bəsimdir.

Mikayılov dedi:

– İndi bir yerdə işləyən mütəxəssis azdır, bilirsən ki, adam çatmır, o da mütəxəssis. Sizi məsləhət görürlər, boyun qaçırmağına dəyməz.

– Yoldaş Mikayılov, iki yerdə işləyə bilməyəcəyəm. Bəsimdir, axşamlar da məşğulam.

– Nə ilə məşğulsan?

– Evdə işləyirəm.

– Evdə nə iş, yoxsa şeir-zad yazırsan?

– Şeir olmasa da, ondan pis şey yazmıram. Xəyalımda bəzi niyyətlər var.

– Yaradıcılıq yaxşı şeydir, amma təklif olunan iş sənin iki, ya üç saatdan artıq vaxtını almaz.

– Məsələ saatda deyil, bir xasiyyətim var, cismən işdən ayrılsam da, xəyalımda ayrıla bilmirəm. Saat üçdə evə qayıdıram, iş, layihə, tikinti, daş, kərpic, maşın, fəhlə də zehnimdə mənimlə gəlir. Özümü onlardan ayıra bilmirəm. Bütün bu iş aləmi mənimlə süfrə başına oturur, mənimlə yorğan-döşəyə girir, zehnimi bunlardan qurtara bilmirəm.

– Bu yaxşı deyil, dincəlməlisiniz!

– Bəzi xeyirli niyyətlərim var.

– Bəlkə müsabiqədə iştirak etmək istəyirsiniz?

– Bəlkə elədim!

– Bu gözəl fikirdir, sizə mane olmaq cinayətdir. Onda biz düşünək, başqa yoldaş tapaq, bağışla.

Səhər Gəldiyev inşaat şöbəsinə gəldi. Mikayılovun bir adamla söhbət etdiyini gördü. Mikayılov qarşısındakına inşaat haqqında məlu-

mat verirdi. Gəldiyev vacib işi olanlar kimi oturdu. Mikayılovun başı ayılanda kürsünü yaxına çəkdi.

– Bəs Nayıbovu çağırmadınız?

– Çağırdıq, gedəsi olmadı.

Gəldiyev qaşlarını düyüb, təəccüblə soruşdu:

– Niyə?

– Ayrı işi var, məşğuldur!

Gəldiyev hirsləndi:

– Canım, işi-zadı yoxdur, mən yaxşı bilirəm, bir smen işləyir.

– Özü xüsusi çalışır, deyəsən "Yeni Bakı" müsabiqəsində iştirak edəcək, qoy mane olmayaq.

Gəldiyev içi boşalmış maşın kimi dayandı. Nitqi kəsildi, deyəsən onun ürəyinə gələn, uzaq bir güman saydığı şeylər həqiqət olurdu.

– Nə bildin?

– Özü deyir.

Gəldiyev əlini tovladı:

– Hay, hay!..

Mikayılov soruşdu:

– Necə bəyəm, bacara bilməz?

Gəldiyev istehza ilə dedi:

– "Əbləh köpək qaysavadan pay umar". Hələ şübhə altından çıxmayıb, özünü doğrultmayıb, istəyir dövlətdən mükafat alsın, hay, hay!

Mikayılov güldü:

– Nə guruldayırsan ə!.. Hər kəs desə də, sən gərək bu söhbəti ağzına almayasan. Jürinin katibisən, deyərlər qabaqcadan...

– Katibdə nə ixtiyar var. Qiymət qoyanlar ayrı adam... Mən ancaq yazı-pozusuna baxıram. Amma öz aramızdır, məscidin qapısı açıq oldu, itin həyasına nə gəlib? Yoldaş Mikayılov, doğrudan da bəzi qanunlarımıza heyran qalırsan, ötənin belə böyük işə barmaq qoymasına niyə imkan verək axı? Sən özün bilirsən ki...

Mikayılov ayağa qalxdı, stolun gözünü bağlayıb açarı cibinə qoydu.

Gəldiyev layihə bürosundan zəng vurub Vahidi çağırdı, onunla görüşməyi vədələşdi, ancaq səbəbini gizlətdi. Axşam saat səkkizin yarısında mərkəzi kitabxananın qabağında Vahidi tutdu:

– Hara belə, Vahid?

– Kitabxanaya!

– Keflər, əhvallar?
– Sağ olun.
Gəldiyev boynunu qaşıdı. Səhərdən bəri başında hazırladığı fikri Vahidə deyə bilmədi. Boğazı tikilmiş kimi səsi çıxmadı, dili dönmədi.
“Bəzən adam uzun düşünüb ölçür, biçir, müəyyən nəticəyə gəlir. Həmin nəticə ilə iş görmək, qədəm basmaq istərkən bir saniyənin içində fikri dəyişir, daha faydalı bir məsləhət yadına düşür...”
Gəldiyev bunları fikirləşəndə şüur, ona yetişməli olan bir meyvə kimi gəldi. Bu meyvəni istiyə tutmaqla, küləyə verməklə, dərib gün qabağına qoymaqla vaxtından qabaq yetişdirə bilməzsən.
Budur, elə bu dəqiqəcə Gəldiyevin məsləhətləri alt-üst oldu. İndi anladı ki, əbəs yerə Vahid ilə görüşür, ona heç bir şey deməyəcəkdi və demək də məsləhət deyil. Vahidlə söhbəti daha münasib bir vaxta qoydu:
– Eləcə görüşmək istəyirdim, yadıma düşmüşdün!

* * *

“Yeni Bakı” plan-layihəsinin müsabiqəsi haqqında təlimat üçün plan idarəsi sədri, mühəndislər, memarlar yığılmışdılar. Gəldiyev də sədrin yanında əyləşmiş, əlində qələm danışanları qeyd etmək niyyətində idi. Onun gözü Vahidə sataşanda lap yəqin etdi: “Köpək oğlu iştirak eləyəcək”.
Müşavirədən sonra onu yanlamaq, qulağını doldurmaq fikrinə düşdü: “Məbadə, məbadə belə şeyə vaxt sərf edəsən. Elan olunmağına baxma, layihənin əsil müəllifləri də var, mükafat alası adamlar da məlumdur, kimdir. Müsabiqə elə-belə, tak sebe, quru rəsmiyyətdir. Şəhərdə iki yüz-üç yüz mühəndis var, hərə bir layihə çəkib gətirsə, baxıb qurtarmaq olmaz, hamı da işdən avara qalar. Bir də bu elə şeydir ki, uzağı üççə dənə, ya ikicə dənə lazımdır. Artıq nəyə lazımdır. Lap yaxşı çəkən olsa da, heç üzünə baxmayacaqlar. İndidən işarə elədikləri adama tapşırıblar, onunku da qəbul olunacaq, vəssalam. Burada işdən başqa, səndən nə gizlədim, adamın özünə, anketinə də fikir verirlər. Baxırlar da nəçidir, necədir, nə sayaq adamdır, yoxsa bir ətək pulu çölə tökməyiblər. Yazıqsan, get nağd işə yapış...”
Gəldiyev bu məsləhətləri ilə Vahidi bişirəcəkdi. Deyəsən onun ürəyinə bir həqiqət damdı:

“Sən yüz de, Vahid bildiyini edəcək. Ay inandırdın ha!”

Gəldiyev ayrı yol seçdi. “Qoy otursun, çalışsın, özünü öldürsün. Bu zəhrimar bizim əlimizdən gəlib keçəcək, ya yox? Ona bir “mükafat” hazırlayım ki, heç haqq-hesabını qiyamətəcən öyrənə bilməsin.

Gəldiyevi belə bir tədbirə vadar eləyən o idi ki, şəxsən özü layihə düzəltmək niyyətində idi. Müsabiqədə iştirak etdiyi üçün Vahidin işindən qorxurdu. Vahid heç bir mənsəb sahibi olmasa da mütəxəssislər arasında böyük hörməti var idi. Hətta müsabiqə haqqında danışanlar onun adını çəkir, iştiraka çağırırdılar. Vəzirbəyli camaatın qabağında açıq dedi ki, “Biz qocaman memarlarla yanaşı, yeniyetmə və Vahid kimi ümid verən istedadlı mütəxəssisləri mütləq cəlb etməliyik”.

Bu da Gəldiyevə çox ağır gəldi. Aylar keçdi, il döndü, layihələr çəkildi, müsabiqənin qurtarmağına bir ay qalanda bağlı, möhürlü, gizli imzalı əsərlər gəlməyə başladı. Gəldiyev hər gün saat ikidən iş otağında oturur, əsərləri texniki katibdən alıb, münsiflər heyəti üzvlərinə paylayırdı. Əlinə keçən layihələrə diqqət yetirməmiş, gizli imzaların əslini tapmaq üçün mülahizə eləməmiş rahat olmurdu. Öz əsərini “şirin yuxu və istirahət hesabına yaratdığı əsəri” səliqəli bir qutuda “Ürək” adı ilə müsabiqəyə təqdim etmişdi (bu adı o harada isə gördüyü bir rəsmdən götürmüşdü). Gəldiyev sadəcə təqdim etməklə kifayətlənməmiş, xüsusi məktub ilə “Ürək” əsərini hamıdan qabaq münsiflər heyətinin sədri Poladova göndərmişdi. Üç gün sonra zəng edib rəyini soruşmuşdu. Poladov etiraf etmişdi ki:

– Yoldaş katib, baxa bilməmişəm və yaxın günlərə söz verə bilmirəm. Gəl sən bunları əvvəlcə vaxtı olan yoldaşlara ver, layihələr yatıb qalmasın, başım ayılanda mən də tanış olaram. Qoy yoldaşlar baxsınlar! Qoy öz mülahizələrini hazırlasınlar.

Gəldiyev belə fürsət axtarırdı: “Ürəy”i sədrdən alıb, Vəzirbəyliyə göndərdi. Bir məktub da yazdı:

“Yoldaş Vəzirbəyli, müsabiqəyə gələn “Ürək” əsərini göndərirəm, beş günəcən ona baxıb rəyinizi bildirmənizi xahiş edirəm. Bu əsər haqqında üzvlərin fikri vardır, yaxşıdır. Sədrə göndərilmişdir. Sizin də tez baxmanız məsləhət görülür”.

Vəzirbəyli katibin kağızından bir az da təşvişə düşdü. Güman etdi ki, layihə bəyənilmişdir. Həmin gün “Ürəy”i açdı, yanları açılmış böyük stolun üstündə səliqə ilə düyməçələdi. Sağına-soluna keçib baxdı, yoxladı. İki gün bütün vaxtını buna sərf etdi, özünü heyrətdən

saxlaya bilmədi. Layihə bürosuna zəng etdi, adam yox idi. Poladovu çağırdı:

– Yoldaş Poladov, siz müsabiqəyə gələn əsərlərə baxmısınız, ya yox?

– Yox, ay Vəzir, heç baş aça bilməmişəm. Məni gözləməyin, işləyin, bir-bir əldən çıxsın.

– "Ürək" layihəsini görməmisiniz?

– Göndərmişdilər, baxa bilmədim, doğrusu.

– Mən baxmışam ona.

– Necədir?

– Qəribədir!

– Nə sarıdan?

– Müəllifinin heç adi riyazi savadı yoxdur.

– Elələrini atın kənara, vaxt itirməyin!

– Qorxuram hər ötən ağlına gələni çəkib ata üstümüzə, vaxtımız...

– Ləyaqətsiz şeyləri müzakirəyə qoymaq əbəsdir. Əvvəl, ötəri də olsa, bir yoldaş gərək baxıb seçsin. Mən Gəldiyevə tapşıraram. Elə boş şeyləri göndərməsinlər.

Vəzirbəyli telefonu təzəcə yerə qoymuşdu ki, zəng çalındı. Gəldiyev "Ürəy"ini soruşdu:

– Professor, keyfiniz, zadınız? Uşaqlar necədir? Layihəyə baxdınız yəqin, hə? Sizi çox yormadı ki?

– Yox, Gəldiyev, yormadı, heyran elədi.

Gəldiyev sevindiyindən qışqırdı:

– Heyran elədi? Baxanların hamısına belə təsir bağışlayır.

– Heyran olursan, bərk də əsəbiləşirsən!

– Yəni yaxşı əsərlərin azlığına əsəbiləşirsiniz? Eybi yoxdur, yavaş-yavaş...

– Adamları tanıya bilməməyimizə əsəbiləşirəm.

– Doğrudur, hələ biz kadromuzu tanıyıb qiymət qoya bilməmişik. Kadro nədir, idarəmizin də qədrini bilmirik. Əlbət ki, layihələri ilə özlərini göstərənləri ləyaqətli vəzifələrə çəkib qoymaq lazımdır. Zənnimcə, bunu hökumət özü eləyəcək. Məsələn, plan idarəsində niyə bir yaxşı kommunist mühəndis oturmasın?! Narkom mütəxəssis olsa, əlimizi qaralar!

– Mən o babətdən demirəm, texniki vəzifə bəzən axmaq adam əlindədir.

– Aydındır ki, müsabiqə yarış vasitəsilə bu qüvvətli yoldaşları aşkara çıxaranda, naşı-maşının da dalından dəyəcəyik.

– Bu barədə deyə bilmərəm. Amma inşaat idarələrimizi belələrinin əlindən almalıyıq.

Gəldiyev çaşan kimi oldu.

– Söhbət kimin haqqındadır.

– Elə həmin adamın, “Ürək” müəllifinin haqqında. Mən bu layihəyə baxanda doğrudan heyrət etdim. Nə təhər olur, belə adamlar mühəndis adı alırlar? Əsərin başında müəllifin bir məktubu var ki: – injenerəm, filanam, görəsən hansı idarəni kor qoyur...

Gəldiyev bir ah çəkdi:

– Deməli bəyənmədiniz, hə?

– Bəyənmək nədir əşi! Məncə, qeyri-qanuni də olsa, bu adamın paketini açmaq, harada işlədiyini bilmək, tezliklə qovmaq lazımdır. Layihə işindən xəbəri yoxdur. Allah göstərməsin belə mühəndisləri...

Gəldiyev elə bir ah çəkdi ki, hənirtisini Vəzirbəyli də eşitdi:

– Nə cəhətdən yaramır, yoldaş Vəzirbəyli?

– Nə cəhətdən? Deyinən nə cəhətdən yarayır? Pinti bir məktəb şagirdinin cızmaqarası! Nə artıq, nə əskik. Guya küçələri çəkir: Bayıldan Ağ şəhərəcən uzanan küçəni heç bir küçə kəsmir. Bir küçədən o birisinə keçmək üçün damlardan hoppanmaq lazım gələcək. Evlər üst-üstə minib. Bu üzdəniraq mühəndis şəhəri susuz, yolsuz, hərəkətsiz təsəvvür edir. Bina yığını!

– Doğrudan?

– Ayrı aləmdir!

Professor dedikcə göy kağız gözü önündə açılır, nöqtələr, cizgilər görünür, Gəldiyevin səsi onu daha da qəzəbə gətirirdi.

– Yaxşı, – dedi, – göndərin görək nə olur.

Bu həmin Vəzirbəylidir ki, Gəldiyevin diplom alandan sonra ilk tikinti işinə irad tutmuş, hörmətdən salmışdı.

Məktəbi qurtaran kimi, Gəldiyevə Bayılda fəhlə uşaqlarına tikiləcək səliqəli bir bağçanın layihəsini verdilər: “Başla, tik!” dedilər. Gəldiyev əvvəl layihəni gözdən keçirdi; o yana çevirdi, bu yana çevirdi; axtardı, əl qoyulmalı bir qulp tapdı.

– Görün, – dedi, – dövlət pulunu göyə necə sovururlar! Bu bağça ki klubun böyründə tikilir, buna təzədən yan divar götürmək nəyə

lazımdır. Hazır yapışdır klubun divarına, filan qədər pul da hökumətin cibində qalsın.

Gəldiyev ağıla batan söz danışırdı. Raysovetin mühəndisi onun fikrini bəyəndi, öz idarəsində ağız dolusu təriflədi:

– İnjener buna demişəm, bax, dünən qurtarıb, bu gün camaatın səhvini tutur. Elə səhvlər tapır, mat qalırsan.

Hərçənd bu barədə layihə sahibi ilə danışmaq lazım idi, ancaq Gəldiyev tikinti gecikməsin deyə, fəhləni töküb işlətdi. Bir ayın ərzində binanın divarları tikilib qurtardı. Təsadüfən Gəldiyevin bədbəxtliyindənmi, layihə çəkən mühəndisin xoşbəxtliyindənmi, Vəzirbəylinin yolu Bayıla düşdü (Verdiyev sonra Gəldiyevi inandırmışdı ki, Vəzirbəylinin baş qaşımağa macalı yoxdur, dərsin saatına yüz manat alır, nə düşmüşdü öz başına Bayıla gəlsin. Onu gətirən var). Vəzirbəyli qıraqdan dayanıb, bağça binasını nəzərdən keçirdi:

– Bunu sən tikirsən də?

Gəldiyev sinəsini irəli verdi, layihənin səhvini danışdı, ancaq Vəzirbəyli, deyəsən, ona qulaq asmırdı. Qolundan tutub kənara, binanın beş-on addımlığına çəkdi, dayandı. Fasadı göstərdi:

– Bir bax!

– Mən çox baxmışam, siz də baxın!

– Düzdür bu?

– Düzdür!

– Dəvənin boynu kimi düzdür!

Gəldiyev başa düşmədi. Vəzirbəyli bir də işarə elədi.

– Yaxşı bax!

Gəldiyev diqqət eləyəndə qızardı. Vəzirbəyli binanın sağ tərəfinin bir metroya qədər uzun olduğunu göstərib soruşdu:

– Başa düşürsənmi?

– Düşürəm, bəli düşürəm.

– Yaxşı oldu ki, düşdün, belə yerdə deyiblər, qaş qayırarkən göz çıxardırsan. Simmetriya hanı bəs?

Vəzirbəyli Gəldiyevin üzünə baxdı. Gəldiyev gözünü divarlardan ayırmadı. Vəzirbəyli dedi:

– Əminəm ki, axırıncı dəfə olacaq.

O oldu-bu oldu Vəzirbəylinin yanında Gəldiyevin dili gödək idi. Əlacı olsaydı, "Ürəy"i onun sərəncamına göndərməzdi. Lakin yaxşı bilirdi ki, tez-gec bu əsərə o baxmalıdır. Qabağa və tələsiyə salıb,

sözə basmaq, ondan, miyanə də olsa, bir rəy almaq istəmişdi. İndi onun bu haqdakı sözlərini eşidəndə dinəcəyi olmadı.

Layihəni götürüb kənara qoydu, qan-tər içində Vahidin işini tapmağa cidd-cəhd elədi.

* * *

Gecənin birində Gəldiyev evə bir dəstə ağ, qırmızı, sarı, göy zərflər gətirdi. Ağca xanım təəccüblə soruşdu:

– Yoxsa bunlar hamısı sənə gəlib?

– Gəlib, hamısı mənim üstümə gəlib.

– Kimlərdən?

– Qızlardan!

Ağca xanım əyri-əyri baxdı:

– İnanmıram.

– Niyə inanmırsan?

– İnanmıram ki, bizim vilayətdə bu qədər axmaq qız ola.

– Deməli, sən axmaqsan ki, mənə gəlmisən?

– Mən sənə gəlməmişəm, sən mənə gəlmisən!

Gəldiyev söz tapmadı:

– Çox danışma, hamamxananı yandır, bir az buxar ver, bunları daşın üstünə qoy, nəm çəksin.

Ağca xanım bildi ki, Gəldiyev özgənin məktublarını açmaq istəyir.

– Niyə xalqın kağızını oxuyursan?

– Xalqın deyil, qulluq işidir. Dəyişik salmışıq, konvertlərə hayıfım gəlir.

Gəldiyev əlindəki kibrit çöpünü nəm çəkmiş zərflərin böyründən salır, bura-bura açırdı. İstədiyini tapa bilməyəndə təkrar bağlayırdı. Yeddinci zərfdə Vahidin əsərini öyrənə bildi: “Açıq kitab!”

– A zalım oğlu, adını “Açıq kitab” qoyursan, daha niyə belə bərk-bərk bağlayıb, məni əziyyətə salırsan! Sevincdən qayıdıb Ağca xanıma qışqırdı: – Ağca, çay qoy, süfrə hazırla, işimiz işdi.

Ağca xanım qaçıb gəldi:

– Premyanı qazanırsan?

– Bu Vahid köpəkoğlu qoysa.

– Vahidə nə dəxli, əsər yazan sən.

– Bilmirsən, çəkişir də mənnən! Mən nə yazıram, o da gedir onu yazır.

Ağca xanım irəli yeriyib, onun əlindəki zərfi aldı, başqa zərflərin üstünə qoydu.

– Qabağa sal, sən yazan qoy üstə dursun!

Gəldiyev onun əlindən aldı:

– Bu özgənindir, a qız.

– Bəs hansıdır səninki?

– Hələ hazır deyil.

– Necə hazır deyil? Altı aydır qurdalanırsan, nə qayırırsan? Özgə işiylə veyillənincə, oturub qurtarsana!

– Düz deyirsən, balam, oturum işləyim.

Gəldiyev çayını içəndən sonra, iki stolu birləşdirdi, pəncərələri örtüb, qapını bağladı. Vahidin layihəsini səliqəylə düyməçələdi, başladı üzünü köçürməyə:

– Ağca, buraya heç kəsi buraxmayacaqsan! Eşitdinmi?

Düz on yeddi gün qələm, xətkeş, pərgar, rezin əlindən düşmədi. Gündüz iki saat idarəyə qaçıb görünür, qayıdırdı. Surətini çıxarıb qurtarandan sonra bağladı, üstünə öz layihəsinin adını yazdı: "Ürək". İstədi Vahidin layihəsini puç eləsin. Heyfi gəldi, bir də "aydın olmayan yerləri öyrənməyə lazım olar" – deyə, büküb bir küncə qoydu. Ağcanı sayıq salmaq üçün əvvəlki tapşırığı təkrar etdi:

– Ağca, bu otağa heç kəsi buraxmayacaqsan! Sözüm sözdü!

## İkinci fəsil

Üç gün qabaqdan divarlara böyük, rəngli elanlar vurulmuşdu. Enli sarı kağızın üstündə kölgəli, qəşəng göy xətt ilə bu sözlər yazılmışdı: "Səttar Səttarzadənin konserti".

Tramvayların pəncərəsindən yellənərək, görünən elanın xırda sətirlərini oxumaq olmurdu. Ancaq "Səttarzadə" seçilirdi. Qocaman sənət xadimini dinləməyi arzu edən çox idi. Biletlər dünəndən satılıb qurtarmışdı. Bilet alanlar cürbəcür adamlar idilər.

Bunlardan bəzisi Səttarzadə adına hörmət edib, bilet alanlar idi.

Səttarzadə respublikanın məşhur musiqi xadimlərindən biridir. Ancaq çox qocalmışdır. Altmışdan yuxarı yaşı var. Onun gənclik qüd-

rəti, məharəti çoxdan yox olub getmişsə də, kişidəki həvəs, musiqi eşqi, camaat qabağına çıxmaq meyli daha da artmışdır.

Həyatın amansız qanunları var, insan ömrü boyu əlləşir, vuruşur, hünərini, qüdrətini, qabiliyyətini göstərir, nəyə isə nail olmaq istəyir. Buna tədricən nail olur. Axırda bütün ömrü boyu qazandıqlarını təslim etməli, qoyub getməli olur. Ölünün, deyərlər, rəhməti, ya lənəti apardığında yox, qoyub getdiklərində olur. İnsan öz əməyinin ümidli əllərə düşdüyünü görəndə ölüm də rahat və əyləncəli gəlir.

Səttarzadə çox həyəcan ilə öz gəncliyini xatırlayır. Sonradan kor olanlar gün işığından danışan kimi, o da itirdiyi cavanlıqdan həsrətlə danışır. Təklikdə, ya evdə nə qədər sakit, sönük görünürsə, adam içində, ictimai yerlərdə öz xələflərini görür. Qocalıq kədərini bu təsəlli ilə söndürür. Mümkün etdiyi məclisdən qalmır. Cavan çalğıçıların müvəffəqiyyətlərilə sevinir, onları çəkə-çəkə səhnəyə aparır. Camaatın qabağında əlini sıxır, alnından öpür. Camaat Səttarzadənin xatirini əziz tutur. Əsil tamaşaçılar onu görəndə musiqi aləminin, sənət dünyasının zənginliklərini bir daha xatırlayırlar. Belə qabil xadimlərimizin olduğuna sevinirlər. Həm də kədərlənirlər; çünki qocalıq küləyi Səttarzadənin sənət bağını soldurmaqda, barmaqlarını zəiflətməkdə, titrətməkdədir.

Bu elə bir kədərdir ki, dünyada hiss və şüuru olan hər bir kəsi ağrıdır. Çox yox, iyirmi-iyirmi beş il bundan qabaq tarı bağrına basanda bülbülləri cuşə gətirən, kainatın bütün zərifliklərini, gözəlliklərini incə səs tellərində ifadə edən bir sənətkar indi tərk-silah olunmuş bir əsgər kimi zəif görünür.

Onun məclislərində yer olmazdı. Cəld uşaqlar dama dırmaşar, qadınlar çəpərlərə tökülüşər, gənclər qapı-pəncərələrdə az qala bir-birinin başına çıxardı. Onun qəlbi atlananda, sədəfli tarı rəqqasə kimi xurdişə gələndə barmaqlarını görmək olmazdı. Deyərdin simlərin böyrünə yüz bülbül qonub, hərəsi bir cür nalə çəkir. Çox zaman kənd qızları barmağının üzüyündən, cavanlar kəmərindən, saatından keçərdilər. Bilməzdilər nə dil ilə sənətkara razılıq etsinlər...

Hanı o Səttarzadə? Gənclik heç kəsdən, Səttarzadədən apardığı qədər aparmamışdır. Bu itki o qədər ağır və aydındır ki, yalnız Səttarzadəni yox, onu eşidənlərin hamısını ağrıdır.

İndi Səttarzadənin müsamirəsinə gələnlərin çoxu ondan, gənclikdə aldıqları kimi ləzzət almağa yox, bəlkə bu ləzzəti yada salmağa, bir də qocaya öz ixlas və məhəbbətlərini ifadə etməyə gəlmişdilər.

Bəziləri də muğamat sözünü eşidib gəlmişdilər. Onlar o qədər mahnı eşitmişdilər ki, bezmişdilər. Musiqi aləmindən muğamatın qovulduğunu düşünür, səbəbini bilmir, soruşmağa da cürət etmirdilər. Elanda "muğamat" görüb, bilet dalınca yüyürmüşdülər.

Bəziləri də sadəcə "müsamirə" sözü üçün gəlmişdilər. Bunlar o adamlardılar ki, şəhərdə bir tamaşa buraxmazdılar. Boş olan axşamlar başlarından ağrı tutar, kütlənin mədəni istirahətini təmin edə bilmədiyi üçün incəsənət idarəsini tənqidə başlayarlar. Bunlar nə musiqi, nə tamaşa, nə məclisin məzmunu ilə maraqlanarlar. Bunu onlara nöqsan tutmaq da olmaz; çünki məzmun ilə qeyri-məzmunun təfavütünü seçməzlər. Bunlar ya libaslarını səyyar sərgidə göstərmək üçün, ya filan qızı (ya oğlanı) fəth edib ələ gətirdiklərini nümayiş etdirmək, ya da məclisdə söhbət düşəndə "görmüşəm", "getmişəm", "eşitmişəm" demək, "mədəni" adlanmaq üçün can atırdılar. İlk cərgədə oturarlar, dal cərgədəkiləri adam hesab etməzlər. Tez-tez dönüb baxar, onların qabaqda kimlər oturduğuna diqqət yetirib-yetirmədikləri ilə maraqlanarlar. Bunlar, demək olar ki, müsamirədə çıxış etməli olanlardan az hazırlaşmazdılar. Libaslarından, bər-bəzəklərindən başqa, necə tərpəşəcəklərini, tənəffüsdə necə kürsüdən ağır-ağır qalxıb çıxacaqlarını, əvvəl hansı ayaqlarını atacaqlarını, yaylığı hansı əllərinə alacaqlarını, bir tanış gördükdə necə kübarcasına, gözucu salam verəcəklərini, ibarələr lüğətcəsindən necə istifadə edəcəklərini, rus sözlərinin axırında səslərini necə alçaldacaqlarını məşq edirlər.

Məşhur artistlərin çıxışında intizar keçirərlər, çıxışın qurtarmasını gözləyərlər, dərhal əllərini bir-birinə döyüb şaqqıltı salarlar, artist gəlmək istəmədikdə ayaqlarını da yerə döyər, qışqırarlar. Bəzən elə şirin söhbət mövzusu taparlar ki, tənəffüs heç yadlarına düşməz. Gözləri səhnədə olsa da, etina etməz, başlarını cütləşdirib, danışarlar:

– Sən öləsən, arvad həmişə konsertə gəlməyə can çəkir. Onun ucundan gecikirəm.

– Sabir öz hekayələrində bu barədə göstərib.

– Sən Sabiri deyirsən. Füzulinin podval məqaləsini oxumuşam.

– Hansı məqaləsidir, adə, gözümə dəyməyib?

– İki arvadlılar barəsində. Ruscasını oxumuşam. Bizim dildə yoxdur.

– Həlbət ki, ruscası yaxşıdır. Bizdə şair yoxdur ki, o kişilərin Plexanov kimi, İvan Qroznı kimi şairləri var.

– İvan Qroznı? Deyəsən bu şair mənə tanış gəlir.

– Gürcüdür də, Qruziyadandır. Hələ mən uşaq idim, bunların şeirlərini əzbər bilirdim, nədir o, tülkü ilə qarğanın poeması, lap qiyamətdir!

– Azərbaycancası yoxdur?

– Var, Füzuli perevod eləyib, ancaq ruscasının ləzzətini vermir. Azərbaycanca elə-belə danışasan, şeirdə qafiyə məsələsi var axı.

– Əyə, sən ki, bu zəhrimar şairliyi bilirsən, niyə yazmırsan?

– Yazsam, axı indikilərin çörəyinə bais olaram.

– Yox, zarafatsız, sən yaz!

– Zarafatsız deyirəm, şairlərə bais oluram. Odur ki, qoymurlar. Adamın qabağına daş dığırlayırlar.

– Əşi, sən qəşəng yazandan sonra kim nə deyəcək?!

– Sözdür danışırsan da. İndi ki açıldı, deyim: bir poema yazmışdım, özü də belə (baş barmağını dikəldib, göstərir) mirovoy, töküldülər üstümə, qoymadılar üzə çıxa.

– Nədən yazmışdın?

– Götürmüşdüm Fərhad adında bir əsgəri. Səngəri vurub dağıdır, çıxır üzə, bomba ilə düşmənin yeddi batareyasını batırır, bir pulemyotla bir diviziya qırır. Bir diviziya da qaçır. Apardım redaktora.

– Redaktor nə dedi?

– Söz tapmadı, dedi: apar, yazıçı Mirzə Maarifə.

– Mirzə Maarif necə, bəyəndi?

– Bəyəndi-bəyənmədi bilmirəm, amma çox güldü.

– Yəqin çox xoşuna gəlib! Verdimi çapa?

– Yox!

– Bəs nə dedi?

– Dedi ki, gərək qızıl əsgərin adını dəyişəsən.

– O niyə? Fərhad yaxşı addır ki?

– Dedi, Fərhadı qarala, Əlinin qəzəb oğlu yaz! Deyəsən qarabağlıdır, ona görə...

– Səni ələ salıb.

– Yox əşi, tanışdır, elə adam deyil.

– Ondansa həzrət Abbas yaz da. Bəs axırı nə oldu?

– Gördüm nəm-nüm eləyir. Götürdüm, yerinə redaktordan şikayət yazdım!

– Bəs axırı?

– Cavab gözləyirəm. Gərək bu günlərdə gələ.

– Gələr, gələr inşallah, poçta tez-tez get! Qoy ləngitməsinlər...

Bir qisim adamlar da Səttarzadənin müsamirəsinə iş üçün gələnlərdir. Ya görüş təyin etmişlər, ya güdməyə gəlmişlər. Belələrinin Səttarzadəyə xeyri olmadığı kimi, maneçiliyi də yoxdur. Onların çoxu dal cərgələrdə oturar, gəlib-gedənə göz yetirərlər. Zalda dünya dağılsın – oxusunlar, çalsınlar, ya heç oxumasınlar, çalmasınlar, onlar üçün fərqi yoxdur. Bunlar otuz, qırx nəfərin səsləndiyi xora çığır-bağır adı verirlər. Özü də bu "çığır-bağırın" əvvəlcədən bir şey üçün – solo oxuyan qızın nəfəsini dərməsi üçün hazırlandığına inanmırlar.

Müsamirədə bu cür adamların olduğuna hamıdan artıq darıxan Vahid idi. Vahid Rübabə ilə sağ tərəfdə, beşinci cərgədə oturmuşdu. Müsamirənin başlanmasını gözləyirdilər. Sarıyanız, ucaboy, şıqgeyimli bir kişi gözucu salam verib, onların yanından ötdü. Vahid Rübabəyə döndü:

– Deyirsən danışma. Görürsən bunu! Səhnədən də tanıyırsan, yəqin onu şəxsən tanımayanlar yüksək rəydədirlər.

– Mahir aktyordur. Baş rollarda çıxır.

– Mən də bəyənirəm, ancaq yüngüldür. Bəlası budur. Yalnız səhnədə deyil, həyatda da artistdir. Halbuki mən istərəm artistin də alim kimi, ədib, diplomat, filosof kimi qırılmaz təmkini, zəngin daxili aləmi olsun. İçində küləklər əsməsin. Artistin demədiyi də mənalı olmalıdır. Doğrudur, artistliyə görkəm, zahiri əlamətlər də lazımdır; lakin zaldakılar yalnız göz və qulaqdan ibarət deyillər. Onlarda zərrə seçən bir hiss var. Qəlb, zövq, diqqət var. Artistdən ağırlıq, vüqar istəyirlər. Yüngüllük insanın qiymətini də yüngül edər. Biz xalq içində artistin hörmətini daha da qaldırmalıyıq. Onda analar keçmişdəki kimi həyasız qızlarına yox, ismətli qızlarına artist deyərlər...

Adamlar dəstə-dəstə gəlib, yerlərini tuturdular. Gəldiyev səhnə tərəfdən keçib, Vahidgilin yanından tünd yel kimi ötdü. Vahid onu gördü, özünü görməməzliyə vurub, nəzərini yayındırdı.

Gəldiyev müsamirənin lap əvvəlindən burada idi. Nə üçün gəldiyini özü də bilmirdi. Onu bilirdi ki, yetişən kimi vurnuxub Rübabəni axtardı və tapdı da. Lakin o, Rübabəni belə tapmaq istəmirdi. Dal qapıdan baxıb onu qoşa, uzun hörüklərindən tanıdı. Ürəyində dedi: "Ay zalım qızı, gözəllər karvanına qatılsan da səni seçərəm".

Vahidi onun yanında görüb pərt oldu. Adəti üzrə dodağını gəmirdi, əlini kəmərinə keçirib bir az dayandı. Sonra fikirləşdi ki: "Düşmənə

bu kökdə görünmək ayıbdır... Mən bu konsertə Rübabədən gözəl bir qız ilə gəlməli, Vahiddən qabaq cərgədə oturmalı, Səttarzadəni etinasız dinləməli idim...”

Gəldiyev özünü, Rübabəyə göstərməmişdən gedə bilməyəcəkdi. “Qoy bilsin ki, Vahidi özünə ər elədiyini seçənlər var!”

Bir də Gəldiyev onların rahatlığını pozmaq, təşvişə salmaq istəyirdi. Vacib bir iş üçün adam axtarırmış kimi, bir neçə dəfə Vahid oturan cərgədən o yan-bu yana keçdi. Birində Rübabənin dönüb baxdığını duyub, yeyin addımlarla saymazyana qapıdan çıxdı.

O axşam Gəldiyevin əsəbiliyi, ovqat təlxliyi tamamilə təmin olunmuşdu. Heç yerdə təsəlli tapa bilmədi. Evə gəldi ki, ürəyindəkiləri unuda bilsin. Təəssüf ki, ayrı bir aləm, gözlənilməz bir mənzərə gördü. Başı aşağı, hirsli içəri girəndə sarısaç, yad bir qadının divanda oturduğunu gördü. Hazırlaşdı ki, qonağa xoş gəldin desin, onu bir təhər gördü: “Necə qonaqdır ki, ev sahibinə etina eləmir? Necə qonaqdır ki, kişinin ayağına qalxmır?”.

Diqqət edəndə, küncdə təkərək kimi dığırlanan oğlan uşağını görəndə hər şey ona aydın oldu. Sanki bütün dünyanı bir dəyirman daşı kimi əldə gəzdirdilər, gətirib Gəldiyevin boğazına keçirtdilər. Ağırlıq onu yıxası oldu. Gəldiyev əlini boğazlığına atdı, düzəltdi, bir udqundu, bir öskürdü, başı hərləndi, vücudu elə bir vəziyyət aldı ki, oturmaqmı, durmaqmı istədiyini seçmək olmazdı. Deməyə söz axtarırdı. Ağca xanımın kəsərli səsi eşidildi:

– Gör bu arvad kimdir?

Gəldiyev boğazından şərfi aça-aça, Zoyaya tərəf baxdı, etirafdan başqa çarəsi olmadı.

– Когда приехали?

– Это вам не интересно, держите своего ребенка, я уезжаю!

Gəldiyevin boğazı qurudu. Arvadı dilə tutmaq istəyirdi ki, Ağca xanım onun peysərindən bir yumruq endirdi:

– Belə işlərin də var imiş, a küçədən gəlmə şortu?!

Ağca xanımın bu yumruğu Gəldiyevə gülləden ağır idi. Xəyalında o Zoyanın həsəd edəcəyini, köhnə ərinin yeni həyatına küsənəcəyini güman etmişdi. İndi isə onun ürəkdən güldüyü, Gəldiyevin Ağca xanım kimi bir əjdahaya tuş gəldiyini bilib sevindiyi yəqin idi. Zoyanın səsi də Ağca xanımın səsinə qarışdı:

– Прошу не задерживать меня, на поезд, опаздываю. Дайте мне расписку о том, что своего ребенка вы в здоровом состоянии получили!

Zoya bunu deyib, uşağını ayağa qadırdı, çənəsindən tutub, başını qaldırdı. Uşağın iri və diri gözləri muncuq kimi parıldadı.

Ağca xanım keçib uşağın qolundan tutub murdar bir pişik balası kimi çıxarıb eyvana qoydu, kürəyinə bir də yumruq güpsədi. Uşaq üzüstə yerə gəldi. Sonra dikəlib ağzını göyə açdı, qışqırıb ağladı. Ağca xanım dedi:

– Mən bicxana açmamışam. Bir saat qoymaram evimdə belə qoduqları! – Üzünü Gəldiyevə tutdu: – Yığışdır şələ-şüləni, qoduğunu da götür, hansı cəhənnəmə gedirsən get!

Gəldiyev çaşıb qalmışdı:

– Ay Ağca, uşağın nə günahı var. Bir dözümün olsun, bir səbir...

– Dözdüyüm bəsdir. Bir də sənin kimi qurumsaqlar ilə baş yastığa qoymayacağam. Bil! Haydı!

Gəldiyev dinmədi. Eyvanda ağlayan uşağa baxdı. Zoyaya nə isə demək istədi. Ağca xanım hirsini boğa bilmədi.

– Mənim adresim bu şortuda nə gəzir, hə? Bəs sən oğlan idin? Oğlan vayına oturum, inşallah!

Ağca xanım erkək pişik kimi atılıb onun saçlarını çəngələdi, toyuq tükü kimi yolmaq istəyəndə Gəldiyev, ət qaçırdan itə qışqırırmış kimi, səsləndi:

– Ay ərkansız, nə qayırırsan?

Onların bu hərəkəti Zoyanı sevindirməkdən çox qəzəbləndirirdi.

– Освободите ради бога меня, потом можете играть сколько хотите.

Gəldiyev keçib kağız-qələm gətirəndə Ağca xanım tutub əlindən aldı:

– Sənə deyirəm, mənim evim piryut-zad deyil, götür uşağını da, çıx burdan! Gedin davanızı harda istəyirsiniz eləyin!

– Ağca xanım, bəsdir, bir toxta, adamın evinə qonaq...

– Kəs səsini, binamus! Elə sən də qonaq gəlmişdin. Sənin kimi qonaqları çay aşağı axıdım, çay yuxarı axtarım!

Gəldiyevin sinəsindən elə itələdi ki, kişi az qaldı samovarın üstünə yıxılsın. Cin vurdu Gəldiyevin başına, istədi onu götürüb mıxlasın yerə. Partiya biletini yadına salıb, hirsini yedi. Heç olmasa bir neçə

saatlığa, Ağca xanım özünə gələnə kimi, evdən uzaqlaşmağı. sonra qayıdıb arxayınlıqda danışmağı, qılığına girməyi məsləhət bildi. Papağını başına qoyub qapıdan çıxdı. Zoyanı da çağırdı:

– Paşli, davay!..

Zoya çıxanda Ağca xanım dalısınca ürəkdən dedi:

– Haydı, bura sizə görüşxana deyil!

Zoya nə qədər azərbaycanca az bilsə də kürkünü sudan çıxara bilirdi. Qayıdıb dilucu cavab verdi:

– Ayıbdı, xanım, mərifətiniz olsun!

Ağca onun azərbaycanca danışdığını görəndə çəkindi, duruxdu. Bayaqdan bəri dediklərinin hamısını anlamış olduğunu, bəlkə də bir hiylə üçün əri ilə rusca danışdığını fikrinə gətirdi. İstədi onun abrını ətəyinə büksün, ancaq mərifətdən danışmağı qabağını aldı. Ağca xanımın ağzını bağlayan isə bu deyildi, başqa şey idi. Zoya mərifətdən deyib eyvana çıxanda, Gəldiyev qapıda üst-başını çırpır, papağını düzəldirdi. Onlar cüt yeriyəndə, qabaqlarında da uşaq görünəndə Ağca xanımın gözündən od töküldü, sinəsi tez-tez enib qalxdı, rəngi qaçdı, əsə-əsə eşiyə yüyürdü. Gəldiyevin ətəyindən tutub, bərk geri çəkdi və gücü çatdıqca qışqırdı:

– Qayıt içəri!

Gəldiyev dinmədi. Ağca xanım daha da bərk qışqırdı:

– Bu saat içəri, deyirəm sənə!

Gəldiyev dedi:

– Bu saat gəlirəm!

Ağca xanım keçib onun yolunu kəsdi:

– Bir gir içəri! Bir o qalmışdı ki, evimdə svidani düzəldib, kefə gedəsən! A boyunu yerə soxum!

Gəldiyev bilmədi nə eləsin:

– Ay Ağca, bayaqdan özün qovurdun?

– Hə, ürəyindən keçir? Yağlı xörək tutub səni... Ay sənin başın üçün!

İkiəlli Gəldiyevi itələdi, içəri salıb qapını bərk çırpdı. Zoya uşağın qolundan tutub qapıya sarı yaxınlaşdı:

– Xanım, qoy bizi yola salsın.

– Ay... nə istəyirsən? Nə istəyirsən ay dambov! Xalqın kişisindən əl çəkəcəksənmi?

Zoya onu daha da yandırmaq istədi:

– Xanım, ərində gözü olan yoxdur. O mənim ərim olanda heç səni tanımırdı... Mənim artıq-urtuğumdur, sənə tuş gəlib! Qoy uşağını tapşırım özünə, ondan sonra məni burada görsən, basıb döyməyə də haqqın var.

Ağca xanım qapının rizəsini vurdu, pərdəsini saldı, gəlib oturdu. Pərdəni salmaq, sakitcə evə girməklə Zoyaya acıq vermək, "yandırmaq" istəyirdi.

Ancaq Zoya əl çəkmədi. Qonşu qapıları döyüb qadınları oraya tökdü:

– Camaat, – dedi, – bilin, bax bu binamus öz yetiminə yiyə durmur. Rayondan bura yanıma salıb gətirmişəm, yaxın qoymur. Bu saat gedib milis çağıracağam.

Uşaq da bu hay-küyün onunçun olduğunu duyur, balaca yumruğunu gözünə basıb ağlayırdı. Qonşular tökülüşüb ana-balanı kiridirdilər.

– Ayıb olar, bacı! Gəldiyev gərək elə kişi olmasın. Dayan, bu saat çıxar.

Qapını döyür, Gəldiyevi eşiyə çağırırdılar. Zoya da səsə gələnlərin hamısına Gəldiyevin onun necə evlənməsindən, uşağından, uşaq pulundan danışırdı. Bunları eşitdikcə Ağca xanım içəridə kabab kimi qovrulurdu. Bütün xanımanı yanan bir adamın əlacsız dayanıb baxdığı kimi bu vəziyyətə dözür və bu saat bir şey olacağını, əzabdan qurtulacağını güman edirdi. Ancaq heç kəs onu əzabdan qurtarmayacaqdı, Zoya qarıda ağzına gələni deyəcək, Gəldiyevin arvadı olduğunu car salacaq, Gəldiyev də içəridə başını ovcuna alıb oturacaqdı. gəldiyevin bu sakit oturuşu, xiffət çəkən adamın oturuşuna oxşamır. O, köhnə arvadının sözlərinə qulaq asır Bəlkə də lap söyüş eşitsə də onun səsindən həzz alır. Bəlkə də bu söyüşlər onlara keçmiş, mehriban ailə həyatlarını xatırladır, Zoya bunları danışmaqdan, Gəldiyev də eşitməkdən ləzzət alır. Od da öz işindədir, şiş də. Arada bağrı parçalanan, yanan, tüstüsü göyə qalxan kababdır. Ağca xanım Zoyanın səsini, bəhanəsini kəsmək üçün şaraqqıltı ilə qapını açdı, çölə çıxıb, uşağın qolundan tutdu.

– Gəl içəri, – dedi, – ədə, yetim, gəl!

Uşaq evə girdi. Zoya onun dalınca baxıb hönkürtü vurdu... Zoya həmişə uşağına Gəldiyevin oğlu kimi baxmış, Gəldiyevin hayıflarını çox vaxt ondan çıxmağa çalışmışdı. Ürəyi soyumamışdı... Gəldiyevin

başqa qadınlar yanında "oğlanam" deyə evlənməsini yalana çıxarmaq, kefinə mane olmaq üçün uşağı gətirib, üstünə atmağı qət etmişdi. Onun üçün sadə, asan görünən bu işin belə qarışıq, dəhşətli bir mənzərə alacağını güman etməmişdi.

Əvvəla, Gəldiyevin belə bir ailədə yaşadığını, deməli uşağı saxlamağa və bununla heç də kefdən qalmamağa şəraiti olduğunu gördü. İkinci tərəfdən o, uşağı atasına tapşırmağa gətirmişdi, ögey anaya yox! Üçüncü tərəfdən, Ağca xanımın bir dəfə çağırışı ilə uşağın etibarsızlığına yox, özünün günahlarına hirsləndi. Xəyalında dedi: "Yəqin onun evində oyuncaq şeyləri görür, dəm-dəsgah görür; mənim kasıb daxmamın nəyinə meyl salsın!.."

Bu fikirlər Zoyanın qəlbindən bir ildırım kimi keçdi. Riqqətə gətirdi, onu qovurdu. İllərdən bəri ürəyini daşa döndərən qəmlər, kədərlər tutqun bir bulud olub könlündən qopdu. Uşaq evə girəndə Zoya, son ümidləri əbədi olaraq əlindən getmiş kimi, fəryad çəkib elə ağladı ki, eşidənlər suya döndü. Qonşu qadın içəri keçdi, uşağı dilə tutub qucağına aldı, anası ilə görüşdürməyə gətirdi. Zoya son dəfə onu bağrına basdı, göz yaşları macal vermədi. Ana-balaya, bala-anaya qarışdı. Küçədən keçənlər böyük bir müsibət üz verdiyini güman edib dayanırdılar. Kimisi dillənirdi: "Ay uşaq, görün o biçarəyə nə olub, kömək eləmək lazımdır".

Kimisinin də ürəyi dözmür, tez ötüb getməyə çalışırdı.

Zoya uşağından ayrılıb getmək istəyəndə Gəldiyev çıxıb, iki otuzluq ona tərəf uzatdı:

– Biletə verərsən!

Ağca xanım yüyürüb pulu kişinin əlindən qapdı:

– Bircə o qalmışdı. Aşnalarının da xərcini mən çəkəcəkdim, a binamus?!

* * *

Bütün gecəni qəzəb və pərtliklə keçirən Ağca xanım səhər tezdən başı-yaxası açıq, nəfəs almaq üçün həyətə çıxdı. Başında köhnə şal, əllərini duaya açmış kölgə kimi dayanan bir qadını görəndə qorxdu, geri-geri çəkildi.

Zoya səsləndi:

– Balamı ver!

Ağca xanıma elə gəldi ki, Zoya dünəndən bəri burada dayanıb nəyi isə gözləyirmiş, bəlkə də Gəldiyev evdən çıxanda onunla görüşəcəkmiş, bəlkə bir hiylə var, bəlkə məni sınayır, bəlkə...

Hər halda fürsət idi, Ağca xanım tez içəri qaçdı, yuxulu-yuxulu gözünü ovuşduran uşağı qabağına qatıb gətirdi:

– Apar matahını!

Zoya illərdən bəri ayrılmış kimi, uşağını bağrına basdı:

– Xanım, – dedi, – acından ölsəm də balamı sənin ümidinə qoymaram, Kərim istəsə, ancaq səni boşayandan sonra bunun atası ola bilər.

Bu söz Ağca xanımı yandırdı:

– Kül başıva, – dedi, – xaxol matişkə, Kərim onun anasının üzünə tüpürmək də istəmir...

– O istəmir, gün olar ki, mən ölsəm də, bu uşaq Kərimin üzünə tüpürər.

## Üçüncü fəsil

Ucaboy, qoca, lakin qıvraq həkim içəri girəndə evdəkilər özlərini itirdilər. Biri aralığı yığışdırır, biri stul çəkir, biri həkimin paltosunu, papağını alırdı.

– Kimdir xəstə?

Ağca xanım onu içəri otağa çağırdı:

– Doktor, bura buyurun!

İzzətin çarpayısı lap baş tərəfdə qoyulmuşdu. Xəstə üzüdivara yatmışdı. Yuxuladığı, ya halsız düşdüyü məlum deyildi. Qızdırmadan yanaqları od tutub yanır, gözləri qızarmışdı. Dodaqları qupquru qurumuşdu. Ağzında dili tərpənmirdi.

– Nə vaxtdan yatır?

Ağca xanım istədi: “Beş gündür” desin. Vaxtında həkim çağırmadığını ağartmamaq üçün ”dünəndən” dedi.

Həkim uşağın nəbzini yoxladı, qalxıb oturmasını tələb etdi. Uşaqdan zəif və yazıq bir zarıltı çıxdı. Anası onu qoltuqlayıb oturtdu; uşaq balınca söykənmək istədi. Həkim qolu ilə onu saxladı. Ciyərlərinə qulaq asdı. Qaşıq salıb boğazına baxdı.

– Oğlunuzdur bu?

– Bəli!

– Neçə uşağın var?

– Elə budur.

Həkim xəstəni yerinə uzandırdı. Kürsüyə oturdu. Dərindən köksünü ötürdü. Bir müddət dinməz-söyləməz yorğan-döşəyə baxdı. Kənardan baxan elə bilərdi ki, o, xəstəliyi müəyyən etməkdə çətinlik çəkir.

Uşaq narahat olduğundan, həkimdən qorxduğundan, ya kömək gözlədiyindənmi, nədənsə, gözünü açıb baxdı. Həkim ona rahat olmasını işarə etdi. Uşaq bir şey başa düşmədi.

Həkim müayinəni qurtarıb, o biri otağa keçdi. Gəldiyev bu zaman stol başında oturmuşdu. Həkim kişinin ağır xəstə ilə maraqlandığını görüb soruşdu:

– Bu sənin oğlundur?

Gəldiyev ayrı cavab verə bilmədi:

– Bəli, – dedi.

Həkim cib dəftərindən iki varaq cıraraq qələmi mürəkkəbə batırdı. Üzünü Ağca xanıma tutub dedi:

– Bərkdir xəstəliyi... iki tərəfdən, özü də quru sətəlcəm! Necə olub ki, vaxtında həkim çağırmamısınız? Dünən nədir, bir həftənin naxoşudur!

Bu saat yazdığım ünvandan sestra çağırarsınız; səhər, axşam iynələmək lazımdır. Nüsxə yazmışam, ağ dərmanı iki saatdan bir, qırmızını gündə üç dəfə içirdərsiniz. Evə hava verin, uşağın yastığını uca eləyin. Ağır şeylər – ət, yağ, yumurta verməyin sabah mütləq həkim çağırın.

Geyinib çıxanda bir də boylanıb xəstəyə baxdı. Anası onu dikəldib su verəndən sonra kürəyinə balınc qoymuşdu. Uşaq diri gözlərini qapıya dikmiş, sanki həkimdən kömək gözləyirdi. Həkim onun bənizini, kiçilmiş üzündə böyük görünən gözlərini, incəlmiş boğazını, qanı qaçmış quru dodaqlarını görəndə yazığı gəldi. Yaxın yeriyib gülümsədi:

– Necəsən, bala? Əl ver əmiyə! Ay sağ ol!

Həkim çıxanda Gəldiyev ona razılıq elədi. Qayıdıb işinə məşğul oldu. Ağca xanım dərman kağızını əlində tutub, sanki dolaşıq latın hərflərini höccələmək, oxumaq istəyirdi:

– Aptekə vermək lazımdır...

Gəldiyev başını qaldırmadı:

– Səhər işə gedəndə verərik.

– Səhər verilən dərman havaxta hazır olar?

– Onsuz da gecə aptek işləmir.

– Axı bura sroçnı – təcili yazıb?

– Yazıb deyəndə, padumeş, bir həkimin sözü ilə aptek açmayacaqlar ha! Sroçnı, hökumət xəstəsi olanda baxırlar. Sənə, mənə nə sroçnı!

Ağca xanım istəyirdi sestra barədə söhbət açsın. Ərinin cavabından sonra qayıdıb o biri otağa getdi. Gəldiyev radionu işə saldı. Uşaq balınca söykənib durmuşdu, anasının gəldiyi yola, o biri evin qapısına göz dikmişdi. O, xəstəliyində, ümumiyyətlə, ömründə birinci dəfə görürdü ki, haqqında söhbət edirlər. Hələ üstünə həkim də çağırıblar. Bunların yəqin ki, bir nəticəsi, köməyi olacağını zənn edir, hər dəqiqə eşik otağa intizarla baxırdı. Anasının öz yerini açdığını, əsnəyərək koftasını soyunduğunu görəndə bu axşam heç şey olmayacağını yəqin etdi. Başını yastığa söykəyib, böyüklər kimi bir ah çəkdi. Göz qapaqları endi, çətinliklə udqundu, ayaqlarını açıb əllərini sinəsində çataxladı.

Bu gecə Ağca xanımın ürəyində səhra kimi böyük bir boşluq açılmışdı. Bu boşluq onu yüngülləşdirdiyindən, təşvişə saldığından düşündürdüyündənmi, narahat edirdi. Yuxusu gəlmirdi. Üzünü ovcunun içinə alıb, yumşaq balınca söykəmiş, gözünü uşağın çarpayısına dikmiş, nəyi isə gözləyirdi. Radio da təmiz, güclü və aydın bir səs ilə, sanki, bu ailənin qayğısını, xiffətini unutdurmaq üçün şirin-şirin danışırdı.

"Sevgi hekayəsini dinləyin!" Bu sözdən Ağca xanım qalxıb radionu çıxarmaq istədi: "Sevgi! Mənəmi yaraşır sevgiyə qulaq asmaq!".

Bu istehza ürəyindən keçəndə, "sevgi" deyə, gəlib-gedən kişilərin hamısı gözünün qabağına yığıldı.

Radioda bir ədib danışırdı: "Qız oğlanın sevgisinə inanmadı, ona görə də, razılıq vermədi!".

Ağca xanımın xoşuna gəldi:

"Ağıllı qız imiş!"

Radio davam edirdi: "Oğlan, bütün həyatı bahasına olsa da, qızın qəlbini ələ gətirmək istəyirdi. Qız onun sədaqətini yoxlamaq niyyətinə düşdü. Oğlandan soruşdu ki: "Dünyada sevdiyin başqa nə var?". Oğlan dedi: "Bircə anam var. Səndən sonra onu sevirəm". Qız dedi: "Mənim qəlbimi almaq istəyirsənsə, ananın qəlbini verməlisən!". Oğlan bu tələbi anlamadı. Qız dedi: "Ananın ürəyini çıxarıb gətirsən, inanaram məni sevirsən!".

Oğlan bu dəhşətli tələbdən sarsıldı. Yalvardı ki, belə şey danışmasın. Qız isə israr etdi: “Ayrı əlacı yoxdur, məhəbbətimin bahası budur!”.

Oğlan qızdan üz döndərmək istədi. Çox düşündü, çox əzab çəkdi, çox vicdan ağrısı gördü. Axırda qət etdi ki: “Anam qoca adamdır, sabah-biri gün ölüb-gedəcək, ürəyi də həşərata yem olacaqdır. Qoy sevgilim əldən çıxmasın...” Gecənin birində yatmış anasını öldürüb, ürəyini çıxartdı. Sevgilisinə ərməğan gətirdi...

Burada Ağca xanım səksənən kimi oldu. Övladın bu ağır cinayətindən onun tükləri biz-biz durdu. Dalısını dinləmək istəmədi, radio isə əl çəkmədi:

“Anasının ürəyini əlinə alıb, qıza hədiyyə apararkən, oğlanın ayağı ilişdi, büdrəyəndə ürək əlindən çıxıb daşa dəydi. Ürəkdən səs gəldi: “Oğul, ayağın incimədi ki?”.

Ağca xanım öz qəlbinin doğrudan da yerindən çıxıb getdiyini, sinəsində isti sellər axdığını güman etdi. İxtiyarsız gözlərindən axan yaşın balıncı islatdığını duydu. Ürəyində neçə dəfə “sevgi, sevgi!” deyə təkrarladı. Sanki bu təkrarlar onu oğluna – əllərini köksündə çataqlayıb yatan zəif, yetim və xəstə uşağa yaxınlaşdırdı. Dodaqlarını balasının göyərmiş, isti dodaqlarına qoyanda radio da susmuşdu.

* * *

Gecənin havaxtı idisə uşaq atəşdən yandı. Neçə dəfə “Ana! Ana!” deyib çağırdı. Ağca xanım oyanmadı. Gəldiyev eşik otaqda nə iləsə məşğul idi. Uşaq onu çağırmağa cürət etmədi. Qıçlarını güc ilə döşəkdən çəkib, aşağı salladı, durub pəncərə qabağından su götürmək istədi. Ayaqlarını yerə toxunduranda anlaşılmaz bir sevinc onun ürəyini tərpətdi, oynayan günləri, gəzdiyi, deyib-güldüyü yoldaşları yadına düşdü. Güman etdi ki, uzun illərdir yatır, yoldaşlarını çoxdan görməmişdir. O zamankı həvəs və hiss ilə qalxdı. Dayana bilmədi, yeriyəndə səndirlədi. Əllərini göyə qaldırıb guya havadan tutmaq istəyəndə, pul kimi döşəməyə sərildi: sanki ürəyi şaxta vurmuş meyvə kimi qopub düşdü; ancaq indi bildi ki, canı qalmamışdır.

Gəldiyev şarappıltı səsi eşidib, tez bu biri otağa keçdi:

– Nə olub, niyə durmusan? Nə axtarırsan?

Uşaq heç nə demədi, deyə bilmədi. Yorğan-döşəyə sarı sürünməyə çalışdı. Gəldiyev kömək edib onu yerinə saldı, özü keçib işinə məşğul oldu.

Uşaq ağrıdan özünü unutsa da, susuzluğu unuda bilmirdi. Neçə dəfə sızıldayıb anasını çağırdı. Gəldiyev gəldi, ucadan və hirsli soruşdu:

– Nə istəyirsən?

Uşaq dinmədi. Gəldiyev gedəndən sonra uşaq bir də anasını çağırdı. Gəldiyev lap hirsləndi:

– Nə istəyirsən, ay itin küçüyü?

Uşaq susdu. Gəldiyev bir də soruşdu:

– Nə istəyirsən?

Uşaq dedi:

– Anamı!

– Görmürsən yatıb?

O biri otağa keçdi. Nə fikirləşdisə döndü. Təpiklə vurub Ağca xanımı oyatdı.

– Dur gör, qoduğun nə deyir!

Ağca xanım qalxdı. Uşağa su verdi. Ufultu və zarıltısını bir xeyli dinlədi. Üzünü ərinə tutdu:

– Bir içim su versən nə olar? Xəstə uşaqdır... Kafirin balasına heç belə eləməzlər!

– Kafirin balasından da betərdir. Mənə naz eləyir. Sənin qarnından çıxan nə olacaq!..

Ağca xanım gedib yerinə girdi.

Onun dinməməsi Gəldiyevə hər hansı cavabdan betər oldu. İndi anladı ki, uşaq nə üçün yıxılmışdır, nə üçün yerindən qalxmışdır.

Uşağın cürət edib ondan su istəməməsi, Ağca xanımın nisgili və ən nəhayət, susub getməsi ona pis təsir etdi. Özünün bu hökmranlığında doğrudan da çirkin bir niyyət olduğunu, deyəsən, onun qulağına pıçıldadılar. Heç olmasa, uşağın üzünə mərhəmətlə baxmaq üçün o biri otağa keçdi. Uşaq qorxusundan dərhal ufultusunu kəsdi, üzünü divara çevirdi.

* * *

Səhər Gəldiyev yerindən qalxanda Ağca xanım yanında yox idi. Dönüb baxanda onu uşağın çarpayısının başında oturmuş gördü. Tez geyindi. Gəlib xəstəyə baxdı. Ölüm müdhiş qanadını uşağın üstünə gərmişdi. Uşağın dodaqları tamam göyərmiş, gözləri sönmüşdü.

– Yoxsa, ağlayırsan? Dərman kağızını bura ver.

Ağca xanım dinmədi. Yaşarmış gözlərilə ona baxdı. Demək istəyirdi: "Gec deyilmi?"

Hansı bir ümid ilə isə nüsxəni ərinə verdi. İzzətin balıncını qucaqlayıb oturdu.

Gəldiyev qaçıb dərman sifariş elədi. Qəbzini gətirdi:

– Bir saata hazır olacaq!

Arvadına təsəlli vermək istədi. Xəyalına gətirdi ki, "hələ vaxtı deyil, bunu basdırana qədər evdə ovqat-təlxlik olacaqdır. Olsun, qoy bir gün, beş gün qəm-qüssə ilə keçsin. Axırı ki, asudəlik gəlir. Daha evdə yetim olmayacaq. Daha Ağca dəqiqədə bir hirslənməyəcək... Daha başqalarının mənim ailə işimə qarışmasına bəhanə tapılmayacaq..."

Ağca xanım dizi üstə çöküb, başını oğlunun çarpayısına söykəmişdi, əlində yaylıq gözünün yaşını tökürdü. Ancaq səsini çıxarmırdı. İzzətin rəngi ölü rəngi idisə, vəziyyəti, uzun əyləncə və oyundan sonra şirin yaz yuxusuna getmiş uşağın vəziyyətini andırırdı. Nə zarıyır, nə tərpəşir, nə xırıldayırdı. Anası hərdən cib aynasını onun ağzına tutur, nəfəsi gəldiyini seçirdi.

Kərim Gəldiyev dərmanı ona görə almağa tələsirdi ki, sonra bu da bir söz olmasın. Xəstənin dərman içəsi vəziyyətdə olmadığını bilirdi. Amma yenə alıb gətirdi. Əlində balaca şüşələr evə girəndə, əlac istəyirmiş kimi, uşağın boynu tərpəndi, ayaqları çəkildi, uzandı, hıçqırırmış kimi, nəfəsi içəri çəkildi, daha qayıtmadı. Ağca xanım ürək bəndinin qırıldığını, qəlbinin qopub düşdüyünü duydu. İki əli ilə başına vurub hayqırdı:

– İzzət! İzzət!

Yanıqlı bir vaveyla səsi evi başına aldı. Gəldiyev meyitin üzünə dəsmal saldı. Ağca xanımı sakit etmək istədi. Sonra nə fikirləşdisə, özü də cibindən yaylıq çıxarıb, bir küncdə çöməldi. Başını aşağı salıb kədərlənən kimi oldu...

## Dördüncü fəsil

Gün əyiləndə Ağcagilin darvazasından üzünə nimdaş bir ağ çəkilmiş uşaq tabutu çıxardılar. Ağca xanım qara matəm libasında, əlləri qoynunda, yaxası-başı açıq, gözüyaşlı tabutun dalınca yeriyirdi. İki

addım atmamış qapıda dayandı, dayandığı yerə baxdı, sanki burada bir şey itirmiş, ya tapmışdı.

Ağca xanım fəryad çəkib diz çökdü.

Tabutu uzaqlaşdırdılar, onu evə gətirdilər...

Ağca xanımın yeriməyə, danışmağa taqəti qalmasa da, xəyalı dincəlmirdi, yaralı quş kimi budaqdan-budağa enirdi, müsibətinə şərik axtarırdı.

Toyundakı cah-calaldan vayında bir əlamət görmürdü. Hanı onlar? Təbarəklər, hacılar, atalar, analar... Deyəsən o keçmiş dünyadan kimsə qalmamışdır. Onların kölgələri isə Ağca xanımdan qaçır, tində, dalanda, qarovul daxmalarında, bazarlarda, zirzəmilərdə, bağ-bağça hasarları arxasında gizlənirlər.

– Qonaqlar hanı? Hanı qonaqlar?

Həmişə İzzətin səs-küyündən şikayətlənən bu ev indi çıraqsız zülmət bir dama bənzəyirdi. Qaranlıq, tənhalıq, ayrılıq həsrəti, peşmançılıq, qulaq tutan sükut qadını məngənə kimi sıxırdı. İzzətin sağlığında arzuladığı asudəliklər, uşaq sarıdan sərbəstlik bir tikan olub onun gözünə girirdi. O, balası ilə bərabər bütün sevinci və ümidlərini də basdırmışdı, həyatdan əli üzülmüş kimi, özünü uçurumlardan yuvarlanmış, hələ yerə dəyməmiş bir vəziyyətdə, fəlakət göylərində duyurdu. Uşağı düşündükcə analıq hissləri qəlbinin dərinliklərindən qaynayıb çıxırdı. Əsrlərcə dağlar, daşlar təzyiqinə uğramış, sıxılmış, boğulmuş bir məhəbbət, güclü və odlu bir axın kimi təkan verib yerləri parçalayırdı. Bütün ağırlıqları aşıraraq üzə çıxırdı. Dəhşətli gurultu qoparır, aləmi lalə rənginə boyayır, yer üzünü tuturdu. Sanki, bundan bu saat müdhiş bir zəlzələnin gurultusu qopacaq, dünyanın bütün əzab-əziyyətlərinə son qoyacaq, hər şeyi bitirəcəkdi. Ağca xanım libasını parçalayır, ağ sinəsini bu od işığına verir. Qırmızı maye hələ qaynayır, hələ qabarır, köpürür, dünyanı ağzına almaq istəyirdi. Sanki bu axının heç kəslə işi yox idi. Yalnız bu tərəfə yönəlib gəlirdi. Ağca xanımın təmiz analıq həyatını tapdayan, müqəddəs hisslərini boğan köhnə ziyafət libaslarını, gərdək pərdələrini, pəncərə tüllərini yandırmaq, işrət guşələrini, görüş məclislərini, gəzinti yerlərini dağıtmaq istəyirdi.

– Qoyun! Yol verin! Həyat bağçasına su gəlir, qoyun sel də olsa səhraları bassın. Qoyun kol-kosu götürsün, zibilləri, xəzəlləri süpürüb aparsın!

Bu nədir?

Ananın gözlərindən axan yaşmıdır, göylərin qəhrindən tökülən doludurmu? Tökün, yağdırın güllələrinizi, ey bulud qoşunları! Ana sinəsindən qopan həsrət küləyi gurlasın, dolu döysün, sel bassın! Qoy məhəbbətin vətəni, analığın üfüqləri tərtəmiz olsun! Hava durulsun, yer təmizlənsin, torpaq öz xasiyyətinə qayıtsın!

* * *

Vahid və Rübabəni tanıyanlar arasında elə adam yox idi ki, bu iki cavanın evlənəcəyinə şübhələnsin. Elə adam da yox idi ki, bu məsələni dilinə gətirsin. Sanki bu, əvvəldən onların alnına yazılmışdı; sanki bu, bir gəncin boy atması, böyüməsi kimi adi və sual qəbuletməz bir həqiqət idi. Çoxlarına, hətta bu gənclərin öz ailələrinə də elə gəlirdi ki, Vahid Rübabə ilə, Rübabə də Vahid ilə yaranmışdır. Birinin adı gələndə o biri öz-özündən xatırlanırdı. Birini görüb o birisini görməyən adam, açılan üfüqün günəşini görmək istəyirmiş kimi, intizar çəkirdi.

Qəribə budur ki, "məhəbbət" haqqındakı bu mənalı sükut yalnız zahiri deyildi, hətta Vahid ilə Rübabə ikilikdə, lap tənha gəzişəndə belə bu barədə bir kəlmə kəsməmişdilər, danışa bilməmişdilər, guya alovlu məhəbbətlərindən söz açsalar dilləri, dodaqları yanacaqdı.

Belə sözlər ürəklərinə gələndə ancaq bir-birinə baxır, qıpqırmızı qızarıb, başlarını aşağı salardılar. Lakin onların könülləri səssiz oxunan bir kitab kimi, bir-birinə məlum və aydın idi. Bunun qəlbi onun, onun ürəyi bunun köksündə idi. Bu sükut uzun sürə bilməyəcəkdi, çünki onların sevgisi ilə, bundan doğan və doğmalı olan nəticələr ilə maraqlananlar vardı. Fatma arvad oğlundan kağız aldı, həmin kağızda Rübabədən salam-dua eşidəndə çarqatını yellədərək eniş-yoxuş şəhər küçələrindən yeyin ötərdi. Tanışları onu dayandırıb soruşardı:

– Vahidi evləndirirsən deyirlər, ay qız? Allah mübarək eləsin! Qız kimlərdəndir?

Fatma ana səadətinin sevinci, oğul fərəhi ilə danışardı:

– Mübarəkbadlıq içində olasan! Tarçı Səttarzadənin qızı bənd olub, gədənin də görürəm, könlü atlanıb, Allah sizinkilərə də qismət eləsin!

Fatma arvada Sadığın aldıqları bəs eləmirdi. Pətəklərin balından satıb vurhavur zər-zivər axtarır, parça alır. Gəncəyə kəlağayı üçün sifariş edir, qızıl saat axtarır, qənd, çay hayına qalırdı.

Dünyada ayın da üzündən ləkə əskik olmadığı, günəşin də tutulmaq dərdi olduğu kimi, bu gənclərin toy tədarükündə də qəmgin bir nöqtə var idi. Rübabənin bu xeyir işində anası meydanda yox idi. Analar üçün ən böyük arzu olan övlad toyu Şirin xanıma qismət olmamışdı. Qadın böyük həsrətlə hazırlaşdığı günü görə bilmədi.

O, vaxtilə qapısına gələn elçiləri nəzakətlə qovardı. "Qızım oxuyur, xəyalından da elə şey keçmir". Bununla belə Rübabəyə hiss etdirmədən hazırlıq görərdi. Otaqların ikisini ailənin ümumi ixtiyarından yayındırmağa çalışırdı: "Tək uşaqdır, – deyirdi, – kənara verməyəcəyəm".

Bir ay ərinin rayonlarda verdiyi müsamirələrdən güclü pul gəldi. Şirin xanım həmin pulu öz səliqəsi ilə Rübabənin toy tədarükünə xərclədi.

Deyəsən, yazıq qadın öləcəyini bilirmiş. İki ilin içində əl-ayağını elə yığışdırmışdı ki, Rübabə özünü qurulu ev sahibi saya bilərdi. Bu barədə danışmağı da xoşlamazdı. Sanki o, elədiklərinin hamısını uzun zaman fikirləşəndən, götür-qoydan, qəti rəyə gələndən sonra edərdi. Bir də görərdin küçə qapısı açıldı, hamballar bir dəst mebel gətirib otaqlara düzdülər. Bir də görərdin dərzi gəlib pəncərələri ölçdü, məxmər nümunələri göstərdi ki: "Pərdə hansından tikilsin?". Bunlar hamısı bütün ailə üçün xoş idi, ancaq ixtiyar sahibi Şirin xanım idi.

Bəlkə hər şey öz qaydasına düşəndən, Rübabəyə qurulu ev hazır olandan sonra Şirin xanım qızı ilə qabaq-qabağa oturub nə isə deyəcək, tapşıracaq və öyrədəcəkdi. Lakin bu da Şirin xanıma qismət olmadı. Mərəzinin şiddət etdiyi bir axşamda qızını yanına çağırıb, əlini ürəyinin başına qoydu:

– Eşidirsənmi, – dedi, – qızım?

Güman ki, Şirin xanımın indi də qızına bir çox şeylər deməyə dili gəlmirdi. Ancaq onun son vurğular ilə döyünən və qüvvətdən düşən qəlbi bunları deyə bilərdi və doğrudan da deyirdi:

– Eşidirsənmi, qızım?

Rübabə qara, uzun nəmli kirpiklərini çaldı:

"Eşidirəm, ana" demək istədi.

Kirpiklərinin arasından iki damla yaş düşdü. Bunlar balanın anasına son və sadiq sözü idi. Rübabə ağladığını anasına bildirməmək üçün başını yana çevirdi, göz yaşını sildi. Dönüb xəstənin üzünə baxanda ruhunun uçub getdiyini duydu...

Bu hadisədən sonra heç kəs toy əhvalatını dilinə gətirməzdi. Səttarzadə istəkli arvadının, ömür yoldaşının dünyadan getdiyinə nə qədər qüssə çəkərdisə, onun bu həsrətinə beş o qədər qəhərlənərdi. Evdə tək dayana bilməzdi. Gözü Şirin xanımı xatırladan bir şeyə sataşdımı, ağsaqqal kişi uşaq kimi hönkürtü vurub ağlardı.

Vahid də Rübabəni gözdən qoymaz, tək buraxmazdı. Dərs ilə, mütaliə ilə başını qatar, vaxt tapanda götürüb şəhərə, ictimai yerlərə çıxardı.

Bu yay Rübabə də, Vahid də diplomlarını almışdılar. Vahid böyük bir tikintiyə mühəndis təyin olunmuşdu, Rübabənin hələlik işləməsini məsləhət görmür, "zəifsən, dərsdən sıxılmısan, – deyirdi, – bir-iki ay dincəl, payızda havalar sərinləyəndə işləyərsən".

Deyəsən Sadıq kişi Azərbaycan İnşaat İnstitutunun dərs cədvəlindən xəbərdar idi. Buraxılış axşamının səhərisi Rübabəni də, Səttarzadəni də yuxudan oyadan o oldu. Xurcunu çiynindən aşıran kimi, Səttarzadə köynəyinin yaxasını düymələyə-düymələyə o biri otaqdan çıxdı.

– Xoş gəlmisiniz, Sadıq!

Sadıq onun əlini sıxdı, Fatmanı təqdim elədi:

– Tanış ol, Vahidin anasıdır.

Fatma ağzına yaşmaq çəkib, utana-utana qabağa yeridi, bərk əlini Səttarzadənin ağ və yumşaq əllərinə toxundurdu. Sadıq evə göz gəzdirdi:

– Qızım hanı? Dərs ki, qurtarıb.

– Yuxu dərsi oxuyur.

Sadıq kişi səsini alçaltdı.

– Bunu bayaqdan de də, sağ olmuş. Dəyirmançı kimi evə hay salmışam.

– O biri otaqdadır, eşitməz.

Fatma arvad ağzı boğulmuş və möhkəm bağlanmış bir torbanı açmaqla, orada nəyi isə yerbəyer etməklə məşğul idi. Sadıq kişi xurcunu boşaltmağa başladı. İkiqat bükülü şaqqa əti stolun üstünə qoydu,

üç şan təzə bal çıxarıb, ehtiyatla divara söykədi. Səttarzadə məcməyi gətirəndə Sadıq dedi:

– Götür əlində at-tut, bir damcı düşməz. Ustası elə toxuyub, bizlərin işi deyil.

İçi kərə yağla dolu şirli küpəni döşəməyə qoydu. Süfrəyə bükülmüş bir bərni gilənar mürəbbəsi, lay-lay bükülmüş ağ lavaş, yağlı fətir, baş-baş təzə pendir...

Sonra Sadıq torbanı Fatmanın əlindən aldı.

– Səttar dadaş, burda bir az ayın-oyun var... Açıq qab...

Səttarzadə mətbəxə ötdü, Sadıq Fatmaya dedi:

– Otur dincəl...

– Yorulmamışam.

– Yorulmasan da işləməli günlərin gəlir.

– Təki həmişə xeyir iş olsun.

Fatma yavaş səslə yerindən soruşdu:

– Bu kişinin də qızı var?

– Maral kimi!

– Subaydır?

– Subaydır!

– Necə şeydir, Vahid görüb?

Sadıq özünü gücló gülməkdən saxladı:

– Sənin də bir dılğır oğlun var, bütün qızlara müştəri çıxırsan?

Sadıq torbanı boşaltdı, üstdən qoyulmuş iri və tirməyə oxşar boğçanı çıxarıb, ehtiyatla pəncərənin içinə qoydu. Fatma arvad boğçanın yanına gəldi. Qucaqlayıb götürdü, bir az da pəncərənin dib tərəfinə qoydu. Səttarzadə paltar şkafının ağzını açdı. Sadıq boğçanı arvadından alıb, şkafa qoydu. Fatma arvad onun dalınca yeridi, sanki boğçadan ayrıla bilmirdi.

Sadıq torbanı ağzı üstə mis məcməyinin içinə çevirdi. Heyva, alma ətrafa dığırlandı. Səttarzadə dedi:

– A Sadıq, bu nə zəhmətdir çəkirsən?

Rübabə gələndə Sadıq ayağa qalxdı:

– Qızım, kefin, halın? Lap yaxşısanmı?

Fatma onu görüb diksindi:

– Bıy, qızım, sən... Sadıq, məni hara gətirmisən, niyə demirdin bəs?

Dalısını deyə bilmədi. Ancaq nə demək istədiyini Sadıq anladı.

Rübabə Fatmanın əlini sıxıb, xoş gəldin elədi:

– Nəzirə necədir? Heç məni yadına salırmı? Bəs Dilarə niyə gəlmədi. Mənə söz vermişdi. Yalan danışmaq da bilir?

– Uşağı onun yanına qoymuşuq. Dedik əl-ayağa dolaşmasın, allah qoysa, vaxt olar, onlar da gələrlər.

Rübabə Fatmanı elə danışdırdı ki, Fatma arvad cavabların çoxusuna aciz qaldı. O, gəlinlik satan, hər sözünü, yaxşı görünsün deyə ölçən-biçən bir qız yox, öz ailəsində adi həyatını yaşayan, sadəliyini pozmayan bir qız kimi danışırdı. Fatma nə onun alnından öpə bildi, nə boyunu oxşaya bildi, nə bir söz deyə bildi. Rübabə çay gətirir, çörək kəsir, qulluq edirdi. Fatma isə heyran-heyran onun izincə fərəhlə baxır, xəyalında deyirdi:

“Belə də olarmış! Görürsənmi, qismətə baxırsanmı!”

Rübabəni kənddən yola salanda Sadıq kişi dil-ağız eləmişdi:

– Qız deyilsən, qızılsan, sənə aslan deyim, tərlan deyim, şura balası deyim, nə deyim?! Vahidə hamıdan çox köməyi sən elədin. Görüm səni uca rütbələrdə olasan, istəklindən ayrılmayasan!

Lakin ürəyində təmin olunmamışdı. “Quru qurbanın olum, nə olsun? Bunlar adamlıq elədilər, sən də bacar, xəcalətliyindən çıx”.

Odur ki, bu dəfə gələndə düşünmüşdü: “Rübabənin əsil sovqatı bir oğlandır ki, tapıb, nişan dəsgahı bəsdir? Qaldı mənim qoca yoldaşım, onunku da yemək-içməkdir”. Bununla kifayətlənməyib, Səttarzadəyə papaqlıq, ya palto yaxalığı – bir yaxşı buxara dərisi gətirmişdi.

Rübabənin “nişan dəsgahı” deyilən sovqatı isə boğçada idi. İndilikdə ona kimsə yaxın getmir, kimsə əl vurmurdu, vurmağa da ixtiyarı yox idi.

Sadıq kişinin gəlişi adi bir qonağın gəlişi deyildi. Onlar nişan üzüyü gətirmişdilər. Vahidin əmi oğlusu Əsgər əmisi ilə gələ bilmədisə də, iki günə qədər özünü Bakıya yetirəcəkdi. Bacısı Dilarə də gəlmək istəyirdi. Çoxları isə (bibiləri, məktəb yoldaşları...) gözləyir, Vahidin toyuna hazırlaşırdılar.

Yolda Sadıq kişinin Fatma ilə danışığı oldu. Fatma mehmanxanaya, ya başqa yerə düşmək istəyirdi. Sadıq kişi dedi:

– Birbaşa Səttarzadəgilə gedəcəyik!

– A kişi, xalqı özünə güldürərsən, nişandan qabaq da qız evinə gedilərmi? Axı elin qayda-qanunu var. Başarmırsan, çəkil qırağa. Sözə qulaq as.

– Elin qaydası nədir? Deyir qohumun evinə getmə, düş o vaxtkı kimi, şəhərin canına ki, bu qəstin mənim, o qəstin sənin!

– Qəstinə düşmə, lap düzün-düzündə qal. Mən nişandan qabaq xalqın evinə ayaq basa bilmərəm.

– Sən basmırsan, mən basıram. İstəyirsən, heç tanışlıq verməyim. Deyim qulluqçumuzdur, gətirmişəm.

Fatma bu sözdən bərk acıqlandı. Üzünü yana çevirdi, bir müddət dinmədi. Güman eləyirdi ki, əri küsdüyünü görüb, yola gələr, könlünü alar. Sadıq kişi isə arvadının susduğuna bir az sevindi. Pəncərə qabağına keçib, fışqırıq çaldı. Fatma durub onun ətəyindən dartdı:

– Məni qürbət vilayətə rüsvay eləməyə aparırsan? Gözləyəcəyəm Əsgər gəlsin, Əsgərsiz heç yerə getməyəcəyəm. Lap bu vaqonda qalacağam.

Sadıq onu yumşaltdı:

– Ay arvad, səni çöldən tapmamışam, hara kefindir, aparım. İndi yadıma düşür, Vahidin tələbə yoldaşı var, onlara gedərik!

Fatma sevindi:

– Ona nə sözüm. Dediyim odur, qız evinə yox. Bəs bu sovqatları necə çatdıraq yerinə?

– Nə var ki, bir hambala verib göndərərəm.

– Getdiyimiz evdə görəcəklər axı.

– Görsünlər də.

– Yaxşı olmaz.

– Daha da yaxşı, görərlər ki, sən gəlininə sovqat gətirmisən.

– Sovqatı qonaq evindən çıxartmaq layiqdirmi?

– Qonaq yeri əjdaha deyil ki! Payını yeyər.

– Burda nə var ki, pay verəsən.

– Baxma, burda yeddi kürdün xörəyi var.

Sadıq arvadını aldadırdı. Onu düz Səttarzadəgilə gətirmişdi. Fatma Səttarzadəni tanımadığından və əri də onu sadəcə “Vahidin anası” – deyə təqdim etdiyindən bir şey seçməmişdi. Ancaq Rübabə bəriki otağa keçəndə Fatma duydu ki, əri dediyini yeritmişdir.

İş işdən keçdiyini görüb, dodağını çeynəyir, “kül mənim başıma, bu kökdə qız evinə gələrlərmi” – deyə üst-başına diqqət yetirir, çəkilib bir küncdə oturmaq istəyirdi. Sadıq isə öz evi kimi dolanırdı.

Səttarzadə kürsü çəkib, qonaqları çay süfrəsinə çağıranda, Fatma üzrxahlıq istədi:

– Səttar qardaş, gərək bağışlayasan. Bu kökdə evinizə gəlmişik. Günah mənimkindədir. Aldadıb gətirib, davamız qalsın sonraya, amma çox layiqsiz oldu. Mən Rübabənin yanına karvan-karvan daş-qaş ilə gəlsəm də azdır. Ancaq ki...

Sadıq güldü. Fatmanı aldatdığını danışdı. Səttarzadə Fatmaya dedi:

– Nahaq, nahaq utanırsınız, – ətrafına baxdı. Rübabəni uzaqdan görüb dedi: – Evlənənlər, işin əsil yiyələri illərlə bir yerdə oxuyub, oturub durur, yoldaşlıq eləyirlər, bizə nə olub, bir-birimizdən gizlənək? Bizi birləşdirən zərgərin üzüyü deyil ki, cavanların xeyir işidir!

– Yox da, Səttar qardaş, adət var axı.

– Adət odur ki, pis ilə yaxşını seçəsən. Bunu adət eləsən, aldanmazsan. Allahdan gizli deyil, sizdən nə gizlədim. Uşaqlar bunu bizdən yaxşı seçir. Can deyib, can eşitdiklərini görürəm, deyirəm təki biz də bu zaman dünyaya gələydik.

Səttarzadənin sözlərindən Fatma açılışan kimi oldu. Yerində sərbəst oturmağa, ətrafa arxayın baxmağa başladı. Hətta əvvəl çəkindiyi "yad kişinin" yanında ağız açıb çörək yedi, çay içdi.

Sadıq Rübabəyə eşitdirdi:

– Vahid görəsən harada olar, yataqxanada, ya klubda?

Səttarzadə dedi:

– Harda olsa gələcək.

Çay süfrəsi yığılmamış Vahid gəldi, xoş-beşdən sonra ev-eşikdən əhval soruşdu.

Sadıq kişi dedi:

– Hamı səndən nigarandır!

Vahid dedi:

– Məndən xəbərin yoxdur? Oğulsuz qalmışdın ha!

Anası dilləndi:

– Ağzını xeyrə aç!

Sadıq kişi soruşdu:

– Niyə, nə olmuşdur?

Səttarzadə dedi:

– Təyyarə işinin xatasını bilmirsən?

Vahid pəncərədən göyü göstərdi:

– Oradan düşən nə olar?

Fatma durub oğlunun qolundan tutdu. Dönə-dönə tapşırdığı, lakin oğlunun hələ də əl çəkmədiyini yəqin etdiyi bir "xata" peşədən danışdı:

– Bura bax görüm, ədə, yoxsa genə gedirsən? Çətirdə hoppanırsan! Sənə deməmişəm əl çək?

Vahid onu sakit etdi:

– Yox, ay ana! Hoppanan-zad yoxdur, təyyarə qırılmışdı, az qala göyün yeddi qatından yerə gəlmişdim.

Fatma arvad uşağa hirslənən kimi əl-qolunu ölçdü:

– Minmə! Burax onu! Yekə yer sənə darlıq eləyir? Gərək göyə uçasan? Allaha xoş gedən sənət sənə qəhət olub?!

Sadıq kişi oğlunun cürbəcür təyyarə hünərlərini eşitmişdi. Bu söhbətlər ona xoş idisə də, hər uçan təyyarəni gördükcə ürəyi bir tikə olurdu:

– Bala, ehtiyatlı ol! Demə hünərdi. Göydən yerə zarafat olmaz, gözlə! Cavanlığına salma, bala!

* * *

İki gün çəkmədi Əsgər özünü yetirdi. Əmisindən qabaq Vahidi gördü:

– Necə eləyək? Nişana neçə adam getsin? Alınası bir şey yoxdur ki?

Vahid dedi:

– Atam ilə danış. Dilarəni niyə gətirmədin?

– Toya gələr, bəsidir, neynəyir indidən.

Şirinlik içilən axşam qonaqlar mübarəkbadlıq edib dağıldı. Sadıq kişi Səttarzadəni eyvana çağırdı, qırağa çəkib dedi:

– Səttar dadaş, gəlmişkən yaxşı olar ki, xeyir işimizi qurtaraq. Bizim də yolumuz uzaqdır. Uşaqlar da, şükür, dərsi-mərsi qurtarıb, niyə qalsın.

Səttarzadə xeyli Sadıq kişiyə baxdı, sanki onun dediklərini sevincdən işıqlanan üzündə oxumaq istəyirdi: sonra, bir şeyi yadına salmaq üçün düşünən adamlar kimi, qaşlarını çatıb yuxarıya nəzər saldı; gözlərini endirib razılıq ahəngi ilə dedi:

– Çatdıra bilərikmi?

Sadıq kişi onun cavabından daha da ürəkləndi:

– Çatdırmaq deyəndə, nə eləmişiksə eləmişik. Bundan sonra özləri fərasətli olar, eləyərlər. Yox, daha gözləməyək, məsləhətdir!

– Məsləhətdirsə, nə deyirəm.

Ataların razılaşdığından bir həftə sonra, bir yay axşamında Rübabəgilin böyük zalında toy məclisi qurulmuşdu. Ev qonaqlarla dolu idi. Pəncərələr hər tərəfə açıldığından şənlik, musiqi səsi küçələrə yayılırdı.

Dənizdən sərinlik gətirən külək bu evdən də kənara ətir yayırdı. Süfrə başındakıların biri oturanda o biri qalxırdı, biri Vahidə "Həyat ustası" deyib badəsini qaldırırdı, bir başqası onu "Göylər fatehi" adlandırır, biri "Sadəcə insan", daha biri "Əsrin məsud gənci" deyirdi...

Birdən səs-səda kəsildi. Hamının diqqəti qapı tərəfə, bir əlində kitab, bir əlində badə olan Səttarzadəyə çevrildi; Səttarzadə elə dayanmışdı ki, deyərdin evdə heç kəs yoxdur, o ən əziz bir dostu ilə qabaq-qabağa durmuşdur. Onun başı, yaxası açıq, sifəti dinc, gözləri gülər idi; sol əlində tutduğu qalın, qırmızı meşin cildli kitabı qulağına aparanda hamı susdu. Səttarzadə bülbül kimi fəğanə gəldi:

"Məndə Məcnundan füzun aşiqlik istedadı var!
Aşiqi-sadiq mənəm, Məcnunun ancaq adı var".

Səttarzadə bu beyti elə oxudu ki, eşidənlər onun gəncliyə – otuz il bundan qabaqkı həvəsinə qayıtdığını güman etdilər. Hamı sevindi, hamı əl çalmaq, afərin demək istədi, ancaq bu ləzzətli musiqini bir də eşitmək arzusu hamını susdurdu. Sükut daha da dərinləşdi. Səttarzadə kitabı qabağına qoydu badəni qaldırıb dedi:

– Qonaqlar! Dostlar!

Az danışan və hissini ifadəyə söz tapmaqda çətinlik çəkən adam kimi, onun nitqi də qəribə idi. Adamlar eyni maraqla əyləşmişdilər.

– Qonaqlar, dostlar! Mən burda, sizin hüzurunuzda qızıma... – Səttarzadə Rübabənin adını təkcə çəkməyin yaxşı olmadığını, bunun vaxtı keçdiyini, Vahidsiz Rübabə sözünün naqis göründüyünü düşünüb əlavə etdi: – Qızıma, oğluma – Rübabəyə, Vahidə bir hədiyyə verəcəyəm.

Adamlar maraqlanıb irəli oturdular. Bəziləri tələsik pıçıldaşdı: "Üzük bağışlayacaq". Səttarzadə davam etdi:

– Bu dünyada hər kəsin bir etiqadı, bir əqidəsi var. Biri Qurana, biri İncilə itaət edir, biri təbiəti, maddəni üstün tutur, biri də bunlara inanmır, quru bir heçə ürək bağlayır... – Pəncərəyə işarə ilə açıq göyü göstərdi: – Ona bax! Əvvəli, axırı olmayan göyə etiqad bağlayır,

ayəsini, hədisini ayazlı, buludlu göylərdə oxuyur... – Səttarzadə susdu. Söhbətinin sanki uzun çəkdiyini görüb badəni yerə qoydu: – Mən də bir cür adamam. Övladıma əqidəmi hədiyyə, cehiz verirəm! – Qoca xanəndə kitabı göyə qaldırdı. Ona baxan gözlərə sanki cavab olaraq daha da qaim səsləndi: – Bunun adı məhəbbətdir. Deyəcəksiniz əsil məhəbbət kitabda niyə? Onu üzük ilə bir yaylıq, bir dəstə gül ilə göstərirlər. Düzdür, əsil məhəbbət həyatdadır. Ancaq bu kitabda əbədi həyat olmuş bir məhəbbət oxunur. Nədənsə mən...

Səttarzadə kitabı daha da göyə qaldırdı. Övladına baxıb öyünən analar kimi baxdı, gözlərində fərəh parladı, yanaqlarında təbii bir həyəcan qızardı.

– Nədənsə mən bunu görürəm. Məhəbbət üçün nə üzüyü, nə çiçəyi, nə ayrı əlaməti deyirəm. Bu kitab: bu, dostlar bilir, bu kitab yalnız məhəbbət deyil. Bax, o göydə ay, günəş gözəldir. Məhəbbət də öz mənasında...

Səttarzadə nəzərini oturanların üzündə gəzdirdi. Vahidi görüb bir addım da irəli yeridi:

– Oğluma bir zəhmət verəcəyəm...

Qonaqlar yol açdılar, Vahidi qayınatasının yanına ötürdülər. Səttarzadə onu sol qoltuğuna aldı, dönüb o biri otağa baxdı. Sadıq kişi sanki onun ürəyindəkini başa düşdü: “Rübabə!” çağırdı. Əsgər o biri otağa getdi. Hamı Səttarzadəyə, Səttarzadə də gözü qapıda qızına müntəzir idi. Bənövşə güllü, ağ, uzun, ipək libasda, yanaqları lalə kimi yana-yana, ucaboy qız başıaşağı içəri girəndə məclisdə ürək qalmadı çırpınmasın, göz qalmadı yaşarmasın. Səttarzadə oğlanın da, qızın da alnından öpdü. Üçüncü dəfə kitabı göyə qaldırıb onların üzünə baxdı:

– Balalarım! Füzuli kimi sevin! Onun kimi böyüyün!

## Beşinci fəsil

Xəbər verdilər ki, ayın beşində komissarlar sovetində institutun məruzəsi qoyulur. Verdiyev papağını başına atıb ali məktəblər idarəsinə qaçdı.

Rəisin yanında iki-üç adam var idi. Verdiyev vacib iş üçün gələn, başqalarını əhəmiyyətsiz sayan bir tövr ilə, izinsiz içəri girdi, paltosunu soyunmamış rəisə əl verdi:

– Nə var, nə yox?

Rəis onun yersiz sualını eşitməməzliyə qoydu və yanındakılarla məşğul oldu. Verdiyev bu etinasızlığa dözməyib qonşu otağa, katibənin yanına keçdi.

– Nə var, nə yox?

– Sağlığın.

– Bizim məktəb haqqında göstərişdən-zaddan almamısınız?

– Nə göstəriş olacaq?

– Yox ey, komissarlar sovetindən-zaddan? Bəlkə siz onlara bir məlumat vermiş olasınız?

– Məlumat verəndə ümumi olur. Təkcə sizin məktəb haqqında yox!

Verdiyev katibənin sözünü axıra qədər eşitmədi, rəisin yanına qayıtdı.

Rəis soruşdu:

– Mənə aid qulluğunuz?

Verdiyev yumşaq kürsünü altına çəkdi:

– Yoldaş Zülfüqar, komissarlar sovetində bizim məruzəmizi siz qoymuşsunuz?

Rəis güldü:

– Bu gün səndən qəribə sözlər eşidirəm. Mən qoyası olsam, bilirsən ki, məruzənizi öz idarəmizdə qoyaram. Komissarlar sovetində mən nəçiyəm sənin məruzəni eşidəm?

– Yox, yenə də, siz ilə məsləhətləşirlər axı.

– Məruzəniz olacaq?

– Ayın beşində.

– Görünür kömək eləmək istəyirlər. Sevinməli hadisədir.

– Axı mən öyrənmək istəyirəm ki, necə eləyək?

– İşləri yaxşı hazırlayın, hazır gedin.

– İş sarıdan hazıram. Ayrı cəhətdən. Necə qurmaq məsələsi var.

– Nə quracaqsınız?

– Məruzəni!

Zülfüqar ayağa qalxdı:

– Qurmaq! Qurmaq asılıdır məruzəçidən. Faktlar, rəqəmlər gətirin, vəziyyəti, sonra da gələcək üçün tədbirləri deyin! İndi məruzələr qısa, sadə, işgüzar olmalıdır. Gurultulu nitqin vaxtı keçib! Hələ vaxt var.

Verdiyev onun getmək istədiyini bilib ayrıldı. Plan idarəsinə yol aldı. İşçilər yığılıb, hökumət sarayı tikilişinə baxmağa getmişdilər.

Verdiyev Bakı komitəsinin mədəniyyət şöbəsinə gəldi. Referantdan xahiş etdi:

– Yoldaş Nemətova deginən Verdiyev gəlib.

Referant xəbər gətirdi ki, məşğuldur.

Verdiyev orada dayana bilməyib məktəbə gəldi. Nemətov zəng elədi:

– Müavindir? Mənə şöbə müdiri lazımdır. Bəs haçan görə bilərəm? Bir onca dəqiqə vaxtını alacağam. Bilirsiniz, danışan direktor Verdiyevdir, inşaat institutundan... Komissarlar sovetində məruzəm var, istəyirdim bir az ustanovka alım. Siz onun kabinetindəki telefon nömrəsini deyə bilməzsiniz? Telefon ilə ustanovka vermir? Yaxşı...

Verdiyev adam göndərib, layihə bürosundan "vacib iş üçün" Gəldiyevi çağırtdı. Muxtarı da yanına səsləyib oturdu:

– Görəsən bizim məruzəmizi qoymaqdan sovnarkomun fikri nədir?

Muxtar dedi:

– Elə iş var? Yəqin bizimlə yaxşıca məşğul olmaq, kömək eləmək fikrindədirlər. Biz də gərək ləyaqətlə çıxaq qabağa.

– Sən yəqin bilirsən kömək üçün qoyublar?

– Ayrı nə üçün qoyarlar.

Gəldiyev dilləndi:

– Muxtar deyəndir. Ancaq bu prosto kömək deyil. Nəzərə alın ki, bir tərəfdən də partiyamız mədəni işlərə çox diqqət yetirir. Mənim zənnimcə, burada ayrı məqsəd də var.

Verdiyevin ürəyinə şübhələr gəldi:

– Ayrı nə məqsəd?

Gəldiyev gülümsər gözləri ilə onun üzünə baxdı və bir sirr söyləyirmiş kimi, əlavə etdi:

– Orden məsələsi.

Muxtar anlaya bilmədi:

– Nə orden?

– Naqradit eləyəcəklər. İnstitut yaxşı kadrolar verir, görmürsünüz, konstitusiyada da ziyalı-miyalını fəhlə ilə bərabərləşdiriblər.

Muxtar istehza etdi:

– İnstitut işçiləri yəni nə qəhrəmanlıq göstəriblər?

Gəldiyev ciddiyyətini saxladı:

– Yoldaş Muxtar, şərt o deyil ki, vətəndaş müharibəsində səngərə yatıb atışasan, qıçının da birini qoyub gələsən. İndinin səngəri buralar, kadr ocaqlarıdır. – Şəhadət barmağını göy məxmərli stola döydü: – Buradadır! Mədəni cəbhədir! Adam öz evində öz övladı ilə başara bilmir, böyük institutda bizim kimi mühəndislər hazırlamaq özü böyük qəhrəmanlıqdır. Buna sən, mən fikir verməsək də partiyamız və hökumətimiz yaxşı görür. Görür və qiymət qoyur!

Gəldiyevin söhbətindən Verdiyevin kefi duruldu:

– Ağıl kəsən sözdür, qardaş.

Muxtar çiyinlərini çəkdi:

– Yaman nikbin adamlarsınız. Axırı xeyir olsun.

Gəldiyev ayrı sübutlar gətirdi.

– Bəs demirsən, niyə komissarlar soveti qoyur, ayrı idarə yox?

Muxtar dedi:

– Mühəndislər hazırlığı ilə komissarlar soveti, plan idarəsi məşğul olur.

– Bağışla, burada bir kadr məsələsi deyil. Elə olsaydı, çağırıb deyərdilər, ay filan-filan olmuşlar, ildə bizə yüz yox, iki yüz mühəndis verəcəksiniz. Gedin başınıza çarə qılın. – Gəldiyev ahəngini dəyişdi, bir müəllim kimi izah elədi: – Sadə rəhbərlik deyil, məsələn, mənim proyekt büroda çalışmağım, qurtaran tələbələrin bəzisinin işi. Bilirsən, bəzi yoldaşları irəli çəkmək, qiymətləndirmək məsələsi var. Yoldaş direktor skromniçit eləyir, hərçənd, Azərbaycanda – Şərqin qapısında ali mühəndis məktəbi zarafatdırmı? Bu barədə bütün dünyaya gərək səs düşə! Kadro, kadro!

Muxtar güldü:

– Demək istəyirsən ki, Verdiyevi dünya miqyasına çıxarırlar?

– Yox, bir Verdiyevin adı deyil. Əlbəttə, direktorun əhəmiyyəti öz yerində, amma mədəni inkişaf məsələsi var.

Verdiyev özünü saxlaya bilmədi:

– Mən də o fikirdəyəm. Az vaxtda topdağıtmaz ali məktəb qurmuşuq. Gəldiyev görür, yuxu bilməmişik, istirahət bilməmişik, sağ olsunlar kişilər, qiymət qoyurlar.

Gəldiyev dedi:

– Amma, aşna, daklada əməlli hazırlaş ha!.. Elə olsun ki, qulaq asanlar razı getsinlər.

– Əməlli deyəndə, partiyaçı yoldaşlarsınız, ustanovka verin, kömək-filan! Ondan sonra pis danışsam, mən cavabdeh!

– Ustanovka var, asandır.

– Hə, asandır? Üç gündür Nemətovun dalınca düşmüşəm, hələ bir misqal ustanovka ala bilməmişəm.

Muxtar dedi:

– Ustanovka məlumdur, nöqsanlar üzərində dayanmaq, əməli işə əsas yer vermək lazımdır.

Gəldiyev etiraz elədi:

– Ay Muxtar, taraz ilə aran yoxdur. Biz burada naqrada məsələsindən danışırıq...

– Çox da danışırıq. Bizim danışığımıza nə verərlər?

– Havayı danışmırıq. Bir şey bilməsək danışmarıq.

Gəldiyev son sözünü açıq deyilməsi mümkün olmayan bir xəbər kimi dedi: "Bir şey bilməsək danışmarıq!".

Muxtar bunu duydu və susdu. Gəldiyev davam etdi:

– Odur ki, nöqsan-möqsan... bir də, yoldaşlar, mestkom iclasından tutmuş divar qəzetinə kimi hər yerdə nöqsandan danışılır. Bəsdir, axı pis deyə-deyə pisi çıxmasın. İş gör hara yetişib ki, bal satan oğlu da institutu tənqid edir. Zənnimcə, bu məruzəni dastijenilər üstündə qurmalıyıq. Burada bu neçə müddət ərzində təşkilatın usanmadan apardığı işi göstərməliyik. İnstitut rəhbərliyinin fəaliyyətini, kadrları qeyd etməliyik. Hərçənd məruzəçiyə öz barəsində danışmaq yaxşı düşmür, hər halda ayrı-ayrı yoldaşlar çıxış eləyə bilərlər.

Verdiyev dedi:

– Gərək təhsil məsələsində də çox dayanaq; yuxarılarda həmişə maraqlanırlar, işin keyfiyyətindən soruşurlar.

Gəldiyev yadına bir şey düşmüş kimi, onun sözünü ağzında qoydu:

– Əlbəttə, işə onlar vasitəsilə qiymət verəcəklər. – Baş barmağı ilə geriyə, dərs otaqlarına, tələbələrə işarə etdi: – Onlar vasitəsilə! Otliçniləri hesaba almaq lazımdır. Dekanlara tapşırın, düzəltsinlər.

Adamlar gedəndən sonra Verdiyev kabinetində tək qaldı. Ayaq üstə, əli cibində, üzü pəncərəyə tərəf dayandı.

Deyəsən, bütün şəhər onun qarşıdakı məruzəsini gözləyirdi. Hər şey onun əhəmiyyətini xatırladırdı. Binalar, yollar, küçələr, səkilər, daş pilləkənlər, ağır sütunlar, naxışlı qapı tağları, bağ-bağça hasarları – hamısı bir söz deyirdi: "Məruzə! İnşaat!"

Verdiyev öz məruzəsini elə buradan başlayacaqdır; çoxlarının il uzunu söylədiyi rəsmi, quru məruzənin, hesabat nitqinin əksinə olaraq, tribunaya qalxan kimi bir udum su içəcək, əlini pəncərəyə sarı uzadıb, göstərəcəkdir:

– Görürsünüz, bu geniş asfalt, müntəzəm daşsız-çınqılsız, tikansız, tozsuz-torpaqsız küçələri! Görürsünüz? Bəzəkli imarətlərə baxırsınız, yoldaşlar? Bağlar, xiyabanlar, parklar, stadionlar. Bunlar özbaşına yaranmır, əl ilə tikilmədən əvvəl baş ilə tikilir! Hər məhsulun bir fabriki olduğu kimi, imarət tikən, bina tikən başların da fabriki vardır ki, o da haqqında danışacağımız və şəhərimizin cavan təşkilatlarından olan inşaat institutudur.

Verdiyev dəftərini çıxarıb, yadına düşənləri qeyd edirdi. Telefon səsləndi:

– İslam qədəş, döşünü hazırla!

– Necə, yoxsa segah oxuyacağam?

– Necə, oxumazsan? Sən də oxumayacaqsan, bəs kim oxuyacaq?

– Nə münasibətlə?

– Bundan yekə münasibət? Döşünün düzəlməyi münasibətilə.

– Döşümə nə olmuşdur ki?

– Elə dərd o idi ki, bir şey olmamışdı. Nə olsa bundan sonra olacaq.

– Nə olacaq?

– Nə olacaq. Həm qızışacaq, həm sərinləyəcək!

– O nə sözdür, a Qurd oğlu, açıq de!

– Kalinin yoldaş o parıldayanın birini yapışdıranda...

– Qoy görək, ay Qədir, sən allah! Biz nə eləmişik ki, orden verələr.

– Bura bax, İslam, bu qədər də təvazö yaramaz axı. Bu bizim öz qüvvəmizə inanmamağımız kimi çıxır ey! Bütün şəhər bilir ki, kadro yolunda siz nə zəhmət çəkirsiniz. Sabah-biri gün də bayramdır, hökumət çağırıb zəhmətinizi qeyd edəcək, daha bunu danmaq, ya xısın-xısın danışmaq nə üçün?

Verdiyev məsələnin yəqin olduğuna inandısa da Qədirdən söz almaq istədi:

– Əsli olmaz əşi!

– Sənə söz deyirəm, kostyumun sol döşündən bir deşik aç! Əlbəttə ki, hələlik bir deşik!

– Havadan deyirsən bunu?

– Havadan? Havadan niyə! Bəs nə üçündür, sənin məruzəni komissarlar sovetində qoymaq? Hökumətin işi-gücü qurtarıb gəlsin bir məktəbin məruzəsini eşitsin? Axı özün yaxşı bilirsən ki, dünənəcən sənin məruzəni komsomol iclasında da qoyan yox idi. İndi iş dəyişib, kadroya əhəmiyyət artıb! Qədəş, sağ əlin başımıza, ulduzun parıldayır.

* * *

Ürəyi arxayın olsun deyə, Verdiyev şəhər komitəsi mədəniyyət şöbə müdirini gördü:

– Yoldaş Nemətov, – dedi, – hökumət məruzəmizi qoyub, dünən də gəlmişdim, məşğuldunuz. Dedim, ustanovka alım, əliboş çıxmayım.

Nemətov cavan, lakin bacarıqlı bir oğlan idi.

– Ustanovka ilə, – dedi, – əl dolmur, əli doluluğunuzu işiniz təmin etməlidir. Məsləhətə qalanda, məncə, nöqsanlardan danışın, özü də hamısını açıq danışın! Cürətlə!

– Bəs müvəffəqiyyət?

– Müvəffəqiyyət nə varsa məlumdur. Özgə şəhərdə danışmırsınız ha. Göz qabağındadır. Nöqsanınızı söyləyin ki, tədbir görsünlər, kömək eləsinlər.

– Nöqsanı şübhəsiz deyəcəyik. Binamız darısqaldır. Kabinetlərdə texniki vəsaiti gərək artıraq...

Nemətov hirsləndi:

– Bəzi müdirlərdə bir xasiyyətdir, müvəffəqiyyət gələndə, şəxsən özlərindən danışırlar, nöqsan deyəndə binanı, laboratoriyanı göstərirlər. O qədər işçiniz, tələbəniz, dərslər, təşkilat... hamısı nöqsansızdır? Hamı kommunizmə çatıb?

– Növbə ilə, yoldaş Nemətov, mən bir az nizama salmamışam, nöqsan əlbəttə ki, deyiləcək!

Nemətov davam etdi.

– Nə idi o Nayıbovun məsələsi? Ayıbdır, ay yoldaş direktor! Dillərdə deyilir. Adi bir komsomolçu ilə tutaşmaq... özü də biriniz, ikiniz yox, hamınız! Rüsvayçılıqdır.

– Bunu lap düz dedin. Eşidəndə istəyirəm lap qalxam ağzından öpəm. Mən o Vahid üzərində lap möhkəm dayanacağam. Arxayın ol, planım var. İstəyirəm institutumuzun əhəmiyyətindən bir giriş verəm.

– Tarix açmaq lazım deyil. Cəmisi on beş-iyirmi dəqiqə vaxtınız olacaq.

Verdiyev inana bilmədi:

– Necə, necə?

– Bəli, iyirmi dəqiqə!

– İyirmi dəqiqəyə mübahisəyə çıxarlar?

– Artıq vaxt ala bilsəniz, sevinin!

– Canım, iyirmi dəqiqədə heç giriş söyləyə bilmərəm.

– Vacib nə varsa onu deyərsiniz. Qısa, aydın. Ora yığılanların min işi var. Bir iclasda bir neçə məsələyə baxılır, tək siz deyilsiniz.

Nemətovun əvvəlki söhbəti Verdiyevi şübhəyə salsa da, axırıncı sözlərindən orden məsələsi beyninə batdı.

– Hə, az vermələrindən bəllidir. Görünür ya mükafata təqdim etmək fikirləri var, istəyirlər rəsmi olsun, ya da kadro hazırlığının maştabını artırmaq-filan məsələsi var. Öz planları var, məruzə də elə-belə məlumat kimi qoyulur...

Verdiyevə bir şey də aydın oldu: deməli, Vahidin məsələsi yuxarılara çatmışdır. Ürəyinə gəldi ki, bəlkə hərif ərizə verib. Bunun üstündə institutu danlamasalar yaxşıdır... Çağırmaq, dindirmək, heç olmasa könlünü almaq lazımdır!

Verdiyev katibinə üç tapşırıq verdi:

– Telefonunu öyrən, saat ikiyə mühəndis Vahid Nayıbovu çağır; saat üçün yarısına təsərrüfat müdirini, makinaçını, saat üçə də bütün dekanları.

Düz saat ikidə Vahid direktorun yanında idi. Verdiyev Vahidi çox mehriban qarşıladı:

– Keyfin sazdırmı? Səndən incimişəm, incimişəm ona görə ki, gəlib yoxlamırsan, kömək eləmirsən.

Vahidə qəribə gəldi:

– Yoldaş direktor, nə kömək edə bilərəm. Qapınıza az qala yasavul qoyursunuz, gələn necə gəlsin?

– Yox, sən gələ bilərsən, komsomol üzvüsən, özün də aktivsən; üçüncüyə qalanda... – Verdiyev o yan-bu yana baxdı, alçaqdan dedi: – Üçüncüyə qalanda yerlimsən, İsa bulağının suyundan içmişik axı...

– Bunlar düzdür, ancaq məni heç vaxt çağırmamısınız.

Verdiyev bu cavabı heyrətlə qarşıladı:

– Budur ha, gərək çağıralar? Bəs sənin bir komsomolçu kimi təşəbbüsün harda qaldı? Bəs sənin qabaqcıllığın harda qaldı. Bəs demirsən görüm məni yetişdirən məktəbdə nə var, nə yox?

Vahid hərifin sözə basdığını anladı:

– Yoldaş Verdiyev, deyəsən bu gün siz bütün nöqsanlarınızı etiraf etmək niyyətinə gəlmisiniz.

– Nə olar. Mənim də bir direktor olaraq nöqsanım var. O zaman sənin işinlə lazımınca maraqlanmamağım, məşğul olmamağım, filan...

Vahid macal vermədi:

– Direktor olaraq yox, bir kommunist olaraq, sizin təəccüblü işləriniz çoxdur. Adamın heç bir etimadı...

Verdiyev Vahidin dərinlərə gedəcəyini duyub, qolundan tutdu, gətirib divanda oturtdu. Zarafatyana dedi:

– Gəldiyevi mənə calama, onu mən də yaxşı tanıyıram. Keçənə güzəşt deyərlər. Sənə iş tapşıracağam. Çıxar qələmini qeyd elə... Əlli Gəldiyevi mən yerlimə qurban edərəm. Çıxart qələmini!

Vahid dedi:

– Yadımda qalar, buyurun.

Verdiyev əvvəlcədən fikirləşməmişdi, heç bir iş tapşırmaq fikrində də deyildi. Söhbətin bu istiqamətdə getdiyi az qaldı onu pis vəziyyətdə qoysun. Deyəsən qeybdən yadına saldılar. Dikəldi:

– Zad edərsən, məktəbin tarixi ilə maraqlanırlar. Necə bir köhnə tələbə, bu işə sən bələdsən, ona görə çağırmışam. Bəlkə kitab çıxdı, zəhmət çək qəzetləri varaqla, dərsdən və başqa məsələlərin gedişindən bizim barəmizdə nə məqalə çıxıbsa; siyahısını mənə ver.

– Bu işi kitabxana işçiləri daha yaxşı bacarar. Mən, bir də kənaram, bacarmaram.

– Nə oldu, gündə əlində qəzet olmur?

– Qəzetdə mən tarix axtarmıram ki...

Verdiyev hirsləndi, ancaq hirsini yeməyə məcbur oldu:

– Gör də, nə bacararsan, tap! Bizə kömək elə!

– Bacardığım qədər.

Vahid çıxanda Verdiyev onun dalınca baxdı, ürəyində dedi: “Bu köpək oğlundan gözüm su içmir, rahat durmayacaq”.

Təsərrüfat müdiri içəri girəndə Verdiyev qoymadı:

– Oradan makinaçını da çağır.

Gəldiyev də layihə bürosundan gəlmişdi. Verdiyev üzünü əyləşənlərə tutub dedi:

– Beş günlüyə məruzəyə hazırlaşmaq üçün harda mənə bir dinc şərait düzəldək.

Gəldiyev dedi:

– Odur, Mərdəkanda bir otaq tutun, maşını da aparın, maşinistkanı da. Diktovat eləyin, yazsınlar.

Verdiyevin ağlı kəsdi, bu işin xərcindən ehtiyat elədi:

– Hesabdar hanı, görəsən buna pul xərcləməyə bizim ixtiyarımız var, ya yox? Smetada nəzərə alınıb, ya yox?

Təsərrüfat müdiri dinməmiş Gəldiyev cavab verdi:

– Niyə yoxdur, liçni iş deyil ki. Tədris-mədris, komandirovka... o qədər maddə var ki!

Təsərrüfat müdiri də “mümkündür” deyəndən sonra Verdiyev makinaçıya, şoferə tapşırdı, onları yola salmamış, əllərində qovluqlar fakültə dekanları gəldilər. Verdiyev onlardan son sülsün hesabatını, müvəffəqiyyətləri istəmişdi. Riyaziyyat, yer quruluşu, rəsmxət, rus dili, fəlsəfə dərslərinin qiymət siyahısı oxundu. Birinci “A” sinfində riyaziyyatdan on bir adam kəsilmişdi. “V” sinfində fəlsəfədən beş adam, ikincidə rəsmxətdən yeddi adam yetirmirdi. Dekanlar dalbadal siyahıları oxuyanda Gəldiyev mane oldu.

– Dayan, dayan! Hara oxuyub keçirsiniz? Bu sifralar ilə, yoldaş Verdiyev, sizi sovetə nədir, heç mestkom iclasına da qoymazlar.

Verdiyev onun rəyinə böyük əhəmiyyət verirmiş kimi dedi:

– Danış, danış yoldaş Gəldiyev!

– Nəyi danışım. Danışmalı budur ki, “A” sinfində cəmi otuz adam var. On biri zəif alıb, bunu eşitsələr sizə nə deyərlər. Oborota götürərlər!

Verdiyev “A” sinfinin müvəffəqiyyət cədvəlini aldı, dekandan soruşdu:

– Matematikanı onlara kim deyir?

– Vəzirbəyli.

Gəldiyev direktorun fikrini anladı, ondan qabağa düşdü:

– Çağırmaq lazımdır.

Vəzirbəylini dərsdən çağırdılar. Verdiyev siyahını onun qabağına qoyub soruşdu:

– Bu sizin nömrələrdir?

Vəzirbəyli qoca, dünyagörmüş bir alim idi. Moskvada təhsil almışdı. Çox cəhətdən müdiriyyətin işini bəyənmirdi.

– Bəli!

– On bir adam zəif alıb?

– Zəif tələbələrə zəif qiymət verilib.

Gəldiyev saydı:

– Bir, iki, üç!.. On bir! Düz on biri yetirmir.

Verdiyev Vəzirbəylidən soruşdu:

– Yoldaş professor, bunlar niyə yetirmir?

– Çünki dərsi bilmirlər.

– Niyə bilmirlər?

– Çalışmamışlar.

– Niyə çalışmamışlar?

– Tələbələri çağırın, soruşun.

– Tələbə öz yolunda, ancaq siz bir professor olaraq, görək müvəffəqiyyətsizliyin səbəbi ilə ciddi maraqlanmısınız, ya yox?

– Mən müvəffəqiyyətsizliklə yox, müvəffəqiyyətlə maraqlanıram; təəssüf ki, bu tələbələrdə görə bilməmişəm. Görünür müxtəlif səbəbləri var!

Verdiyev dedi:

– Fərz edək ki, biz dərs vermirik, fabrikdə dəzgah dalında oturub corab toxuyuruq. Otuz corabdan on birini xarab toxusaq, brak adlanar, ya yox?

– Adlanar.

– Çox gözəl. Belə gözəl şəraitdə, studentlər stipendiya alırlar, özləri sağlam, cavan adamlar. Özü də yeni briqada sistemi. On bir adamın zəif çıxmasına nə ad qoyaq?

Vəzirbəyli də təəssüf elədi:

– Əlbəttə, biz istərdik ki, bir nəfər də zəif olmasın. Biz tələbkarlıqla onları oxutmalıyıq.

– Sizcə, bu zəifin səbəbi nə olar?

– Müxtəlif səbəblər ola bilər. Hamını bir ayaqdan götürmək olmaz. Tələbə konserv qutusu deyil!

– Bəlkə, yoldaş professor, elə on birinin də səbəbi birdir? Bəlkə dərsinizin metodu yaxşı deyil! Mən biliyinizə şübhələnmirəm.

Vəzirbəyli dinmədi. Verdiyev əlavə etdi:

– Bəlkə qiymətlərdə səhv var?

– Xeyr. Proqramın tələbinə görə qiymət qoyulub, yəqin elə siz deyəndir. Mən leksiya oxumağı bacarmıram. Buna sözüm yoxdur.

Gəldiyev onların söhbətini kəsdi.

– Uzağa niyə gedirsiniz. Biz bu gün burada pis dərs verəni çıxarıb əvəzinə yaxşısını qoymayacağıq ha! Komissarlar Soveti özü baxar bu məsələyə. Ondansa gəlin pis nömrələrdən danışaq. Tapşıraq müəllimlərə, yoldaş professora öz qiymətlərini bir də gözdən keçirsinlər.

Dekan soruşdu:

– Gözdən keçirmək nəyə deyirsiniz? Bir də imtahanmı edək?

Verdiyev dedi:

– Nə olar eləyəndə? Xançalımızın qaşı düşməz ki!

– Buna təlimat yol vermir.

Gəldiyev dedi:

– Başqa çarə tapın. Elə də qoymaq olmaz. Sabah adamın abrını ətəyinə bükərlər. Sizin zəiflər ucundan bütün institut qara dasqaya düşər. Düşünürsünüzmü?

Dekanlar narazı idilər. Tələbələr arasında dedi-qodu salmaq istəmirdilər. Verdiyev onları başa saldı.

– Yoldaşlar, açığı, bu nömrə ilə ki, siz mənim yanıma gəlmişsiniz, mən öz böyüyümün yanına gedə bilmərəm. Mənim böyüyüm məni qovar, yaxşı direktor olsaydım... – Verdiyev: “Mən də sizi qovardım” demək istədi. Buna cürət etməyib susdu. Ancaq bunu dedi:

– Ürəyim yumşaqdır. Vərəqləri götürün, üç gün sizə möhlət, nömrələri təzədən yoxlayın, sonra direksiyanın sərəncamına verin.

Vəzirbəyli söz istədi:

– Mən görürəm, direktorumuz məktəbimizin namusunu çəkir, razı olmur ki, üzümüzə söz gəlsin. Bu qəşəng xasiyyətdir, sağ olun.

Gəldiyev sevindi:

– Yoldaş Vəzirbəyli, istərdik ki, bütün işçilər bir nəfər kimi, məktəbin namusunu çəkə idilər.

Vəzirbəyli əlini qaldırdı:

– Öyrənərik, yoldaş Gəldiyev, öyrənmək borcumuzdur. Ancaq bir əlavəm var, nömrələri düzəltmək barədə şərikəm, gərək düzəlsin, gərək zəifimiz olmasın. Bunun üçün dekanı-filanı, ya müəllimi təzədən bura yığmaq, vaxtını almaq nəyə lazımdır? Direktorun bir əmri bəsdir. Xahiş edək direktor əmr versin ki, bu sülsdə bütün nömrələr əla adlandırılsın. – Vəzirbəyli sol əlini qol çəkən kimi tərpətdi: – Bircə əmr kifayətdir!

Dekanlar gülüşəndə Verdiyev tutuldu. Hər iki əli ilə stola söykənib, ayağa qalxdı:

– Belə artistlik eləməyin də var, cənab professor?

Vəzirbəyli qapıdan çıxa-çıxa dedi:

– Söz iti deyil, məsələnin özü itidir.

Dekanları yola salandan sonra da Verdiyevin hirsi soyumadı.

– Şaxtaçılardandır köpəkoğlu. Zərərçi!

Gəldiyev dedi:

– Vaxtında ifşa eləməyəndə belə olur. Nikolay məktəbi görmüş professorun bizim institutumuzda nə işi var ki, indi də bizimlə dimdik-dimdiyə dursun...

Verdiyev də, Gəldiyev də təsərrüfat müdirini çağırıb maşında oturdular. Mərdəkana otaq bəyənməyə getdilər.

Bir dəfə institutun "M-1" maşını yollara tozanaq salaraq, təsərrüfat müdirini, katibi Mərdəkana aparıb-gətirdi; Verdiyevə kağız, rəqəm, yoxlama daşıdı. Verdiyev məruzəsinin üzünü on bir dəfə ağartdı, yenə ürəyi qızmadı. Məsul yoldaşlardan bəzilərinə oxumaq istədi. Artmaqda olan istilərə, işçilərin məşğul olmasına baxmadı. Sovetin iclasında iştirak etməli olanların heç olmasa bir-ikisini qabaqcadan məruzə ilə tanış etməyi zəruri saydı. İki gün ali məktəb idarəsinin dalınca gəzdi, onun ezamiyyətdən gec qayıdacağını bilib katibini tapdı.

– Oxuyum, gör nə qeydin var.

Katib bu işə özünü məsul saymadığından qulaq asmaq istəmədi. Verdiyev Komissarlar Soveti işlər müdirini istirahət günü təzə köçdüyü bağda tapdı. Yaxın adamı kimi ərk ilə onun çiynindən tutdu:

– Oxuyum, bir qulaq as!

– Mən məktəb işi ilə o qədər tanış deyiləm, xeyrim dəyməz.

– Təki mən hər işə sizin qədər tanış olaydım. Bütün idarənin işi sənin əlində deyilmi, a sağ olmuş. ayda on belə məruzə yola salırsan. Yox, səni boşlamayacağam, otur qulaq as!

İşlər müdiri məruzənin uzunluğundan, boş sözlərdən narazı idi. Verdiyev dedi:

– Onlar xırda şeydir. De görüm, səhvi-məhvi yoxdur ki?

– Savadlı adamsınız, sizə nə səhv tutmaq olar...

Verdiyev sanki bunu arzulayırdı. Məruzəni qatlayıb portfelinə qoydu, razılıqla evinə qayıtdı. Yolda portfelini açıb, yazdığı vərəqələrə baxır, ürəyində deyirdi: "Taleyim səndən asılıdır ha, ay məruzə, görək necə qiymət alacaqsan..."

Məruzəni hazır sayandan sonra Gəldiyevlə oturub, "hər ehtimala qarşı" mükafata layiq adamların siyahısını tutdular.

## Altıncı fəsil

Nəhayət, gözlənilən vaxt gəlib çatdı. Gündüz saat ikidə məsul işçilərin, mütəxəssislərin, mətbuat nümayəndələrinin hüzurunda Verdiyev İslama söz verildi. Verdiyev əlində iş qovluğu kürsüyə çıxanda, dal cərgələrə göz gəzdirdi. Gəldiyevi görmədi. Ürəyinə bir qorxu düşdü ki: "Görəsən harda qaldı".

Pəncərənin qabağında, apaşe geymiş Vahidi oturan görəndə təəccüb elədi: "O hara, bura hara? Onu kim çağırıb?".

Vahidin orada olması Verdiyevin təşvişini daha da artırdı: kürsüyə keçən kimi bir udum su içdi. Nəzərini qabağına açdığı iş qovluğuna dikib dilləndi:

– Görürsünüz bu geniş, asfaltlı, müntəzəm küçələri...

Neçə vaxtdan bəri hazırladığı müqəddiməni bitirəndən sonra "partiyanın rəhbərliyi altında institutun tarixi qələbələrə doğru addımladığından" danışmağa, qrammofon kimi ötməyə başladı. Lakin gözlənilmədən verilən tutarlı suallar onu çaşdırdı. Verdiyevin zəhri yarıldı. Niyyəti, planı pozuldu. Soyuq tər vücudunu islatdı. Gözləri alacalandı, zala baxa bilmədi. Sədr onun üzünə ittihamnamə oxuyurmuş kimi bir az yaxın gəldi, səsini ucaltdı:

– Yoxsa tələbələri, müəllim heyətini aldatmaq sizə asan gəlir? Həmin iştaha ilə də bizi, iclası aldatmaq istəyirsiniz?! – Verdiyev susur, sədr suallı nəzərlə heyran-heyran ona baxırdı. – Çox qəribədir! Qoy yoldaşlar danışsın, görək institutda nələr olur, bunun baisi kimdir, nədir!..

Vahidin, Muxtarın açıq, ətraflı və hərarətli danışığından sonra sədrin təklifi ilə bir qərar qəbul olundu ki, inşaat institutunda rəhbər işçilərə möhkəm əl gəzdirilsin.

Verdiyev qan-tər içində dəhlizə çıxanda Muxtarın üzünə baxdı. Muxtar yarı təbəssüm, yarı ciddi soruşdu:

– Orden siyahısını neylədiniz?

Verdiyev heç nə demədi. Yarım saat əvvəl quş kimi hoppanıb çıxdığı pilləkənləri indi qocalar kimi yavaş-yavaş, ehtiyatla enirdi; sanki arxada, iclas zalında nəsə qoyub gəlmiş, yaddan çıxarmışdı. Ancaq yaddan çıxan bir şey yox idi. Yalnız vidalaşmalı, burada qoyub getməli olduğu vəzifəsindən, şöhrətindən nigaran idi. Əlini qoltuq cibinə atdı, biletinin orada, yerində olduğunu duyub sevindi. Sanki onun da alınacağından qorxub addımını yeyinlətdi.

Gəldiyevi evdə oturub onu gözləyən gördü. Verdiyev salam-kalam eləmədi, hirs ilə soruşdu:

– Ədə, bəs harda qalmışdın? Nə qırdı-qaçdı imişsiniz ə!

– Məni çağırmamışdılar. Elə bildim axşam olacaq. Suraxanıya məruzəyə getmişdim.

– Adamı tək qoyub əkilirsiniz? Gördün köpəkoğlu başımıza nə oyun açdı? Bir balsatan bütün institutun rəhbərliyini iki quruşluq elədi!

– Necə bəyəm?

– Necəsini sənə çatdırarlar.

– Bizə gələndə səni görən olmadı ki?

– Yox!

– Heç?

– Heç kəs. Nə olub ki?

– Elə-belə soruşdum. – Verdiyev bunu deyib papağını başına qoydu: – Dəyəsi yerim var, – deyə çıxdı.

Gəldiyev də durdu:

– Elə mən də gedirəm. Danış görüm, axı iclasda nə oldu? Ordendən-zaddan...

– Nəticəsi məlum deyil. Sən hayana gedirsən?
– Elə-belə, şəhərə sarı.
Verdiyev dayandı:
– Aşağı, ya yuxarı?
– Aşağı.
– Mən yuxarı gedirəm, hələlik...
Gəldiyev əl çəkmək istəmədi.
– Söhbətim var, yavaş!
Verdiyev götürüldü:
– Tələsirəm, sonra, sonra danışarıq.
Gəldiyev onun dalınca baxa-baxa qaldı.

* * *

Axşamüstü süfrəyə oturanda Ağca xanım Gəldiyevə sevincli bir xəbər verdi:
– Deyəsən, müsabiqədə udursan, gözün aydın! Proyektbyürodur, nədir, yoldaşların gəlmişdilər, əsərin üzünü verdim apardılar.
Gəldiyevin boğazı qurudu, tikəsi əlində qaldı, gözü bərəldi.
– Kimə verdin, ay arvad? Niyə verdin?..
– Deyir, sədr özü baxacaq.
– Arvad, nə qayırmısan! Nə danışırsan?
Durub yazı stolunun küncünə, lülə kağızların boş yerinə baxdı. Fəlakət görmüş kimi dizinə döydü.
– Qazandım... Yaxşı qazandım...
Gəldiyev köynəyinə od doldurulmuş kimi, evdə o yan-bu yana ha vurnuxdu, papağını başına qoyub çıxdı. Yenə qayıtdı. Nə getməyə yeri qalmışdı, nə oturmağa səbri. Quyruğu basılmış ilan kimi fısıldaya-fısıldaya o yan-bu yana keçib söyür, köksünü ötürür, dodağını gəmirirdi. Ağca xanım elədiyinə, dediyinə peşman olmuşdu. Ancaq ərinin həmişə bu dolaşıq işlər içində çapaladığını xatırlayıb, əlini tovladı:
– Qurtarmaz, bu partlamışın cəncəl işləri qurtarmaz! Görəsən yenə nə fırıldağı var!
Hava qaranlıqlaşanda Gəldiyev köhnə pencəklərindən birini geydi, yol papağını başına qoyub, evdən çıxdı. Nə Ağca xanım bir söz soruş-

du, nə də o bir cavab dedi. Ancaq ürəyində Verdiyevin sözlərini təkrar edirdi:

– Gördün köpəkoğlu başımıza nə oyun açdı! Bir balsatan bütün institut rəhbərliyini iki quruşluq elədi.

## Yeddinci fəsil

Beşcə gün bundan əvvəl plan idarəsinin kiçik zalında müsabiqə heyəti iclas edirdi. On yeddi layihədən "Ürək" adı ilə verilən layihə ikinci mükafata, "Salam" adlı bir başqası isə üçüncü mükafata namizəd göstərilirdi. Heyət üzvləri rəyə gələndən sonra müntəzir oturub, zərflərin açılmasını gözləyirdilər. Poladov ayağa qalxdı:

– Yoldaşlar, – dedi, – aydındır ki, ancaq qazanan əsərlərin paketini götürməliyik. Başqalarını açmağa ehtiyac yoxdur.

Gəldiyev tez iki zərfi sədrin qabağına qoydu:

– Yoxdur, – dedi – qazanmayanları, niyə açıb avtoru utandıraq.

Poladov göy zərfi cəsarətlə cırıb, iki qatlanmış kağızı əlinə aldı, oxudu. Hamı diqqətlə dinləyirdi. "Ürək" adlı proyekti mən Gəldiyev Kərim Abbas oğlu çəkmişəm. Bu mənim əsərimdir".

Verdiyev ayağa qalxıb, Gəldiyevi qucaqladı:

– Bərəkallah əlinin qabiliyyətinə! İndi daha ölsəm də arzum qalmadı; yoldaş Poladov, gördünüz, yaxşı proyekti yenə də institutumuzun yetirməsi çəkdi.

Oturanlar da Gəldiyevi təbrik etdilər. Gəldiyev sevincindən qızarmış, pörtmüş halda gözünü sədrin əlinə dikmişdi. Nədənsə sədrdə bir soyuqluq görürdü. Poladov ikinci zərfi açdı. "Salam" layihəsinin müəllifi Kirovabad pambıq zavodu inşaatında işləyən qocaman bir mühəndis idi. Sədr nə demək istəyirdisə, Vəzirbəyli soruşdu:

– "Ürək" layihəsinə mən də baxmışam. Bu necə şeydir? Təəccüblüdür!

Gəldiyev tez dedi:

– Professor, bu ayrısıdır, sən deyən "Ürək" deyil. Bizdə iki "Ürək" vardı: biri elə, biri belə!

Vəzirbəyli dinmədi. Xəyalına nə gəldisə, üzünü məclisə tutdu:

– Yoldaşlar, cavan bir mühəndis var, tanımamış olmazsınız. Vahid! Onun layihəsinə kim baxıb?

Gəldiyev dilləndi:

– Onu nə bilmək olar? Proyektlərə ad yazılmayıb ha!

– Yox, o elə iş olmasın gərək! Çox qabiliyyətli mühəndisdir. Gərək ki, iştirak eləyir, işləyirdi. İştirak eləyir, yaxşı da fikirləri, planları var, neçə dəfə mənim yanıma məsləhətə gəlib.

Verdiyev dedi:

– Professor, Gəldiyevin proyektində də təzə fikir az deyil.

– Axı mən bu fikirləri Vahiddən eşitmişəm.

– Ola bilər. Tanışdırlar. Gəldiyev bizə danışan kimi, ona da danışıb da!

Vəzirbəyli alnını qaşıdı, çeşməyini gözündən alıb sildi və yenə də taxdı:

– Güman eləmirəm. Vahid məğrur adamdır. Kim oxuyub onun layihəsini?

Heç kəs cavab vermədi. Poladov Gəldiyevdən soruşdu:

– Resenziyaya verilməmiş əsər varmı?

Bu danışıqlar Gəldiyevin canına elə üşütmə salmışdı ki, az qalırdı, dişi bir-birinə dəyib şaqqıldasın.

– Bağlı konvertdir, nə bilim kimindir? On yeddi proyekt gəlib, hamısına baxılıb.

Vəzirbəyli dedi:

– Bu məsələ, Bayıl, Zığ məsələsi, yaşıllaşma, metro planı... Bunlar daha hansı layihələrdə var.

Verdiyev hirsləndi:

– Canım, bunları çox adam yazıb, deyib, ancaq layihə çəkə bilməyiblər. Vahid olanda göydən-zaddan gəlməyib ki...

Vəzirbəyli ayağa qalxdı:

– Mən görürəm ki, Vahidin proyekti aralıqda yoxdur. Bəlkə kişinin əməyi itib. Niyə axtarmayaq? İki dəqiqə mənə möhlət verin.

Vəzirbəyli telefona yaxın gələndə Gəldiyevin ürəyi tıp-tıp ilə köksünü dəlmək istədi:

– Görünür yoldaş Vəzirbəylinin gizli imzalardan xəbəri var!

Gəldiyev bunu deməklə Vəzirbəylinin hiylə işlətdiyinə işarə vururdu. Professor isə səmimi anladı:

– İmzadan yox, yaxşı əsərlərdən xəbərim var! Çəkənlərin çoxunu tanıyıram. Vahidin özünə üç dəfə məsləhət vermişəm, o əsərin taleyi məni maraqlandırmasın?

Poladov tələb etdi:

– Soruşun özündən görək?

Vəzirbəyli zəng elədi, Vahid tapılmadı. Evinə telefon elədi:

– İndi harda olar o? Plan idarəsindən danışırlar...

Vəzirbəyli məyus olub telefonun dəstəyini yerinə qoydu.

– O işə çox ümid bəsləyirdim: məəttəl qalmışam, bəlkə çatdıra bilməyib. Axı o, gecə-gündüz çalışırdı.

Verdiyev professorun dediklərinə məna verdi.

– Qorxuram bizim belə müzakirəmiz bütün jürinin işini hörmətdən sala. Necə yəni, olan əsərlər buradadır. Resenziyalar da burada, fikirlər məlum! Mükafat da təyin olunub, qurtarıb. Daha durub təzədən əsər axtarmağa nə ad qoyaq?

Verdiyevin dedikləri Vəzirbəylini qəzəbləndirdi.

– Yoldaş İslam Verdiyev, üzdə olmayan əsərlərlə də maraqlanmaq bizim vəzifəmizdir. Çoxları istərdi ki, Vahidin özü də üzdə olmasın.

Professorun bu işarəsindən Gəldiyev güllə dəymiş kimi, yerində hərəkətsiz qaldı. Verdiyev söz tapa bilmədi. Vəzirbəyli sədrə döndü:

– Tələbəmdir, eləsi hər il yetişmir, hər adamdan çıxmır. Onun işini mən görmək istəyirəm. Mən baxdıqlarımın heç biri Vahidin qələminə oxşamır.

Professorun hərarətli və etimadlı danışığı hamının diqqətini cəlb etmişdi. Bu halda qapıçı gəldi.

– Bir oğlan gəlib, yoldaş Poladov.

Vəzirbəyli əl elədi:

– Nayıbov deyil?

– Bəli, Nayıbov Vahid.

– Gəlsin!

Vahid əlində dəsmal, təngnəfəs içəri girdi. Poladov soruşdu:

– Siz müsabiqəyə əsər hazırlayırdınızmı?

– Bəli, hazırlamışam.

– Bəs hanı!

– Sizdə!

– Əsərinin adı nə idi?

– “Açıq kitab”.
Vəzirbəyli heyrət edən bir tövrlə qollarını açdı:
– Mənə rast gəlməyib.
Üzvlərdən biri də şərik oldu:
– Mən də oxumamışam.
Vəzirbəyli Verdiyevdən soruşdu:
– Bəlkə sizin əlinizə keçib!
– Xeyr. O adda əsər görməmişəm.
Vahidin rəngi qaçdı:
– Təxminən bir ay olar ki, mən gətirib qeyd elətdirmişəm. İtsə, bilmirəm daha mən nə edəcəyəm.
Vəzirbəyli Verdiyevə eşitdirdi:
– Gördünüz, yoldaş Verdiyev, mən bir şey hiss etməsəm demərəm. Nəsə qaranlıq gəlir.
Sədr Gəldiyevdən soruşdu:
– Bu nə işdir?
Gəldiyev özünü ağır tutdu:
– Gələn əsərlərin hamısı resenziyaya verilib.
Onun cavabı Poladovu lap şübhəyə saldı. Vahiddən soruşdu:
– Əsərini görsən tanıyarsanmı?
– Ana övladını tanıyan kimi!
Poladov zəngi basıb, texniki katibi çağırdı:
– Gətir bura işlərin hamısını.
Verdiyev razı olmadı:
– Yoldaşlar, – dedi, – bu cəncəl məsələdir. İclas işi deyil. Tapşıraq katibə yoxlasın, sonra müzakirə edərik.
Vəzirbəyli qoymadı:
– Yox, yox, bu saat həll edəcəyik.
Vahid lülələnmiş, cürbəcür kağızları bir-bir nəzərdən keçirib ötürdü:
– Yox, bu deyil, bu mənim xəttim deyil...
Başa çıxanda sədr Gəldiyevin üzünə baxdı:
– Hanı bəs?
– Olan budur ki, var!
Vəzirbəyli dedi:
– Mən görürəm ki, Vahidin işi ortalıqda yoxdur. – Üzünü Gəldiyevə tutdu: – Bir zəhmət çək, öz proyektini bura ver!

Gəldiyev onun nə demək istədiyini anladı və ağardı:

– Professor, bu lap hörmətsizlik oldu ha.

– Baxmaq istəyirəm, niyə ayrı rəng verirsən?

– Yoldaş Poladov, xahiş edirəm nəzərə alınsın ki, mənim mükafat almış əsərimi şübhə altına salmaq istəyirlər.

Verdiyev də şərik oldu:

– Professor, sizdən gözləməzdim. Çox qəribədir.

Poladov danışığı kəsmək istədi:

– Yoldaş jüri üzvləri, gəlin siz bu məsələni mənə etibar edin, arxayınlıqla məşğul olarıq.

Bu təklif Verdiyevin də ürəyindən idi:

– Bizim institut işçilərinin də başı qarışıqdır, məruzəmiz-zadımız var, xahiş edirəm bu müzakirəni, sədr demiş, arxayın vaxta qoyaq...

## Səkkizinci fəsil

Vahid evə gələ bilmədi, deyəsən onun əsil işi indi, layihəsi qəbul olandan və hökumət adamları onu təbrik edəndən sonra başlanırdı. Becərdiyi bağın tamaşasından həzz alan bağban kimi, şəhərin ən uca yerinə – Dağüstü parka getdi. Qaralmaqda olan axşam üfüqlərini, göylərə səpilən, get-gedə qızaran ulduzları, bir nəhəng kimi yatıb dincələn Xəzəri seyr etdi. "Yeni Bakı"nın quruluşu, həyatı, insanları qədər də təbiəti təzələnməlidir. Şəhərə yaşıl don geydirməli. Çoxqatlı binalar, universitet, kitabxana, muzeylər, saraylar, klublar, rəsədxana... Uca çinar, qələmə, qarağac, şam, həmişəcavan ağacları içində görünməz olmalıdır. Eyvanlardan üzüm salxımları sallanmalı; bağçalarda güllər dəstələnməlidir. Dənizdən gəmi ilə gələnlər dünyanın ən gözəl bir şəhərinə yanaşdıqlarını güman etməlidirlər. Bu mənim şəhərim! Məni böyüdən, mənim böyütdüyüm yerlər yenə də dilə gəlin, qoyun aləm bilsin!

Öz işinin ağası olan adamların sərbəst qələmi ilə Şərqin qapısında, yeni tarixində böyük bir kitab yazılmışdır. Murmanskdan Bəsrə körfəzinə, Lamanşdan Vladivostoka qədər uzanan yollarda gəzənlər – yer, su, hava səyyahları – ruslar, azərbaycanlılar, özbəklər, kazaklar, türkmənlər, fransızlar, italyanlar, yaponlar, çinlilər, hindlilər... qaralar,

ağlar, oxumuşlar, avamlar, hərə öz dilində, hərə öz əqidəsində bu kitabı oxuyacaqlar. Bu kitabın dağlardan sahillərə qədər açılan parlaq vərəqləri kimi, məzmunu, mənası açıq və aydındır. Rahatlıq bilməyən buruqlarda, göylərə baş vuran zavodlarda, çoxqatlı mənzillərdə, məktəblərdə, müalicə evlərində, süzüb gedən maşınlarda, trolleybuslarda körpələr də, uşaqlar da, gənclər də, qocalar da, məşhurlar da, sayalar da, əmr verən komandanlar da, eşidən döyüşçülər də, milislər də, xörək bişirən qadınlar da xoş səslə deyəcəklər.

– Sədaqət, məhəbbət qalib gələn yerdə hər şey məğlub olar.

## Doqquzuncu fəsil

Gəldiyev ehtiyatla, ağır-ağır yoxuşu çıxdı. Səkiyə ayaq basanda Vahidin evi gözü önündə dikəldi, rəngi getmiş, divardan çətin seçilən uca, taylı qapı Gəldiyevə tanışdı.

İki ay yarım bundan qabaq, mülayim bir qış axşamında bu qapını "ziyarət" etməli olmuşdu. Ancaq o zaman Gəldiyevin iradəsi davamsız idi.

O, iş görmək istəyən adam üçün bu açıq, aşkar yerdə gəzinməyin, görünməyin yaxşı olmadığını xəyalına gətirdi. Sonra düşündü ki, görən olsa deyərəm: "Təmiz havaya çıxmışam! Bu yalana inanmazlar!"

Ürəyində xeyir ilə şəri deyişdirdi. Şər deyirdi: "Hərif ilə qərəzli olduğun məlumdur. Bircə nəfər şahid çıxsa ki, filankəsi axşam tin başında gördüm, işin bitdi. Keç qapının dalında dur!" "Bəlkə evdən bayıra çıxan oldu? Deyərəm Vahidi görməyə gəlmişəm. Axşama qədər işdə, idarədə niyə görmürsən? Tez yayınar, qaçaram! Yaylı qapı açılanda səsdən biləcək, dalınca düşəcəklər: lampoçkanı burub boşaldaram!"

Şərin sözü kəsilir, Gəldiyevin tədbirləri qətiləşirdi. "Lənət şərə" deyib qapıya yanaşdı. Əllərini belində çataqladı, dalını qapıya söykəyib tamaşa edirmiş kimi durdu. Sonra kürəyi ilə güc gəldi. Ağır, yaylı qapının bir tayı ləngər ilə aralanmağa başladı. Qapı yavaş, lakin yanıqlı bir səs çıxardı. Sanki bir fəlakət olacağını demək istəyirdi. Qapı arasında çəhrayı qurşaq göründü, get-gedə enləndi. Qapı o qədər açıldı ki, bir adam içəri keçə bilərdi. Gəldiyev axırıncı dəfə anlaşılmaz bir hövl ilə küçənin sağ-soluna nəzər saldı, ilan kimi sürüşüb içəri girdi.

Qapının tayını yavaşca örtdü, çəhrayı qurşaq nazilib yox olanda, qapının səsi də kəsildi. Gəldiyev barmaqları ucunda yeriyib pilləkəni çıxdı. Məhəccərin üstünə qalxmamış, düşmək üçün əl yeri, ayaq yeri bələdlədi, dırmaşıb lampoçkanı burdu. Lampoçka barmaqlarını yandırsa da, hərəkətini yavaşıtmadı. İşıq sönəndə deyəsən göydən, naməlum köməkçi bir əl onun müdhiş çiyinlərini örtmək üçün qara və ağır bir pərdə saldı. Zülmətdə hər şey bir-birinə qovuşdu. Gəldiyev qaranlıqda özünü qınına salınmış xəncər kimi hiss etdi. Ancaq, xəncər iş görəndən sonra qınına qoyulur. Siyrilmək, bu pərdəni bir an üçün də olsa götürmək lazım gələcək.

“Yox! Bir də bu dəhliz Vahidin sağlığında işıqlanmayacaq. Mən işimi elə qınımda görəcəyəm. Qaraquşunkunu Allah yuvada yetirər. Mən hərifin üstünə getməyəcəyəm, o mənim üstümə gələcək. Hüquq ilə yanaşsan, mən heç müqəssir deyiləm; budur mən bu qaranlıq pilləkənlərdə dinc həyat sürürəm. O qapını açıb buraya soxulanda, mən necə dayanım, bəlkə məni öldürməyə gəlir, bəlkə boğmaq istəyir, qorunmalıyam, ya yox!”

Bu xəyallar Gəldiyevə həm gülünc, həm də dəhşətli görünürdü. Haçandansa əlini xəncərin dəstəsinə atmışdı. Dəstəni elə bərk sıxdı ki, az qaldı barmaqlarından qan dama.

İçəridən səs gəldi. Gəldiyev divar dibinə çəkildi. Deyəsən oxuyurdular. Qadın səsi, Qarabağ şikəstəsi.

– Odur, o! Şikəstə oxu... Bir saatdan sonra da ağı deyəcəksən...

İntiqam hissi canavar kimi Gəldiyevin içini gəmirirdi. Kürəyini buz divara söykəmişdi, ürəyi daş kimi bərkimiş, əsəbləri ağac kimi qabarmışdı. Əli xəncərin dəstəsində müntəzir dayanıb, gözlərini qapıya zilləmişdi.

Qapı açılanda xəncər Vahidin ürəyinə sancılacaq, qan fışqıracaq, isti yara Vahidin sinəsini qarpız kimi açanda, Gəldiyevin ürəyi sərinləyəcəkdi. Yox, onda yox, Rübabə, dili şikəstəli qız Vahidi bu kökdə gördüyü zaman! Hə!

“Bir quş olub kənardan baxaydım. Vahidin cənazəsi əsgi kimi düşüb qalanda... qan qapıda göl duranda... Rübabə lampoçkanı yandıracaq... İşıq olsun, ərinin ayağı ilişməsin. Baxanda, yaxın gələndə, dizinə döyüb nalə çəkəcək... O nalə mənə bəsdir... Yanğımı söndürməyə bəsdi! Onu istəyirəm, hə, onu!”

Mahnı təkrar eşidildi. İntiqam hissindən tələsdiyindənmi, vahimə duyduğundanmı, nədənsə, Gəldiyevin canına üşütmə düşdü, bədəni yarpaq kimi əsdi, əsəbləri sim kimi gizildədi, tükləri qalxdı, dişi-dişinə dəydi, "Bismillah!" deyib, bir pillə aşağı endi. Dodağını çeynədi. İkiəlli xəncərin dəstəsindən tutub, gərnəşirmiş kimi qollarını şax saxladı. Az qaldı xəncərin qayışı qopsun. Bir ayağını irəli, birini geri qoydu, bu saat Vahid daxil olacaqmış kimi hazır dayandı. Gözünü qapıya dikdi. Nəfəsini oğurladı. İçəridən bir qız uşağı çıxıb kibrit çəkdi:

– Bacı, – dedi, – bura gəl!

Kibrit yanıb qurtarmamış qız birini də çəkdi. Yenə qışqırdı:

– Bacı, tez ol!

Rübabə hay verdi:

– Dayan telefon eləyim, bu saat!

Gəldiyev yəqin etdi ki, onun hənirtisini duymuşlar: "Rübabə milisə zəng edir".

Papağını gözünün üstünə basdı, pencək boğazlığını qaldırıb götürüldü.

Rübabə şaqqıltı ilə örtülən qapının səsinə çıxanda, Gəldiyev az qala beş küçə ötmüşdü. O, dala baxmadan tövşüyə-tövşüyə Çəmbərəkəndə tərəf yüyürdü. Kənardan baxan onun şey qaçırdığını, ya gündüzdən oralarda qiymətli bir şey qoyub gəldiyini güman edərdi...

O gecənin hövlündən Gəldiyev yorğan-döşəyə düşdü. Bir həftə yatdı. Ağca xanımın əzabını artırdı. "Soyuqlamışam" deyə neçə dəfə küpə saldırdı. Bunlar hamısı təcrübəsizliyin acı nəticələri, intiqam yolunun ilk məşqləri idi.

* * *

Gəldiyev nahaq yerə qorxu, vahimə çəkir. Qapını açan, kibrit çəkən uşaq Vahidin altı yaşlı bacısı Nəzirə idi, dəhlizdən köhnə başmaqlarını götürürdü. Başmağının bir tayında cücü görmüş, çimçəşdiyi üçün Rübabəni çağırmışdı. Rübabə isə Vahid üçün idarəyə zəng edirdi.

Bu vaxtlar Rübabənin ən sevincli günləri idi. Onun ailəsinə doğan səadət günəşini gecə də görmək olardı. Moskvadan da teleqram alınmışdı. Vahidin layihəsini bəyənmişdilər.

Rübabə Vahidin planı ilə tikiləcək böyük şəhəri – bütün bir əzəmət dünyasını nəzərinə gətirirdi; göylərin bir qatına çəkilmiş, qabaq-qabağa duran, ağaclar ilə əhatə olunan yaraşıqlı binaların çiçəkli eyvanlarından aləmə musiqi yayılır.

“Mən də Vahidə deyəcəyəm sənətkarlar evində özümüzə otaq ayırsın. Eyvanda oturum, dağlar ayağımın altında qalsın, uçan təyyarələri, trolleybusları quş kimi görüm. Yox, mən bu evdən çıxmayacağam. Vahidlə ilk dəfə bu otaqda deyib-gülmüşük. Bu otaqda biz sıxılmışıq, qüssələnmişik, axırda da sevinmişik. Vahid buranı çox sevir, onun istəyi mənim üçün hər şeydir. Vahid bu gün gecə: “Rübabə, ürəyim ata-baba yerimizi istəyir!” Mən rədd etmərəm. Köçüb gedər, lap rayonda yaşayaram. O, mənəvi iş ilə çox məşğuldur. Mən onun istirahətini, əsəb sakitliyini təmin etməliyəm. Çox işləməyə qoymayacağam. Yaxşıca bir dincəlməlidir. Utancaqlığa baxmaz. İki ay ona vaxt lazımdır. İş həmişə var, can ələ düşməz...”

Rübabə bu fikirləri ilə otaqdan-otağa keçir, bülbül yuvasını bəzəyən kimi, hər şeyi yeni bir qayda ilə düzüb qurmaq istəyirdi. Gah telefona qaçıb yar-yoldaşın təbrikinə təşəkkür deyir, gah piano çalır, gah Füzulinin divanını açıb oxuyurdu. Bu kitabı görəndə Rübabə həm sevinir, həm kədərlənir, həm rahat olur. Həm əsəbiləşir, həm inciyir, həm dincəlir, həm qayğılarını unudur, həm xiffət çəkir, həm təsəlli duyur, həm iztiraba düşür, həm ağlayır, həm gülür, həm alovlanır, həm fəxr edir, həm utanırdı. Məcnunun gəzdiyi o isti, tənha çöllər, çılpaq dağ-daş, hər şey dilə gəlir o, böyük, köməksiz aşiqin halına ağlayırdı. Sətirlərdə Leylinin “Qeys” deyə fəryadı eşidilirdi. Sözlər – şairin qələmindən tökülən odlar bütün kainatı yandırırdı. Qəlbin nə böyük tarixi, nə geniş aləmi var.

Nə üçün bu nurani kişinin önündə diz çökmürük? Nə üçün onun ziyarətinə həsrət çəkmirik? Nə üçün qızlar əl bağlayıb Leylinin qəzəllərini oxumurlar?

Vahid də bu gün xoş bir xatircəmliklə, məmnunluqla evə qayıtdı. Dünəndən bəri duyduğu ürək rahatlığı ömrü boyu çəkdiyi bütün iztirabları unutdurmuşdu. İndi daha hər şey yoluna qoyulmuşdu. Nə düşmənlər, nə üz görən dostlar, nə paxıllar, nə etinasız idarə başçıları, nə yaxşı gün aşnaları – heç kəs, heç kəs işləyənin, yaradanın əl-qolunu tuta bilmədi, yolunu kəsə bilmədi. Hamısı, daşa dəymiş kaşı kimi çilik-çilik olub getdi. Əmək və hünər, sədaqət, məhəbbət üstün gəldi.

Bu sevinc aləmində nə Vahid, nə də Rübabə ailənin aydınlığına çökmək istəyən qaranlığı seçməmişdilər. Yalnız balaca Nəzirənin çəkdiyi kibrit bu qaranlığı qaçırtmışdı...

* * *

Zahirdə ədavət guya soyumuşdu. Vahid Gəldiyev adlı bir bədxahın varlığını da unutmuşdu. İndi Gəldiyev onunla bir yerdə işləmir. Vahidin işi çox olsa da axşamlarını evdə mütaliədə, istirahətdə keçirir.

Gəldiyev onun qulluq işini bilsə də, ailəsindən xəbərsizdir. Ağca xanım onun yanına gəlib-gedən corabçı bir qadın vasitəsilə Rübabənin həyatını soruşur. Corabçı qadının ögey əmi qızısı Vahidin evində qulluqçudur. Ağca xanım ərinin maraqlandığını bildiyindən, hər dəfə corabçıdan söz alır: "Tarçı qızı necədir?"

Corabçı da həmişə Rübabədən fərəhlə danışır. Qapılarında qara maşın dayanmasından, həftəbaşı bir şənlik qurmasından, yaylaq tutmasından ağız dolusu danışır. Bu söhbətlər Ağca xanımı məngənə kimi sıxır, düşünür, bilmir acığını kimin üstünə töksün.

Corabçıdan eşitdiklərini, bir az da alt-üst ilə Gəldiyevə danışır. Gəldiyev içini yeyir, əlacsız qalıb çımxırır:

– Di qoymazsan bir tikə dincələk? Çox xoş xəbər gətirmisən!

Ağca xanım diksinib çəkilir.

– Özün deyirdin ki!..

Ağca xanım düşmən ilə maraqlandığına peşman olurdu.

Unutmaq istəyir, bacarmırdı. Ona elə gəlirdi ki, bütün bu uca binalarda, tül pərdələrin dalında Rübabə yaşayır, piano səsləri onun barmaqlarından, mahnılar onun dodaqlarından qopur; küçələrdə süzən maşınlar, hamısı, hamısı onlar üçündür...

Bunları düşündükcə Gəldiyevin də vücudu od tutub yanır, sinəsindən qopan ahlar az qala dil-dodağını yandırırdı. Ocağa düşmüş ilan kimi qıvrılır, durur-oturur, oturur-durur, uzanır-qalxır, axırda əllərini peysərində çataqlayır, sanki "yeni bir şey çıxsın" deyə başını bərk-bərk sıxır, yastığa söykənir, gözlərini səqfdən ayırmadan plan tökür, tədbir axtarırdı. Bir zamanlar o, mütərəddid idi, bu sualın cavabı ilə uğraşırdı: "Etməlimi?"

– Özüm qələt elədim atamla!..

Vahidin işləri onun tərəddüdlərinə son qoydu. O, güman etmişdi ki, Vahid ictimai bir ləkə tapandan, vəzifəsindən uzaqlaşmalı olandan sonra Rübabə peşmanlayacaq, taleyini beləsinə bağladığına əfsuslar deyəcək, baisə lənətlər oxuyacaq, Rübabənin bu günündə Gəldiyev yanaşacaq, ondan üz döndərmədiyini bildirəcək, Rübabə Vahiddən əl çəkəcək, Gəldiyevdən dördəlli yapışacaq...

Vahidin işi günü-gündən rəvac tapırdı. İş yerində, mühəndislər içində böyük, kiçik hamı onu tanıyır, yada salırdı. Rübabənin də ona məhəbbəti birə-min artırdı. Corabçının deməyinə görə, "Rübabə Vahidsiz bir tikə çörək yemir, onsuz bir məclisə ayaq basmır, hətta onun başını da özü darayır, qalstukunu da özü bağlayır, üst-başını şotkalamamış bayıra buraxmır".

Bu gün inşaatçılar ittifaqı binasında onu təbrik edənlər, başına yığılan qəzetçilər, fotoqrafçıları görəndən sonra bəlkə on dəfə ürəyində təkrarladı: "Etməli".

İndi corabçıdan bir söz eşidən kimi sualı xatırlayır, bu cavab qulaqlarında qətiyyətlə səslənir:

"Mütləq etməli!!!"

Bu cavabından yeni bir sual doğmuşdu: "Nə etməli?"

Həmin bu xoş yay axşamında, demək olar ki, Gəldiyev son sualın cavabını da tapmışdı. Bu, son cavab olacaqdır. Mübahisə kəsiləcək, cavanlıq aləmindəki münaqişələrinin hökmü veriləcəkdi.

Gəldiyev bu iştaha ilə Vahidin qapısına gəlmişdi.

Rübabə gündüzdən getmişdir. Qulluqçu istirahətdədir, gec gələcək.

Deməli Vahid təkdir, əsil iş görməli gecədir!

Gəldiyev əvvəl küçə qapısını sanballadı, açıq olduğunu görüb sevindi. İlk səfərdə etdiyi kimi, tədriclə qapını açıb, özünü dəhlizə saldı. Bu yerlər ona o qədər məhrəm gəldi ki... işığı keçirmədi, cəsarətlə pilləkənləri çıxdı, dayanıb qulaq asdı. Qabaqkı otaqda səs-səmir yox idi. Qapıya təkan verəndə bağlı olduğunu bildi. Açar yerinə diqqət elədi, əlcəkdən tutub gücünü yoxlayırmış kimi, bir bərk silkələdi. Çəkilib qulaq asdı. Sükutdan ürəyi arxayınlaşdı. Qayıdıb küçə qapısını yavaşca açdı, arasına kərpic itələdi, qaranlıqda yox oldu. Yarım saat çəkmədi ki, cibində bir dəstə açar gəldi. Qapının açar yerini qurdaladı. Açarları bir-bir salıb çıxardı. Dördüncü açar, deyəsən, elə bu qapı

üçün qayırılmışdı. Yağ kimi hərləndi, iki dəfə buranda qapı aralandı. İçəridən isti hava gəldi. Gəldiyev sürüşüb, divar peçinin böyründə dayandı.

Eşik qapı dəhlizə açılırdı. Dəhlizdən həm döşənmiş salona, həm də Vahidin otağına yol var idi. Bu qapıların heç biri açar ilə bağlanmazdı. İndi Gəldiyev, mehriban bir xanımanı dağıtmaq üçün nəfəsini dərir, özünə ürək verir, qüvvə toplayırdı. Otaq qapılarında salınan xalçalar, sakit və səliqəli ev şəraiti, həmişə dosta açılan qapılar, yarasanı qovan kimi Gəldiyevi çaşdırdı. Gülüş səsi eşidəndə lap özünü itirdi. Bir əli xəncərin dəstəsində, bir əli də yaxasını yırtdı, salona cumulmaq istədi. Gözünün ucu ilə içəriyə baxdı. Qəribə bir hiss onun qanına yeridi. Buralar heç nalə yerinə oxşamırdı. Pis məqsəd bu evlərə uymurdu. Əyilib yuxarıya diqqət edəndə Vahidin çarpayıda uzandığını, başı üstə oturan uşaq ilə danışıb oynadığını seçdi. Yəqin ki bacısıdır; bu dəqiqə qardaşsız qalacaqdır.

– Niyə yatmırsan, bala?

– Yuxum gəlmir!

Vahid uşağı yanına alıb oynadır, dilə tutub yatırmaq istəyirdi, uşaq isə Rübabəyə öyrənmişdi, onsuz yatmaq istəmirdi. Şaqqıltı duyan bala pişik kimi Nəzirə qapıya sarı döndü:

– Kimdir o, qağa?

Gəldiyevin gözləri uşağın şəhadət barmağına sataşanda xəncəri siyirib, göyə qaldırdı. Uşaq qışqırıb dəhlizə işarə edəndə Vahid dik qalxıb, qapıya tərəf getdi. Onun dik yerişi və ağır addım səsləri bir an içində Gəldiyevi çaşdırdı; o özünü pilləkənlərdən yerə atdı. Vahid qapıdan çıxanda ancaq onun dabanını görə bildi. Dalınca yüyürdüsə də hansı tərəfə qaçdığını təyin edə bilmədi. Qorxan, ağlayan uşağın yanına qayıtdı. Qapıdakı top açarlara baxıb xəyalında: “Cinayət! Cinayət!” dedi. Uşağı yanına alıb, qapıya çıxdı. Rubabə gələnə qədər içəri qayıtmadı.

Rübabənin də, Vahidin də Gəldiyevə gümanı gedirdi. Ancaq heç biri bunu dilinə gətirmədi, getdi.

Gəldiyev lap gecə yarısı, pörtmüş, dili-dodağı təpimiş halda evinə gəldi. Yetişən kimi vəsiqələrini, dəftərçələrini yığıb qoltuq cibinə qoydu və soruşdu:

– Mənim bir pastel qayışım var idi?..

Ağca xanım əlləri qoltuğunda oturub gözləmişdi:
– Neyləyirsən?
– Səfərim var.
– Nə səfər?
– Zaqatalaya göndərirlər.
Ağca xanım deməyə söz tapmadı:
– Sən də gedirsən, hə?
– Getməsəm atamı yandırarlar. Partiyniyəm. Bilet-zad alınıb, tez ol!
Ağca xanım istədi öz vəziyyətini dilə gətirsin, ərini danlasın, bunun faydasız olduğunu bilib susdu. Ürəyindən keçdi: "Görəsən, nə fəndi var".
Ağca xanım tərpənməmiş Gəldiyev qayışı tapdı, çamadanı da boşaldıb, hazırladı. Öz pal-paltarlarını da gətirdi.
Bunu görən Ağca xanımın ürəyindəki boşluq genişlənir, çırpıntı artırdı:
– Neçə vaxta gedirsən?
Gəldiyev qayışı bərk çəkib bağlaya-bağlaya dedi:
– Bilmək olmaz! Nə bilirəm!
– Havaxt qayıdacaqsan?
– Asılıdır yerli təşkilatdan. Həmişəliyə saxlasalar, əlbəttə qayıda bilməyəcəyəm. Yox, müvəqqəti olsa, görək də...
Gəldiyevin tələsdiyini, gözünü qapıdan kəsmədiyini görən Ağca xanım şübhəyə düşdü:
– Sənə nə olub, belə hövldəsən?
– Hövldə olmayım neyləyim, vaxta az var. Sonra mənə kim təzədən bilet tapacaq. Səfər özü tələsikdir. Bu saat çağırıb əmr veriblər əlimə ki, gərək çıxasan.
Gəldiyev zənn edirdi ki, Ağca xanım özü haqqında bir şey deyəcək, ya getmək istədiyini bildirəcək, ya mane olacaq. Ağca xanımın bu barədə heç danışmaması ona qəribə gəldi: "Yəqin hərif razıdır, məni o yana ötürüb, özü şəhərdə əl-qol açacaq. Ev xəlvət, uşaq-muşaq da yox, çoxdandır axı sərbəstlik görmür. Yəqin xəyal edir ki, ərim rayonda eşşək kimi işləyəcək, pul göndərəcək, mən də həmin pul ilə aşnalara məclis quracağam. Hay-hay! Axmaq qızı daha demir ki, sabah ayağımı rayona qoyan kimi kəbin kağızını göndərəcəyəm..."
Qadının əlləri qoltuğunda dümdüz dayanıb səfərə gedən kişisinə tamaşa elədiyini, bu gedişin aqibətini duymuş kimi, məzlum və naçar

baxdığını görəndə Gəldiyevin ürəyi köyrələn kimi oldu. Ancaq məna vermədi.

– Hər halda vəziyyəti sənə yazacağam, hələlik!

Doğrudur, Ağca xanım onun səfər xəbərini çox məyusluqla qarşılamışdı, lakin dediklərini eşitmirdi. Ürəyində öz dərdləri ilə məşğul idi.

Gəldiyev onun qapısından çıxan birinci kişi deyildi. Çoxları gəlib-getmişdi. Həvəslə, eşqlə, gülər üz, şirin dillə gəlmiş, rəsmi soyuq xudahafizlə getmişdilər.

Ağca xanım gəncliyindən qalma qürur, tələbkarlıq hisslərini çox vaxt boğmağa, Gəldiyevlə barışıb yaşamağa səy etmişdi, ancaq görürdü ki, mümkün olmayacaqdır.

Gəldiyev getdi, özü görünməz, ayaq səsləri də daha eşidilməz oldu. Ağca xanım içəri döndü, evə çökən sükut və tənhalığı dinlədi, qırmızı döşəmədən göy səqfə qədər şəkilli divarlara, rəngi getmiş qapıya, dolu və boş boçkaya qədər hər şeyə baxdı. Deyəsən, onlar bir sirri soruşurdular.

Ağca xanım səs eşitmiş kimi döyükdü, ətrafına boylandı. Qulağının cingiltisini, ürək döyüntüsünü, ağırlaşan nəfəsini dinlədi. Deyəsən, Təbarəkdən bu yana gələn və qucağında qızışıb gedənlərin sonuncusu, həm də ən amansızı həmin bu Gəldiyev idi. Gəldiyev onun sinəsindəki az-çox hərarəti, ümid işığını tamam söndürüb getdi.

Xəyalət onun nəzərini küçəyə, cərgə ilə düzülən və pəncərəsindən kənara işıqlar saçan otaqlara çəkdi. Bu evlərdə yüzlərlə ailələr olur; qadınlar, kişilər, qızlar, gəlinlər, balalar, körpələr məsud yaşayırlar. Səhər açılan kimi qalxıb gedirlər, günün bir hissəsini iş deyilən ailə həyatından uzaq bir aləmdə keçirirlər. Axşamüstü oradan evə sevinc, səadət, şirin söhbət, əyləncə, həyat ləzzəti gətirirlər.

– Bunları birləşdirən nədir? Nə üçün mənim tifaqıma əsən küləklər bunlara əsmir? Nə üçün o kişilər məni tapmır? Nə üçün bu səadət mənə yaraşmır...

Ağca xanımın ürəyindən qopan həsrətli bir səs pıçıldaşırdı:

“Mən də hökumət idarəsində oturaydım, qolu çirməkli görünəydim; mənim də cərgələrdə yerim, dəftərlərdə adım, işlərdə payım olaydı; mən də işləyəydim, yorulaydım, çalışaydım, həftəm, ayım, cüməm, məzuniyyətim olaydı. Danlanaydım, mənə də ərk olunaydı; ağır-yüngül sözlər deyiləydi; mən də bu minlərin biri olaydım...”

Səhər-səhər iş paltarında tramvaya minən, nahar vaxtı qayıdan qadınların, kişilərin həyatı ona ideal göründü:

“Azadlıq deyilən bir leysan yağışı onların həyatını yuyub ağartmışdır. Qanun deyilən bir əl onların üzünə ismət deyilən bir pərdə çəkmişdir. Qanun... Məni də qanunla doğub, qanunla bələdilər. Qanunla adaxladılar, Quran ayəsi, təkbir səsi ilk siğəm oldu. Axund yola salanda başımı qucaqlayıb, gözlərimin içinə baxırdı. O mənim bəbəklərimdə gələcək günahlarımı görməkmi, yoxsa təlqin etmək, hidayətdə saxlamaqmı istəyirdi?.. Həmin qanunlar mənə üç şey verdi: təbarəki, işrət məclislərini, tənhalığı! Həmin qanunlar məndən üç şey aldı: ismətimi, gəncliyimi, oğlumu...”

Ağca xanımın gözünə yuxu getmirdi. Ömrünün əziz günlərini keçirdiyi, həmişə deyib-güldüyü evdə indi şaxta, qış soyuqluğu duyulurdu. Hər şey ona düşmən görünürdü. Gözü İzzətin yatağına sataşanda ürəyi alışıb-yanırdı. Balaca yorğan, çəkili balınc, döşəkağı, çarpayı örtüsü səs-səsə verib çağırırdılar: “İzzət, İzzət!”

Ağca xanım səsini onların səsinə qatıb, uşağını haraylayırdı: “İzzət, körpəm, əzizim, haradasan, gəl yat!”

Birdən yadına düşdü ki, İzzət çoxdan yatmışdır. Yaş torpaqlar üstündə, qaranlıq məzarda, sal daşlar altında həmişəlik yatmışdır!

Qadın bu təsəvvürə inana bilmədi, ayağa qalxdı. İki əli ilə başına vurub saçlarını yoldu. Çəngə ilə əlinə gələn tükləri yaylıq kimi gözlərinə basıb nalə çəkdi. Üzü üstə döşəməyə düşüb hönkür-hönkür ağladı...

...Gözəl bir yay səhəridir. Uşaq bağçasında bayram keçirirlər. Şənlik qurtarmışdı. Hədiyyə paylanır, qırmızı sap ilə bağlanmış təzə qutularda çoxlu şeylər var. Hər kəs aldıqca “sağ ol” deyib, anasına qoşulur, oynaya-oynaya evlərinə gedir.

İzzət uçuq bir divara söykənib durur. Mürəbbiyə ona hədiyyə vermək istəyir. İzzət gəlmir. Yoldaşları deyir: “Müəllim, anasından qorxur”, Ağca xanım bu yandan qışqırır: “İzzət, İzzət, get al. Qorxma, sən də al!”

İzzət eşitmir. Ağca xanım çəpərdən hoppanıb, uşağın əllərindən tutmaq istəyir. Bağça, mürəbbiyə, hədiyyələr, sahildən ayrılan gəmi kimi uzaqlaşır. Analar uşaqlarını aparırlar. Deyəsən divar da gedir. Ağca xanım yeridikcə divar qaçır, uşağı aparır. Divarın kölgəsi qatılaşır,

uzanır, uzandıqca Ağca xanımdan uzaqlaşır. O, "Oğul, oğul!" deyir. İzzət eşitmir. Ancaq uşaqlar gedən tərəfə baxır. Səs düşür, uşaqlar quş olub dəstə ilə uçurlar. Oxuya-oxuya uçuq divarın üstündən ötürlər. İzzət də qollarını açır, yoldaşları onu çağırır. İzzət ha can atır, qalxa bilmir, dönüb anasına baxır:

"Ana, bəs mənim qanadlarım hanı?.."

Ağca xanım özünə gələndə vücudunun sanki yanıb külə döndüyünü, ona görə də yüngül olduğunu güman etdi. Bu saat xəfif bir külək əsəcək, onu göyə sovuracaq, hər şey bitəcəkdi. Əlini üzünə vuranda yaş duydu. Bu tər deyildi. Su tökmüşdülər, yanmışı da bir həyata qaytarmaq, əzablarla daha bərk yandırmaq istəyirdilər. Əllərini yerə verib qalxmaq, divar dibində İzzəti görmək istədi.

Üfüq seçilirdi. Gecənin nə vaxtıdırsa, səs-səmir kəsilmişdi. Bu görünən damlar, ağaclar, qulaq kəsilib Ağca xanımın nalələrini dinləyirdi. Bəs işığı kim söndürmüşdü?

– Yadıma düşdü: "Uşaq rahat yatsın" deyə özüm söndürmüşəm.

Ağca xanım qalxıb, stolüstü çırağı yandırdı, dönüb çarpayıya baxdı. Orada davam edib duran, sanki, qiyamətəcən duracaq olan boşluq, vay xəbəri kimi onu oxladı; diz çökdü, qəlbindən yanıqlı bir "uf" qopdu; göz qapaqları ağırlaşdı, kirpiklərindən daş asılmış kimi oldu; gözü qaraldı, xəyalı uçurumlarda yox oldu. Qorxunc təsəvvürlərdən ayrılmaq üçün özünə güc verib gözlərini açdı. Budur, həmişəki məhrəm isti ev öz qaydasındadır. İçi rəngbərəng qablarla dolu bufet, qablarda nə xörək çəkilməmişdir, nə qonaqlar qarşılanmamışdır... Ağır açılıb-örtülən komodun gözlərində paltarın sayımı var? Ağca xanım bu libasları geyinib, yenə süzə bilməzmi? Üzüklər, sırğalar, boyunbağılar, qolbaqlar, ətəklilər, mirvarilər...

Ağca xanım evinin bəzənmiş ziyafət süfrəsini açıb, özünü qonaqlar arasında zənn etdi; qalxıb qulluq etmək istədi.

Onlar hanı? Komodun üst gözünü çəkib, böyük albomu çıxartdı. İllər uzunu qapısının, süfrəsinin, vücudunun məhrəmi olan adamlar buradadırlar; onlar Ağca xanımı görən kimi hamısı birdən dilə gəldilər: "Əyləş dizim üstə!", "İç bu badəni! Mənim xatırıma", "Həyatım qədər sevdiyim", "Məni səndən ancaq ölüm ayıra bilər", "Nə gözəl şairanə bir xilqət".

Bu sözlər Ağca xanıma salam və xudahafiz kimi idi. Ancaq o bu sözlərin sahibini axtarırdı:

– Hanı? Haradasınız? Heç olmasa biriniz? Tək biriniz?

Ağca xanım şəkillərin üstünə qışqırır, heç bir cavab almırdı. Albomu peçə atıb kibrit çəkdi. Alov vərəqlərə yayıldıqca şəkillər tüstü içində görünməz oldu.

Ağca xanımın ağ günləri də beləcə, his kimi qaralmış, puç olub getmişdi:

– Nə gözəl uyğunluq!

İntiqam almış kimi bir yüngüllük duydu. Komodun gözünü açdı, ipək, qumaş paltarları, zər-zivəri hərrac kimi evin ortasına, bir-birinin üstünə qaladı: evi naftalin iyi götürdü. Hər köynəyə baxdıqca yaxasını açan əlləri, hər üzüyü gördükcə, əlini öpən soyuq dodaqları, hər sırğa parıldadıqca, hiyləli sözləri, hər saat əlinə gəldikcə, keçirdiyi dəqiqələri, hər çəkmə gözünə dəydikcə, xəlvət gəzdiyi yerləri xatırladı...

Bütün bu pal-paltar, vücuduna daraşan ilan kimi göründü. Zinətlər əfi dərisindəki pullar kimi parlayırdı. Bu ilan onu tilsimə, kəməndə salıb boğmuş, qaraltmış, üzmüş, qurutmuşdu; onu balasından məhrum etmiş, həyat çırağını söndürmüşdü. Ağca xanım atadan qalma, ağır və şax sallanan pərdələrə əl atdı, bərk-bərk tutub çəkdi, dəmir halqalar o yan-bu yana sürüşür, dəstəyi buraxmırdılar. Ağca xanım evində həmişə ata mirası deyib əzizlədiyi piləkli məxmərə altdan-yuxarı qəzəblə baxdı. Qucaqlayıb var gücü ilə çəkdi, ağac qırıldı; pərdələri bulud kimi bükdü; pəncərələri açdı. Eşikdən gələn sərinlikdən qadın titrədi. Başı əzilmiş ilan kimi büküm-büküm olan paltarları ağac ilə çəngələyib çölə atdı; sandıq şeylərini də həyətə tökdü, bundan bir rahətlik duyub, təkrar evin sükutunu dinlədi.

Lakin nə şəkillər, məktublar, nə də zinətlər onu mal kimi satın alan, top kimi atıb oynadan kişiləri uzaqlaşdırırdı. Sanki onlar indi də görünməz bir yol ilə onun boynuna sarılırlar. Əllərini yaxasına atdı, çəkib koftasını cırdı.

Meyvəsi yoluşdurulmuş ağac kimi pozulmuş, qurumuş taxta sinəsinə baxdı. Saralmış *bənizinə nəzər saldı. Bütün vücudundan bir pərişanlıq yağırdı. Dolu sifəti çəyirdək kimi qurumuşdu.

Bəli, hər şey bu daş kitabda – bu aynada yazılmışdır. Hamısı, hamısı burada həkk olunmuşdur. Bunlar əsrlərcə oxunacaqdır.

Ağca xanımın əlinə keçən həvəngdəstə güzgünün ortasına dəyəndə daş ayna yaz səması kimi birdən şaqqıldadı, ay kimi parçalandı. Bundan da Ağcanın ürəyinə bir sərinlik çökdü.

Yenə İzzət gözünə göründü. O, səsəmi gəldi? Torpaqlar altından baş qaldırıb, şikayətmi edir?

Ağcanın canına bir əsmə gəldi. Bədəni ağac kimi silkələndi. Qol-qanadında həyat adına nə qalmışdısa xəzəl kimi ələndi. Əlini atıb, ət bıçağını götürdü, bir istədi küləklər və boranlar oylağı olan ürəyini parçalasın; sinəsindən çal-çarpaz dağ çəkib, dərdini yazsın, bala busəsinə büzülməyən dodaqlarını doğrasın. Biləklərini sıxdılar, damarlarında qan dayandı, bütün bəndləri boşaldı. Yerə düşən bıçağı ayaqladı.

Nə hiss iləsə qapını çırpıb, özünü çölə atdı. Sanki gözü bunları, ömrünün əziz və zəlil günlərini danışan şeyləri, gəncliyinin taleyini xəbər verən ev əmlakını görməsə dincələcəkdi, gecə qaranlıqları onun əsəblərini su kimi oxşayacaqdır.

Bir kölgə kimi yeridi, eyvandan ötüb qonşu dama çıxdı, dalda bir yer tapdı; üzünü aşağılara, döş-döşə verib yatan uca və alçaq binalara, muncuq kimi düzülən işıqlara, qır gölü kimi görünən dənizə, sahilin qızıl sütunlarını parçalayan dalğalara tutdu. Göydən yerə qədər bütün aləmdə bir məmnunluq, müəyyənlik duyulurdu. Görünən, görünməyən adamların, hamının yeri, vəzifəsi, işi, əhəmiyyəti var idi. Hamı rahat-farağat və razı idi. Bu böyük, mürəkkəb aləmdə heç bir şey artıq deyildi.

Bax, o dənizin içərilərinə soxulan qara burun, o təpəcik də lazımdır. Kənarlarını dalğalar döyəcləyən körpü sütunları, sınıq qayıqlar, suyu sıxışdırıb içərilərə qovan daş, çınqıl, tar-taxta, dəmir... hamısı, tramvay, asfalt yolla süzülüb gedən maşın, sularda ağaran yelkən, qılınc kimi göyləri yaran təyyarələr... Hamısı lazımdır, hamısı bir məqsəd üçündür. İşıqlar tel-telə verib, yolçuların qədəmlərinə nur səpir; milislər nizam gözləyir, keşikçilər qoruyur; tramvaylar adamları mənzilinə aparır...

Budur, bir ailə görüşdən gəlir. Bir başqası görüşə gedir. Kimi nişan aparır. Biri gəzməyə çıxır, o birisi gəzintidən qayıdır. Bir ayrısı eyvanda oturub əylənir, biri oxuyur, biri çalır, biri qəh-qəh çəkir. Məsud, xoş bir ahəng...

Yox! Bunların hamısı zahirən belədir. Hamı üzünü dağlıq hissəyə çevirib qır dama, bu damda daş kimi dayanan qartala baxır... Möhtəşəm binalar, küçələr, sallanan fənərlər, gəzənlər, dayananlar... Hamı Ağca xanıma tamaşaya durmuşdur; sanki bu damın indicə yıxılacağını,

kimə isə zərər vuracağını gözləyirlər. Baxışlar tənəlidir, istehza edirlər, hamı ağız-ağıza verib, ucadan və hiddətlə deyir: “Sən artıqsan! Sən nəyə lazımsan!..”

“Sudan xilas dəstələri məni keçmişin əzab dəryasından, peşmançılıq alovundan xilas edə bilməzlərmi? Buna şəhərin qüdrəti çatmazmı? Mən yeni şəhər tikən, şəhəri yenidən tikən şəhəri yenidən tikən adamdan kömək ala bilmərəmmi?..”

Qonum-qonşunun həyətdəki səs-küyünü eşidəndə Ağca xanım bir cani kimi uzaqlaşıb getdi.

Qonşular həyəti qiymətli şeylərlə dolu gördülər. Qadının dəli olduğunu, bəlkə də özünü öldürdüyünü güman edib, evə yüyürdülər. Qapılar taybatay, ev isə sahibsiz idi. Küçəyə adam qaçırtdılar, su quyusuna çıraq salıb baxdılar... Zirzəmini, pilləkən altını, vanna otağını gəzdilər. Ağca xanımdan bir nəm-nişan yox idi. Paltarlarının, ayaqqabısının evdə olmasından yəqin etdilər ki, bir yerə getməyib. Səhərə qədər axtardılar. Odunların altına, köhnə təndir uçuğuna, qonşu damlara, həyətlərə baxdılar. Tramvay altına düşməsindən şübhələndilər. Zəng vurub “Təcili yardımdan” soruşdular. Ağca xanımın yox olması xəbəri rayona çatdı. Fövrən evə iki milis gəldi: şeylər siyahıya alındı, şahidlər qol çəkdi, qapı möhürləndi.

* * *

Kainat rəncbərinin xırman işi bitir, göy üzünə səpilmiş xaş-xaş dənələri, gündüz böyük bir tığ təşkil etmək üçün yığılır, səhər açılırdı. Ötən axşam haralardansa kəmənd kimi atılan və get-gedə tündləşib bir qaranlıq olan kölgələr, sanki yuvalarına çəkilir, bəndlərinə bağlanırdı. Səhər açılırdı.

Zülmətin gücündən bir-birinə qarışan varlıqlar, durulan suda daşqum kimi ayrılmağa, seçilməyə başlayır, səhər açılırdı. Göyərən və ağ ləpələri ilə torpaqları aşırıb, həyat işığına çıxan bitki kimi, günəş üfüqdən boylanır, göyə lalə yarpaqları tökülür, səhər açılırdı.

Qaranlığın amansız hökmü ilə torpağa bağlanmış, hərəkətdən qalmış məxluqat, həmin bu sabah işığı ilə həyat və sərbəstlik alır, yer üzünü şənləndirmək üçün hərəkətə gəlir. Səhər açılırdı.

Tramvaylar, fabrik fitləri, radio dalğaları, samovar nəğmələri, saat zəngləri səs-səsə verib, insanlara “Sabahın xeyir” deyir, səhər açılırdı...

Vahid Nayıbovun ev qapısı həmişəki sakitliyi ilə aralandı və örtüldü. Əlində zənbil olan qulluqçu cəld və yeyin addımlarla pilləkənləri enəndə dəhlizdə bir adam seçdi:

"Qapını kim açıb?" deyə xəyalından bir sual ötdü. Yadına düşdü ki, əmisinin maşını səhər tezdən Rübabəni gətirmişdi. Ala-toranda ayaq üstə dimdik, heykəl kimi görünən adam qulluqçunun canına vahimə saldı. Qız qayıtmaq istədi, çətinliklə dilləndi:

– Kimsən?

Qaraltıdan cavab çıxmadı. Qulluqçu bir də soruşdu:

– De, kimsən?

Qaraltının dinməz-söyləməz, yavaş addım ilə gəldiyini görən qulluqçu geri-geri pilləkənləri çıxmağa başladı:

– Kimsən? Ay, kimsən?

Qaraltı dayandı, boğuq səs eşidildi:

– Vahidi görəcəyəm!

Qulluqçu qayıdıb, tez yataq otağının qapısını tıqqıldatdı, qorxulu bir səslə Rübabəyə dedi:

– Vahidi istəyirlər, xanım bacı!

Rübabə qulluqçunun təlaşını duydu:

– Qız, sənə nə olub?

– Dəhlizdə bir adam dayanıb.

Vahid qulluqçunun səsini eşidən kimi geyindi, pencəyini çiyninə salıb çıxdı. Pilləkənlərin lap başında xəyal kimi hərəkətsiz dayanıb baxan bir qadın gördü. Qadını tanıya bilmədi. Ancaq onun vəziyyəti nəsə qeyri-adi bir hadisədən xəbər verirdi.

Rübabəni içəri qaytardı, dəhlizin işığını yandırdı, müdhiş bir heykəl kimi dayanan, savaşdan, davadan çıxmış, qatil əlindən qurtulmuş kimi bir adam gördü: rəngi qaçmış, saçları dağılmış, yaxası parçalanmış, üzündə iztirab oxunurdu. Vahid ömründə belə adam görməmişdi, nəzərini onun üzündən götürmədi:

– Gəlin!

Qadın dinmədi. Gur və dağınıq saçları altından baxan və alov saçan gözləri ilə sanki nəsə deyirdi. Qaşları çatılmış, sifəti sillə dəymiş kimi qızarmışdı. Enmiş köksündən, qalxmış çiyinlərindən, damarlar atmış boğazından, müvazi xətlərlə doğranmış alnından məlum idi ki, bu nələr yaşamış, nə iztirablar keçirmişdir. Vahid adi bir dəlinin, ya

azğının evə soxulacağından, bir iş baş verəcəyindən çəkinib, qapını örtmək istədi. Qadının simasında, duruşunda və sükutundakı intizar buna mane oldu. Bir də təkrar etdi:

– Gəlin! Gəlin içəri!

Qadın sanki çətinliklə dilləndi:

– Mən çox gəlmişəm... Bir addım da siz gəlin!

Bu sözü deyərək qadın nə qımıldandı, nə əlini tərpətdi. Zənn edərdin ki, bu onun sözü deyil, qeyri yerdən gəlmə bir səsdir. Yaxud bunu dili, dodağı yox, bütün vücudu dedi. Vahidin şübhəsi daha da artdı. Aldığı cavab haradan, nə cəhətdən və nə səbəbdənsə qadının ona bağlı, onunla əlaqədar olduğundan xəbər verirdi. Qadın məhrum bir səslə dedi:

– Qapınıza gəlmişəm, qovmayın, Vahid!

Vahid qadının gözlərindəki şikayəti duydu. İndi qadın onun gözünə bir müəmma yox, fəlakətə uğramış bir yazıq kimi göründü:

– Buyurun içəri!

Qadın tərpənmədi:

– Mənə doğru bir addım da siz atın!

Bu söz Vahidi yenə şübhəyə saldı, kömək istəyən adamın sözü deyil, bu, tələb edən, uman, həm də yaxın bir adamın sözüdür. Vahid dillənmək istəyirdi. Qadın əllərini açdı, əyilən kimi oldu:

– Rübabəyə kəniz gəlmişəm, götürün!

Rübabə yad adamdan öz adını eşidəndə qapıya çıxdı. Qadın birdən vurulmuş kimi üzü üstə yıxıldı, hönkürtü vurdu.

– Astanana gəlmişəm, – dedi, – mənim başımı kəs, ya məni el içinə qaytar!

Rübabə onun qolundan tutub, içəri gətirdi. Vahid düşündü: "Buna nə olub?" O biri otağa keçəndə Rübabə ərinin qulağına pıçıldadı:

– Gəldiyev bunu da bədbəxt edib...

Vahid təəssüf və hiddətlə başını tərpətdi. Rübabə xahiş etdi:

– Yazıqdır, ona arteldə-zadda iş düzəlt.

– Kömək lazımdır!

Sabahısı gün qəzetlər Vahid ilə əlaqədar dörd yeni xəbər yazdılar:

Ağca xanımın sərgüzəştini, "Açıq kitab" layihəsinin müsabiqədə udduğunu, Kərim Gəldiyevin partiyadan qovulduğunu, inşaat institutunda havanın təmizlənməsi ilə əmələ gələn şadlığı.

## Onuncu fəsil

Gəldiyev sağ-salamat gəlib, Vartaşenə çıxdı. Onun məqsədi burada qalmaq deyildi. Köhnə və sadiq dostu İsmiyevi görəcək, onun vasitəsilə Rusiya darülfünunlarından birinə ezamiyyət alacaq, yayınacaqdı. Əlbəttə, İsmiyev mühəndis olmuş dostunu asanlıqla buraxmayacaqdı: "Bəsdir oxudun, – deyəcəkdi, – qurtardın, gəl indi xalqa xeyir ver!"

Amma Gəldiyev onu başa salacaqdı: "Hələ yarımçığam, Bakıda lazımi professorlar olmadığından dastatoçni bilik almadım. Moskvada oxumasam, özümə inciner demərəm. Təvəqqe edirəm boynuma qoyduğunuz haqq-sayı axıracan aparın. Mən də duz-çörək itirən oğul deyiləm, özün tanıyırsan!.."

Gəldiyev axşam çıraqlar yananda rayona çatmışdı. Birbaşa dostunun evinə getmək, əziyyət vermək istəmirdi. Mehmanxanaya gəldi, orada ortayaşlı çopur bir kişi işləyirdi. Gəldiyevə bir köhnə çarpayı verdi. Gəldiyev ondan əhval soruşdu:

– Deyəsən burada təzə işləyirsən, hə?

– Olar bir iki il yarım!..

– Necə yerdir? Xoşuna gəlir?

– Niyə, görmürsən, yazı cənnət kimi... Əbəs yerə Vartaşen deməyiblər ha. Vartaşen, yəni gül kənd!

– Adamları necədir?

– Adamları deyəndə, qardaş, sən qəribə söz soruşursan. Beş barmağın beşi də birdir? Pisi də var, yaxşısı da. Bir də mənə təfavüt eləməz, nəyim şəriklidir? Başımı salıb qulluğumu eləyirəm.

– İspalkomu-zadı deyirəm ey!

– Niyə, sağ olsun, canyandıran adamdır.

Gəldiyevin qoltuğu qarpızlandı:

– Dostumdur. Canlara dəyən kişidir.

– Onun nəyinə kişi deyirsən, qardaş, cavanca oğlandır ki!

– Necə cavan, 45-dən yuxarı yaşı var.

Çopur kişi bir az fikirləşəndən sonra dedi:

– Sən deyəsən axı İsmiyevi deyirsən.

– Bəs sən kimi?

– Daha ispalkom İsmiyev deyil. Müslümzadədir. Köhnəni qovdular.

Gəldiyevə təəccüb gəldi:

– Necə qovdular?

– Bəli, burdan qovdular Yevlağa, orda da tutdular.

Gəldiyev qaşlarını çatdı:

– Tutdular? Necə yəni tutdular?

– Bəli!

– Niyə tutdular?

Çopur kişi söhbətin uzanacağını görüb, qutusunu çıxartdı, papiros bükdü:

– Günahı çoxdur, qardaşoğlu, onun. Doğrudan dostundur?

– Zarafat eləyirəm, əşi. Dalaşmışdım onunla.

– Çox idi günahı. Adamları var imiş. Pay bölüşdürürlərmiş. Rayonu yeyiblər, üstü açılıb.

– Havaxt açılıb?

– Mən gələndən bir altı-yeddi ay sonra.

– Əşi, yoxsa sən açmısan üstünü?

– Mənim nə xəbərim var. Mərkəzdən adam gəlmişdi, raykomu da dəyişdilər.

– Axı mən eşitdim, İsmiyevə dəyməyiblər.

– Əvvəl dəyə bilmirdilər, dişi bərk idi, sonra ona da dəydilər.

Gəldiyev İskəndəri xəbər aldı. Çopur kişi onun üzünə baxıb dinmədi. Sonra papirosunun kötüyünü sorub dedi:

– Qardaş... Sən elə adamları soruşursan ki... İskəndər ələ keçsə, dərisinə saman təpərlər. Əmanət kassasının otuz üç min manatını götürüb yox oldu.

Balaca bir oğlan uşağı pişik kimi qapını açdı, qaça-qaça gəlib, çopur kişinin dizləri arasına girdi. Əlindəki tor zənbili sinəsinə basdı:

– Anam dedi, çörək alsın!

Gəldiyev uşağı tanıdı. Birinci arvaddan olan oğlu idi. Uşaq böyümüş, rəngi açılmış, dirçəlmiş, çevikləşmişdi. Parlaq gözləri hər şeyi görmək istərmiş kimi oynayırdı. Bu tanışlıqdan Gəldiyev pozuldu, üzünü yana çevirdi: "Bu uşaqlar məndən nə istəyirlər..."

Çopur kişi uşağın qolundan tutub, qapıya çıxdı. Gəldiyevə döndü:

– Hələ ki, buradasınız, qardaş?

Gəldiyev o tərəfə dönmədən cavab verdi:

– Arxayın ol, buradayam!

Onlar küçənin o tayındakı kooperativə girdilər. Gəldiyev şüşəbənddən baxırdı. Çopur kişi bir bütün təndir çörəyi, bir torba qənd

alıb, tor zənbilə qoydu. Uşaq bir əlindəki konfeti gəmirir, o biri əli ilə də şeyləri döşünə basıb, bərk-bərk tuturdu. Onlar küçə fənərinin altında dayanıb, nə isə danışdılar, sanki fənər onların mehribanlığını görüb, başlarına nur yağdırırdı. Çopur kişi uşağı at-fayton, maşın yolundan addadıb, evə yola saldı, özü mehmanxanaya qayıtdı.

Gəldiyev xəbər aldı:

– Deyəsən evlisiniz?

– Bəli. Gələndən sonra burada evlənmişəm.

– Bəs uşaq sizin deyil?

– Atası yaman çıxıb, uşaqlı arvadı boşayıb, Bakıda bir lotuya uyub. Mənim ürəyim götürməz. Oğlumdan artıq baxıram. Niyə ki, uşaqdır, böyüməlidir, bəslənməlidir. Sağ olsun, hökumət də az kömək eləmir. Bağçası-zadı müftədir. Sabah-biri gün də qoyacağam oxusun.

Gəldiyev heç nə demədi. Durub çıxmaq istədi. Çopur kişi soruşdu:

– Pasportunuzu, ya kinişkanızı verəydiniz, dəftərə salaydım, sonra yoxlayarlar.

– Çamadandadır, bir azdan açaram...

Gəldiyevin uzaq şəhərlərdən gətirdiyi qorxu və intizar bu kişinin qabağında xiffətə çevrildi; könlünün qaraldığını gizlətmək, tənhalıqda kədərlənmək üçün qalxıb otaqdan getdi.

Gəldiyev ay işığında nizamsız, adda-budda tikilmiş kənd evlərinin arasında, zəif elektrik çırağı işıldayan küçədən keçdi. Fındıqlı deyilən balaca dərəni addayıb, meşəyə çıxmaq istədi. Suyun səsi onda atəş oyatdı. Arxın qabağında çömbəlib ovuclarını doldurdu, sərin dağ suyundan içdi. Kolluqlarla başlayan, get-gedə sıxlaşan meşəyə dikləndi. Gəldiyevə elə gəldi ki, bu ağacların yalnız torpaqda deyil, havada da kökləri var. Onlar yarpaqlı, puçurlu budaqları ilə fəzaya bağlanmışlar. Yer də, göy də onları bəsləyir. Onlar pardaqlanıb böyüdükcə fəzanı fəth edir, günəşə qovuşurlar; sısqaları, qırıntıları, vəcdən düşmüş ağacları kölgələri ilə basıb məhv edir, payız xəzəllərinə qatırlar.

Keçmişmi, gələcəkmi, xatırlamaq, yoxsa unutmaq hissimi, nəsə Gəldiyevi çəkə-çəkə bir yerə gətirdi. Burda vaxtilə bir qarağac bitmişdi. Bu ağacın yerini o çox yaxşı bələdləmişdi; onun ətrafındakı kolları da, öz əli ilə əkmiş kimi tanıyırdı. O, həndəvəri bir-birinə vurdu, alçaq, qol-budaqlı, sıx kölgəli ağac yoxa çıxmışdı; deyəsən göyə uçmuşdu. Onun yeri adi bir açıqlıq idi. Açıqlıqdan, buraya düş-

məyə imkan tapan günəşdən otlar qidalanmış, boy atmışdı. Cavan bir nar ağacı bitmişdi. Gəldiyev otları aralayanda ayağı böyük bir şeyə ilişdi. Kəsilmiş qarağacın quru kötüyünün üstündə oturdu.

Neçə il bundan əvvəl Zoya ilə burda görüşmüşdü... Əlini cavan nar ağacının yarpaqlı budaqlarına toxundurdu. Elektrik işığında dayanıb, çopur kişini dinləyən uşaq gəlib Gəldiyevin qabağında bitdi. Nar ağacını göstərib, nə isə demək istədi, ağac isə susurdu, meşə də, otlar, çiçəklər, sular, küləklər, ulduzlu səma da susurdu. Hamı, hər şey uşağın boyuna tamaşa edir, sözünü eşitmək istəyirdi. Uşaq da susurdu...

Gəldiyev çox oturdu, nəfəsini qısıb meşənin sükutuna qarışdı. Heç kəsdən, heç yerdən səs eşidə bilmədi. Başını aşağı salıb, kötüyə baxdı. Dodaqları tərpəndi; üzülmüş həyatından, həsrətinin dərinliklərindən, quyudan gələn kimi, zəif, hüznlü bir səs eşidildi:

– Bir də göyərsəydim!..

*1941*

# MÜNDƏRİCAT

